Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 10 iyul 2009-cu il tarixli 7 nömrəli iclasının qərarı ilə nəşr edilir.

Rəyçilər:
Hacı Vasim Məmmədəliyev
*akademik*
Ziyad Səmədzadə
*akademik*

Möhsün Nağısoylu
*filologiya elmləri doktoru*

Tərtib edib nəşrə hazırlayan:
Hacı Mustafa Mailoğlu

Redaktorlar:
Məmməd Adilov
*filologiya elmləri doktoru*

Hacı Arif Buzovnalı

HAŞIM BƏY SAQİB. "DİVAN"
Bakı, "NURLAR" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2009

İSBN: 9952 – 403 – 35 – 6

# “TƏNG OLSA CƏHAN MÜLKİ...”

Uşaqlıq xatirələri hamı üçün əzizdir. Buzovnadakı həyətimizdəki tut ağacının meyvələri kimi şirin olan həmin xatirələrin mərkəzində isə bir insanın xüsusi yeri vardır: ötən əsrin 20-30-cu illərində Bakıda və Bakının ətraf kəndlərində ad çıxarmış şair Haşım bəy Saqib! O, anamın əmisi idi. Əslində anamın dediklərindən və uşaqlığımın əziz xatirəsi kimi yaddaşımda dərin iz salmış hadisə də Haşım bəy Saqib və məşhur muğam ustası Cabbar Qaryağdıoğlu ilə bağlıdır. Bu haqda bir qədər sonra.

Klassik şeir ənənələrimizin novator davamçısı, Şərqin böyük şeir dühalarının və nümunələrinin mahir bilicisi Haşım bəy Saqibin “Divan”ının nəşri klassik ədəbiyyatımızın və poeziya vurğunlarının haqlı olaraq böyük sevincinə səbəb olacaqdır. Mükəmməl şəkildə tərtib olunmuş bu kitab mədəni həyatımızda mühüm hadisədir. “Divan”a şairin böyük ustalıqla qələmə aldığı, insanlara ilahi eşqi, əsl məhəbbəti tərənnüm edən qəzəlləri ilə yanaşı, yaşadığı dövrün reallıqlarını, o illərin müsibətlərini, xalqımızın başına gətirilən faciələri əks etdirən əsərləri də daxil edilmişdir.

Bu qiymətli şeir nümunələrindən biri də zamanın ziddiyətli məqamlarını özündə səciyyələndirən, uşaqlıq yaddaşıma həkk olan, bu gün də sevə-sevə xatırladığım “Kim-kimədir” adlı şeirdir. Çünki atamın və anamın Haşım bəy Saqibin “Kim-kimədir” şeirini necə böyük həvəslə, lakin çox həyəcanla əzbərdən oxuması uşaqlıq xatirələrimin heç vaxt unudulmayan səhifələrindəndir. Anam da, Haşım bəyin qızı Nuriyyə xanım da danışardılar ki, yazdığı bu şeirə və bir neçə başqa şeirlərinə görə Haşım bəy Saqibə çox təzyiqlər olmuş, lakin şair öz əqidəsinə sadiq qalmış, zəmanəsinin və xalqının dərdlərinə əsərlərində yer verməkdə davam etmişdir.

“Divan”la yaxından tanışlıqdan belə qənaətə gəlmək olur ki, öz sələflərinin ənənəsini zənginləşdirən Haşım bəy Saqib yarım əsrə yaxın bir zaman kəsiyində ədəbiyyata yeni poetik düşüncə və nəfəs gətirmişdir.

Şairin, yazıçının fitri istedaddan savayı mütləq savadı olmalıdır. Yəni, dünya ədəbiyyatının ən yaxşı nümunələrinə bələd olmalı, daha dəqiq desək, yazdığından çox mütaliə etməlidir, böyük mədəniyyətə sahib olmalıdır. Haşım bəyin əsərlərindən aldığımız təəssüratlar deməyə əsas verir ki, o, cəmiyyətə baxışları, xasiyyəti, əməli ilə əsil-nəcabətinə layiq olan, savadlı, eyni zamanda son dərəcə mədəni bir şəxs idi. O, bolşeviklər hakimiyyətə gəldikdən sonra “bəy nəslindəndir” deyə ona xor baxan, cəmiyyətdə sözü keçən ziyalıların hər addımını izləyən, “ədəbiyyat yalnız bolşevik ideyasına xidmət etməlidir” fikrini zorla yeritməyə çalışanlara münasibətini şeirlərində ifadə edirdi.

Haşım bəy Saqib sözü sözdən seçən, hər kəlmənin uca məqamını dəyərləndirən ustad idi. Müasirləri mötəbər şeir məclislərində dəfələrlə onun hazırcavablığının şahidi olublar.

Anam İzzət xanım Haşım bəy Saqibin qardaşı Kərim bəyin ortancıl qızı idi. Babam da kəndin hörmətli adamlarından idi. O, dini təhsil görmüşdü, ərəb fars, türk, rus dillərini mükəmməl bilirdi. Bu xalqların ədəbiyyatına dərindən bələd idi.

Haşım bəy muğamı, onun incəliklərini çox gözəl bilirdi. Təsadüfi deyil ki, görkəmli tarzən Mirzə Fərəcin sənətkarlığını, ifa tərzini yüksək qiymətləndirən Haşım bəy evində tez-tez muğam-şeir məclisləri qurar və bu məclislərdən xüsusi zövq alarmış. "Divan"da yer alan, Mirzə Fərəcin vəfatı münasibəti ilə ona ithaf etdiyi şeir Haşım bəyin sənətə və sənətkara verdiyi yüksək qiymətin təzahürüdür.

Kəndin ağsaqqallarından sayılan İsa kişi danışardı ki, 1930-cu ildə Buzovna kəndində atam Əliabasla anam İzzət xanımın toy məclisi üç gün-üç gecə davam edib. Həmin toy məclisində Bakının və ətraf kəndlərin sayılıb-seçilən adamları, o cümlədən Haşım bəy Saqib, Məşədi Azər, Səməd Mənsur, Hacı Dadaş Qaib kimi şairlər iştirak etmişlər. Şahidlərin dediyinə görə, xanəndə Cabbar Qayağdıoğlu "Bayatı-Qacar" və "Mənsuriyyə" muğamlarını oxuyanda Haşım bəy Saqib göz yaşlarını saxlaya bilmir. Bunu görən xanəndə ayağa qalxır, onun üz-gözündən öpür. Sonradan Haşım bəy bu hadisədən təsirlənərək böyük muğam ustadına – Cabbar Qaryağdıoğluna bir qəzəl həsr edir.

Anam İzzət xanım atası Kərim bəyin və əmisi Haşım bəy Saqibin istirahətlərini ovda keçirmələri haqqında ağız dolusu danışardı. Bir qayda olaraq onlar ova şair Əbdülhəmid Mina və milyonçu-mesenat Şəmsi bəy Əsədullayevlə getməyə üstünlük verər və ovdan sonra Buzonadakı malikanələrində məclis qurardılar.

Haşım bəy Saqibin babası Əliyar bəy də, şeir və sənət hamisi idi. Bir dəfə Əliyar bəy şamaxılı Mahmud ağa ilə birlikdə "Beytüs-səfa" şeir məclisinin qonağı olmuş fransız yazıçısı Aleksandr Dümanın Bakıya gəldiyini eşidir. Dərhal Aleksandr Dümanı evinə dəvət edir, Buzovnadakı mülkündə bir neçə gün qonaq saxlayır, şərəfinə ziyafətlər verir, şeir-muğam məclisləri təşkil edir. Düma Əliyar bəydən minnətdarlıqla ayrılır, yerli şairlərin, peşəkar muğam ustalarının ifalarından məmnun qaldığını dilə gətirir. Əliyar bəyin ənənələrini sonralar Haşım bəy, Ağa bəy və mənim babam Kərim bəy ləyaqətlə davam etdirmişlər.

Bir faktı da qeyd edim ki, Bakıda olarkən görkəmli rus şərqşünası Berezin 1837-ci ildə nəşr olunmuş "Qafqaza səyahət" adlı kitabında da Buzovnada Əliyar bəyin qonağı olmasından, onun evində şeir-musiqi məclislərində iştirakından bəhs edir.

Əslində həmin nəslin kökləri çox uzaqlara gedir. Belə ki, Haşım bəyin atası Hacıbəy Heybətbəyovlar nəsli Buzovna kəndində ziyalı və xeyriyyəçi kimi tanınırdı. Həmin dövrdə onların xoş sorağı Türkiyə, İsveçrə, Fransa və Almaniyadan gəlirdi. Onlar Bakı xanlarının sarayına yaxınlığı ilə tanınır, həmçinin içərişəhərli Mansurovlar, Mirbabayevlər, Əsədullayevlər, Muxtarovlar ailəsi ilə dostluq edirdilər. Bütün bunları ona görə vurğulayıram ki, XX əsrin əvvəllərində Bakının inkişafı, yuxarıda adı çəkilən Bakı milyonçularının bu istiqamətdə gördüyü iri həcmli işlər, Abşeronun ab-havası, İslam ənənələrini daim uca tutan Bakı kəndlərində keçirilən poeziya, muğam və təziyə məclisləri şairin yaradıcılığına öz təsirini göstərmişdi.

Anamın dediyinə görə, 1931-ci ildə təkcə Heybətbəyovlar və Səmədzadələr nəslini deyil, Buzovnanı və Bakının ətraf kəndlərini acı xəbər sarsıtdı. Ömrünün 61-ci ilində Haşım bəy Saqib vaxtsız vəfat etdi. Şairin yas məclisinə Bakı, Buxara, Şəki, Dərbənd,

Təbriz, Lənkəran, Şuşa, Səmərqənd şəhərlərindən din xadimləri, şair və ədiblər gəlmişdilər. Bütün yas məclislərində “Quran”ı şairin yaxın dostu, Əliağa Vahidin də ustadı olmuş Məşədi Azər oxumuşdur.

Haşım bəyin qızı Nəcibə xanım da Azərbaycanın teatr və kino sənətində özünəməxsus iz qoyub. Bu gün də Nəcibə Məlikovanın adı teatr-kino xadimləri sırasında hörmətlə çəkilir. Yaxşı xatirimdədir, onlar bizim bağa tez-tez gələr, keçmişin şirin xatirələrindən, ata-babalarımızın sənətə məhəbbətindən, sənətkara hörmətindən ürək dolusu danışardılar.

Etiraf etmək istərdim ki, dövrünün qüdrətli söz ustadı, müqtədir şair, “Məcməüş-şüəra” ədəbi məclisinin üzvü, xeyriyyəçi Haşım bəy Saqibin əsərləri sovet dövründə demək olar ki, nəşr olunmamışdı. Bu biganəliyi ilk dəfə Rəhimağa İmaməliyev aradan qaldırdı. O, 1996-cı ildə “Boz oğuz” nəşriyyatında Haşım bəy Saqibin şeirlərindən ibarət “Kİm-kimədir” adlı kitabı nəşr etdirdi. Lakin bu kitab  Haşım bəy Saqibin yaradıcılığının çox az bir hissəsini əhatə edirdi.

Nəhayət, Haşım bəy Saqibin əsərlərini Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi işçisi Hacı Mustafa Əliyev bir yerə toplayaraq klassik “Divan” üslubunda tərtib etdi. Ümumiyyətlə, AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun mədəni irsimizin qorunmasında rolu müstəsnadır.

Qeyd edim ki, Hacı Mustafa Əliyev şair-qəzəlxan, füzulişünas-alim,  klassik ədəbiyyatımızın və muğamlarımızın gözəl bilicisi, unudulmaz dostum Hacı Mail Əliyevin oğludur. Atalar misalı var: ”Ot kökü üstündə bitər”.

Mən belə bir gözəl əsərin araya-ərsəyə gəlməsinə görə kitaba əmək sərf edən hər bir kəsi təbrik edir və öz  dərin təşəkkürümü bildirirəm. Milli mədəniyyətlərə qloballaşma, xarici amillərin təsirinin gücləndiyi bir şəraitdə milli-mənəvi dəyərlərimizi qoruyan insanlara hər zaman minnətdar olmalıyıq.

Sanki şair “Qalmaz” rədifli qəzəlinin son beytini bu günü görərək yazmışdır:

Təng olsa cəhan mülki sana, səbr elə, Saqib,
Dut fəqrü fənani, kişi təşvişdə qalmaz.

Ziyad Səmədzadə
akademik

# ÖN SÖZ

Qədim və zəngin tarixə malik Azərbaycan ədəbiyyatının inkişafında və xalqımızın mədəni həyatında ədəbi məclislərin çox böyük rolu olmuşdur. XII yüzillikdə Eldəgizlərin, Şirvanşahların, XVI yüzillikdə Şah İsmayıl Xətainin sarayında dövrün görkəmli sənətkarlarının toplandığı ədəbi məclislər mədəniyyət tarixinə düşmüşdür.

XIX yüzillik ədəbi məclislər tarixində, belə demək mümkünsə, intibah dövrü sayıla bilər. Həmin yüzillikdə Tiflisdə Mirzə Şəfi Vazehin və Gəncədə Mirzə Mehdi Nacinin başçılıq etdikləri "Divani-hikmət", əsrin 30-cu illərində Qubada A.A. Bakıxanovun rəhbərliyi ilə "Gülüstan", yüzilliyin ortalarından etibarən Ordubadda Hacağa Fəqirin, onun vəfatından sonra isə M. Sidqinin başçılığı ilə "Əncümənüş-şüəra", 1850-1900-cu illərdə Lənkəranda Mirzə İsmayıl Qasirin rəhbərlik etdiyi "Fövcül-füsəha", 1867-ci ildən Şamaxıda əvvəlcə Seyid Əzimin, sonra isə Molla Ağa Bixudun başçılığı ilə "Beytüs-səfa", 1864-cü ildən Şuşada əvvəlcə Hacı Abbas Agəhin, daha sonra X.B. Natəvanın rəhbərlik etdikləri "Məclisi-üns", 1872-ci ildə Mir Möhsün Nəvvabın təşəbbüsü ilə yaradılmış "Məclisi-fəramuşan" və nəhayət, əsrin 60-cı illərində Bakıda Məhəmmədağa Cürminin rəhbərliyi ilə "Məcməüş-şüəra" kimi ədəbi məclislər fəaliyyət göstərmişdir. Qeyd edək ki, klassik irsin öyrənilməsində, söz sənətinin xalq arasında təbliğ olunmasında, həmçinin yeni-yeni istedadların üzə çıxmasında ədəbi məclislərin böyük əhəmiyyəti olmuşdur. Bu ədəbi məclislərin iştirakçılarının əksəriyyəti əsasən Füzuli ədəbi məktəbinə mənsub olmuşlar. Onlardan bir çoxu öz yaradıcılığında nəzirələrə daha çox yer ayırsalar da, hər biri özünəməxsus bədii ifadə tərzi, sözü və dəst-xətti ilə seçilmişdir. Məclis şairlərinin çoxu klassik ədəbiyyatın görkəmli nümayəndələri səviyyəsinə yüksəlməsələr də, onlar klassik ədəbi janrların əksəriyyətində qələmlərini sınamış, ədəbi prosesin gedişində bu və ya digər dərəcədə iştirak etmişlər.

XIX əsrin ikinci yarısından XX yüzilliyin 20-ci illərinə kimi mövcud olmuş "Məcməüş-şüəra" ədəbi məclisi təqribən yarım əsrdən çox fəaliyyəti dövründə bir çox nüfuzlu, qüdrətli şairlər yetirmişdir. Məhəmmədağa Cürmidən sonra Məşədi Azərin sədr olduğu bu ədəbi məclis eyni zamanda muğam, musiqi ocağı kimi təkcə Bakı və Abşeronda deyil, Şamaxı, Şuşa, Dərbənd, Lənkəran, Təbriz şəhərlərində də tanınmış, onun ayrı-ayrı üzvləri həmin şəhərlərdəki ədəbi məclislərlə əlaqə saxlamışlar. Təsadüfi deyil ki, "Məcməüş-şüəra" üzvü Haşım bəy Saqib "Məclisi-üns"ü təşkil edənlərdən biri Mirzə Rəhim Fəna ilə yaxından dostluq etmiş, onun vəfatından çox kədərlənmiş, bu münasibətlə şeir yazmışdır:

Bivəfadür bu cəhan əhli, bütün mafiha,
Ey könül, eyləmə bir zərrəcə meyli-dünya.

Qəmə aludə ikən, gəldi genə qəm xəbəri,
Qapumi açdı xəbər verdi mana badi-səba.

Səfəri-axirətün dutdı yolın, fəryad et,
Ney kimi şamü səhər Mirzə Rəhim, yə`ni Fəna...

Həmin illərdə Ağakərim Salik, Əbdülxalıq Yusif, Əbdülxalıq Cənnəti, Məşədi Azər Buzovnalı, Ruhulla Qafil, Əbdülhəmid Mina, Məhəmmədağa Cürmi, Mikayıl Seydi, Qüdrətəli Qüdrət, Ağadadaş Müniri, Ağadadaş Sürəyya, Hacı Dadaş Qaib, Məhəmməd İsmayıl Asi, Mirzağa Dilxun və digər şairlərin əsərləri geniş oxucu kütləsi içərisində dərin rəğbət qazanmış, sevilə-sevilə oxunmuşdur. Məhz o dövrdə məşhurlaşanlardan biri də Haşım bəy Saqib olmuşdur.

Haşım bəy Hacı bəy oğlu Heybətbəyov 1870-ci ildə Bakının Buzovna kəndində tacir ailəsində dünyaya gəlmişdir. Yeri gəlmişkən, Heybətbəyovlar təkcə Buzovnanın deyil, eyni zamanda Bakının ən məşhur və qədim nəsillərindən biridir. Haşım bəy bir şeirində özü barədə belə deyir:

...Kişiyəm, türkdür əslim, nə farsam nə ərəb,
Əgərəm baş nə şəhü xanə, nə də ağayə.

Nokərəm türkə, təmizlikdə onun qanı hələ,
Salmayubdur özini rəngə, çıxub arayə.

Namımız Haşimdür, leyk təxəllüs Saqib,
Bildirübdür özin ədna ilə, həm ə`layə...

Məlum olduğu kimi, klassiklər dərin mənalı təxəllüslər seçməyə böyük əhəmiyyət vermişlər. Haşım bəyin təxəllüsü də bu baxımdan istisna deyildir. Belə ki, bir mənası "nüfuz edən, yarıb keçən", digər mənası isə "çox parlaq, çox nurlu" olan "Saqib" təxəllüsü Haşım bəy şəxsiyyətinə, Haşım bəy isə öz təxəllüsünə layiq bir şair olmuşdur.

Haşım bəy Saqibin atası Hacı bəy Heybət bəy oğlu Bakıda, Dərbənddə, Petrovsk-portda (Mahaçqalada) və Səmərqənddə ticarət mərkəzləri ilə əlaqə yaratmışdı. Haşım bəy gənc yaşlarından, xüsusilə atasının vəfatından sonra həmin şəhərlərdəki ticarət kontorlarının sahibi olmuş, hətta bir çox xarici ölkələrdə olan ticarət mərkəzləri ilə sərbəst alış-veriş etmişdir.

Haşım bəy ibtidai təhsilini hərtərəfli savada malik olan atasından, daha sonra atasının dostu və kəndlisi Kərbəlayi Əziz İmaməliyevin öz şəxsi mülkündə təsis etdiyi mədrəsədə almışdır. Məhz bu təhsilin sayəsində ərəb, fars, türk dillərini, Şərq ədəbiyyatını və tarixini, ilahiyyat elmini mükəmməl öyrənmişdir. Deyilənlərə görə, Haşım bəy Saqib iti hafizəsi və yüksək qavrama qabiliyyəti nəticəsində hətta özbək-cığatay, rus dillərini və ədəbiyyatını da mükəmməl surətdə öyrənmişdir.

Təhsil aldığı illərdə atasına ticarət işlərində kömək etməyə başlamış, ilk şeirlərini də həmin dövrdə yazmış, sonralar "Məcməüş-şüəra" mühitində bir şair kimi püxtələşmiş və "Saqib" təxəllüsü ilə tanınmışdır. Şübhəsiz, onun bir şair kimi yetişməsində ilk növbədə Buzovna ədəbi mühitinin və Məşədi Azər Buzovnalının, sonralar isə Əbdülxalıq Cənnəti, Əbdülxalıq Yusif kimi şairlərin böyük təsiri olmuşdur. Ümumiyyətlə, Bakı kəndlərinin həmişə özünəməxsus ədəbi, mədəni və dini mühiti olmuşdur. Buzovna kəndi də bu cəhətdən istisna deyil. Bu kənddən Əliağa Şərqi, Məhəmməd İsmayıl Asi, Hacıdadaş Qaib, Qüdrətəli Qüdrət, Ağasəlim Fədayi, Məşədi Azər və b. kimi məşhur şairlər, Şeyx Kamiyab, Şeyx Mirzəli, Axund Şeyx Cavad, Şeyx

Musa və b. kimi böyük din xadimləri çıxmışdır. Haşım bəy Saqib məslək və qələm dostu Məşədi Azər Buzovnalını özünün ustadı saymış, bir çox şeirlərində onunla fəxr etdiyini və ona hədsiz minnətdarlığını bildirmişdir:

Saqib, cəhanə fəxr elə, ustadi-şe`rsən,
Tə`lim aldun Azəri-alicənabdən.

Və ya,

Çox təəccüb etmə, Saqib, mən qəzəl ustadiyəm,
Aləmə fəxr eylərəm, ustad Azərdür mana.

Başqa bir yerdə deyir:

Təfaxür Azər ilə eylə, Saqib, Azəristandə,
Təməllüq rəngi yox məndə, qəzəl təxtində sultandur...

Saqib həmçinin böyük ustad şair Əbdülxalıq Yusiflə də həm möhkəm dost olmuş, həm də onu özünə müəllim və ustad bilmişdir. Qəzəllərində Yusifə çox yer vermiş, şeirlərinə nəzirələr yazmış, yeri gəldikcə ona öz ehtiramını və minnətdarlığını bildirmişdir:

Saqib, gər istəsön qəzəlün tərhini nədür,
Hər ləhzə şe`ri-Yusifi-alicənabə bax.

Və ya,

...Yusif qəzəlin al nəzərə şe`ri yazanda,
Saqib, bu sana fəxr, süxəndanlığun artar.

...Dedim: Saqib, neçün şe`rün belə peyvəstə şürbidür,
Dedi: Yusif kimi ustadə dərban oldığımdandur.

...Şe`ri kəsb eylədi Saqib rəvişi-Yusifdən,
O səbəbdən qəzəli lə`l kimi kandədür.

...Bica demüb bu şe`ri şirinkəlam Yusif:
"Ya fındığa dügün vır, ya qandur əhli-qalə"...

Yaş fərqinə baxmayaraq, Haşım bəy Saqib dövrünün bir çox ədib, şair və ziyalıları ilə – Səməd Mənsur, Əlabbas Müznib, Mikayıl Müşfiq, Əlağa Vahid, Orucov qardaşları, sənət və musiqi aləmindən Sidqi Ruhulla, Hüseynqulu Sarabski, Mirzağa Əliyev, Mirzə Mənsur Mənsurov, Mirzə Fərəc, Qurban Pirimov, Cabbar Qaryağdıoğlu ilə səmimi dostluq etmişdir. Onların bir çoxu ilə yaradıcılıq münasibətində olmuş, şeirlərinə nəzirə yazmış, bəzilərinə şeir həsr etmişdir. Səməd Mənsurun məşhur "Rəngdir", Əlağa

Vahidin "Dəlidir" rədifli qəzəllərinə nəzirələri və s. bunlara misal ola bilər. Məşhur tarzən Mirzə Fərəcin vəfatı münasibətılə yazdığı şeir onun nə qədər musiqi həvəskarı və muğam bilicisi olduğunu göstərməklə yanaşı, dostluqda möhkəm olmasına da bariz nümunədir:

Genə dövran sitəmi musiqiyə çəkdi Həsar,
Dutdı matəm eləyüb çaki-giriban Qətar,
Nitqdən düşdi cərəs, ağladı çəngü neyü tar,
Yardən gizlədüb ayinəsini ayinədar,
Tökdi əfşan yüzə giysulərini ol məhrüxsar,
Saqinün sağər əlində eləyür əşk nisar,
Dedim, ey saqi, əmandur, genə aləmdə nə var,
Verməyürsən meyi, öldürdi məni rənci-xumar,
Sağəri vırdi yerə sölədi, get, ol huşyar,
Fərəcün canını səyyadi-əcəl etdi şikar.

Yadə düşməz dəxi nə Şur, nə bir də Şəhnaz,
Pərdədən xaric olub rəsmi-Bəyati-Şiraz,
Əldə dəf xəstə müğənni eləməz əzmi-Hicaz,
Verdi səccadə meyə, tərk elədi razü niyaz,
Çıxdı mehrabdən hər zahid edüb tərki-nəmaz,
Salmayur yadinə hərgiz dəxi Məhmudi Əyaz,
Dəxi, heyhat, görə misli-Fərəc vəqti-diraz,
Yerü gög cüft ola, almaz əlinə tar nə saz,
Kim ilən fəxr edəcəkdür genə ol çərxi-fəraz,
Azəri kişvərini eylədi ənduhə düçar...

Haşım bəy Saqib Azərbaycan dövri mətbuatında da çıxış etmiş, "Yeni yol" qəzeti və "Maarif və mədəniyyət" jurnalı ilə əməkdaşlıq etmişdir. 1914-cü ildə "İqbal", 1924-cü ildə isə "Qızıl qələm" qəzetlərində şeirləri dərc edilmişdir.

Haşım bəy Saqib eyni zamanda xeyriyyəçi, maarifpərvər bir şəxs olmuşdur. Buzovnadakı şəxsi mülkündə təmənnasız savad kursları açmış, kəndlilərinə ərəb, fars, türk, rus dilləri və ədəbiyyatından, Qur`ani-kərimdən, habelə klassik ədəbiyyatdan dərs demişdir. Bu vacib və xeyirxah işə həyat yoldaşı Xoşsima xanımı da cəlb etmişdir. Xeyriyyəçi şairin maarifpərvərliyindən danışarkən bir faktı da qeyd edək ki, milli mətbuatımızın və nəşriyyatımızın təşəkkül tapmasında Haşım bəy Saqib qaynı Ruhulla Axundova maddi və mənəvi köməklik göstərmişdir. Xalqın maariflənməsinə və təhsilə çox önəm verən şair "Məarif söyləyir..." adlı şeirində deyir:

Məarif söyləyür, insan get ol, gəl,
Cəhalət söyləyür, nadan ol, gəl.

Məarif söyləyür, mövhumdən qaç,
Cəhalət yox deyür, mövhumə göz aç.

Məarif eyləyür insanı kamil,
Cəhalət məhv edüb yüz min qəbayil.

Məarif sərbəsər ruhi-rəvandur,
Cəhalət sərbəsər adı ziyandur.

Məarif xeyr işə eylər dəlalət,
Cəhalət göstərür rahi-zəlalət.

Məarif kimi aləmdə fən olmaz,
Cəhalət kimi heç düşmən olmaz...

Haşım bəy Saqib 1931-ci ilin dekabrında qəflətən vəfat etmişdir. Məzarı Bibiheybət qəbiristanlığındadır.

* * *

Haşım bəy Saqibin adına ilk dəfə olaraq, 1960-cı ildə nəşr olunan "Azərbaycan ədəbiyyatı tarixi" kitabında rast gəlirik. Həmin kitabda "Məcməüş-şüəra" ədəbi məclisinin bir üzvü kimi adı çəkilir və doğum tarixi 1868-ci il göstərilir.

Haşım bəy Saqibin bədii irsi ötən əsrin 80-cı illərindən nəşr edilməyə başlamışdır. 1981-ci ildə mərhum şair və ədəbiyyatşünas Cəfər Rəmzinin böyük zəhmətlə toplayıb tərtib etdiyi "Deyilən söz yadigardır" ("Yazıçı", 1981) kitabının I nəşrində Saqibin 20 qəzəli və hər biri dörd misralıq 2 şeiri, 1987-ci ildə həmin kitabın II nəşrində isə 2 qəzəli, 1 məsnəvisi çap edilmişdir. Daha sonra mərhum tədqiqatçı-filoloq Məmməd Nuru oğlunun nəşr etdirdiyi "Azərbaycan qəzəlləri" (Azərnəşr, 1991) kitabında şairin 2 qəzəli yer almışdır. Mərhum tədqiqatçı-alim Nəsrəddin Qarayevin tərtib etdiyi "Poetik məclislər" ("Yazıçı", 1987) kitabında da Haşım bəy Saqib haqqında məlumat verilmişdir. Bundan əlavə, 1996-cı ildə Rəhimağa İmaməliyev tərəfindən Saqibin eyni adlı şeiri ilə adlanan "Kim-kimədir" ("Boz Oğuz", 1996) kitabı işıq üzü görmüşdür. Qeyd edək ki, bu kitab Haşım bəy Saqibin adı xatırlanan kitablar sırasında məlumat baxımından daha zənginidir. Bu kitabda Haşım bəy Saqibin şeir və novhələri ilə yanaşı, onun haqqında filologiya elmləri doktoru Ağarəfi Zeynalovun məqaləsi, Saqibin qızı Nuriyyə xanımın xatirələri, akademik Ziyad Səmədzadənin anasının əmisi Haşım bəy Saqib haqqında xatirələri və saqibşünas Cabbar Baxşıyevin yazıları yer almışdır. Tədqiqatçı-alim Axund Hacı Soltan Hüseynqulu oğlunun tərtib etdiyi "Azərbaycan dərvişləri və rövzəxanları" (Bakı, 1995) və "Gizli xəzinələrdən incilər" (Bakı, 2002) kitablarına da Saqibin şeirlərindən nümunələr daxil edilmişdir. Haşım bəy Saqibin həyat və yaradıcılığı haqqında bilgi verən mənbələr sırasında Tomris Babanlının "Haşım bəy Saqib haqqında" (Elm" qəzeti, 21 noyabr 2000-ci il) və AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun əməkdaşı, gənc tədqiqatçı Xatirə Yusifovanın "Haşım bəy Saqib və onun əlyazmaları" ("Elm" qəzeti, 5 aprel 2002-ci il) adlı məqalələrinin də adını çəkmək lazımdır.

Ancaq sadaladığımız kitablarda verilən şeirlər, aydın məsələdir ki, Saqibin çoxşaxəli yaradıcılığını əhatə etmir. Haşım bəy Saqibin əlyazmalarının Azərbaycan Milli Elmlər Akademiyasının Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda saxlandığı haqqında məlumatı ilkin olaraq, Sona Xəyalın 2000-ci ildə nəşr edilən "Əlli yaşlı xəzinədən əlli məqalə" adlı kitabından əldə etdik. Hal-hazırda fondda şairin 9 əlyazması mühafizə olunmaqdadır. Bu əlyazmalardan daha çox diqqət çəkəni D-240 şifrəsi altında saxlanılan, 121 vərəq həcmində olan, 21,5x33,5 sm. ölçülü dəftərdir. Bu əlyazmanın elmi təsvirini ilk dəfə Əlyazmalar İnstitutunun əməkdaşı tədqiqatçı-alim Sona Xəyal vermişdir. Burada mətn müxtəlif rəngli qələmlərlə nəstəliq xətti ilə yazılmışdır. Qəzəllər ardıcıl nömrələnmişdir. Qəzəllərin arasında ara-sıra tərkibbənd, tərcibənd, novhə, rübai kimi şeir nümunələrinə də rast gəlmək mümkündür. Şeirlərin ümumi sayı 479-dur. Əlyazmanın ilk vərəqi bu sözlərlə başlanır: "1347-ci ildə (1929) inşa olunan əşarlar Buzovna kəndinin sakini Haşım bəy Saqib tərəfindən".

Diqqət çəkən əlyazmalardan biri də Fr-173 şifrəli fraqmentdir. 3 dəftər və 62 müxtəlif həcmli vərəqlərdə qəzəl, tərkibbənd və tərcibəndləri toplanmış, adi qələmlə yazılmışdır. Vərəqlərin birində naməlum şəxs tərəfindən Saqibin ölüm tarixi qeyd edilib. Məlumata görə, "Haşım bəy Saqib 1931-ci ildə dekabrın 16-da dəfn olunmuşdur. Təxminən 63 yaşında".

Digər bir nüsxə Fr-948 şifrəli əlyazmadır. Müxtəlif ölçülərdə olan əlyazma 144 vərəqdən ibarətdir. Burada şairin müxtəlif illərdə yazdığı qəzəl, qəsidə, tərkibbənd, tərcibənd, novhə, mərsiyə, 1 məktubu və fars dilində bir sıra qeydləri mövcuddur.

Mənbələrdən biri də B-1454 şifrəsi altında mühafizə olunan əlyazmadır. Ölçüsü 17,5x22 sm., həcmi 14 vərəqdir. Nəstəliq xətti ilə qara mürəkkəblə yazılmış əlyazma sonradan sarı rəngli dəri ilə cildlənmişdir. Bu nüsxəyə 12 bənddən ibarət olan "Müsibəti-övladi-Fatimə (ə)" başlıqlı novhə və 5 digər novhə daxil edilmişdir.

Fr-1149 şifrəli əlyazma bir dəftər vərəqi həcmindədir. Adi qələmlə iki sütunda bir qəzəl yazılmışdır. Fr-1192 şifrəli əlyazmada isə nəstəliq xətti ilə yazılmış bir tərkibbənd vardır.

Səlman Mümtazın arxivindəki (fond 24) s/v 604-də 14x22 sm. ölçülü iki vərəqdə Saqibin bir qəzəli və bir mürəbbesi mövcuddur.

D-357 şifrəsi altında saxlanılan cüngdə 221-225-ci səhifələr arasında 5 qəzəli, Fr-108-də bir dəftər vərəqi həcmində 2 qəzəli saxlanılır.

Bunlardan başqa şəxsi evlərdə də Haşım bəy Saqibə aid əsərlər saxlanılır. Axund Hacı Soltan Hüseynqulu oğlunun şəxsi arxivində qorunan cüng çox dəyərlidir. Aşağısında fabrikin xüsusi möhürü vurulmuş rus kağızında yazılmış cüngün cildi kartondan olub, üzərinə mil-mil parça çəkilmişdir. Qara mürəkkəblə yazılmış 330 səhifədən ibarətdir. 32 şairin, əsasən novhə şairlərinin mərsiyələri toplanmışdır. Son 50-60 səhifə göy rəngli mürəkkəblə yazılmışdır. Xətti şikəstə ünsürlü nəstəliqdir. Burada Saqibin biri farsca olmaqla 22 mərsiyəsi vardır ki, bunlardan da bir çoxu əlimizdə olan nüsxələrdə mövcuddur.

Başqa bir şəxsi arxiv mərhum Aydın Qaradağlının arxividir. Tədqiqatçı-alim, Bakı Dövlət Universitetinin baş müəllimi, filologiya elmləri namizədi Vüqar Qaradağlı tərəfindən bizə təqdim olunan əlyazma Aydın Qaradağlının xətti ilə kiril əlifbasında yazılmışdır. "Hər kəs öz keyfindədir" adlanan bu şeir Rəhimağa İmamverdiyevin tərtib

etdiyi “Kim-kimədir” (“Boz Oğuz”, 1996) adlı kitabdakı şeirlə cüzi fərqləri vardır. Bizdə olan Saqibin avtoqrafı ilə bu nüsxənin arasında olan böyük fərqi nəzərə alıb hər iki variantı “Divan”a daxil etdik.

Digər bir nüsxə Hacı Mailin arxivində olan “Cünuni-əsr mənəm, keçdi növbəti-Məcnun” rədifli qəzəldir. Kiril əlifbası ilə Hacı Mailin xətti ilə müxtəlif şairlərin şeirləri toplanmış dəftərə yazılmışdır. Bizdə olan nüsxə ilə cüzi fərqi vardır. Həmin dəftərdə Hacı Mail Haşım bəy Saqibə aid bir neçə beyti “laədri” (müəllifi məlum olmayan) imzası ilə vermişdir.

Sadalanan bu əlyazmalarda şairin Azərbaycan və fars dillərində klassik ədəbiyyatın müxtəlif janrlarında yazdığı əsərləri toplanmışdır. Burada qəzəl, qəsidə, müxəmməs, təxmis, tərkibbənd, tərcibənd, rübai, novhə, qitə, saqinamə və sair şeir nümunələrinə rast gəlmək mümkündür.

Əsər üzərində işlədiyimiz zaman bütün bu şeir nümunələrinin klassik divan ədəbiyyatı üslubunda yazıldığını nəzərə alaraq Saqibin “Divan”ını tərtib etməyi qərara aldıq. Əvvəlcə qəzəlləri əski əlifbanın qaydalarına müvafiq olaraq sıraladıq. Sonra isə digər şeir növlərini ardıcıllıqla “Divan”a daxil etdik. Fikrimizcə, şairin özünün də nə vaxtsa əsərlərini “Divan” halında görmək arzusu olmuşdur. Lakin keşməkeşli zəmanə onu bu fikrini həyata keçirməyə qoymamışdır. Qəzəllərindən birində şair bir “mişkin qələm”in gəlib bu işi görəcəyinə ümid bəslədiyini yazır:

Əş`ar cəm`in etmək içün qorxma, Saqiba,
Təşvişə düşmə zərrəcə, mişkin qələm gəlür.

Haşım bəy Saqibin poeziyası zərif duyğular poeziyasıdır, həyata, insana böyük məhəbbətin ifadəsidir, vətənpərvər və humanist bir şairin könül nəğmələridir. Saqib şeiri xalqın sevinci, kədəri, bir sözlə, həyatının bədii əksidir. Bu şeirlər bayatılar kimi təsirli, nağıllar kimi əsrarəngiz, dastanlar kimi təravətlidir.

Saqibin yaradıcılığında qəzəl janrı üstünlük təşkil edir. Bu da təbiidir. Lirikanın mühüm qolu olan bu janr vasitəsilə şair duyğu və düşüncələrini, arzu və istəklərini oxucuya, dinləyiciyə daha tez və daha yığcam çatdırmaq imkanı tapır. Şair klassik şeir növlərinin, xüsusən qəzəlin əleyhinə olanlara cavab olaraq yazır:

Qəzəl zəmani degül, hər yetən deyür, Saqib,
Qulaq verməgilən, dinü dil ver əş`arə.

Haşım bəy Saqibin qəzəlləri son dərəcə sadə, səmimi və anlaşıqlıdır. Təbiiliyi, lirizmi, bədii gözəlliyi ilə qəlblərə yol tapır. Saqibin qəzəlləri dövrünün mənfi aləminin güzgüsüdür, gözəllik və səadət haqqında şairanə duyğuların ifadəsidir.

Saqibin bədii irsində özünəməxsus yer tutan novhələri, əsasən Kərbəla faciəsinə və bu faciənin əsas qəhrəmanı İmam Hüseynə (ə) həsr olunmuşdur. Bu novhələrdə duyulan ah və fəğan şairin kədər və acılarıyla bərabər, eyni zamanda dövrün haqsızlıqlarına etiraz səsidir. Ümumiyyətlə, Vətənini, millətini böyük məhəbbətlə sevən şairin yaradıcılığı boyu kədər, hüzn onu müşayiət edir. Saqib şeirlərində olan bu

hüznlə, sanki dövrünün bütün kədərini öz üzərinə toplayaraq, gözəllik və səadət həsrəti ilə yaşayır.

Geniş oxucu kütləsi üçün nəzərdə tutulan bu kitab hər bir söz xiridarına Haşım bəy Saqib irsi ilə yaxından tanış olmaqda, Saqib şeirini duymaqda, öyrənməkdə yardımçı ola bilər.

Ümid edirik ki, dövrün, rejimin siyasəti ucbatından vaxtilə unudulan, xatırlanmayan cavidan şairimiz Haşım bəy Saqib adına ədəbiyyat dərsliklərində də rast gələcəyik.

Şikayət eyləmə çox, e`tibarımız getdi,
Tələsmə, səbr elə, xoşbəxt bir zəmanə yetər.

**Hacı Mustafa Mailoğlu**

Əgər zatun nihandur, heç nihan etməz əyan peyda,
Əyandur, bəs olubdur ol əyandan asiman peyda.

Əyansan, qabiliyyət yoxdu bu ayinə göstərsün,
Bu zatun göstərür, olmış bu əbruyi-kəman peyda.

Səni Məcnuni-rüsva görməseydi Leyli hüsnində,
Dəmadəm ney kimi eylərdi heç ahü fəğan peyda?

Bir şuxun vermisən eşqin mənə, bu fitnəsindəndür,
Şəbi-hicran gözümdən eyləmiş dəryayi-qan peyda.

Qılanda şanə zülfin ney kimi könlüm fəğan eylər,
Məbada olmasun sərfitneyi-axirzəman peyda.

Gəhi zünnar olur zülfün, gəhi zənciri-divanə,
Gəhi Zöhhak duşində olub əf`i ilan peyda.

Kəsad etmiş cəmali-Yusifi bazari-hüsn içrə,
O gün ki oldı, Saqib, ol büti-namehriban peyda.

* * *

Vəsfi-rüxsarun oxur "leylətül-əsra", əsra,[*]
Göz sərün xəstəsidür, nərgisi-şəhla, şəhla.

Kimdür aləmdə gözəl kim, sora Məcnun-Məcnun,
Deyəcək bu sözi Məcnun genə: Leyla-Leyla.

Demə, Yə`qub, bu qədr hicrdə Yusif-Yusif,
Eylədi eşqi Züleyxanı da rüsva-rüsva.

Ey kəlim, gəl bu məhün kuyinə heyran-heyran,
Ehtiyat eylə, degül vadiyi-Sina, Sina.

Desə Fərhad, nə oldı, hanı Şirin-Şirin,
Bisütun dad eləyür özi bu dünya-dünya.

Getdi əğyar evinə Leyli də xəndan-xəndan,
Dutma, Məcnun, bu qədər daməni-səhra, səhra.

Nə qədr eyləyüm hicran güni nalə-nalə,
Göz yaşım qərq elədi aləmi dərya-dərya.

[*] Məhəmməd Peyğəmbərin (s) meraca getdiyi gecə

Sərhədi-məqsədə, Saqib, nəyin olmaz-olmaz,
Özüvə qılma sitəm boş yerə, bica-bica.

* * *

Hüsn bazarinə çıxma, göz vırar o-bu sana,
Rəşkdən çak eylərəm dil, dursa kim qarşu sana.

Bağə girsön, durma, keç, göstərmə ariz laləyə,
Mən kimi pabənd olur, ey sərvnazım, u sana.

Dutmuş əldə sünbüli-tər min bəla peykanların,
Lafi-həmrəngi uranda ol güli-şəbbu sana.

Rubəru durma, gözəlsən çox, düşərsən heyrətə,
Hüsnüvün ayatını göstərsə gər güzgu sana.

Çin-çin et, sal boynuma, divanələr zənciridür,
Tab qılmazsan, ağırdur bu qəra giysu sana.

Ləblərün fikrilə, zalim, bağrımi qan eyləmə,
Verməgə əğyarə dil, ögrədməsün bədgu sana.

Qıl təhəmmül bari-qəm çəkməkdə, ey dil, naqə tək,
Gəlmə ney tək naləyə, gər açsa möhnət ru sana.

Vermə dil qal əhlinə, axır edər rüsva səni,
Guşeyi-meyxanələrdə olsa həmzanu sana.

Saqiba, e`raz qıl əhli-həsəddən, müxtəsər,
Guşeyi-viranda bəsdür söhbəti-bayqu sana.

* * *

Mübtəla, kaş, olmayeydim, ey kəmanəbru, sana,
Kim verür meyxanədə mənsiz şərab ağu sana.

Badə içdikdən sora, gör, bir nə rəngə düşmisən,
Birbəbir, dur bir müqabil, göstərür güzgu sana.

Etmisən bədməstlik izharını, ey qönçələb,
Min işarə eyləmiş barmaq ilə bu, u sana.

Qədrüvi bil, heyfsən, sındırma gül tək qədrüvi,
Hər yetən meyxanələrdə oldı həmzanu sana.

Badələr sağər içində lə`li-nabun məstidür,
Nəş`əsən başdan-əyağə, bəs degülmi bu sana?

Pərtövi-şəm`ə günəş möhtac olsa, eybdür,
Şəm` gündən pərtöv almış, mən genə bədgu sana.

Ləhzə-ləhzə çak qıldun bu dili-viranəmi,
Xəsm ola, ey tiri-qəmzə, türreyi-giysu sana.

Olmaz hiç səyyadidə ahuni kim, seyd eyləmək,
Ram olmaz, Saqiba, ol dilbəri-bədxu sana.

* * *

Könül, verəndə bu məhvəş şərabi-nab sana,
Al içgilən, desə də xanimanxərab sana.

Ayılma, yıx özüvi, durma xüm əyağından,
Görüm ki, neynəyəcəkdür bu inqilab sana.

Şərabxanədə nisyə şərabə meyl etmə,
Piyalənün yerinə xüm olur hesab sana.

Əzab olmayacaqdur sana qiyamətdə,
Verür bu mahvəşün firqəti əzab sana.

Məni bir ah ilə, qoy, zülfüvi edim əfşan,
Vırar göz, açma yüzün, mahü afitab sana.

Sual eyləmə məndən, nədür mey, ey zahid,
Çətindür, anlamasan,[*] nə verüm cəvab sana.

Cəhandə, get, oxı eşqün risaləsin, Saqib,
Fəqihi-mədrəsə, qoy, açmasun kitab sana.

* * *

Yaraşmaseydi bu qamət, bu gülüzar sana,
Əsir olmaz idim, nə belə düçar sana.

[*] Anlamazsan

Müqabil olmagilən, güzgu oğrayar hüsnün,
Niqabdur, yüzə tök, zülfi-müşki-mar sana.

Qaşun qılıncı da can qəsdin eyləyər, ey məh,
Bu tiri-qəmzədə qalmış hər ixtiyar sana.

Dolanma kuyinə ol sərvqamətün, ey dil,
Olub rəqibə bu məhvəş, dəxi nə var sana.

Nə məqsədün ola könlündə, yetməmiş yerinə,
Əman verərmi məgər çərxi-kəcmədar sana?

Gətürmə xatirə, dildar kuyinə yetərəm,
Şəbi-fəraqdə, bəsdür min ahü zar sana.

Bu ahu gözliyə, Saqib, əgərçi heyransan,
Olan degül, yemə xuni-cigər, şikar sana.

* * *

Eyləməz tə`sir neyçün ahü əfğanlar sana,
Ehtiraz et, açılur çaki-giribanlar sana.

Sərvqədlər vadiyi-heyrətdə sərgərdanidür,
Vəsfi-hüsnündə qul olmaz mahi-Kən`anlar sana.

Üzməsən[*] əğyardən dil zərrəcə, ey səngdil,
Gündə min dəf`ə fəda etsəm əgər canlar sana.

Bilmədim mən, sən haçan seyd eylədün könlüm quşın,
Gör, necə nüsrət verüb bu tiri-müjganlar sana.

Türreyi-pürpiçi-yarə mübtəlasən, ey könül,
Göstərür dami-cünun zülfi-pərişanlar sana.

Bu gözəl rüxsar ilə gülzarə qoyson gər qədəm,
Lalənün bərgin nisar eylər gülistanlar sana.

Etgilən əş`arə diqqət, kimsə irad etməsün,
Afərinlər söləsün[*], Saqib, qəzəlxanlar sana.

* * *

---

Üzməzsən

* Söyləsin

Heç bilmədim kim etdi məni mübtəla sana,
Nadidə eylədim dilü canı fəda sana.

Bir mən əsir olmamışam dami-zülfüvə,
Heyran olubdu, gör, necə şahü gəda sana.

Əğyar yetdi vəslüvə, qan etmə bağrımi,
Sındırma qəlbimi, oturur çox bəha sana.

Ey dil, dolanma kuyinə ol mahparənün,
Peyvəstə yüz verür qəmü dərdü bəla sana.

Lə`lündən aldı kami-dil, ey şux, hər yetən,
Dil qanə döndi kim, deyəcək bivəfa sana.

Ey qan olan könül, bu məhə uyma, əl gətür,
Uymuş rəqibə, eyləməyür e`tina sana.

Giysuyi-zülfi-yarə əsir olmağun yetər,
Bəxti qəra odur, deyə bəxti qəra sana.

Dəsti-təməllüq heç kəsə açma zəmanədə,
Gər kasə-kasə xuni-dil olsa qəza sana.

Halindən olmadun genə agah Saqibün,
Eşqün yolunda oldı əcəb xaki-pa sana.

* * *

Xəlqi-aləm olmasun, ey məh, niyə heyran sana?
Xətm edüb arayişi-hüsni bu gün dövran sana.

Sən elə şirinləbi-məhparəsən, ey sərvqəd,
Can nədür hər bir nəfəsdə olmasun qurban sana.

Müttəsil bu ayü gün seyr eyləyür, bir vəchi var,
Hüsnüvə qılsun təmaşa, xəlqdən pünhan sana.

Hifz qılsun Rəbbim, ey məhvəş, yəman gözdən səni,
Gərçi yetməz, sən elə canansən, nöqsan sana.

Həlqə-həlqə boynuma, gəl sal, əsiri-eşqünəm,
Qönçələb, ağırlıq eylər zülfi-müşkəfşan sana.

Aləmi, ey səngdil, rüsvayi-eşqün etmisən,
Vadiyi-heyrətdə sərgərdan degül böhtan sana.

Dil sana kim versə, Məcnun tək olur rüsvayi-xəlq,
Olmaya heyran, görüm, heç xanəsi viran sana.

Cami-eşqün məstinə çox etmə tə`nə, Saqiba,
Damənü təsbih əldə, kim deyər insan sana.

Daşə etmə səcdəni, əbruyi-yarə səcdə qıl,
Eyləyür izhari-nifrət hər zəman Qur`an sana.

* * *

Olsun, ey gülrüx, fəda bu kişvəri-Azər sana,
Hər gözəllik xətmdü, ey simü bərü dilbər, sana.

Sən elə şirinləbi-məhparə sərvnazsən,
Aləmi heyran edüb, hacət degül zivər sana.

Mən necə eşqündə rüsva olmayum Məcnun kimi,
Afitab etsün məhi-taban dövri-madər sana.

Ey ləbi-canan, öpər hərdəm səni mey sağəri,
Tərbiyət vermiş qucağında məgər şəkkər sana.

Ey yaran bu bağrımi hər ləhzə bir müjgan ilə,
Ögrədib bu zərbi-dəsti, de, haçan xəncər sana?

Könlümi bənd etmisən, ey türreyi-pürpiçü tab,
Verdi bu fitvani yoxsa, əsri-mişki-tər sana.

Məscidi tərk eylə, Saqib, guşeyi-meyxanə dut,
Zahidi-bixud, cəhənnəm, qoy desün kafər sana.

* * *

Həlaldur mana mey, zahida, həram sana,
Acıqlı baxma mana, nəhy edüb imam sana.

Xilafi-şər`dür hər bir işün, bilürsən özün,
Deməzlər müxtəsər, insan, vəssəlam sana.

Ədəblə saqiyi-gülçöhrə badeyi-nabi,
Verür mana, deyür, al iç, mənəm qulam sana.

Keçəndə meykədə səmtindən ehtiyat eylə,
Xərabi-badeyi-nab etməz ehtiram sana.

Məbada guşeyi-meyxanəyə qədəm qoyasan,
Verür səda, meyi içmə, piyalə verüm, cam sana.

Həyati-Xızrı taparsan müdam sən, ey dil,
Ləbindən ol ləbi gülbərg versə kam sana.

Qiyamətün qopar, ey eyləyən məni rüsva,
Bu sərvqədün edə qaməti qiyam sana.

Zəkati-hüsnüvi ver aşiqə, kəmanəbru,
Bu hüsn qalmayacaqdur, inan, müdam sana.

Cəfayi-dəhrdən, ey Saqib, eyləmə fəryad,
Tələsmə, yüz verəcək vəqti-intiqam sana.

* * *

Yaraşmaseydi, pərivəş, bu lə`li-nab sana,
Yaraşmaz idi belə içməgə şərab sana.

Çəməndə laləni yandırdı atəşi-hüsnün,
Necə bərabər olar mahü afitab sana?

Yanar mənim kimi bu oda şəm` pərvanə,
Bu zülf olsa da, ey mahvəş, niqab sana.

Gətürmədün ələ bu könlümi fəraqunda,
Nə eyləsən də məni xanimanxərab sana.

Dolaşma zülfinə, ey dil, bu şuxi-səngdilün,
İlan kimi gecə-gündüz verür əzab sana.

Cəhanə eylə nəzər, vəqt gör nəyi istər,
Verüb nə nəf`i de, zahid, bu boş kitab sana.
Xərabi-badeyi-nabi mey ilə sirab et,
Gərək degülmi məgər, Saqiba, şərab sana?

* * *

Lalə degül bəs nədü arizi-minu sana,
Durmagilən müqabil, göz vıra güzgu sana.

Zülfüvi əfşan elə hüsnüvə, ey sərvqəd,
Rəşk məni öldürür, baxsa gər o, bu sana.

Eyləmə qan bağrımi ləblərüvün yadilə,
Gərçi əsər eyləməz naleyi-yahu sana.

Bağə xuram eylədün, dutdı xəbər bağban,
Verdi şəbaş eylədi, min güli-şəbbu sana.

Öylə pəriçöhrəsən, qul sana Yusif degül,
Heyf, təmaşa edir hər yetən, hər su sana.

Qəmzə oxından sənün eyləməz heç vahimə,
Naz ilə etsön əgər, ram olar ahu sana.

Var yeri nəqqaşə gər canı fəda eyləsəm,
Sanki qılıncdur çəküb, iki xəm əbru sana.

Mən sənün heyranuvam, əl gətür əğyardən,
Heyfsən, həmraz ola qoyma bu bədgu sana.

Vəqt əyağə səni saldı belə, Saqiba,
Tə`nə vırar hər nəfəs, səbr elə, bayqu sana.

* * *

Qoyma sərkeşlik edə nəfsi-dənizadə sana,
Edə sərkeşligi, qoy, bu qədəhü badə sana.

Özüvi xəlqidə, zahid, elədün avarə,
Verdi nə mənfəəti, tərk elə, səccadə sana.

Dolıdur buyi-riya ilə, utan məsciddən,
Həqqün asarı yox orda, dedim, ey adə, sana.

Nə olur bir gələsən, meykədələr ovbaşı,
Künci-meyxanəyə, eylər nələr amadə sana.

Başuvı vırma daşa huriyi-qılmanə görə,
Heç nə yoxdur, görünübdür gecə rö`yadə sana.

Yetişərsən o zəman məqsədə, ey xanəxərab,
Əl uzatdı dutasan, mey kimi üftadə sana.

Saqiba, uyma fəqihün sözinə məsciddə,
Əqlə gəl, əqlə ki, bağlanmadı dünyadə sana.

* * *

Firqətündə ta gecə-gündüz bərabərdür mana,
Sənsiz hər bir saətim aşubi-məhşərdür mana.

Təlx göftarun əzabi-ruhdür, ey sərvqəd,
Kəsmə məndən lütfüvi, candan bu xoştərdür mana.

Tiri-müjganun, gəl, atma, səngdil, can qəsdinə,
Tə`neyi-əğyari-zalim növkü xəncərdür mana.

Əldədür can nəqdi, al, bu qəmzəvün qurbanidür,
Var bu yox, bir can qalıbdur, bu müyəssərdür mana.

Eyləmə azad zülfündən məni-divanəni,
Bu cünun zənciri Məcnundan müqərrərdür mana.

Ey mana hökm eyləyən zahid, mey içmə, tərk qıl,
Yüz verəndə dərdü qəm, qəmxar sağərdür mana.

Çox təəccüb etmə, Saqib, mən qəzəl ustadiyəm,
Aləmə fəxr eylərəm, ustad Azərdür* mana.

* * *

Qəm güni qəmxar yox, cüz saqiyü sağər mana,
Ey gözün qurbanı, saqi, mey peyapey ver mana.

Vadiyi-eşq içrə sərgərdanəm, ey dil, əl gətür,
Ərsəgahi ləng edüb bir səngdil dilbər mana.

Dil əsiri-dami-zülfündür sənün divanə tək,
Oldı sövdayi-cünun, ey Leylivəş, rəhbər mana.

Qaşlarun mehrabi, ey məh, səcdəgahimdür mənim,
Dutmaram yüz Kə`bəyə, xəsm olsa Peyğəmbər mana.

---

* Ustad şair Məşədi Azər Buzovnalıya (1870-1951) işarədir

Bir qiyam ilə qədün yüz min qiyamət göstərür,
Yüz açur heyhat, bir də məhşəri-digər mana.

Ah, neylüm, qərqi-xunabi-sirişkəm hicrdə,
Hər tərəf döndükcə qəm olmış hücumavər mana.

Zahida, meyxanə dut, gəl, vəsfi-cənnət etmə çox,
Dur, gedək cənnət dalıyca, hardadur, göstər mana.

Saqiba, əhsən, fəsahət mülkinün sultanisən,
Yox ləyaqət Sə`diyi-Şiraz ola çakər mana.

* * *

Rubəru ayinəyə durma, degülsən tay ona,
Oğrar əksi-hüsnüvi, ey şux, vermə ray ona.

Arizünlə gül necə həmrənglik lafın vırar?
Rəng bu hüsnündən almış, zərrə yetmiş pay ona.

Qaf tək xəm etməz idi qəddimi, ey sərvqəd,
Qaşlarun ta verməseydi gözlərün fitvay ona.

Dutmaq olmaz, gün dutuldı, düşmə, ey dil, heyrətə,
Durmaseydi gər müqabil naz ilə bu ay ona.

Qətlimə səf-səf düzübdür navəki-müjganların,
Məst olub nəqqaş, çəkmiş, gör, nə əbru yay ona.

Xalə bax, düşmiş necə mabeyni-əbru xaldə,
Biədəb yer tapmıyur, gör, harda olmış cay ona.

Eşq dəryasinə hər kim düşdi, əl çək, qərqdür,
Qıl həzər, divanə könlüm, girmə, yoxdur say ona.

Çöllərə el tə`nəsindən qaçdı Məcnun, Saqiba,
Daməni-səhradə xoşdur naleyi-eyvay ona.

Asəfa[*], ver Nadirə sınmış qəzəl gəhvarəsin,
Guşeyi-viranədə bayqu oxur lay-lay ona.

* * *

[*] Şair Əliheydər Asəf (1874-1930) Haşım bəy Saqibin yaxın dostu, "Məcməüşşüəra" ədəbi məclisinin üzvü olmuşdur.

Şərabi-nabdən insan kimi iç, can olar peyda,
Əgər can olsa peyda, canidən insan olar peyda.

Dağıtma əqlüvi, əl çək, ərəqdən ictinab eylə,
Səni rüsva edər, rüsvadən hər heyvan olar peyda.

Meyi-əngurdən saf olsa, iç meyxanə küncində,
Səbu küncində bəh-bəh qətrəsindən qan olar peyda.

Gədayə vırma tə`nə, əl gətür, ey düşkini-şərbət,
Anı təhqir qılma, əqldən sultan olar peyda.

Özüvi mübtəla çox etmə, zahid, qeydi-təsbihə,
Məgər ondan sana bir zərrəcə iman olar peyda?

Gözəlsən, yox sözüm, beş günlik içün çox də fəxr etmə,
Təfaxür eyləməkçün Yusifə zindan olar peyda.

Təhəyyürdə qalıbdur xəlq kim, Saqib qəzəlgudur,
Nə müşkil əmr ola insan içün asan olar peyda.

* * *

Gəzəndə zülfin içrə şanə eylər müşki-tər peyda,
Dili-divanəm əmma nalə ney tək eyləyər peyda.

Ləbündən kami-dil almaqlığun, ey şux, müşkildür,
Müyəssər müft olmaz, etməsəm xuni-cigər peyda.

Qan etmə bağrımı bir ləhzə dil əğyarə verməkdə,
Həzər qıl ah odından, etməsün ahi-səhər peyda.

Cəhani fitnə dutmuşdur, girürsən gündə bir rəngə,
Kəlimə kim edübdür Turdən nari-şəcər peyda?

Degül zatun nihan, göz yox ki, görsün şəm`i-rüxsarun,
Kim etsün mən kimi görməkligə kəsbi-hünər peyda.

Nə bipayan cəlali-basəfadur səndə kim, vardur,
Qəra toprağdən kim sən tək eylər simübər peyda.

Fəqihün bəzminə yüz dutma, Saqib, badə aludə,
Məbada mey içə təsbih ilə, eylər kədər peyda.

* * *

Mənimçün necə oldı bilmədim bu simübər peyda,
Qoyub qan bağrıma, hər ləhzədə min naz edər peyda.

Gələndə ləblərün göftarə hər dəm, ey kəmanəbru,
Edər Qarun içün gənci-sədəf, dürrü gühər peyda.

Xəcil qıldun üzari-laləni gülzar seyrində,
Kəlimə eylədün bu hüsn ilə nari-şəcər peyda.

Əsüb badi-səba rədd eyləyəndə zülfi-pürçinün,
Yüzündən zahir oldı gah şəmsü gəh qəmər peyda.

Kəman dut, gözlərimdə məskən etsün tiri-müjganun,
Məbada dildə məskən eyləyə, eylər xətər peyda.

Cəmali-Yusifə Yə`qub hərgiz fəxr eyləməzdi,
Əgər olseydi sən tək sərvqəd, gülrüx pəsər peyda.

Qəfəsdə tutini lal eylədi göftari-şirinün,
Edüb Harun bu lə`li-ləblərün qəndü şəkər peyda.

Çətindür, ey pərivəş, bir nəfəs kim, səndən ayrılmaq,
Rüxi-alundən olmış bağ ara gülbərgi-tər peyda.

Nihali-zəhrə versön su əsəldən bağı-cənnətdə,
Həman zəhrün verür, qılmaz dəxi şirin səmər peyda.

Qalubdur xəlqi-aləm vadiyi-heyrətdə sərgərdan,
Qəzəldə, Saqiba, sən etmisən mö`ciz məgər peyda?

* * *

Xəm qaşun tək bari-eşqün eyləmiş qəddim düta,
Qaf qəddin xəm edüb, qəddim nədür, ey məhliqa.

Xəlq təklif eyləyür mən səndən, ey məh, əl çəküm,
Eyləmək asan degül Məcnuni Leyladən cüda.

Eşq bir dəryayidür, kim düşsə, fövrən qərq olur,
Əvvəlü axir yox onda, həddinə yox intəha.

Yanə-yanə eşq rəsmin kəsb qıl pərvanədən,
Kuyi-eşqə getməgə pərvanə tək yox rəhnüma.

Eylə sərməst eylədi Məcnuni-zari cami-eşq,
Bilmədi, başında tikdi ah ilən quşlar yuva.

Eşq odunın zərrəsi bir bərqi-aləmsuzdür,
Hər yerə bir zərrə düşsə, yandırar, eylər fəna.

Cami-eşqün məsti bilməz zərrəcə can qədrini,
Şövq ilə cananinə minnət çəkər, eylər fəda.

Eşq uymaz bu fəqihi-mədrəsə fitvasinə,
Mürşidi-meyxanəyə sərməst eylər iqtida.

Eşqüvün sövdasıdur bu Saqibi rüsva edən,
Türreyi-mişkinüvə etmiş özini mübtəla.

* * *

Dutma, Məcnun, bu qədər daməni-səhra, səhra,
Tökülüb üstüvə möhnət yüki dərya, dərya.

Vergilən fikrüvi bir ləhzə cərəs naləsinə,
Nə deyür, gör nə salub aləmə qovğa, qovğa.

Quş yuva tikdi başunda, genə yoxdur xəbərün,
Getdi əğyar evinə naz ilə Leyla, leyla.

Lə`nət olsun bu kəmanqaşlu məhparələrə,
Yox vəfa, rəhm bularda dəxi əsla, əsla.

Bəsdür, ey dil, elədün nalə şəbi-hicranda,
Özüvi eyləmə bica yerə rüsva, rüsva.

Dedi, gəlləm o pəriçöhrə, öpərsən ləbimi,
Gəlmədi, bir də dəxi gözləmə bica-bica.

Qəmi-hicranə əlac eyləmək olmaz, Saqib,
Verə saqi sana gər badəni mina-mina.

* * *

Baxma beş gündür, olur, ey şux, bu təl`ət fəna,
Çox da aləmlər çəkər rüxsarüvə həsrət fəna.

Səndən ötri mən necə bu dinü dil tərkin edim,
Göz yumub-açuncadur səndə bu xoş surət fəna.

Fəxr edirsən sən bularlan, ey qoyan qan bağrıma,
Qaşü göz əbruyi-kəcdür, xali-hər xilqət fəna.

Şöhrəti hüsn ilə salma aləmə, ey qönçələb,
Ülfət eylə, şöhrət artur, olma heç ülfət fəna.

İzzətün şəxsün zərü sim oldığın fəhm eyləmə,
Fəqrdür izzət, edüb Qaruni boş izzət fəna.

Girəm, etdün aləmi təsxir kəskin tiğ ilən,
Qan tökürsən, sanma olmaz müntəha nüsrət fəna.

Bülhəfəs şəxsiyyətə meyl etmə, uyma nəfsüvə,
Gözləməz səndən şəh olson də, dəxi hörmət fəna.

Sal ələ cəhd etgilən ünsiyyətün sərriştəsin,
Eyləsön həmnöv`üvə ehsan, qoyar qiymət fəna.

Nəfsüvi öldürgilən, gəlməz günahi boynuva,
Sahibi-şöhrət olarsan, eyləyər nifrət fəna.

Bu cəhan mülkində xoş rəftar eylə xəlq ilən,
Səndən alsun hər nəfəs, hər eyndə ibrət fəna.

Laneyi-murü ilandur çeşmi-mərdümküşlərün,
Sürmə ilən rəngə salma, eyləyər diqqət fəna.

* * *

Oldum əsir zülfüvə, ey şuxi-dilrüba,
Mümkin degül bu damdən etmək onı rəha.

Peymanələrdə qan olasan, qan, ey könül,
Sən eylədün bu şuxə məni-zari mübtəla.

Saldım bəlayə başımi divanələr kimi,
Heç bilmədim haçan sən ilə oldum aşina.

Girəm ki, tiri-qəmzön edüb qanımi həlal,
Kam almamış nədür bəs ona, sölə, xunbəha.

Zirü zəbər zəmanə ola, tapmasan* genə,
Bir aşina vücudi məgər varmı, kimiya.

Qaşun qəra olanda nolur, səngdil, məgər,
Çox fəxr etmə, məndə də həm bəxtdür qəra.

Saqib, piyalə alma ələ əhli-qal ilən,
Ərbabi-halə canuvi aləmdə qıl fəda.

* * *

Hərdəm düşəndə zülfüvə, ey şux, piçü tab,
Sən göstərəndə şanəni dil eylər iztirab.

Məxmur gözlərün məni böylə xərab edüb,
Al saqidən xəbər, degüləm badədən xərab.

Oxşatdı xümmi-badə özin lə`li-nabüvə,
Bais odur ki, zahid edər ondan ictinab.

Rüxsarun atəşi məni yandırdı şəm`tək,
Bir ləhzə, bari, türreyi-mişkini qıl niqab.

Sağər toxundı badə içində dodağuva,
Qanı axanda dutdı bu dünyanı inqilab.

Heyrani-hüsnüvə edən olmaz məlaməti,
Vermək olarmı qeyrə dil, ey rəşki-aftab?!

Çeşmündən özgə qanımi hər ləhzə tökməgə,
Kim etdi qeyri qəmzəvü, ey şux, intixab?

Ey dil, çəkincə minnətini hər dənilərün,
Çıx təndən, əl gətür, dəxi çox vermə, gəl, əzab.

Saqib, çağırsa, getməgilən künci-məscidə,
Göndər fəqih qanmaza meyxanədən cəvab.

* * *

* Tapmazsan

Şanə ilə türreyi-mişkinüvə çox vırma tab,
Qalmadı cismimdə tab, ey rəşki-mahü afitab.

Çeşmi-bədməstün məni, ey şux, bədməst eyləmiş,
Mən hərifi-badeyi-meyxanəyəm, yıxmaz şərab.

Bir nəfəs asudeyi-aləm olar, ey qönçələb,
Bu hərir pirahən ilən eyləyəndə nazi-xab.

Etmisən azad könlüm dami-zülfündən neçün,
Mən əsirə sən kimi zalim verür hərdəm əzab.

Çeşmi-mərdümküşlərün aşub salmış aləmə,
Nərgizi-bimar edüb gülzari dutmuş inqilab.

Ey müğənni, mən sana hərdəm təəccüb eylərəm,
Gəl Müxalif tərkin et, can rahətidür bu Rəhab.

Saqiba, bu sərvqəddən hasil olmaz kami-dil,
Söləmə çox bu sözi: "Allahü ə`ləm bissəvab".[*]

* * *

İçmə mey, get, tərk qıl, olmasa gər səndə tab,
Künci-səbuni dutmaz, incisə səndən şərab.

Dövrini qoy eyləsün, incimə, qoy çərxi-dun,
Eyləmə təşviş sən, aləm ola gər xərab.

Fəxr eləmə, eylədim aləmi təsxir mən,
Yox əsəri, hardadur kişvəri-Əfrasiyab.

O, bu mənimdür demə, heç nə degül, bil, sənün,
Həsrəti-xunabədən başqa sana yox cəvab.

Rənc ilə saldun ələ gənc, degül qismətün,
Kim aparar bilməsən,[**] ey dili-alicənab.

Ömri-giranmayəni sərf eləmə boş yerə,
Olmayasan, qıl həzər, mən kimi əhli-əzab.

Nəfsə əsir eylədim var-yoxımı bixəbər,

[*] Ən doğrusunu Allah bilir
[**] Bilməzsən

Bir də əlin məndən heç çəkməyəcək bu tənab.

Sən edənə verməyür fikrini ol çərxi-dun,
Zəhməti-bicayidür, sal ələ yüz inqilab.

Olmayacaq sən sevən, başuvı vırson daşa,
Xəlqə əziyyət rəva görməgilən bihesab.

Eyləmə təşviş çox loğmə içün, Saqiba,
Gənc salursan ələ rənc əlilən bab-bab.

Tökmə yüzün suyini qarə üzüm suyiçün,
İç ürəgün qanıni adıni, get qoy, şərab.

* * *

Cəhan xərab, məni-xanimanxərab xərab,
Əcəb degül eyləyübdür məni şərab xərab.

Məlamət eyləmək olmaz müğənniyə, mütrib
Çalanda naşi kəmançə düşər Rəhab, xərab.

Gözəl zəmanə əyağdən-əyağə düşməz idi,
Əyağə düşməsə idi gər inqilab xərab.

Çətindür həqq sözün qanmağı, degül asan,
Deyürsən hər yetənə sahibi-kitab xərab.

Daşa toxunmaz əyağun gözətsön özüvi gər,
Əyağun altına bax, eyləmə şitab xərab.

Sözüm yox heç sana düzsən ki, eybün heç yoxdur,
Nə etməli ki, verürsən neçün hesab xərab.

Xəyali-həqq eləməglik xəlayiqün işidür,
Sanurla[*] görməyəcəklər dəxi əzab xərab.

Hicab vəhşiligə yol verür, hicab nədür,
Günəş hicabı verür xəlqə iztirab xərab.

Sənün, mənim nə təfavüt məgər var, ey Saqib,
Gərəkdi yaxşı-yəmani bil, nədür niqab xərab.

* * *

[*] Sanırlar

Naz ilə bir qəmzəyə aləmi etdün xərab,
Fitnə dutar aləmi çəkmə yüzündən niqab.

Eyləmərəm meyli-mey saqiyi-gülçöhrədən,
Məst edübdür məni səndəki bu lə`li-nab.

Cənnətə meyl eyləməz arizi-alun görən,
Qoy duta cənnət yolın zahidi-alicənab.

Çıxma gecə yarısı ay kimi bu hüsn ilən,
Aləmi, ey sərvqəd, bir də dutar inqilab.

Zülfüvün əndişəsi eylədi Məcnun məni,
Riştəbəriştə, gör, necə canə düşüb piçü tab.

* * *

Aləm xərabü gərdişi-dövrü zəman xərab,
Bundan bətər oleydi, göreydim, cəhan xərab.

Qan saf olanda, badeyi-safi, get, içgilən,
Saqi, nə hacət içməgə mey bağrıqan xərab.

Künci-qəfəsdə naləni çox etmə, əndəlib,
Gülşən xərab, bərgi-güli-ərğəvan xərab.

Qoy quşları başunda sənün eyləsün yuva,
Məcnun, rəqibə Leyli verüb mumiyan xərab.

Qoydunmı bir nəfəs yetişüm mən muradimə,
Könlüm kimi, fələk, olacaqsan haçan xərab?

Əfsus eyləsəm nə əcəbdür nəfəs-nəfəs,
Tərk oldı yaxşı qaldığı pirü cəvan xərab.

İzhari-əmri-həq biri gər etsə, zahida,
Həqq söləyəndə aləmə etmə bəyan xərab.

Bilsön ki, başə düşürmisən əsl məqsədi,
Bilməkdür olmısan dəxi bixaniman xərab.

Vay haluva ki, bilməməgi bilmişəm desön,

Aləmlərə bütün verəcəksən ziyan xərab.

Asanlıq ilə saliki-rahi-həqiqəti,
Kim bildi, eyləmə həqqi virdi-zəban xərab.

Ta nəqdi-canı dutmayasan əldə, Saqiba,
Yetməsən[*] həqqə, eyləmə hərgiz yəman xərab.

* * *

Rəhi-eşqündə məni eyləmisən xanəxərab,
Tab hicranüvə yox məndə, verürsən çox əzab.

Lə`li-nabun görəni badəpərəst oldum mən,
Yoxsa mən hardan hərdəm eləyim əzmi-şərab.

Durma gözəllərə qarşu, sənə eyb eylərlər,
Səni göstərməz hər ayinə, gər açson da niqab.

Ehtiyacun sənün, ey ayinə, yox ayinəyə,
Baxasan, hanı gözəl sən kimi, ey zülfi tənab.

Nəqs yox bu rüxi-alunda sənün, mahvəşim,
Örtəsən üstüni zinətlə, gözəlsən nayab.

Ümmidür səndə, bu gögçəkligüvə söz yoxdur,
Vəsfi-rüxsarüvi etmiş bizə ol xümmi məab.

Səndə bir nəqs var, ey sərvqədü şirinləb,
Gər desəm, incimə, məndə dəxi yox taqətü tab.

Əhd qıldun mən ilə, verməræm əğyarə könül,
Hanı ol əhd, sorar lə`li-ləbündən o cənab.

Dutacaq çaki-giribanuvi miskin Saqib,
Ey qoyan bağrıma qan, eylə yəqin, ruzi-hesab.

* * *

Saqiya, yıxdı məni, tə`n eləmə, camü şərab,
Sən məni xanəxərab eylədün, ey xanəxərab!

Dutmaz idim rəhi-meyxanə mən, ey şirinləb,

---

[*] Yetməzsən

Ləblərün zövqi dəmadəm mana verdi meyi-nab.

Sən tökəndə yüzə bu zülfi-əbirəfşani,
Şövqdən səhni-gülistanda gəlür rəqsə qürab.

Diri əf`i dolaşub boynuma gördüm yuxıda,
Zülfüvün tarı imiş, eylədilə* tə`biri-xab.

Düzülüb daneyi-xalun ləbün ətrafında,
Deyəsən, dövri-Peyəmbərdə durubdur əshab.

Əksi-rüxsarüvə, qoy, xəlqi təmaşa eləsün,
Qədəğəndür, gözəlim, salma bu rüxsarə niqab.

Dərd bir olsa idi çarəsini eylərdim,
Tə`ni-əğyarə dözüm, ya ki, edim hicrüvə tab?

Tağı-əbruyi-nigarə edərəm mən səcdə,
Daşə vır başuvi, zahid, sənün olsun mehrab.

Şadlıq eyləmə, diqqət gözün aç, eylə nəzər,
Sitəmi-dəhri şikayət eləyür çəngü rübab.

Can deyüb can eşidən olmayacaq aləmdə,
Əhli-insaf vücudi ilə olmuş nayab.

Künci-meyxanədə sərf eyləmiş ömrin Saqib,
Zahid, əl çəkməyəcəksən, dəxi nə həqq-hesab.

* * *

Saqiya, bir mahvəşi-rüxsardür camü şərab,
Zahid ondan eyləyür təsbih əldə ictinab.

Sorma hüsnün vəsfini ayinədən, ey qönçələb,
Harda xəffaşə olur mə`lum qədri-afitab.

Məndən al rüxsari-alun vəsfini kim necədür,
Nazil olmış vəsfi-rüxsarundə, zalim, dörd kitab.

Mən necə əbrulərün tiğindən imdad istəmüm,**
Gəh olur zəncir zülfün, gah əf`i, gah tənab.
Mən necə Məcnun kimi sərgəştə heyran olmayum,
Çeşmi-bədməstün sənün salmış cəhanə inqilab.

---

* Eylədilər
** İstəməyim

Göz-göz etmiş navəki-qəmzön dili-divanəmi,
Böylə tirəfşanlığı ögrənməyüb Əfrasiyab.

Saqiba, heç yerdə yoxdur yer sana, avarəsən,
Vermisən əldən vətən sən, ya günah et, ya səvab.

* * *

Gizləndi xümdə rahəti-ruhi-rəvan şərab,
Əhli-fəsad içməyə bu bağrıqan şərab.

Ey dil, qədəm qoyanda bu meyxanə küncinə,
Qıl ehtiyat, eyləyəcək imtəhan şərab.

Var səndə tab içməgə, nuş et, həlaldür,
Yox tab içməgə, söləmə: verdi ziyan şərab.

Ol həmpiyalə əhli-ədəblə, fərəh verür,
İçdikcə hər nəfəs sana arami-can şərab.

Çox içmə, adət eyləmə, rüsva edər səni,
Səndən, həzər qıl, olmıya ta bədgüman şərab.

Bir özgə halı var içəsən mahi-ru ilən,
Hər sübhü şam anlamaz eldən nihan şərab.

Bir nəfs məndən inciməyüb, saqi şahidim,
İçsəm şərabxanədə ruzü şəban şərab.

Düşməz şərab tərki mana, zahid, əl gətür,
Etsə nə qədr gər məni bixaniman şərab.

Azad eyləyür məni ənduhü qüssədən,
Saqib, bu mahruyilən içsəm haçan şərab.

* * *

Zahid əgər bileydi nədür rütbeyi-şərab,
Təsbihə vırmaz idi əl, eylərdi ictinab.

Sufi meyi həram oxıdı, vəchi var onun,
Oxşatdı mey özin ləbüvə, oldı mey xərab.

Yaxşı-yəman fərqin bilərsən sən ol zəman,
Tədbir üzilə gər çəkəsən tiği-inqilab.

Bir göz yumub-açınca dutar fitnə aləmi,
Xəlqün ümurinə edəsən naşi intixab.

Bilsön ki, var sənün kimi bir sərvqamətim,
Heyrətdə qalsun, aç yüzini, mahü afitab.

* * *

Kim söləməz bu arizün, ey şuxi-məhniqab,
Od vırdı hüsni-laləyə bağrın edüb kəbab.

Sən eylə sərvnazü pəriçöhrə şuxsən,
Şahid kim istəsə edər iqrar dört kitab.

Davuddən Zəburdür, İncil Məsihidən,
Yox şübhə, bu gözəlligüvi etmiş intixab.

Qur`andə Mühəmməd(s) oxur vəsfi-hüsnüvi,
Tövratdə Kəlimə salursan min iztirab.

Şanə vıranda türreyi-pürpiçü tabuvə,
Uydım cünunə, könlüm evin eylədün xərab.

Hər bir gözündə zahir olur bir cəhan bəla,
Xalü xətündə tə`biyədür əksi-inqilab.

Durmış nizamə tiri-müjön qətli-am içün,
Etməz bu tirə sineyi-Əfrasiyab tab.

Qıldun əsir zülfüvə divanə könlümi,
Bəsdür, qaşun qılınci ilə vermə çox əzab.

Keçdi bəhar fəsli, mey içmək həramdür,
Saqib, günahdür, dəxi meyl eyləmə şərab.

* * *

Neyləyürsən, səndə yox iman, imandur ədəb,
Ayə-ayə baxgilən Qur`anə, Qur`andur ədəb.

Qatilün şeytan olur, olson ədəbdən bixəbər,
Getsə canun, kəsb qıl, cəlladi-şeytandur ədəb.

Biədəbdən gözləmə insanlığun arayişin,
Olma nəfsün düşkini, bil əsl insandur ədəb.

Kafəristan kişvərin fəth etmək olmaz tiğ ilən,
Zərrəcə gər var əlündə, kafəristandur ədəb.

Ey təfaxür eyləyən, mən aləmün sultaniyəm,
Biədəbsən, çox təfaxür etmə, sultandur ədəb.

Biədəbdən fərq yox heyvanlığun, ey biədəb,
Saliki-rahi-həqiqət, şahi-mərdandur ədəb.

Ey soran Allah nədür, gəl, göstərüm Allahı mən,
Yoxlığı var eyləyən, Allahi-Rəhmandur ədəb.

Xətm olunmazdı nübüvvət Xatəmi-peyğəmbərə,
Rütbeyi-xatəmligə sərmayə mizandur ədəb.

Cami-vəhdət badəsindən Saqibi məst eyləmiş,
Ruhdür başdan-əyağə, rahəti-candur ədəb.

* * *

Etmə əfşan zülfüvi rüxsarüvə, ey qönçələb,
Ləblərün dövrində həlqə vırmasun ol biədəb.

Nə qiyamət vardur bilməz dili-divanədə,
Məskən etmiş ləblərün küncində daim ruzü şəb.

Verməmək olmaz könül sən kimi laləarizə,
Olmadım rüsvayi-eşqün, ey pərivəş, bisəbəb.

Gəldi aləmlər təmaşa etməgə rüxsarüvə,
Mən də gəldim, aç yüzün, zalim, nə hacətdür qəzəb.

Dutmason can nəqdi əldə, getmə yarun kuyinə,
Etmək olmaz gənci, ey dil, rəncisiz hərgiz tələb.

Kim ola eşq aləmindən bixəbər, insan degül,
Heç nəyə lazim degül, ondan gözəlraqdür hətəb.

Vəqt istər gör nə səndən, Saqiba, dut damənin,
Əldə dut can nəqdini, ya türk ol, ya ol ərəb.

* * *

Keçməsön candan, könül, heç eyləmə canan tələb,
Yetməsən[*] canana hərgiz, eyləsön gər can tələb.

Tökmə qanın, möhtəsib, meyxanələrdə sağərün,
Vəqt olur kim, səndən eylər sahibi-qan, qan tələb.

Gör, nə istər vəqt səndən, verməgə amadə ol,
Verməsön, dərd alsa canun, eyləmə dərman tələb.

Hazır ol, türk oğlısan, yatma, vətən imdadinə,
Əldə dut can nəqdin, eylə tiği-xunəfşan tələb.

Getdi səndən gör nələr, bəsdür təğafül eylədün,
Xanəviran, bəsdür etdün huriyi-qılman tələb.

E`tiqadun hər nəyə vardur, kifayətdür sana,
Yaxşı-bəd hər gündə etmə qeyr bir ərkan tələb.

Aləmi-insanlığun bir zərrə, Saqib, qədri yox,
Sən də aləmlər kimi, get, etgilən nadan tələb.

* * *

Necə mən eyləməyüm naləni, ey şirinləb,
Nə qədr söləyüm hicründə ki, ya Rəb, ya Rəb!

Yoxdur aram mana ayrılığun fikrindən,
Sakit olmaz gözümün yaşi dəxi ruz, nə şəb.

Qorxuram mən eləyüm bircə təmənna səndən,
Tiği-əbrulər ilə etməyəsən bir də qəzəb.

Qan olarmı soram ol lə`li-ləbündən bir dəm,
Məni incitməyəsən, hasil oleydi mətləb.

Ayü gün seyrdədür görməgə bu rüxsarun,
Harda sən kimi görüb bir gözəli türkü ərəb.

---

[*] Yetməzsən

Dedi ol şux, eləmə şikvə mənim hicrimdən,
Məqsədə yetməz o kəs, çəkməyə ta rəncü təəb.

Zahidün qövlinə bel bağlama, tərk etmə meyi,
Düşkini-məscididür, ol nə bilür rəsmi-ədəb.

Simü zərdür sana artıq ana ilə atadan,
Verməz iş zərreyicə* gər olasan alinəsəb.

Leyliyə sölədi Məcnun, mana bir dəm dil ver,
Saqiba, etmədi tə`sir rəqibə, oldı səbəb.

* * *

Olmadı kamımca didarun sənün, ey qönçələb,
Etdigim fəryad ney kimi degül heç bisəbəb.

İçmə mey, təklif edər zahid məni-üftadəyə,
Saqiya, ver cami-mey andan ki, saqitdür ədəb.

Sən gedüb qıl guşeyi-mehrabə, zahid, səcdəni,
Mən xəmi-əbruyi-yarə eyləsəm gər etmə əsəb.

Ərsəgahi-məhşərə gəlləm əlimdə cami-mey,
Meydən etsəm tövbə hərgiz, qoy, məni dutsun qəzəb.

Hansı dinün əhlisən, gəl, sorma məndən, ey fəqih,
Dinü imanı əlimdən aldı bir alinəsəb.

Sərvqamət, Leylivəş, mehrabi-Kə`bə qaşları,
Gər desəm giysulərin zənciri-Məcnun, yox əcəb.

Şübhəsiz, Saqib, gəlürsən yüzi qarə məhşərə,
Məğfirət gər etməsön meyxanələrdən sən tələb.

* * *

Əqli heyran edər hüsnün sənün, ey şirinləb,
Dili-viranəmi zülfündə əsir etdün əcəb.

Tökülüb, gör, necə rüxsarüvə zülfi-siyəhün,
Deyəsən, həlqə vırubdur qəmər üzrə əqrəb.

* Zərrəcə

Hansı saətdə yaratdun bu pərirüxsari,
Qəmzədür başdan-əyağə, nə gözəldür, ya Rəb?

Hüsn bazarinə Yusif nə içün qoydı qədəm,
Bir kəlaf oldı onun qiyməti, kim oldı səbəb?

Dögünür dil rüxi-alundəki xalundan öpə,
Eyb divanəyə dutma, nə bilür rəsmi-ədəb.

Verürəm müjdə sənə, min belə canı qurban,
Görsə idim yuxıda arizi-alun bir şəb.

Vermə əğyarə dedim dil, səni rüsva eylər,
Nə günah etdim, edərsən mana hər ləhzə qəzəb.

Nalə, ey dil, bu qədr eyləmə hicran gecəsi,
Yetməsən* vəslə əgər, çəkməyəsən rəncü təəb.

Saqiba, şe`rüvə heyran eləyərdün xəlqi,
Ah, əfsus, əgər azca göreydün məktəb.

* * *

Meyl etmə ol pərivəşə, ey dil, xəta görüb,
Etmüb xətani görməgə hərgiz, həya görüb.

Can eyləsön fəda ona hərgiz bilən degül,
Zanusi yerdə, qədini daim düta görüb.

Tə`n etmə fe`li-zahidə meyl etməyənlərə,
Zöhdində bəlkə rənginə buyi-riya görüb.

Göz tikmə xani-ne`mətinə süfləpərvərün,
Daim özini dərbədər, əksik gəda görüb.

Namusi olmayanlar ilə ülfət eyləmə,
Qanın dəgişmiş, aləmi qəmdən rəha görüb.

Mən` etmə ol kəsə içə gər zəhr kasəsin,
Yox çarə əldə, halını xəlqün fəna görüb.

Ənqa ki, var adı özi yoxdur nədür səbəb,

* Yetməzsən

Saqib, qaçub bu xəlqdən, əzbəs cəfa görüb.

* * *

Hansı qamət qamətün kimi qiyamət göstərüb,
Hansı sərv, ey sərvqamət, böylə qamət göstərüb.

Qıyqacı baxmaqlığun məndən alubdur dinü dil,
Hansı peyğəmbər belə kəşfü kəramət göstərüb.

Xəlq məndən çəkməz əl, eşqündə rüsva olmayum,
Necə olmum, kim sənün kimi nəzakət göstərüb.

Tiri-qəmzön bağrımi min yerdə gər çak eyləsə,
Şikvə etməm, hüsn sultani siyasət göstərüb.

Səcdə eylər çeşmi-bədməstün qaşun mehrabinə,
Gör, necə kafər kəramətlə imamət göstərüb.

Bu dili-divanəmi, gör, atəşi-hicranüvə
Yanmağə pərvanə kimi istiqamət göstərüb.

Xidmət etmiş ol qədr Saqib qəzəl ustadinə,
Bais oldur şe`rdə hərdəm məharət göstərüb.

* * *

Qaşlarun tərhin müsəvvir tiği-xunəfşan çəküb,
Ey pərivəş, gözləri əmma çəkəndə qan çəküb.

Qönçə bağrın qan edüb gülzaridə ləbbəstədür,
Ləblərün fikrilə məst olmuş ləbün xəndan çəküb.

Qətlimə əbrulərün də üstəlik hökm etməsün,
Qətlimə səf səndə kim, bu navəki-müjgan çəküb.

Yerbəyerdən tiri-qəmzön sancılıbdur bağrıma,
Çıxsa da, qoymaz çıxa ağuşə gər bica çəküb.

Bu ləbün küncində xalun məskən etmiş, vəchi var,
Tiri-qəmzön qorxusundandur özin bir yan çəküb.

Etməsün heç kim məlamət dinü dil verdüm sana,
Hüsnüvə neylüm dili-divanəmi heyran çəküb.

Ey mana tə`n eyləyən, tərk etgilən meyxanəni,
Tərkin etməm, arizuyi-bu ləbi-canan çəküb.

Aşiqün halun pərişan görsön, ey məh, incimə,
Tə`neyi-əğyardən sonra qəmi-hicran çəküb.

Yox əcəb bu Saqibi bir cam yıxsa, saqiya,
Varə-varə hər nəfəsdə afəti-dövran çəküb.

* * *

Bu gözəllikdə səni xameyi-təqdir çəküb,
Aləmi məhv eləmiş kim, belə təsvir çəküb.

Heyrətə düşdi müsəvvir, necə çəksün qaşuvi,
Qıldı çeşmün ona tə`lim, iki şəmşir çəküb.

Demə bu türreyi-mişkindür, ey şirinləb,
Eşq divanəsinə ah ilə zəncir çəküb.

Qaşlarun tağı arasında yatub məst gözün,
Deyəsən, kaminə ahubeçəni şir çəküb.

Sürmədən alma xəbər vəsfini müjganlarıvun,
Dili-divanəmi çak eyləməgə tir çəküb.

Dedi zahid mana, mey içmə, dedim yar ləbi,
İçdirür badə mana naleyi-təkbir çəküb.

Eylə bilmə xətü xalun məni Məcnun etmiş,
Məni divanəligə türreyi-şəbgir çəküb.

Vaizi-şəhrə dedim, həqqə nədür isbatun,
Baxgilən qanmaza, şahid mana təfsir çəküb.

Tövbə təklifini etmə mana, naseh, əl çək,
Məni meyxanəyə Saqib kimi bir pir çəküb.

* * *

Qoy, sayə salsun hüsnüvə, ey yari-dilfərib,
Çin-çin şikənci-türrələrün görməsün rəqib.

Dinü dil etdi kuyüvə mən gəldigüm zəman,
Bu bir məsəldü, xəlq deyər: "kur olur qərib".

Ey söləyən bu dərdü qəmü eşqə çarə qıl!
Olmaz əlacı, zəhməti-bica çəkər təbib.

Zahid, məlamət etmə mey üftadəsin görüb,
Gün gahi sərfəraz olu,* gahi olur nəşib.

Sərgərmi-badə olmamağun heç əcəb degül,
Təklifi-tövbə eyləməgündür sənün əcib.

Dövran əlilə gülşəni xar etdi paymal,
Künci-qəfəsdə nalə çəkər zar əndəlib.

Qədrincə hər kəsün eləyüb bəxt yarlıq,
Salmış məni əyağə, vəli bəxti-nanəcib.

Gəh ağladur zəmanə bizi, gah güldürür,
Saqib, qəm etmə, xoş gün olur aqibət nəsib.

* * *

Döndərmə qanə bağrımi, ey yari-dilfərib,
Bəsdür eşiddim hicr güni tə`neyi-rəqib.

Əğyarə vermə meylüvi, rüsva edər səni,
Vəslün mana ölüncə dəxi olmasun nəsib.

Gülzar soldı, oldı xəzan, ahü naləsin,
Künci-qəfəsdə tərk eləməz miskin əndəlib.

Ney kimi nalə eyləsəm, ey şuxi-səngdil,
Divanə eyləsə məni hicrün, degül əcib.

Axtarma çarə dərdimə, nəbzimdən əl gətür,
Bu dərd, dərdi-eşqdü, səhv etmə, ey təbib.

Divanə könlüm itmiş idi eylədim soraq,
Etmiş əsir zülfün onı, sevməyür qərib.

* * *

---

* Olur

Dutdı dil hicründə od, ey dilnəvazü dilfərib,
Bağrımi qan eyləyürsən, kam alur səndən rəqib.

Ahü nalə eyləməkdür çarə ancaq aşiqə,
Eyləmə tədbiri-dərman dərdimə, əl çək, təbib!

Tişəni künd eyləmə, ey kuhkən, Şirin içün,
Bisütun dağında çox, Şirin sana olmaz nəsib.

Yandırur gül bərgini əttar çəksün ətrini,
Naləni eylər qəfəs küncində miskin əndəlib.

Kasə-kasə xuni-dil iç, çəkmə nakəs minnətin,
Damənindən dutma gər sultan olsa nanəcib.

Mərdümi-baqeyrətə, get, canuvi qurban elə,
Başuvi ver istəsə min dəf`ə, olma naşəkib.

Kuyinə yarun yetərsən, nalə etmə, Saqiba,
Kam hasil eyləyərsən, səbr elə sən, ənqərib.

* * *

Dərdi-eşqə çarə yoxdur, etmə dərman, ey təbib!
Dəf` dərman ilə olmaz dərdi-hicran, ey təbib!

Eyləməz hər zəxm, çəkmə zəhməti mərhəm qəbul,
Var cigərdə zəxmi-növki-tiri-müjgan, ey təbib!

Mən necə rüsvayi-eşqəm, bildirür nəbzim sana,
Bilməsün, bidərdlərdən saxla pünhan, ey təbib!

Artırur dərdim mənim, əl çək, bu dərmanun sənün,
Çarəsi lə`li-ləbi-canandur, qan, ey təbib!

Könlümün cəm`iyyətin cəm` eyləmək mümkin degül,
Eyləmiş ol sərvqəd zülfin pərişan, ey təbib!

Nəbzimə əl vırma, çox incidmə sınmış könlümi,
Tə`neyi-əğyar edübdür bağrımi qan, ey təbib!

Xanə bərduşəm, əlacun var isə, gəl, eylə kim,

Başimə, gör, nətdi[*] axır dövri-dövran, ey təbib!

* * *

Çarə yoxdur dərdi-eşqə, etmə çox dərman, təbib,
Əl gətür, dərman qəbul etməz qəmi-hicran, təbib.

Sordılar Loğmandən, var dərdi-eşqün çarəsi?
Sölədi, yox, çarə olmaz, oldı rugərdan təbib.

Var əlacı, qismət olmaz, qisməti-əğyardür,
Bağrımi qan eyləyən lə`li-ləbi-canan, təbib.

Çarəsi bu dərdi-eşqün vermədi Məcnunə əl,
Dərdinə etdikcə çarə, eylədi tüğyan təbib.

Bir məni eşq aləmində görmisən rüsvayi-eşq,
Vadiyi-heyrətdə çoxlar etdi sərgərdan təbib.

Nəbzimə əl vırma, əl çək, sorma heç əhvalımi,
Könlümün mə`murəsin qəm eyləmiş viran, təbib.

Aləmi-eşqün nə bilsün, Saqiba, keyfiyyətin,
Bilməz heç miqdar dərman da, nədür mizan təbib.

* * *

Künci-qəfəsdə oldı sənə nalələr nəsib,
Gül fəsli keçdi, tərk eylə biçarə əndəlib.

Avarə olsa zülfün içində əcəb degül,
Könlüm, qaranlıq olsa vilayət, azar qərib.

Əl çək, əlacı yox bu dili-parə-parənün,
Eşqün mərizinə kim edər çarə, ey təbib!

Ey ahü nalə etmə deyən, az məlamət et,
Əşkim fənayə aləmi versə, degül əcib.

Hicran güni şəmadəti-əğyar, künci-qəm,
Bir dəf`ə al bu canımi, ey yari-dilfərib.

Məcnunə söyləmə xəbəri-Leyli, ey cərəs,

---

[*] Nə etdi

Leylayə ver xəbər, sanur ol Leylini rəqib.

Saqib, xəyalə sal Vətənün canfədalərin,
Qaşü gözi xəyal eləməz kamilən ədib.

* * *

Zülfün kəməndi könlümə qoy verməsün nicat,
Bəsdür, mana bu ləblərün hərdəm verür həyat.

Töksün nə qədr həsrəti-xunabə gözlərim,
Bari bu tiri-qəmzön ilə eylə iltifat.

Heyrani hüsnüvün olam hərgiz əcəb degül,
Eylə gözəldü hüsnün, edüb kainatı mat.

Ey mahparə, kim sora bu lə`li-nabuvi,
Ta həşr üzin görüncə gərək görməsün məmat.

Ey dil, gedəndə kuyinə ol mahparənün,
Qıl ehtiyat, görməsün əğyar, mən fədat.*

Yox fərqi, zahida, eləsən doğrı səcdəni,
Ya məscidi-xərabə ola, ya ki, sovməat.

Saqib, qəzəldən eyləmə e`raz bir nəfəs,
Aləm dağılsa yansa əgər külli-kainat.

* * *

Cami-meydən tökülən saqi əlindən qətərat,
Verür hər qətrəsi min ruhi-Məsihayə həyat.

Xüm əyağında qazun qəbrimi, ey əhli-vərə`,
Qəbrim üstündə verün dürdi-şərabi xeyrat.

Demə meyxanəyə gəl, zahidə, əl çək, saqi,
Kafər, ey rahəti-can, cənnətə getsün heyhat.

Nola təsbihə verüb daneyi-xalun zahid,
Edəcək daneyi-təsbih ilə virdi-sələvat.

Yanar əhvalimə vaiz ki, cəhənnəmdü bizim,

* Sənə fəda olum

Yetişüb sərhədi-məqsudə ol alidərəcat.

Bağlayub kakilün əndişəsi zəncirə məni,
Eylə bənd eyləyüb, bir də ola rahi-nicat.

Navəkün bu dili-suzanımi min parələyüb,
Dutaram mən bu giribanuvi ruzi-ərəsat.

Qanə döndi könül ol lə`li-ləbün fikriylə,
Nə qədr xuni-dil ilə keçirüm mən övqat.

Tutiya tək gözə çək xaki-dəri-əhli-dili,
Saqiba, fəhm elə, qılma dəxi qeyri-həsənat.

* * *

Yox sərvdə, ey sərvqədim, səndəki qamət,
Eyvay, mənim əhvalimə gər etsə qiyamət.

Mehrab qaşunda oturub nərgisi-məstün,
Heç görməmişəm mən, eləsün kafər imamət.

Sən hüsndəsən, xətmi-nübüvvətdə Mühəmməd(s),
Var hansı gözəldə bu lətafət, bu məlahət.

Rüxsarun odı tə`nə urar atəşi-şəm`ə,
Rəhm et, dili-pərvanəmi yandır, elə rahət.

Gülzarə girüb açmagilən arizi-alun,
Qönçə qalur heyrətdə, çəkər lalə xəcalət.

Sən eylə pəriçöhrəsən, ey qaşı kəmanım,
Tərki-dilü din eyləyərəm, etsön işarət.

Bir nimnigəh eyləyəsən, qəsdi-can eylər,
Bu qətlimə əbrulərivün tiği nə hacət.

Lə`li-ləbüvün fikri ilə badəpərəstəm,
Divanədü hər kimsə məni etsə məlamət.

Saqib eşidübdür könül əğyarə verübsən,
Zalim, dəxi bəsdür elədün böylə zərafət.

* * *

Gəlibdür təngə səndən, əl gətür, pirü cəvan, firqət,
Tökər bu gözlərim nətmiş* sana dəryayi-qan, firqət.

Gedim ol sərvqəddün kuyinə, bir ləhzə azad et,
Dolanum başuva seyran, bir dəm ver əman, firqət.

Rəqibün xatirin sındırmadun, qan eylədün bağrım,
Bu sərvi-qədimi həm eylədün qəmdən kəman, firqət.

Rəqibün fitnəsindən yar məndən dutdı yüz axir,
Mana bir tiri-qəmzə etməz ol namehriban, firqət.

Edərsən bağrımi qan, xanəviran, görsön hər yerdə,
Əlündən qaçmağa mümkin degül bir natəvan, firqət.

Rəqibi güldürürsən sən mana, insaf yox səndə,
Məni şad eyləyərsən bilmirəm bir dəm haçan, firqət?

Səri-kuyində yarun eyləyər ney tək fəğan hərdəm,
Nə etmiş, bimürüvvət, Saqibi-bixaniman, firqət.

* * *

Sabitqədəm ol, qaçma, sana yüz verə möhnət,
Bu rəncə hünər var isə səndə, elə sibqət.

Qəddar fələk incidər ərbabi-kəmali,
Adət eləməz tərk, tapubdur belə şöhrət.

Qəmdən, bu cəhanə gələ kim, başı ayılmaz,
Dut sinəvi, atsun oxı, etmə əzimət.

Köç eyləyəcəkdür köçəri, hürsə də itlər,
Yet sərhədi-məqsudüvə, varunsa həmiyyət.

Gər var-yoxun getmiş isə, səbr elə, getsün,
Ver başuvı, qoyma dağıla pərdeyi-ismət.

Nadanlar ilə durma-oturma, həzər eylə,
Bil qədrüvi, ərbabi-kəmalə elə xidmət.

Gördün yıxılub məst dəri-meyxanədə birsi,

---
* Nə etmiş

Tə`n eyləmə, mə`lum degül onda kəramət.

* * *

Məlamət küncini, ey dil, fəğan çox etmə, mənzil dut,
Ki, suzi-ahilə yan, arizuyi-vəsli müşkil dut.

Geyüb rəxti-cünun Məcnun gəzər Leyli sorağında,
Cərəs fəryad edər, Məcnun, rəhi-səbrü təhəmmil dut.

Həyatım kəştisi girdabi-qəmdə oldı qərq, ey dil,
Təvəkkül badbanın vermə əldən, rahi-sahil dut.

Dənilər süfrəsindən, göz yumub keç, kasəlis olma,
Məgəs tək qonma gər şirinsə, anı zəhri-qatil dut.

Dolanma məclisi-dəhr içrə çox hər əldə sağər tək,
Xəm ol, xəlvətnişin ağır, təriqi-əqli-kamil dut.

Alub minnət yükin, qamət xəm etmə, uyma mehrabə,
Qiyas et sərvdən, ancaq dili-toprağdə dil dut.

Şəh olsa, nanəciblər ilə, ey dil, hərgiz əgləşmə,
Gədayə dikmə göz, göz pərdəsin bilmərrə hayil dut.

Vücudi-dustə canlar fəda, canun fəda eylə,
Vücudi-dusti dut kimiyayə, qeyri batil dut.

Kim olsa, Saqiba, razi-dərunə hiç yol vermə,
Cərəsdən, fəhm qıl, asılmasın əldə dəlayil dut.

* * *

Əzmi-mey etdi sənün ləblərün, ey cövhəri-qut,
Düşdi meyxanə o gün məst, piyalə məbhut.

Qönçələb, qan elədün bağrıni tər qönçələrün,
Lə`li-nabun kimi həmrəng ola bilməz yaqut.

Əyağun öpməgə hərçənd təmənna etdim,
Ağzıma vırdı qaşun tiği mənim möhri-sükut.

Kargər düşmədi qəmzön oxı göz mərdüminə,

Canə vır qəmzə oxın, bir də vəfa rəsmini dut.

Hüsn bazarinə bu ariz ilə gər getsön,
Hüsnüvün əksinə Yusif necə olmaz məbhut.

Verəni dil sana düşdüm nəzərindən xəlqün,
Yerbəyerdən məni əğyarlər etmiş bayqut.*

Saqiba, camdə xurşidi-meyün səcdəsin et,
Səcdə eylər dəri-meyxanəyə ruhi-mələkut.

* * *

Əsər etməz əhli-qalə kəlamati-adəmiyyət,
Degül əbləhün pəsəndi hərəkati-adəmiyyət.

Sözün həqqini sən, ey dil, demə qanmaza ki, qanmaz,
Nə həyati-adəmiyyət, nə məmati-adəmiyyət.

Dedi Musa(ə): "Rəbbi ərini",* ona gəldi "lən"** cəvabi,
Bu müşkil işdi tapmaq dərəcati-adəmiyyət.

Bu qədər də qan olarmı tökülür qəribə yəm tək,
Hədər oldı, getdi yeksər, zəhəmati-adəmiyyət.

Nə gözəl qaşun çəkilmiş təzə ay kimi xəmidə,
Nə əcəb bu tərhə, ey məh, qala mat adəmiyyət.

Bura əhli-halun olmuş nəzəri ki, səcdəgahi,
Burada qəbul olunmış həsənati-adəmiyyət.

* * *

Bəhar fəsli mey iç, seyri-bağі-gülzar et,
Başunda nəş`ə, təmaşayi-arizi-yar et.

Zəmanədən sənə nə, girsə gündə hər rəngə,
Fədayi-cani-əzizi, bu mahi-rüxsar et.

Binasını elə viran, əziyyət-azarun,

---

* Boykot
* "...Ey Rəbbim mənə görün..." )Qurani-kərim, Bəqərə, 24(
** "... heç bir zaman, heç vaxt..." )həmin ayə(

Həmişə xeyr işə hər an xəlqi vadar et.

Əmin bilsə səni, versə birsi can nəqdin,
Xəyanət eyləməsün, nəfsüvi xəbərdar et.

Desün, nə eybi, mana cümlə xəlq, kafirsən,
Başun da getsə əgər, qorxma, həqqə iqrar et.

Dolaşma ignə kimi tari-pərdə, bənd olma,
Özüvi sərv kimi bardən səbükbar et.

Əziz olmağuvi istəsön gər aləmdə,
Nə dinün əhli ola, xoş onilə rəftar et.

Özüvə düşməni güldürmə, müflis olson da,
Küdurət eyləmə izhar, səbri izhar et.

Alanda sağər ələ, gör, kim ilə almalısan,
Yanaşma nanəcibə, sağərin nigunsar et.

Günahı boynuma, hər ləhzə, get, meyalud ol,
Əziyyət eyləmə bir nəfsə, zülmdən ar et.

Özüvi bağlama, Saqib, bu qeydi-İslamə,
Diyari-küfrə gedüb, fikri-qeydi-zünnar et.

* * *

Fövt eyləmə vəqti tələbi-sağərü cam et,
Meyxanə yolın dut, xüm əyağında məqam et.

Zahid sözinə baxma, gedüb badəfüruş ol,
İftari-meyi-lə`lvəşi, mahi-siyam et.

Tökdi bu üzüm suyi yüzüm suyini, saqi,
Doldur qədəhim, xeyr işə naz ilə qiyam et.

Azad elədüm mən səni, ey qəmzədə könlüm,
Ol sərvqədün kuyinə ahəstə xüram et.

Ol vadiyi-eyməndə ədəb şərtini gözlə,
Qəmzə oxı gər yetsə sana, qorxma, dəvam et.

“Ərni” demə Musa(ə) kimi, kəmrütbə olursan,

Yari özüvə qeyri təmənna ilə ram et.

Ey badi-səba, düşsə yolın kuyi-nigarə,
Xaki-rəhini busə qılub, ərzi-səlam et.

Əmr eyləmə bir nəfsə, ağır yükdü, həzər qıl,
Asudə olursan, özüvi xəlqə qulam et.

Vaiz, oxuma Saqibə çox tövbeyi-meydən,
Tövbə eləmiş içməməgi, xətmi-kəlam et.

* * *

Bir dəm, gözəlim, naz ilə bir bağə güzar et,
Bülbül gözinə qönçəni, tər laləni xar et.

Ram eyləgilən bu dili-divanəmi, ey məh,
Giysulərüvün daminə, dut, qoyma, düçar et.

Zülf içrə nihan eyləmə bu arizi-alun,
Fitnə dutar aləmləri bir ləhzə kənar et.

Yol getməgi tə`lim elə gülzaridə sərvə,
Qıyğacı bax ahuyi-xətadidə şikar et.

Minayi-meyi al ələ, ey saqiyi-gülrüx,
Ehsan meyi meyxarələrə fəsli-bəhar et.

Bir nimqədəh dürdi-mey ilə dut əlimdən,
Tədbir, əmanun günidür rənci-xumar et.

Bu deyri-fəna keçməsə xoş gər sana, Saqib,
Yol var, gedəsən, əzmi-rəhi-qeyri diyar et.

* * *

Meyxanələrün küncini sərməsti-məqam et,
Öp saqi əlindən, tələbi-sağərü cam et.

Huşyarlığa nəfsüvi ram eyləmə bir də,
Divanəligün badəsinə nəfsüvi ram et.

Sındırmagilən qədrüvi, çoxdur sənə qiymət,
Düşmə əyağə, get, özüvə şahı qulam et.

Azadəligün şərti nədür, sərvə nişan ver,
Bu qamət ilə naz ilə bir bağə xuram et.

Öldür məni qurtar, dəxi çox qoyma can üstə,
Bir nim nigəh qəmzə ilə ömrü təmam et.

Aləm özini badəyə aludə edübdür,
Zahid, hələ təsbih ilə sən hökmi-məram et.

Saqib, səri-kuyində sən ol mahliqanun,
Səcdə elə xaki-rəhinə, xətmi-kəlam et.

* * *

Rüxsarüvə zülfüvi niqab et,
Dil qalmaya məndə, dut, xərab et.

Neyçün sana böylə mübtəladur,
Məndən ayır anı, bir səvab et.

Bir dəm məni qəmdən eylə azad,
Sürmə gözə çəkmə, nazi-xab et.

Asudə olum sitəmləründən,
Yox de, yox, səngdil, şitab et.

Güldi, dedi ol kəməndi-giysu,
Aşiqsən əgər cəfayə tab et.

Əbrulərimün qılıncı kəskin,
Can nəqdidi, dut, həqq-hesab et.

Bir qəmzəmə dinü dili verdün,
Kim dedi, get, əksi-inqilab et.

Pərvanədən ögrən eşq rəsmin,
Dil şəm`i-məhəbbətdə kəbab et.

Yoxdur bu gözəllərün vəfası,
Saqi, məni məsti-bu şərab et.
Tərk et o qərəzli məhliqani,

Saqib, özüvə, get, intixab et.

* * *

Bir ləhzə, get, insanlığa bu nəfsüvi ram et,
Qəflət yuxusını özüvə, yatma, həram et.

Eyb eyləmə xəlqə, özün hər eyb içində,
Bədgulığı tərk et, əməli-xeyrə qiyam et.

Təşviş eləmə saliki-həqqün rəvişindən,
Təklif sana etməsə, rə`yüncə dəvam et.

Zərfün sənün əzbəs ki, tünükdür, daşacaqsan,
Yox çarəsi bihudə yemək, sübhüvi şam et.

Nail olasan məqsədə, qoymaz səni hərgiz
Bu kibrü məniyyət, mey içüb xidməti-cam et.

Meydən açılur üqdə, mey iç, uyma fəqihə,
Meyxanə yolında əyağun çəkmə, məqam et.

Nadanə çətindür, sözün həqqin demə, Saqib,
Baş ağrısı çox verməgilən, xətmi-kəlam et.

* * *

Bu güli-rüxsar ilən, ey məsti-nazım, seyri-gülzar et,
Nədür gül, bülbülə bildir, gözində qönçəni xar et.

Gözün seyr eylədi, oldum əsiri-zülfi-pürçinün,
Məni bundan bətər bu dami-Məcnunə giriftar et.

Apardı, ey cərəs, əğyar evinə naqə Leylani,
Dəxi seyri-biyaban etməsün, Məcnuni bidar et.

Xəcalət bağbanə vergilən kim, tərki-bağ etsün,
Pərişan eyləmə rüxsarə giysu, ərzi-rüxsar et.

Verürsən qətlimə fərman qaşun tiğilə, ey zalim,
Əlimdə nəqdi-can, get, bari, bir dəm tərki-əğyar et.

Vırar məxmurlıq lafını nərgis çeşmi-məstünlən,

Gözün bimarı tək, vır qəmzə peykanilə, bimar et.

Gözəllik xətm olur məndə, nə var Yusifdə sölürdüm,
Dağıt bazari-hüsni-Yusifi, dur, əzmi-bazar et.

Gedürsən məndən ayrı, ey səba, kuyinə dildarun,
Şəbi-hicrində bu hali-xərabimdən xəbərdar et.

Qənimət bilgilən, can nəqdini dut əldə, ey Saqib,
Nədür bir can anı hərdəm fədayi-çeşmi-dildar et.

* * *

Şikvə eləməm, könlümi zülfündə düçar et,
Bir ləhzə üzarundan anı, yari kənar et.

Bəsdür bu qədr qəmzə oxın könlümə vırdun,
Ahuyi-xətadidələri rami-şikar et.

Məcnunə də vermə dəxi, ey Leyli, Leyli,
Bilsön nə gözəlsən, gözəlim, kəşfi-üzar et.

Lal eyləgilən bülbüli vəsfi-gül edəndə,
Vır lafi-lətafət gülə, gülzarə güzar et.

Ahəngi-Müxalif bu qədr etmə, müğənni,
Bənd eylə Həsar içrə anı əzmi-Qətar et.

Meyxanə yolın bağlama, zahid, mana, əl çək,
Məsciddə nə var, xidməti-bərbadə kəsad et.

Saqib, ələ al cami-meyü qəbqəbi-yari,
Sərməsti-təmaşayi-güli-fəsli-bəhar et.

* * *

Əgərçi Yusifün hüsni cəhanda tapdı rəvac,
Qapunda qul sana olmaz, olub sana möhtac.

Yanaşdı zülfi-siyahunla, cüt kəmanəbru,
Mübarək oldı Mühəmmədə(s) "Leylətül-me`rac".[*]

Ürək dəvam eləməz, qorxudan dönər qanə,

---

[*] Məhəmməd Peyğəmbərin meraca qalxdığı gecə

Yaralu ahu kimi bir baxanda sən qıyqac.

Görüb cəmaluvi heyrətdə qalsa gün, nə əcəb,
Alursan hər səhər ondan yüzün açanda xərac.

Görüblə ayinəni əksi-arizün oğrar,
El oldı cəm` onı şəhrdən edüb ixrac.

Edərdi tövbə yəqin Kə`bənün təvafından,
Təvaf edəydi əgər kuyüvi sənün Həccac.

Əsir qıl xəmi-zülfündə daneyi-xalun,
Həzər bu danədən, hər din evün edüb tarac.

Təbib, nəbzimə əl urma, əl gətür məndən,
Çətindür, eyləmək olmaz bu dərdi-eşqə əlac.

Qəbul eyləmərəm, Saqiba, qiyamət ola,
Başimə qoysa əgər nanəcib qızıldan tac.

* * *

Əgər olseydi aləmdə süxənsənc,
Olurdı hər sözüm sərmayeyi-gənc.

Əgərçi mat edər şətrənc şahi,
Qəzəl şətrəncinə neylər bu şətrənc.

Çalışma gənc içün, rəncin çəkərsən,
Gedüb ol sərv tək azadü birənc.

Təğafül badəsindən huşyar ol,
Dönüb qəm-qüssədən et zövqi örgənc.

Eşit ney naləsin, tarun sədasın,
Müğənni azdı, etdi tərki-Sarənc.

Vətən girdabi-qəmdə qərq olubdur,
Umursan nərddən gəh çar, gəh pənc.

Fəribi-dəhrə, Saqib, uyma hərgiz,
Təəllüq ondan üz, göstərsə min ğənc.

* * *

Bəsdür əfşan elədün ayineyi-rüxsarə saç,
Olmasun aləm təmaşasında aciz, hüsnin aç.

Ləxtə-ləxtə bağrımi qan eyləmə, ey qönçələb,
Ləbləründən eyləyəndə sağəri-peymanə maç.

Bilmədim mən hiç haçan oldum əsiri-kakilün,
Düşməyeydi gözlərim sən tək gözəl cananə kaç.

Dil verüb əğyarə, ey dil, ol pərivəş, əl gətür,
Seyl tək xunabi-həsrət hicrdə rüxsarə saç.

Bərqi-aləmsuzdür, eşqün odından, qıl həzər,
Eşq olan yerdə dolanma, ehtiyat et, durma, qaç.

Saqiba, tərk etgilən, rəsmi-müsəlmanlıq nədür,
Olgilən asudə, get, dut daməni-zünnarü xaç.

* * *

Gec açılmaz, ah neylim, ah, kəcrəftar sübh,
Qıldı yarı ayrı məndən mərdümi-azar sübh.

Qıl giriban çak, göstər sübhi-sadiq zahidə,
Dutmasun məscid yolın, bilsün nədü asari-sübh.

Görməsün əğyar gəldim kuyüvə, ey qönçələb,
Yetməmiş açıldı, qıldı könlümə azar sübh.

Gün də açsun arizin hər sübh vəqti, sən də aç,
Eylər əlbət ki, gözəllikdə səni iqrar sübh.

Sübh vəqti qarşu dursa hüsnüvə xurşid əgər,
Rəşkdən rüxsarıni açmaz, özin yırtar sübh.

Qamətim kimi xəm olmuşdur, hilalü məh degül,
Sinəsində qaşlarun tərhin qılur izhar sübh.

Səndən ayrı sübhədək hicründə fəryad eylərəm,
Bir də gəl, ayrılma məndən, halıma ağlar sübh.

Bəsdür, ey bülbül, qəfəs küncində fəryad eylədün,

Eyləmə bidar, naz ilə yatubdur yar sübh.

Etmərəm ol mahvəşdən kam hasil, Saqiba,
Atəşi-hicranə yan, bəsdür, nə qədri var sübh.

* * *

Ya hüsnüvə və ya məhə, ya aftabə bax,
Yox fərqi, birdür, ya süvərü dörd kitabə bax.

Divanə könlümün yerini bilmək istəsön,
Giysuləründə əf`i ilan tək tənabə bax.

Hüsnündə baxma daneyi-xali-siyahüvə,
Rahət yatub, gözündəki bir inqilabə bax.

Ey söləyən, səndə bu nə piçü tabdür,
Çıxsun gözün, bu türreyi-pürpiçü tabə bax.

Baxma rəqibə ol səri-kuyin təvaf edər,
Yandım fəraqüvə, məni-xanəxərabə bax.

Hər ləhzə tiri-qəmzön hücum eyləyər mənə,
Qıllam sipər bu sinəmi, bir məndə tabə bax.

Çox tul vermə nəğmeyi-Mahurə tar ilə,
Gəl şurə, ey müğənni, bir az da Rəhabə bax.

Nadan əlində, gör, necə fəryad edər müdam,
Hər sübhü şam naleyi-çəngü rübabə bax.

Saqi, ki dinü dil sana verdüm şərab içün,
Gör borclı kimdür, naz ilə həqqü hesabə bax.

Baxma kitabə çox, başuva tez həva gəlür,
Zahid, əlimdə sağərü camü şərabə bax.

Saqib, gər istəsön qəzəlün tərhini nədür,
Hər ləhzə şe`ri-Yusifi-alicənabə bax.[*]

* * *

Ey dil, demə bu sərvqədi-gülüzarə bax,

---

[*] Ustad şair Əbdülxaliq Yusifə (1853-1924) işarədir.

Hicründə məndə naleyi-biixtiyarə bax.

Əğyarə sevgili o pəriçöhrə yar olub,
Ney kimi nalə ilə şəbi-intizarə bax.

Hərgiz dolanma kuyinə ol sərvqamətün
Həsrət gözilə, çək özüvi bir kənarə, bax.

Qoymur rəqib kuyüvi bir dəm təvaf edim,
Çeşmün fədası, məndəki bir ixtiyarə bax.

Divanə könlümün xəbərin məndən alma, əl gətür,
Olmuş bu tiri-qəmzəyilən parə-parə bax.

Təklif etmə mana, ey saqi, cami-mey,
Məstəm həmişə mən ki, bu çeşmi-xumarə bax.

Bir göz yumub-açınca, gədazadə şah olub,
Şahi gəda edən fələki-kəcmədarə bax.

Ağü qəra nədür, ona heç fərq qoymayan,
Başında taci-zər oturub, şəhriyarə bax.

Könlüm degül yerində, demə bir də, Saqiba,
Olmuş əsir zülfinə yarun, dübarə bax.

Verrəm müdam kam ləbimdən, dedün mana,
Verdün rəqibə, səndəki bu e`tibarə bax.

Çeşmün işarə eylədi düşdi əsiri-dil
Giysulərün kəməndinə, zalim, şikarə bax.

Ney kimi nalə eyləsəm hicründə, incimə,
Yarından ayrı neydə olan ahü zarə bax.

* * *

Bir dərdə düşmişəm, ona heç yerdə çarə yox,
Əl çək, təbib, mən kimi bir bəxti qarə yox.

Eyvay, eşqdən saldı məni min bəlalərə,
Yandım, əmandur, heç belə od yox, şərarə yox.

Ey dami-zülfi könlümi birdən əsir edən,

Bir dəf`ə al bu canımi, zalim, dübarə yox.

Qəmzön oxilə imdi ki, qanım həlaldür,
Qoyma can üstə, xeyr işə bir istixarə yox.

Kuyin gədasın istəsəm öpmək əyağıni,
Can nəqdi əldədür demə, ey mahparə, yox.

Biganə görməsün səni hərgiz içəndə mey,
Xəlvətdə al piyalə ələ, aşikarə yox.

Dəryayi-eşqə qərq olusan, girmə, Saqiba,
Kim düşsə, qərq olur ona, hərgiz kənarə yox.

* * *

Fərəh verüb kimə, ey dil, bu dəhri-bədbünyad,
Sitəmlərindən anun kimdür etməsün fəryad.

Nəfəs çəkəndə o da zəhmət, əziyyətdür,
Əziz ömr gedir fovtə dəmbədəm naşad.

Gələndə bilmisən gəldigün yerün haradur,
Gedəndə həm genə bilmisən, ey evi bərbad!

Ədəb mülahizə eylə alanda sağər ələ,
Əqiq tək ləbi-şirindür dili-Fərhad.

Qaçan yerün haradur, heç yerə yolun yoxdur,
Kəmin edüb sana min yerdə tiğ ilən cəllad.

Piyalə etməgə meyxanələrdə mey içənə,
Gəzər dalunca sənün, yatma, kuzəgər ustad.

Nə qədr vəqt var əldə, mey iç, meyalud ol,
Ayılma nəş`ədən aləmdə, hərçi badabad.*

Hanı Skəndərü Daravü Xosrovü Cəmşid?
Xəyalə yox gətürən, aqibət nə oldı Qubad?

Qayə uçan güni toz qalxacaq, məsəl vardur,
Behiştü duzəx fikrini etmə hərgiz yad.
Bıraxma daməni-sağər əlündən, ey Saqib,

* Hər nə olur olsun

Dutanda ahuni səyyad eyləməz azad.

* * *

Məqami-əmn degül dəhri-duni-bədbünyad,
Sitəmlərindən anun kimdür etməsün fəryad.

Biri mənəm, edərəm ney kimi fəğan hərdəm,
Haçan mən olmuşam aləmdə bir nəfəs dilşad.

Çəmən-çəmən gəzər azadə xar gülşəndə,
Olub əsiri-qəfəs, əndəlib, evi bərbad.

Necə vırarsan oxı nazənin ahuyə,
Məgər ki, zərrəcə yox rəhm səndə, ey səyyad!

Sorar rəqib ləbi-lə`li-nabi-Şirini,
Başinə tişə vırar Bisütundə Fərhad.

Əyağun altınə diqqət gözilə eylə nəzər,
Dönüb qubarə, üzari-ərusdür damad.

Əlaci-möhnətü qəm badədür, ver, ey saqi,
Qədəh-qədəh, məni məst eylə, hərçi badabad.

Nə etdi xəlqə əziyyətdən özgə aləmdə,
Gedəydi dürdi-meyə, kaş, təxtü taci-Qubad.

Ayılma, var-yoxuvi ver şərabü mə`şuqə,
Kimün əlində qalub, noldı sərvəti-Şəddad?

Səd heyf, guşeyi-mehrabə oxşadub qaşuvı,
Çəkeydi əgri qılınc, bari, səhv edüb ustad.

Dutarmı daməni-təsbihi bağrıqan Saqib,
Bu küfri-zülfün anı eyləyən degül azad.

* * *

Fəryad ki, fəryadrəsim yox, elə fəryad,
Neytək şəbi-hicranidə yan, ey dili-naşad.

Ey qanə dönən, dutma dedim daməni-eşqi,

Tab eyləməsən* möhnətə, eylər səni bərbad.

Dutma bu rəhi-eşqi, sərəncamı yəmandur,
Sərdəftəri-üşşaqdə Məcnun idi ustad.

Tab eyləmədi möhnəti-eşqə, həzər eylə,
Səhralərə düşdi, ona eşq etmədi imdad.

Hicran güni başində yuva eylədi quşlar,
Hərgiz xəbəri olmadı, qəm etmədi imdad.

Şirin həvəsi kuhkəni dağlara çəkdi,
Çaldı başına tişəni şirin pərizad.

Şirin ləbini sormağa dil verdi rəqibə,
Əğyar deyürdi ona: Şirin, evin abad.

Bənd eyləmisən könlümi zülfün girəhində,
Ey qaşı kəman, kiprigi ox, gözləri cəllad.

Qarətgəri-küfrü dinidür xali-siyahun,
Heyrani olub qamətüvün sərv ilə şümşad.

Dil qanə dönər ləblərüvi yad eləyəndə,
Sormağdadur əğyar onı, eyləmərəm yad.

Saqib, hələ sən yetməmisən sərhədi-şe`rə,
Məqsudə yetərsən, eləsön xidməti-ustad.

* * *

Kim cünun zəncirinə zülfi-pərişan qoymış ad,
Eyləmiş sədparə könlüm, tirə müjgan qoymış ad.

Bir qəmi ki, Nuh əyyamindən olsun sərnigun,
Gah əbru, gəh kəman, gəh tiği-bürran qoymış ad.

Qaməti-bir mahvəşdür bağ içində bağban,
Baş çəküb toprağdən, sərvi-xuraman qoymış ad.

Könlümi qəm fövci viran eyləmiş hicran güni,
Gəh Süleyman(ə) mülki, gahi kafəristan qoymış ad.
Hər təbibə yüz dutub sordum əlaci-dərdi-dil,

---
* Eləyə bilməzsən

Əl gətürdi çarəsindən, dərdi-hicran qoymış ad.

Hər şəbi-hicran görüb pərvanə kim, eylər təvaf,
Ahi-aləmsuzimə şəm`i-şəbistan qoymış ad.

Seyli-əşki-dideyi-Məcnuni-sərgərdandür,
Firqəti-Leyladə dəryalər kimi qan qoymış ad.

Eylədim hicrində nalə ahi-aləmsuz ilən,
Yar dil vermiş rəqibə, əhdi-peyman qoymış ad.

Aləmi əhli-qərəz atdı qan dəryasinə,
Kasə-kasə içdigi al qanə vicdan qoymış ad.

Qılmadun səccadə rəngin badeyi-gülfam ilən,
Kim sana, ey zahidi-kəcbin, müsəlman qoymış ad.

* * *

Bimürüvvət Leyliyə Məcnun həmdəm qoymış ad,
Dami-zənciri-cününə, zülfi-pərçəm qoymış ad.

Bağban bülbül gözindən seyltək göz yaşinə,
Lalənün rüxsari-əlvanındə şəbnəm qoymış ad.

Qədrsiz hərdəm əyağ altında qalmış toprağə,
Bixəbər insafdən, xunrizi-adəm qoymış ad.

Çeşmi-mərdümküşlərindən Yusifün meyxanədə,
Kuzəgər bir pulə vermiş, sağəri-Cəm qoymış ad.

Ləblərün fikrilə bağrım qan olub, ey mahvəş,
Kim anı zəxmi-dili-üşşaqə mərhəm qoymış ad.

Ey deyən bu dəhr yeksər behiştün bağidür,
Səhvsən, bayqulər anə möhnətü qəm qoymış ad.

Zahidə həmsöhbət olma, olsa əldə cami-mey,
Mey ona ruhə əziyyətdür, cəhənnəm qoymış ad.

Çərxi-bədmehrün əlindən mən necə ah etməyüm,
Çarəsiz bir dərdidür insanlığa, kim qoymış ad.

Guşeyi-meyxanədən əl çəkmə, Saqib, badə iç,

Həmdəm ilə mürşidi-meyxanə xoşdəm qoymış ad.

* * *

Dərdi-dil izhar edərdim olsa idi dərdmənd,
Atəşi-hicranə düşdüm, ah neylüm, çün səpənd.

Çoxları saldun əyağə buriya tək mən kimi,
Eylədün, ey dəhri-dun, çox nanəcibi sərbülənd.

Daneyi-ənguri saldun kim, əyağlar altına,
Daneyi-təsbihə bax, olmış necə zahidpəsənd.

Əndəlibi-gülşənə verdün qəfəs küncin vətən,
Qoymadun yensün vəli gülşəndə bir xar gəzənd.

Sinəmi çak etdi ol məh navəki-müjgan ilə,
Salmamış əl çəkmədi kim, boynuma zülfin kəmənd.

Mən` edər zahid məni, guya xərabi-badəyəm,
Əhli-hal əhli-riyadən heç qəbul eylərmi pənd?

Saqiba, baxma həqarətlə kim olsa, dut əziz,
Muri-ləngə sərfiru qıl, eyləmə hiç rişxənd.

* * *

Birsi şəxsün şəhpəsənd olmış, biri əbləhpəsənd,
Xuni-dil dana yeyür, nadan əzası şəhdü qənd.

Mərdümi-baqeyrətün nə qədri var nə qiyməti,
Neyləmək sərdəftəri-aləm olubdur hər ləvənd.

Payimali-xar olub tər qönçələr gülzardə,
Əndəlibi-binəva dami-qəfəsdə paybənd.

Dil bilən kim olsa da, get, canuvı qurban elə,
Qanmaza tə`sir qılmaz cəhd ilə kim versə pənd.

Buriya tək dərdü möhnət payimalı oldı kim,
Qan oleydun, ey könül, gör kimlər oldı sərbülənd?

Sən də, ey dil, laübali olgilən bu xəlq tək,

Fikr vermə heç kimə, bəsdür bu qədri çunü çənd.

* * *

Yansun ahim odına, ey könül, əflaki-kəbud,
Qoydı qan bağrıma, hər an elədi qəmalud.

Gərdişi-nəhsinə qanlu fələkün heyrandur,
Kafərü ərməni, bu gəbrü müsəlmanü yəhud.

Çərxdən-çərxə dolandurdı məni iplik tək,
Qəmi-hicrün sənün, hiç qalmadı asari-vücud.

Məni rüsvayi-cəhan eylədi eşqün, getdi,
Dinü dil tərk elədim, olmadı hasil məqsud.

Yetdi əğyar sənün vəslüvə, ey şirinləb,
Nə qədr söləyüm hicründə sənün, ya mə`bud.

Bir səri-muyüvi versəm sənün, ey şirinləb,
Versələr təxt ilən kişvəri-sultan Məhmud.

Qaşlarun tağinə meyl etməsə zahid, nə əcəb,
Hərgiz həmrəng ola bilməz Xəlilə Nəmrud.

Lə`li-nabun mana meyxanə yolun göstərdi,
Tulladum məscidi, səccadəni, oldım mərdud.

Mənilə içməsə idi gər bu üzüm suyindən,
Adəmə eylər idi sidq ilə iblis sücud.

Saqiba, verdün əlündən səri-kuyin yarun,
Sana bu naleyi-hicran dəxi, get, verməz sud.

* * *

Əcəb degül yüzüvə gül, bənövşə etsə sücud,
Yüzündə şö`lələnür sanki atəşi-Nəmrud.

Qədəh-qədəh meyi-gülfami dur gətür, saqi,
Çəməndə bülbül oxur məst nəğmeyi-Davud.

Əziz ömri tələf etmə ahü nalə ilən,

Ayılma, məsti-meyi-nab ol, xumaralud.

Bir əldə dut güli, bir əldə ğəbğəbi-yari,
Nə töksə başüvə, töksün, dil açma, çərxi-kəbud.

Mey içməsön, eyləmə seyr çəmənü gülzari,
Eşitmə, söləsə vaiz hədisi-Adü Səmud.

Müğənni Şur oxıyur yari-dilnəvazimçün,
Qulağimə yetişür bangü naleyi-neyü ud.

Piyaləni ələ aldıqda, öpməmiş içmə,
Üzari-Leylivü Şirindür, olub nabud.

Məni məlamət edər xəlq: eylə badəni tərk,
Keçərmi, olsa qiyamət Əyazdən Məhmud?

Əl atma pərdeyi-namusi-xəlqə, düşmən ola,
Əgər varundur, əzizim, yanunda guşü şünud.

Məbada eyləyəsən xəlqə eyb, eylə həzər,
Məsih eylədi neyçün pəs asimanə süud.

Qəzəl şüarını, Saqib, Cəlaldən ögrən,
Rümuzi-şe`r bütün ondadur, bəli, mövcud.

* * *

Gözəl rüxsarüvə baxdıqca könlümdə səfa artar,
Necə kim, hər nəfəs xurşididən ayə ziya artar.

Pərişan eylədikcə hüsnüvə giysuyi-pürçini,
Olur aləm əsiri mən kimi bəxti qəra artar.

Könüllər xunbəhasın verməsön gər lə`li-nabundan,
Rüxi-alundan istər xəlq busə, xunbəha artar.

Demə verməm zəkati-hüsnimi, ey sərvi-azadım,
Rəhi-eşqündə məntək xəlq olur müflis, gəda artar.

Eylə ziba gözəlsən, dindirəndə arizün titrər,
Qızarur lalətək əzbəski, hüsnündə həya artar.

Mənilə söhbət eylərsən, görüb həsrət çəkər aləm,

Çıxar bu daməni-vəslün əlimdən, müddəa artar.

Edübdür parə-parə könlümi əbrulərün tiği,
Bu qəmzə tirini vırmaq nə hacətdür, yara artar.

Dutub dünyani fitnə, bir də sən bu çeşmi-bədməstə,
Çəkərsən sürməni, zalim, deməzsən bir bəla artar.

Dilündən qıl həzər, qurban sana, bir nəfsi incidmə,
Əgər bir nəfs səndən incisə, gün-gün bəla artar.

Rəiyyət xatirin sındırmasun sultan gərəkdür kim,
Məhəbbət göstərən vəqtdə, birə min can fəda artar.

Qoyursan səcdəyə baş, zahida, cənnət xəyalilə,
Gətür baş səcdədən, bu səcdədən buyi-riya artar.

Səbu küncində mey qaldıqca ləzzət, ruh alur ondan,
Onun hər qətrəsindən möhnətü dərdə şəfa artar.

Necə azadlıqdur, Saqiba, hər ləhzə sölərsən,
Əgər azadəlik vardur, neçün cövrü cəfa artar?

* * *

Gər olsa pərişan, pərişanlığün artar
Yarun xəmi-giysuləri, giryanlığün artar.

Divanə olarsan, həzər et, olma əsiri,
Məcnun kimi hər ləhzədə heyranlığün artar.

Ey dil, rəhi-meyxanəni dut əldə piyalə,
Məst ol meyi-gülfam ilə, insanlığün artar.

Yarun səri-kuyini verüb alma behişti,
Adəm kimi hər ləhzə peşimanlığün artar.

Məşğul özüvi eyləmə səddanəyə hərgiz,
Zahid rəvişin tərk elə, nadanlığün artar.

Bimə`ni sözə vermə könül, əhli-yəqin ol,
Dut daməni-əmri-həqi, irfanlığün artar.

Tabe` özüvi eyləmə heç düşkini-nəfsə,

Alma nəzərə zərrəcə, heyvanlığun artar.

Yusif qəzəlin al nəzərə şe`ri yazanda,
Saqib, bu sana fəxr, süxəndanlığun artar.

* * *

Hər kim əlinə camü meyi-ərğəvan dutar,
Qəm çəkməsün ki, rahəti-ruhi-rəvan dutar.

Kəc baxsam ol qəra qaşuvun əgri tağinə,
Müjganlarun xədəngi gözümdə məkan dutar.

Bazari-hüsnə çıxson əgər sən bu hüsn ilə,
Yusif olur xəcil, üzin eldən nihan dutar.

Bir tiri-qəmzəyə, gözəlim, sərvqamətim,
Can nəqdi əldə verməgə pirü cəvan dutar.

Səyyad gözlərün salub avarə könlümi,
Zülfün içində quş kimi xoş aşiyan dutar.

Çox təşnədür qan eyləməgə tiğ qaşlarun,
Nahəq kim etsə qan, onı axırda qan dutar.

Hüsnün məlahətilə dutub külli-aləmi,
Kim ittifaq eləsə, əlbət cəhan dutar.

Əfsus, yetdi vəslüvə bir-bir rəqiblər,
Nalәm şəbi-fəraq rəhi-asiman dutar.

Eşqün həvasi eylədi divanə Saqibi,
Hicründə sübhətək rəhi-ahü fəğan dutar.

* * *

Zülfündə, məhvəşim, dəli könlüm məkan dutar,
Sınmış qanadı quş necə kim, aşiyan dutar.

Ağzun nə sehr qıldı çəküb kamə zülfüvi,
Əfsunsuz ol şəkər ləbün əf`i ilan dutar.

Əhli-təriqət ilə müxalifdü dəhri-dun,

Hər nanəcibzadə özin hökmran dutar.

Bundan bətər bəla olumı* hər yetən gedüb,
Meyxanələrdə cami-meyi-ərğəvan dutar.

Təsbih danəsilə məni zahid alladur,
Guya özin bu nov` ilə əhli-cinan dutar.

Abi-ğəssalə məs`ələsin şərh qılmamış,
Arif yanında vaiz özin nüktədan dutar.

Şahun gəda ilə nədür, ey dil, təfavüti,
Kim olmış olsa, qəbr evini xaniman dutar.

Razi-dəruni kəşf eləmə xəlqə, Saqiba,
Aqil odur ki, sirri-dəruni nihan dutar.

* * *

Niqabdən haçan hüsnün kənarə çıxar,
Görən təəccüb edər, sanki bir sitarə çıxar.

Gözün sənün dedim, ey şux, oxşar ahuyə,
Dedi ki, ahu demə, şirdür şikarə çıxar.

İşarə etdi göz, əgri qaşlarun, çıxma,
Cəhanə salmağa fitnə bu mahparə çıxar.

Könüldə eylə dutub şö`lə atəşi-eşqün,
Dəgəndə navəki-qəmzön, dutar şərarə çıxar.

Qılınc etsə məni parə-parə, can çıxmaz,
Boynum, qəmzə ilə eyləsön işarə, çıxar.

Tökülməgə yüzüvə qoyma zülfüvün tarın,
Görən deyər, əcəba, əf`i heç üzarə çıxar?

Gözi necə çıxarar dəgsə tir peydərpey,
Şəbi-fəraqdə hər ləhzə intizarə çıxar.

Behişti-huri sənün tale`indədür, zahid,
Mənim də tale`imə dami-zülfi-qarə çıxar.
Gəlür bəla başinə kim ki, saxlamaz dilini,

* Olurmu

Sözi həqq olsa da, Mənsur kimi darə çıxar.

Həyat nəqdini sərfi-şərabü mə`şuqə,
Qumarbazi-əcəl tez onı qumarə çıxar.

Min ahü nalə edim, can çıxan degül təndən,
Bir nimqəmzə ilə eyləsön işarə, çıxar.

Kim oldı əsr süxənsənci, Saqib, Azər tək,
Kimün nə həddi var olsun, var, aşikarə çıxar.

* * *

Böylədür adət, siminbədənü məhrüxsar,
Etdigi əhdə vəfa eyləməsün, ey dili-zar.

Əl atursan səri-zülfinə, vırar əf`i kimi,
Olmaz azad dəxi hər kim ona olsa düçar.

Tiği-əbruyi-pəriçöhrələrün rəsmi budur,
Seyltək qan tökə, rəhm eyləməsün leylü nəhar.

Fitnədür başdan-əyağə, bu gözi qarələrə
Uyma, ey dil, səri-kuyinə dolanma zinhar.

Zəhməti aşiqi-biçarə çəkər yarə görə,
Aparur ləzzətini lə`li-ləbindən əğyar.

Bivəfalərdü, pəriçöhrələrə dil vermün,
Əsər etməz bulara, dərdi-dil etmün izhar.

Adəm övladı, yalandur, desə var məndə vəfa,
Etmişəm təcrübə mən səngi-məhəkdə nə ki, var.

Dutma meyxanə yolın, badəpərəst ol, zahid,
Dami-təzvirdü bu, qoygilə təsbihi kənar.

Bu qədr naleyi-dilsuzdən əl çək, Saqib,
Ahü zarilə müyəssər ola bilməz didar.

* * *

Zahidün təsbih ilə gər zikri-əlfü lamı var,

Guşeyi-meyxanənün mən kimi bir bədnamı var.

Vəsfi-sübhü şamı çox şərh etmə, zahid, əl gətür,
Vəsf qıl bu məhvəşi ki, sübhigahi, şamı var.

Ehtiraz et, ey könül, qaç türreyi-pürpiçdən,
Çox yavuq getmə, əsir eylər, künd damı var.

Bu dili-divanə biaram idi, ey qönçələb,
Eylədün zülfün əsiri, imdi çox aramı var,

Bilməsün, əğyardən gizlin, mən ilə bir danış,
Ləblərün heyraniyəm, şəkkər kimi düşnamı var.

Keçdi Məcnun vəqti, imdi mən sənün məcnunəm,
Ey cəmali rəşki-Leyla, hər kəsün əyyamı var.

Qoy dağıtsun tiri-qəmzön mərdümi-çeşmümdəkin,
Səndən özgə qeyriyə, ey şux, bəlkə ramı var.

Gəl, çağır məscidə, zahid, məni meyxanədən,
Gəlmək olmaz saqinün, gəl, gör, meyi-gülfamı var.

Qoy, hilali-mahi-nov, fəxrini etsün çərxi-dun,
Saqibün də qaşlarun tək tiği-xunaşamı var.

* * *

Məcnun ki, deyürlər sana, Leylayə nəyün var?
Avarə düşüb daməni-səhrayə, nəyün var?

Məcnunsən əgər tikməyüb hiç lanə başunda,
Quşlar nə salub başuva bəs sayə, nəyün var?

Canan tələbin hər kəs edir, sən də edirsən,
Kuyinə gedirsən, de görüm, mayə nəyün var?

Zəncirə deyürsən ki, giriftarü əsirəm,
Bənd etdi səni hansı təmənnayə, nəyün var.

Can nəqdini əvvəl al ələ, Leyli adın çək,
Gər dutmayasan, düşmə bu sövdayə, nəyün var.

Nə`leyni çıxart, getsön əgər kuyinə yarun,

Ey Musiyi-can, vadiyi-Sinayə, nəyün var.

“Ərni” deyəcəksən genə sən, “lən” eşidərsən,
Salmaqlığa bu başuvı qovğayə nəyün var.

Dildar gəzir göz qabağında, demə “ərini”,
Fəxr eyləmə boş-boş yədi-beyzayə, nəyün var.

Mənsur kimi, ey eləyən də`viyyi-ənəlhəq,
İsbatinə həqqün, de görüm, ayə nəyün var?

Saldun oda Qur`ani, sözüm yox ona, Sən`an,
Yetməkligə sən ol büti-tərsayə nəyün var.

Saqib, demirəm şe`rdə mümtaz degülsən,
Düşsün başa əş`aruvi, həmpayə nəyün var.

* * *

Güldə nə hüsn, ey gözəl, hüsn budur ki, səndə var,
Güldə hanı bu rəngü bu, hansı gülü çəməndə var.

Aləmi fikri-ləblərün eylədi badə düşkini,
Dəxli bu ruhpərvərin nə şəkkərü nə qəndə var.

Ləblərivün hekayəti qönçəni etdi bağrıqan,
Ölmərəm heç soram onı, onda nihani xəndə var.

Etdim əsir könlümi türreyi-müşki-famüvə,
Dami-cününə mailəm, tərhi bu pürşikəndə var.

Arizüvün sorağıni lalədən eylədim, dedi,
Öpgilən bağban əlin, oxşarı yasəməndə var.

Dağı dağıtdı kuhkən tişə ilən, çətin degül,
Kim yıxar ayrılıq dağın, gör, necə tab məndə var?

Sirrimi etmədim nihan, yetdi rəqib vəslüvə,
Öldürənün günahi yox, cümlə günəh öləndə var.

Baği-behişt vəsfini eyləmə, zahid, əl gətür,
Nisyədən əl gətürmişəm, istədigim vətəndə var.

Buyi-riya edən edüb Saqibi yadə safi-dil,

Məsti-xumari-badədür, nə məkrdə nə fənddə var.

* * *

Necə heyranun olmum, səndə kim, bu sərvi-qamət var,
Qiyamət eyləyəndə kim deyər bir də qiyamət var.

Necə mən eşqüvi tərk eyləyüm bir dəm, kəmanəbru,
Gözün qurbaniyəm, səndə qəribə işvə halət var.

Necə mən söləyüm, ey şux, Yusifdür gözəl səndən,
Gözəllik xətm olubdur səndə, hüsnündə məlahət var.

Gözəl olseydi Yusif bir kəlafə qiymət olmazdı,
Degül fitnə, hiç səntək gözəllikdə əlamət var.

Yatubdur qaşlarun tağində rahət nərgisi-məstün,
Xütən ahusi tək bilmiş bu yerdə istirahət var.

Qutarmaz tar zülfün qissəsi min il də şərh etsəm,
Bu zənciri-dili-divanədə hədsiz hekayət var.

Toxunsa tar zülfün hüsnüvə ahəstə-ahəstə,
Solar gül bərgi tək, ey lalərüx, bəs ki, lətafət var.

Sataşma zahidün təsbihinə mehrab küncində,
Çalar əqrəb kimi, zahiddə min kəşfü kəramət var.

Əsiri-rəng olmaq, Saqiba, divanəlikdəndür,
Əsiri-rəngdən qaç, od kimi onda şərarət var.

* * *

Lə`lündə məgər, mahvəşim, şəhdü şəkər var,
Ya arizi-alunda sənün laleyi-tər var.

Gizlətməgilən hüsnüvi bu zülfün içində,
Qoy xəlqi təmaşa edə, nöqsani məgər var?

Hər yanda mana qəmzön oxı eylər hücumi,
Sinə açaram, gör, nə qədr məndə hünər var.

Bu hüsn elə fəth eləmiş kişvəri-hüsni,

Əlbəttə, dutar aləmi hər kimdə ki, zər var.

Lə`li-ləbüvin məstiyəm, ey sevgili yarım,
Meyxanəni tərk eyləmişəm, meydə kədər var.

Tərki-dilü din eyləsəm eşqündə, əcəbdür,
Yə`qubdə sən tək necə bir şux pəsər var.

Rahətligi heç gözləmək olmaz bu cəhandə,
Daim tökülər qan, nə qədr nəsli-bəşər var.

Bir qətrə də su verməgilən, qət` elə getsün,
Bir nəxl kim, onda əsəri-təlxi-səmər var.

Saqib, oxıyar şe`rüvi məhparə gözəllər,
Oynar qəzələndə sənün əzbəs ki, əsər var.

* * *

Görmüş xətani çeşmi-siyahun xətası var,
Min fitnə guşəsində yatub, min bəlası var.

Şanə vıranda zülfüvə ahəstə vırgilən,
Hər riştəsində mən kimi min mübtəlası var.

Ver busə, bari, navəki-qəmzön şəhidinə,
Lə`li-ləbündən hüsnə kimi xunbəhası var.

Ey dil, inanma, mahliqalərdən əl gətür,
Əğyarə dil verüb, deməz heç kim vəfası var.

Ey söləyən mana, eyləmə nalə ney kimi,
Al bir xəbər nəyün nə içün ahü vası var.

Ey dil, verəndə yüz sana qəm uyma zahidə,
Saqi əlində mey kimi ruhun qəzası var.

Sövdayi-zülfün eylədi divanə Saqibi,
Bu bəxti qarənün belə bəxti-qərası var.

* * *

Başunda gərçi taci-zəri-Keyqubad var,

Əmma onı başundan alan kəsdə dad var.

Solmazdı arizün güli, dəgməzdi göz sana,
Zatunda xakü atəş ilə, abü bad var.

Mə`lum olar yəmanlıq ilə qədri-yaxşılıq,
Çünki Hüseyn(ə) müqabili ibni-Ziyad var.

Cuyi-zəmanə zərreyicə saf olan degül,
Daim onı bulanlıq edən bədnihad var.

Gəh padşah gəda, gəda gah şah olur,
Əlbəttə, bu müamilədə bir murad var.

Əl atma böylə sirrə xəbər almamış,
İnkar edir, çoxında yəman e`tiqad var.

Daim həmişə gözləmək olmaz tərəqqini,
Hər bir tərəqqinün qabağında kəsad var.

Rüsvayi-aləm eyləmə, zahid, bu badəni,
Təqsir içəndədür, demə meydə fəsad var.

Sındırma şişə könlümi səngi-cəfa ilə,
Ey qan qoyan bu bağrıma, ruzi-miad var.

İncitmə nəfsini o kəsün, səndə yox işi,
Yovmül-hesabə səndə əgər e`tiqad var.

Az bilmək ilə kargəri tə`nə etmə, al,
Fikrin də etmə, səndə məgər fəhm zad var?

Bu durduğun məkan sana gər bədsə, Saqiba,
Qaç, durma, dilnişin sana çox-çox bilad var.

* * *

Mehr asimanda cilvə edər, yer yüzində yar,
Yerdən gögə bu mehrün o mehr ilə fərqi var.

Zəncir damənini dutar dil, fəğan ilən,
Hərdəm göröndə şanəni giysuyi-tabdar.

Etdim əsir könlümi zülfün kəməndinə,

Azadə eyləyüm necə, yox məndə ixtiyar.

Bazari-hüsni bağladun, ey şux, Yusifə,
Görməz sənün kimi gözəli bir də ruzigar.

Zahid, fərib gözlərüvün mübtəlasiyəm,
Ahu, təəccübəm, necə şir eyləmiş şikar.

Oxşatmaseydi qaşuva mehrab özin əgər,
Baş əgməz idi zahid ona leyl vən-nəhar.

Yəğmayə verdi xalü xətün dinü dil genə,
Eşqün yolunda tərk elədim, getdi hər nə var.

Kəc baxmaseydi xəlq gər ustadə, Saqiba,
Od dutmaz idi atəşi-zülm ilə hər diyar.

Ey mahparə, mən necə dil verməyüm sana,
Əbrularun kəman, qədün sərv, gözün xumar.

Bir dəm bu sərvqamət ilə bağə qıl xuram,
Qıl bağbani-dəhri xəcil, sərvi şərmsar.

* * *

Məst etdi xümdə badəni, çeşmi-xumari-yar,
Od urdı lalə arizinə, gülüzari-yar.

Tərk eylə eşqini bu məhün, ey deyən mana,
Etmiş əsiri-zülfi-xəmi-tabdari-yar.

Eyb etmə gözlərim tökə xunabi-həsrəti,
Leylün-nəhar çəkməmisən intizari-yar.

Qan etməz idi bağrımi əğyar tə`nəsi,
Bir zərrə olseydi əgər e`tibari-yar.

Var vəchi ney kimi eləsəm ahü zar mən,
Tökmüş üzarə zülfüni, etməz kənar yar.

Meyxanələrdə naleyi-“va həsrəta”yə bax,
Əzmi-şərab etdi ləbi-abdari-yar.

Saqib, xəlayiq eyb eləyür hər nəfəs sana,

Bu pir vəqtdə niyə oldun düçari-yar?

* * *

Qoydı qan bağrıma kim, lə`li-ləbi-cananlar,
Nə xətadidə imiş zülfi əbirəfşanlar.

Xublər eşqini tərk eyləmək asan bilmə,
Yandırubdur oda Qur`anı neçün Sən`anlar?

Eşq qanunini ey bilməyən, heç dəm urma
Eşqdən, eyləmün tərki-dilü imanlar.

Yetməsən məqsədə, köynək geyəsən Qur`andan,
Nəqdi-can əldə dutub verməyəsən qurbanlar.

Dutmaz idi bu cəhan mülkini aşub belə,
Nəfsə az eyləsə idi sitəmin sultanlar.

Başı dəgsə əgər ərşə genə heç zad olmaz,
Verməsün boş yerə zəhmət özinə nadanlar.

Bağlıdur çarə yolı, qanmaza təklif etmə
Sözün həqqin, nə qədr sərf edəsən dərmanlar.

Eylə azad özüvi, kim dedi təhsil etmə,
Elmlən, bax, dolıdur hər vərəqi-Qur`anlar.

Saqiba, eyləmə şikvə sitəmindən yarun,
Görmədün netdi Züleyxayə məhi-Kən`anlar.

* * *

Nə bilsün qədrini, təklif qılma, saqi, nadanlar,
Nədür mey nəş`əsi, sevməz, bəli, abadi viranlar.

Soruşma lə`li-nabun qiymətini bixəbərlərdən,
O kəs sərrafdür, qədrin bilür, həm qiymətin anlar.

Zəmanə dövləti heyvanlarə təqsim qılmaqdan,
Dutub Məcnun kimi məskən biyaban seyrin insanlar.

Qəfəs küncində nalə etmə, bülbül, gül fəsli,

Əyağdən düşdi növrəs sərvlər, soldı gülistanlar.

Cərəs fəryad edər, dur, yatma, gəldi məhmili-Leyli,
Dolub Leyla sədasiylə, səda eylər biyabanlar.

Yüz aç, ey sərvnazım, hüsnüvi zülf içrə gizlətmə,
Cəmalun pərtövindən nur alur şəm`i-şəbistanlar.

Qaşuvun tiğilə, cana, canımi al, qoyma can üstə,
Kəsəllər xəlqi-aləm eyd olanda çünki qurbanlar.

Nola, halım pərişan olsa, həm zəncirə yüz dutsam,
Çəkəndə şanəni zülfinə bu zülfi pərişanlar.

Cəhan mülkində, Saqib, xoş keçər meyxanə küncində,
Mey iç, sağərpərəst ol, etsə gər təkfir nadanlar.

* * *

Qaşun fikri büküb, ey sərvqəd, qəddim kəman eylər,
Ləbün qan qönçə bağrın atəşi-hüsnün xəzan eylər.

Edər xalun təmənnasıni Adəm ehtiraz etməz,
Deməz kim gənci-hüsnə, xalın ol pasiban eylər.

Dutub mehrab küncin zahid heç məsciddən əl çəkməz,
Səri-kuyin verüb, ey şux, ol meyli-cinan eylər.

Soram lə`li-ləbündən, dil təmənnasında qan olmış,
Ləbün fitva verür ancaq xədəngün qəsdi-can eylər.

Girüb deyri-hüccət içrə zahid vırma naqusi,
Dili-Məcnun anı kim, məhmili-Leyli güman eylər.

Xədəngün canıma, rüxsari-alun xəlqə göstərmə,
Pərirüxsarlər bazari-hüsn içrə ziyan eylər.

Məsiha bircə ol sirri-ləbündən olsa kim agəh,
Yüz e`cazi-Məsihi hər nəfəs, hər dəm bəyan eylər.

Dili-Məcnuni azad eyləyən yox zülfi-Leyladən,
Cərəstək naleyi-Məcnun dili-Fərhadi qan eylər.

Nədamət guşəsində, Saqiba, künci-məlamət dut,

Sənün tək kim belə xuni-cigər gözdən rəvan eylər.

* * *

Rüxsarını ol məhvəş hər dəm ki, nihan eylər,
Zülf içrə necə bilməm, dil tabü təvan eylər.

Ey şux, səri-kuyin verməm, verə kim cənnət,
Cənnət səri-kuyindü, kim meyli-cinan eylər.

Dəm urma, könül, hərgiz e`cazi-Məsihadən,
Bu mahliqa yüz min e`caz əyan eylər.

Zənciri-cünun urmış aləmlərə giysusi,
Məsti-siyəhi-Çini aşubi-cəhan eylər.

Yegdür olasan sərməst izhari-nübüvvətdən,
Ey dil, bu təmənna kim, Musani şəban eylər.

Qal əhlinə qandurmaq hal əhlinə müşkildür,
Söz söylə həqiqətdən, qanmaz nə bəyan eylər?

Məst olmasa hər kimsə bu cami-məhəbbətdən,
Ol kəs özini bilməm, aya nə güman eylər?

Səccadəni, təsbihi ver badeyi-gülrəngə,
Kim etsə bu sevdani, fikr etmə ziyan eylər.

Beş gündü bu dünyanun sultanlığı, peymani,
Aldanma bu təzvirə, əhd etsə, yəlan eylər.

Bu dairədən keçsəm, mən` eyləmə, ey zahid,
Bir aləmi-digərçün könlüm təyəran eylər.

* * *

Nə görmüş badədən zahid, mey içməz ictinab eylər,
Süleyman(ə) mülki tək bəs din evin neyçün xərab eylər?

Şərabaludə görsə bir səni meyxanə küncində,
Deyər əstəğfürüllah, əhli-duzəxdən hesab eylər.

Oxur ümmülxəbais badəni, ümmülxəbaiskən,

Təəccübdür, özin əsrün imamindən hesab eylər.

Dolanım başuva, ey saqiyi-gülçöhrə, ver sağər,
Bu pirü natəvanun kim əlin dutsa, səvab eylər.

Könül əğyarə vermiş, yüz dutar ol bivəfa məndən,
Məni hicran odunda yandırur zalim, kəbab eylər.

Tökər xunabi-həsrət seyl tək bu çeşmi-giryanım,
Qoyar qan bağrıma ol məh, rəqibi kamyab eylər.

Çağırma məscidə meyxanədən bu Saqibi, naseh,
Ləbi sağər ləbində, dəmbədəm meyli-şərab eylər.

* * *

Ləbündən ayrı camü badə hər kim arizu eylər,
Anı meyxanədə piri-muğan biabiru eylər.

Olub məhvi-cəmalun, əgri çəkmiş qaşlarun tərhin,
Sanur mehrabdür zahid, görəndə sərfiru eylər.

Məlamət eyləmə, ram olmayur dil dami-zülfündə,
Necə ram olmayum, zəncirdən divanə xu eylər.

Dedim, ey sərvnazım, dərdi-eşqə çarə vardurmi?
Dutub gül bərgi-tər lə`li-ləbün göstərdi bu eylər.

Dutar həmsöhbət ol təsbih ilə məsciddə, ey zahid,
Mənilə guşeyi-meyxanədə söhbət səbu eylər.

Demə aləmdə mən qəm çəkmərəm, rüsvayi-eşq olmam,
Xəbərdar olmasan, dövran əsiri-mahiru eylər.

Eylə ziba gözəlsən, Saqib olmuş məhvü heyranun,
Səni gəh deyridə, gəh xangəhdə cüstücu eylər.

* * *

Şərabi-nabı qılma zahidə təklif, xu eylər,
Gözün qurbanı, saqi, cami-Kövsər arizu eylər.

Şərabi-lə`li-nabun nəş`əsin çün hər yetən bilməz,

Bilür qədrini ol kəs, səcdeyi-xaki-səbu eylər.

Ləbi-yar ilə mən həmsöhbətəm ayineyi-dildə,
Durub mehrabdə zahid kim ilə göftügu eylər?

Əcəbdür eyləsəm izhari-nifrət gülsitanlardan,
Sevər cənnət gülin, rüxsari-yarı kim ki, bu eylər.

Dili-divanədən sordum neçün böylə pərişansan,
Dedi, çünki pərişan zülfini ol mahru eylər.

Dedim zəncirə, bir dəm əl gətür divanələrdən, keç,
Nigarun dutdı tari-zülfini göstərdi bu eylər.

Bu möhnətxaneyi-qürbətdə bilməz kimsə əhvalım,
Kimə izhar qılsam dərdimi, tez biabiru eylər.

Cəhanda, Saqiba, heç incimə yarun cəfasından,
Zəmanə əhli-hali incidür, bağrını su eylər.

* * *

Dəri-meyxanədən zahid keçəndə hayü hu eylər,
Çəkər damən xərabi-badeyi-nabə, tufu eylər.

Edər təkfir camü badəni mehrab küncində,
Gedər xəlvətdə əmma badə dürdilə vüzu eylər.

Gəlür buyi-riya məscid yolında buriyasindən,
Qurar təzviri-damən xəlqçün, hur arizu eylər.

Könül, ta var ömrün, çəkmə əl meyxanə küncindən,
Qəmü ənduhə çarə saqi camü səbu eylər.

Şikayət eyləmə namərd dəhrün inqilabından,
Dəvam et, tərki-adət eyləməz cövrin, ədu eylər.

Könül, bir badə ver gülzari-hüsni heç xəzan olmaz,
Görəndə qamətini sərvi-novrəs sərfiru eylər.

Cəmalun əksi ilə eylərəm ayinədə söhbət,
Fəqihi-mədrəsə bica özilə göftügu eylər.

Dolanur başuva, göstərmə, növki-tiri-müjganun,

Dəmadəm aşiyani-zülfüvi dil cüstücu eylər.

Məlamət etmə, naseh, ney kimi Saqib fəğan etsə,
Sana cövrin dəmadəm, hər nəfəs bu mahiru eylər.

* * *

Müftiyi-şəhr badəni gərçi həram edər,
Saqi, gözün fədası, gətür, fikri-xam edər.

Gördüm fəqihi dün dutub əldə piyaləni,
Sandum şərabi-köhnəni meyli-təmam edər.

Əhsən dedim fəqihə əcəb badəxarsən,
Ərvahi-ənbiya sənə gögdən səlam edər.

Verdi cəvab, badə degül, xuni-xəlqdür,
İçsəm şərabi həq mənə duzəx məqam edər.

Ümmil-xəbaisi içsə hər kim əlacı yox,
Məhşər güni cəhənnəm anı kamə ram edər.

Xuni-dili-yətimi, get iç, gər hərifsən.
Bir qətrəsi səhihi-rəmimi-izam edər.

Övqaf qanı içgilə, abi-həyatdür,
Lə`nət şərabə həzrəti-xeyrül-ənam edər.

Əstəğfürüllah ilə alur həşt cənnəti,
Ol kimsə ki, cəhandə gedüb qətli-am edər.

Meyxanə naz, saqiyi-gülçöhrə damdür,
Rindi-şərabxarə fəribi-əvam edər.

Sufi həram edübdü bizə sərfi-badəni,
Saqib ki, heyf, saqiyə təklifi-cam edər.

* * *

Çox ahü nalə, könül, etmə xoş zəmanə yetər,
Ki, şəm` dövrinə pərvanə yanə-yanə yetər.

Gəhi gədadən, gəh şahidən zühur eylər,

Sifati-məzhəri-həq ki, şəbanə yetər.

Nə ruhi-Məryəmə nəfx oldı, diqqət eyləgilən,
Məbada eyləyəsən səhv, kim gümanə yetər.

Təvafi-Kə`bəyə, zahid, çağırma Məcnuni,
Rəhi-kuyi-Leylidən üz, görək nə yanə yetər.

Çox açma balü pər əflakə abü daneyçün,
Hüma kimi qanadun tiri-xunçəkanə yetər.

Gədadə, şahdə yox fərq, iksi də birdür,
Kəmal şərtidür, əhli-kəmal kanə yetər.

Qəfəsdə eyləmə çox ahü naləni, bülbül,
Qarışdı xarə, gülü gülistan xəzanə yetər.

Əcəb degül dili-divanə dami-zülfündə,
Əsir düşsə, qaçan quşlar aşiyanə yetər.

Xəbər alanda nolur hali-aşiqi-zari,
Fəğanım hər gecə hicründə asimanə yetər.

Rəqib vəslinə yetdi bu məhvəşün, ey dil,
Şəbi-fəraq sana naleyi-şəbanə yetər.

Gözümdə məskən edüb tiri-navəki-qəmzön,
Əyağuvi, qoy öpüm, bari, xunbəhanə yetər.

Qəzəldə zövq nədür zahid anlamaz, Saqib,
Bu rütbə şövqi, bu e`caz nüktədanə yetər.

* * *

Şərab içün mana, saqi, dolı qürabə yetər,
Nədür piyalə, məni-xanimanxərabə yetər.

Sual etsön əgər dürdi-badə müzdindən,
Gümanımız bu sınıq sağərü şərabə yetər.

Yapuşsa kim əlimə bir əyaği-badə ilən,
Gər olsa həşr güni, hədsiz səvabə yetər.

Dağıtma arizə giysuyi-ənbərəfşani,

Dutulsa gün yüzi, aləmlər iztirabə yetər.

Yanan od içrə ilan kimi qıvrular könlüm,
Haçan ki, şanə bu giysuyi-piçü tabə yetər.

Şərareyi-rüxüvə lalə yandı gülşəndə,
Bu şö`lənün odı axırda afitabə yetər.

Əsir qıl dili-divanəmi, kəmanəbru,
Bu kakilündə durubdur tənab-tənabə yetər.

Bu şuxun eyləsə kim xalunun təmənnasın,
Cəhani məhv eləyən tazə inqilabə yetər.

Bu mahparənün ağzından öpsə kim, Saqib,
Tapar xəzineyi-Qarunı, lə`li-nabə yetər.

* * *

Tökər bu qəmzə oxun qanımi bəhanə yetər,
Dəgən zəmanda mana, naləm asimanə yetər.

Olanda pir biri qanıni tökərlərmi məgər?
Tələsmə, növbəti qan tökməgün cəvanə yetər.

Fəğan ilə gülə yetmək olarmı, ey bülbül,
Ki, şəm`ə, gör, necə pərvanə yanə-yanə yetər.

Xəm oldı qamətim əbrulərün xəyalilə,
Kəmanəbru, qəmi-kəman gümanə yetər.

Könül bu tiri-müjönlə əlaqə etmədədür,
Çifaydə, bu oxun çeşmi-xunçəkanə yetər.

Qaşun qılıncına hökm eylə qanımi töksün,
Gözündə qəsdi-can eylər məgər ki, anə yetər.

Xərabə məscidi, Saqib, verür sana zahid,
Əlində cam ona ancaq şərabxanə yetər.

Təfaxür etməgilən bir də hüsnüvün gülünə,
Əsər xəzan yeli, axır bu gül xəzanə yetər.

Qılınc bağlamaq ilə deməzlər sən kişisən,

Kişilik aləmi meydanda imtəhanə yetər.

Şikayət eyləmə çox, e`tibarımız getdi,
Tələsmə, səbr elə, xoşbəxt bir zəmanə yetər.

* * *

Kim içsə mey ləbün fikrilə qanə düşər,
Qanı aradən itər, mən kimi ziyanə düşər.

Rəqibə vermə könül, qoyma kuyüvə gəlsün,
Əlinə gündə onun gəlməgə bəhanə düşər.

Vıranda tab qaşun tiğinə, kəmanəbru,
Xəbər ki, dutmayacaqsan nə lərzə canə düşər.

Bu tiri-qəmzəvi çox vırma könlümün quşına,
Ona bu künci-ləbündə bu qarə danə düşər.

Batanda ay, yanıma gəlgilən mənim, ey məh,
Gözün fədası olum, xəlq bədgümanə düşər.

Vəli bu pərtövi-hüsnün deyir bu gülməgüvi,
Günəş çıxanda onun nuri hər məkanə düşər.

Təvaf etməgə pərvanə şəm`i-rüxsarun,
Əyağinə odın ol dəmdə yanə-yanə düşər.

Dağıtma səfheyi-rüxsarə zülfi-pürçinün,
Ki, tazədəb genə aşub bu cəhanə düşər.

Qəzəldən hər yetən hər ləhzə dəm vırar, Saqib,
Dəxi xəyal eləməz naşi nüktədanə düşər.

* * *

Badə içdim ləbüvün fikrilə sağər-sağər,
Qoy desün zahidi-bixud mana, kafər-kafər.

Könlümi qəmzə oxıyla elə parə-parə,
Bu dəli, ləblərüvi öpməgin istər, istər.

Can alur, baxsa gözün hər kəsə heyran-heyran,

Aləmə fitnə salub, sürməni neynər, neynər.

Dindirəndə məni hər ləhzə ki, şirin-şirin,
Dəmbədəm qəndə urar tə`nəni şəkkər-şəkkər.

Çək yüzündən bu qəra zülfüvi bir dəm, bir dəm,
Əksi-hüsnün mana bir dəf`ə də göstər, göstər.

Tökmisən hüsnüvə giysuləri pürçin-pürçin,
Cəbrəil sanki açub hüsnüvə şəhpər-şəhpər.

Ey mənim qan eləyən bağrımi zalim-zalim,
Dayadun sən vətənün bağrına xəncər, xəncər.

Vermə bu mahvəşə dil genə Saqib-saqib,
Uyub əğyarə, demə bir dəxi dilbər, dilbər.

* * *

Döndərdi qiblədən məni bu sərvnazlər,
Yetməz hərayə naleyi-suzi-güdazlər.

Tə`n etmə əhli-eşqə, təqazayi-eşqdür,
Məhmudi eyləmiş özinə qul Əyazlər.

Məcnun başında quş yuva tikmiş əcəb degül,
Başdan keçüb həmişə, bəli, eşqbazlər.

Ol mahparə kəsməz idi məndən ülfətin,
Yandırmaseydi fitnə odın fitnəsazlər.

Əğyar qoymadı yetəm, ey şux, vəslüvə,
Qaldı deyülməmiş dili-zarimdə razlər.

Gülzar içində, gör, necə nərgis bərəhnədür,
Pirahəni-həriri geyübdür piyazlər.

Zahid, dutursan eyb mana, məsti-badəyəm,
Var səndə bəs neçün bu riyayi nəmazlər?

Hicran qəmindən alma xəbər, məndən əl gətür,
Halım görüb fəğanə gəlür çəngsazlər.

Saqib, qəm etmə mey kimi düşdün əyağə sən,

Düşmüş əyağidən-əyağə sərfərazlər.

* * *

Cəhanə fitnə salubdur bu sərvqamətlər,
Odur ki, zahir olur gündə min qiyamətlər.

Gözəlligün neçə şərti var, ey kəmanəbru,
Ki, səndə xətm olunub, vardur hər əlamətlər.

Qaşun qılıc, yüzün lalə, ləblərün yaqut,
Qədün qiyaməti sərvə verür xəcalətlər.

Kəməndi-zülfün urar tə`nə dami-zəncirə,
Verildi bu dili-divanəmə bəşarətlər.

Necə dəvam eləsün dil bu tiri-müjganə,
Dələr daşi, eyləsə gözlərün işarətlər.

Fəda bu daneyi-xalə, fəribi-Adəmdür,
Nolur öpəndə onı, saldı dinə qarətlər.

Əgərçi Yusifi-gülçöhrə mahi-Kən`andı,
Yox onda zərreyicə səndəki məlahətlər.

Zəmanənün sitəmi təng edüb həyatımızi,
Nə qədr tab eləyüm, getdi səbrü taqətlər.

Zəmanə cövrini tərk eyləyən degül, Saqib,
Əbəs yerə eyləmə hər zəman şikayətlər.

* * *

Əbəs bu zülfüvə, ey mahvəş, ənbərfəşan derlər,
Ki, təhqiq eylədim, dami-bəlayi-nagəhan derlər.

Təmənna etməmiş bu lə`li-nabun, qıldı qan bağrım,
Səni bəs, ey səngdil, birəhm həm namehriban derlər.

Kəmandur qaşlarun, bu tiri-müjganun gəvahimdür,
Qiyasın et xəm qədimdən, necə tiği-cansitan derlər.

Qılub heyran məni xalü xətün, qarətgəri-dindür,

Fəribi-adəmi bu gənci-hüsnə pasiban derlər.

Qiyamət göstərür hər ləhzə qəddün, ey kəmanəbru,
Qiyamət kim görübdür göstərə sərvi-rəvan derlər.

Ləbün fikriylə dutdum guşeyi-meyxanə hər saət,
Ləbündən nəş`əni almış şərabi-ərğəvan, derlər.

Nə eylər fitnəni bədməst, bir də fitnə arturma,
Yatubdur gözləründə fitneyi-axirzəman derlər.

Qəfəs küncində, bülbül, nalə tərkin etmə, fəryad et,
Əsüb badi-xəzan, yeksər solubdur gülsitan derlər.

Eşitdim, Saqiba, zahid sana mey tövbəsin vermiş,
Eşit, vardur əlində huriyi-bağı-cinan derlər.

* * *

Qaşun tərhini görsə, ey kəmanəbru, kəman titrər,
Qədün, ey sərvi-azadım, görüb sərvi-rəvan titrər.

Ləbün rəngilə gər yaqut edərsə lafi-həmrəngi,
Piyalə məhv olur əldə, şərabi-ərğəvan titrər.

Könül piçidələndi sərbəsər, dil düşdi təşvişə,
Dutub müjgan oxın əbrulərün, cismimdə can titrər.

Açılmaz gülşəni-rüxsarüvi gər görsə tər qönçə,
Qəfəsdə lal olur bülbül, vücudi-bağban titrər.

Vıranda şanəni ahəstə vır ol dami-giysuyə,
Dili-divanələr viran olur, əf`i ilan titrər.

Desəm səndən gözəldür Yusif, ey məhparə, böhtandur,
Olub məhvi-cəmalun, huriyi-bağı-cinan titrər.

Fəqihi-mədrəsə nəhy eyləmişdür kim, üzüm suyin,
Bu böhtani-əzimindən olurmı həmçü qan, titrər.

Vücudi-əhli-dil aləmdə bir iksiri-ə`zəmdür,
Öpər xaki-dərin ruhi-Məsihayi-zəman titrər.

Əlündə cam varsa, Saqiba, təsbihə əl vırma,

Edər səccadə nalə, səcdədə zahid, inan, titrər.

* * *

Səbadən arizi-dildardə zülfi-siyəh titrər,
Xəyal eylər görən kim, əks salmış suda məh titrər.

Dəgəndə tiri-qəmzön könlümə bir-bir, kəmanəbru,
Kəmandan çıxmış əgnində Davudun zirəh titrər.

Kəməndi-zülfüvi rüxsarə əfşan eylədün, bəsdür,
Düşər təşvişə dil, ahim kəməndində zirəh titrər.

Şəbi-hicründə mən, ey Leylirüx, fəryad etməkdən,
Yanar əhvalimə Məcnun olan aramgəh titrər.

Baxanda qıyqacı hərdəm mana bağrım dönər qanə,
Acıqlı baxsa gər sultan, ərkani-sipəh titrər.

Riyayi göz yaşın zahid tökər məscidə hər saət,
Edər büt səcdəsin, mehrabi-taği-xangəh titrər.

Əl atma ixtilafə, fitnə qalmaz, ehtiraz eylə,
Cəmaət bir işə yekdil olanda, padşəh titrər.

Vırubdur başimə mey nəş`əsi meyxanə küncində,
Başımda, Saqiba, vəchi budur pəşmin küləh titrər.

* * *

Yorulub dil genə əbruyi-kəmani istər,
Pir olub, pir olasan tazə cəvani istər.

Vırar hər ləhzə mana navəki-qəmzön şəbxun,
Məndən, ey mahvəşim, sölə, nə qani istər.

Fitnələr tə`biyə olmuş iki çeşmündə sənün,
Kim ki, bədməst ola aşubi-cəhani istər.

Telbətel dil dolanur zülfi-xəm əndər xəmüvi,
Gör bu divanə necə dami-bəlani istər.

Yetmədi məqsədə Fərhad ləbi-Şirindən,

Bisütun dağı yıxub rahəti-cani istər.

Dedim, ey məh, dili-bimar nə istər səndən,
Ləblərin dutdı, dedi, sor, bu dəvani istər.

Qoyma qan bağrıma, doldur qədəhün, ey saqi,
Könlüm ol dürdi-meyi-ruhi-rəvani istər.

Buriya istəməyür zahid, əmma zahidlər
Künci-mehrabı dutub, buyi-riyani istər.

Saqiba, vəqt belə göstərür heç eyb etmə,
Fikrini çəkmə gəda taci-Kəyani istər.

* * *

Zülfün girehindən dili-divanə nə istər,
Zəncir degül qəddi gedə bir yanə nə istər.

Gahi ləbüvi sormağı istər bu qan olmış,
Əl çəkməyəcək düşsə ta qanə nə istər.

Canan tələbin oddan edərlər məgər, ey məh,
Yatdıqca bu şəm`ə genə pərvanə nə istər.

Divanə olubdur dili-sədparə, sözüm yox.
Məskən eləmiş zülfüvi bəs şanə nə istər.

Həqqim var öpəm arizüvi, aşiqi-zarım,
Xalun öpər hər ləhzə bu biganə nə istər.

Zahid yügürür məscidə cənnət ələ salsun,
Zahidə nə var, səbheyi-səddanə nə istər.

* * *

Olmış əsir zülfüvə bəxti siyahlər,
Azad eləməz, verə gər hökm şahlər.

Sən eylə səngdil, elə birəhm yarsən,
Tə`sir eləməz sana heç suzü ahlər.

Əğyar yetdi vəslinə ol sərvqamətün,

Ey dil, vəfa nədür nə bilür hüsni mahlər.

Qafil oturma gərdişi-dövri-zəmanədən,
Biqiymət oldı qibleyi-aləmpənahlər.

Pamal oldı xarun əyağiylə qönçələr,
Bazar içində əl-ələ vermiş giyahlər.

Bir meyvəni ağacdan əgər dərsə padşəh,
Zülm ilə bağı tapdar əyağ ilə sipahlər.

Saqib, ləçək zəmanəsidür, zəntəbiət ol,
Bir pulə yox alan, yerə girmiş külahlər.

* * *

Saqi, açılmaz həşrə kimi qaşü qəbağlər,
Sən, bari, badə ver ki, tər olsun dəmağlər.

Zahid məlamət eyləməsün məsti-badəyəm,
Bağlandı tazədən genə bu əl-əyağlər.

Doldur əyağuvi, məni yıx xüm əyağinə,
Başə çıxıbdur imdi ki, çirkin əyağlər.

Var eylə qolçomağ ki, salub xəlqi heyrətə,
Rüsvayi-aləm oldı əbəs, qolçomağlər.

Ey söləyən mana, nə içün tən-bərəhnəsən,
Soydı-apardı var-yoxı tazə qonağlər.

Çıxsun canun, yıxılsun əgər heç əcəb degül,
Əl atma heç yerə, dəxi sınmış dəyağlər.

Ol qəm ki, məndə var, ona kim bir də tab edər,
Bir zərrəsinə tab eləməz cümlə dağlər.

* * *

Verəni dil sana, ey sərvqədi-siminbər,
Yüzə xunabeyi-həsrət tökərəm şamü səhər.

Gözlərün baxmağıdur məndən alan arami,

Biri yüz qan eləyibdür, birisi nərgisi-tər.

İki ay parəsi tək hüsnüvi qafil görə kim,
Tazədən münşəq edüb mahi deyər, Peyğəmbər.

Açma rüxsaruvi çox bir də, müsəvvir görsə,
Məst olar, qaş yerinə hüsnüvə şəmşir çəkər.

Eşidüb abi-həyatun suyı zülmatdədür,
Yetmədi məqsədinə, getdi əbəs İskəndər.

Çeşməsi abi-həyatun ləbi-meygunündür,
Ey xoş ol kəs, ləbüvi gahi sorar, gahi öpər.

Görmisən bir məni bu hüsnüvün  heyranı olub,
İtiribdür özini əldə qələm surətgər.

Badə nəhy olmaz idi şər`idə, ey şirinləb,
Öpməseydi ləbüvi badə içəndə sağər.

Mümkin olmaz sorasən lə`li-ləbi-dildari,
Kasə-kasə gecə-gündüz yeməsön xuni-cigər.

Naqə əğyar evinə Leylini çəkdi axir,
Ey cərəs, lal olasan, yetmiyə Məcnunə xəbər.

Qanmaza sölərnə həqqün sözini, ey Saqib,
Gündə min mö`cizə göstərsön əgər, etməz əsər.

* * *

Ta key gəlib-gedər belə leylü nəharlər,
Yoxsa gedüb əlindən onun cümlə varlər.

Mən kimi yox əlində məgər ixtiyari heç,
Keçmiş kimün əlinə məgər ixtiyarlər.

Meyxanəyə çağırma məni, saqi, əl gətür,
İçdikcə artırur qəmi bu zəhrimarlər.

Əğyar yetdi vəslinə ol sərvqamətün,
Hicrində oldı qismətimiz ahü zarlər.

Tə`sir naləm etmədi, ey səngdil, sana,

Halım görüb fəğanə gəlür çəngü tarlər.

Ətfal ruzgarun əlində əsir ikən,
Məndən gətürmür əl xəmi-giysuyi-yarlər.

Sınmış piyalə dün mana göstərdi kuzəgər,
Biixtiyar ah çəkərdi həzarlər.

Aldım xəbər, səndə bu nə ahi-suzdür,
Yansun oda dedi, fələki-kəcmədarlər.

Rüxsari-Leylini elədim cami-meykədə,
Məcnuni xişt çəkməyə çox intizarlər.

Şirinləbləri budur əldə piyalədür,
Fərhad xüm səbu çəkər meygüsarlər.

Zərrin qədəh olub məhi-Kən`anun arizi,
Sağər Əyaz rətlgiran şəhriyarlər.

Dami-bəlayə Saqibi salson, degül əcəb,
Gəlməz kəminə öz əyağilə şikarlər.

Damani-nakəsə yapuşub etmə iltica,
Canun da çıxsa, yoxdur ona, etmə e`tibarlər.

Dövran biz ilə böylə müdara gər eyləsə,
Zülmün oduyla məhv olacaq hər diyarlər.

* * *

Vıranda həlqə yüzündə girəh giysulər,
Vırar kəməndə özin mülki-Çində ahulər.

Təəccüb eyləmirəm padşahsən hüsnə,
Satar cəmalun əksini xəlqə güzgulər.

Şəh olmason nə içün hüsnüvi əhatə edüb,
Verübdür əl-ələ, bir-bir qulami-hindulər.

Əgərçi xal oxunur cümlə xəlq arasında,
Bu tə`nədür, mana eylər müdam bədgulər.

Görəndə qaşlarıvun tərhini sənün, ey məh,

Düşərlə səcdəyə yer-yer kəmanəbrulər.

Qədün görəndə rəvan eyləyərəm gözüm yaşın,
Ki, bağban verür sərvə rəsmdür, sulər.

Hekayəti-şəbi-hicranuvə dəvam etməz,
Çəkər bu bari-girani necə tərazulər.

Vəfa hanı bu gözəllərdə, Saqiba, əl çək,
Olurlar maili-əğyar bu səmənbulər.

* * *

Dili-üşşaqdən qanlar içür bu tiğ əbrulər,
İlan tək arizündə həlqələnmiş tar giysulər.

Nə gözdür, gözlərün heyraniyəm mən, ey xətadidə,
Xəta mülkində yatmış naz ilə guya ki, ahulər.

Yetərdim vəslinə ol məhvəşin hər necə olseydi,
Aradə olmaseydi gər süxənçin ilə bədgulər.

Cünun zəncirini Məcnunə verdün, hüsni Leylayə,
Nedim,* başdan-əyağə fitnəsən, bilməm nədür bulər.

Zəmanə gərdişi bağrımi qəmlə qanə döndərmiş,
İlahi, söndürərmi bu odı gözdən axan sulər.

Gədayə taci-zər qismət, mənə viranələr künci,
Görən söylər, budur, məskən dutub virani bayqulər.

Salubdur heyrətə bu könlümi xalü xətün fikri,
Hücum etmiş diyari-Rumə yeksər sanki hindulər.

Təmaşa etməgə biz gəlmişik ancaq bu dünyayə,
Olub sahibxəzinə, neyləmək, cümlə cəfaculər.

Könül vermək əbəsmiş, afəti-can eşqdür, ey dil,
Qocaltdı Saqibi bu sərvqamətlər, səmənbulər.

* * *

Pərişan eylədi rüxsarə Leyli, tökdi giysulər,

---
* Nə edim

Cünunsən, daminə Məcnun kimi ram oldı ahulər.

Nigara, kuyüvə gəlmək müyəssər məndə olseydi,
Gecə ta sübh olunca kim çəkərdi ahü yahulər?

Təbiba, eşq zail olmaz hiç tədbir ilə, əl çək,
Tilsimi-eşqi kim batil edüb, heyrandu cadulər.

Əcəbdü sürmətək çəksəm gözə bu xaki-kuyindən,
Yatub topraq içində sərvqədlər, ya səmənbulər.

Nihan dut hüsnüvi ol türreyi-pürpiçü tab içrə,
Müqabil durma, uğrar əksi-hüsnün görsə güzgulər.

Qaşun tərhin görən fəhm eyləyər kim, bu qılınclardur,
Kəmandur əhli-dil mehrabidür, ey məh, bu əbrulər.

Sevər Leylani Məcnun, Saqiba, Fərhad Şirini,
Bəli, pərvanə şəm`i sən kimi viranə bayqulər.

* * *

Etmiş əhatə aləmi giysubüridələr,
Bir böylə fitnə görməyüb heç afəridələr.

Bazari-hüsni Yusifə yeksər kəsad edüb,
Azəristandə gül kimi tazərəsidələr.

Çox cilvələnmə göz qabağında, hilali-nov,
Müjgan oxın vırar sana əbruxəmidələr.

Bağrım qan oldı lə`li-ləbün arizusinə,
Ətrafuvi əhatə edüb ləbi məkidələr.

Ey məh, nə oldı səndəki ol zülfi-tabdar,
Ram olmış idi onda hər ahurəmidələr.

Ey dil, inanma var bu gözəllərdə e`tibar,
Salmış cəhanə fitnə bu peymandəridələr.

Xüm qaldı, saqi, xali meyi-lə`lfamdən,
Avarə düşdi rənc ilə sağərkəşidələr.

İbrət göziylə eylə nəzər xaki-kuyüvə,

Dönmiş qübarə şahi-qulamxəridələr.

Saqib əsiri-eşqün olub, ey pərivəşim,
Görmüb sənün kimi gözəli hiç didələr.

* * *

Divanə qılur xəlqi bu məhparə gözəllər,
Tökdikdə qəra zülfini rüxsarə gözəllər.

Nəqqaşə təəccüb elə, məhvəşlərə etmə,
Etmiş mənim hərgiz günimi qarə, gözəllər.

Bir qətrə sudan, gör, nələri tərhə çəkübdür,
Əlbətki, qoyar aləmi avarə gözəllər.

Az bir yerə gör bir nələri cəm` eləmişdür,
Yandur deyəcək sən məni odlarə, gözəllər.

Qaş əgri kəmandur deyəsən zülfi-girəhgir,
Mənsuri çəküb zülfi ilə darə gözəllər.

Göz məst içüb qanı müjə tiri-cigərçak,
Əfsus ki, mail olur əğyarə gözəllər.

Rüxsar çəmən laləsi, rəşki-güli-şəbbu,
Xal afəti-din, kim eləsün çarə gözəllər.

Qəd sərvi-rəvandur, edər izhari-qiyamət,
Ləb lə`l saçar, gər gələ göftarə gözəllər.

Saqib, demə hərgiz bu gözəllərdə vəfa yox,
Ram olmadadur aşiqə bir parə gözəllər.

* * *

Dutsam səri-kuyin görüb əğyarə deyərlər,
Xalundan öpəm, türreyi-tərrarə deyərlər.

Zəncirə çəkər könlimi, azad edən olmaz,
Mənsur çəkildi deyəsən darə, deyərlər.

Bu dərdü qəmi-eşqə əlac eyləyən olmaz,

Mümkin ola gər, ləblərüvi çarə deyərlər.

Söz yox ona Yusif də deyürlərdi gözəldi,
Ey sərvqəd, əmma sana məhparə deyərlər.

Sorson nə içün aləmi aşub dutubdur,
Giysulərüvi tökmə bu rüxsarə deyərlər.

Kimdən sorasan noldı mənim aşiqi-zarım,
Hicründə düşüb çöllərə avarə deyərlər.

Qan qoyma mənim bağrıma bir busə verincə,
Zalim sana, ey məh, mana biçarə deyərlər.

Saqib, rəvişi-şe`rdə göstərsön hünər sən,
Əhsən sana, əhsən belə əş`arə deyərlər.

* * *

Şəm`i-rüxsarunda yandı şəm`tək pərvanələr,
Yanmamış ol şəm`ə mən, ey mahvəş, qoy yanələr.

Bir sən ol bir mən, nigara, bir də saqi camü mey,
Saqiya, dur, ver piyalə, görməsün biganələr.

Daneyi-xalun əsir olmuş kəməndi-zülfüvə,
Səndə zənciri-cünun var, görməyüb biganələr.

Fitnələr çox zahir etdi xəlq içində gözlərün,
Allah-Allah gözlərün cadu degül, bəs ya nələr?

Könlümi zülfin kimi çoxdan pərişan etmisən,
Könlümin cəm`iyyətin yıxmaz uranda şanələr.

Çəkmə qəm cənnətdən ötri, ol bizimdür ya degül,
Etməgə abad çoxdur, ey könül, viranələr.

Məscidə təklif edir sərgərm camü badəni
Zahidi-kəcbin, xərab olmuş məgər meyxanələr?

Müftilər fitvasi ilə getdi namusi-vətən,
Eylədi avarə xəlqi səbheyi-səddanələr.

Saqiba, mülki-vətəndən neyləyüm avarəsən,

Xabi-qəflətdən gətür baş, bəsdü bu əfsanələr.

* * *

Əbruyə tab vermə ki, qəddim kəman olur,
Müjganlarun xədənginə sinəm nişan olur.

Ey tiği-qəmzə ilə tökən xuni-aşiqi,
Hər an, hər nəfəs sənə qurban bu can olur.

Şəqqül-qəmər yüzünmüş ol e`cazi-Əhmədi,
Xətmi-Rəsuldən belə mö`cüz əyan olur.

Rəhzənlik etdi o məhə xalun nəticəsi,
Xamtəm`əlik eyləyər, ey dil, ziyan olur.

Lə`lün həvasi etdi Məsihani ruhbəxş,
Bu rəmzi-ləblərün qana kim, nüktədan olur.

Zülfün kəməndinə vəli könlüm əsiridür,
Azad etməsön məgər, ey şux, qan olur.

Əfşan, gəl, eylə zülfüvi, ey mahvəş, yüzə,
Bu rəsmidür xəzinəara pasiban olur.

Kuyin verübsə cənnətə Adəm əcəb degül,
Hicründə həmdəm görüb ahü fəğan olur.

Saqib, cəhanda səbr elə yarun cəfasinə,
Mə`şuqə aşiqə, bəli, namehriban olur.

* * *

Zülfün kəməndinə dili-viranə ram olur,
Ey şux, ona bu məst gözündən pəyam olur.

Seylabi-qəm haçan ki, aşar başdan hicridə,
Hərdəm mana bu dürdi-meyi-lə`lfam olur.

Ey dil, məhəbbət aləmi ənduhü dərdidür,
Kim dami-eşqə olsa əsir, təlxkam olur.

Əfşan çox eyləmə yüzüvə giysuyi-pürxəmi,

Bu şanə ilə aşiqüvün sübhi şam olur.

Bazari-hüsnə girsön əgər sən bu hüsnilə,
Yə`qub, söləyər sana Yusif, qulam olur.

Zahid nola həram oxusa vəsfi-badəni,
Əhli-kəmal rütbəsi biehtiram olur.

Baxma zəmanənün bu qədr hərc-mərcinə,
Bu hərc-mərci sanma həmişə müdam olur.

Hər nəfs öz muradinə bir gün yetər, gəlür,
Min intiqam almağa əldə niyam olur.

Saqib, qəm etmə heç nəyə, yox səndə ixtiyar,
Getməz bu keşməkeş belə, axır nizam olur.

* * *

Sərkeşligi kim eyləsə axır zəlil olur,
Muri-zəifə, pəşəyə məğlubqəbil olur.

Nəmrud çox da atdı Birahimi atəşə,
Xakəstər olsa da, genə axır Xəlil olur.

Sultan nə qədr baxsa həqarət gözilə gər
Miskin gədayə, bir də görərsən dəxil olur.

Eyb etmə xəlqə, öz rəvişin tərk edən degül,
İnsanlıq aləmi sənə nə, hər qəbil olur.

Dəsti-təərrüz açsa sana birsi, incimə,
Bir gün yetər, görəndə səni tez xəcil olur.

Nəfsündən ötri xəlqə əziyyətdən əl gətür,
Bihudə əmr içün məgər insan qətil olur?

Bir iş dutanda gözləməsön aqibət əgər,
Ta key sənə bu kibrü məniyyət vəsil olur.

Bir qətrənün qabağına səd çəkməsön əgər,
Qərq eyləyər cəhani, dönüb rudi-Nil olur.

Getsön yoluvı düz, daşa dəgməz əyağun heç,

Ey dil, inanmason, sana Saqib kəfil olur.

* * *

Cəhalət aləmi dutmış, müsəlman oldığımdandur,
Yalandan nəfsə tabe` əhli-Qur`an oldığımdandur.

Neçün bu aləmə gəldim, mən ani bilmədim hərgiz,
İnandum vaizün fe`linə, nadan oldığımdandur.

Dedilər var cənnət, əl gətür, dünyapərəst olma,
Vətən mülkin bıraxdım getdi, nadan oldığımdandur.

Demə cənnət vətən gülzar imiş, hicrani duzəxdür,
Həqiqət eylədiyim, az əhli-iman oldığımdandur.

Sənün eşqündə verdüm bağі-cənnət zahidə, ey məh,
Yetişdüm sərhədi-məqsudə, insan oldığımdandur.

Dedim: neyçün dutubdur quş yuva başunda, ey Məcnun?
Dedi: Leylayi-eşqə məhvü heyran oldığımdandur.

Dedim giysusinə yarun, neçün könlüm pərişandur?
Dedi: ey bəxti qarə, bax, pərişan oldığımdandur.

Dedim: ey şəm`, neçün ağlayursan yandı pərvanə,
Dedi: pərvanənün halına suzan oldığımdandur.

Dedim: Yə`qub neyçün gözlərin kur eylədi, Yusif?
Dedi: bax hüsnimə, aşubi-dövran oldığımdandur.

Züleyxayə dedim: Yusif neçün pabəndi-zindandur?
Dedi: eşqində mən çaki-giriban oldığımdandur.

Dedim: Saqib, neçün şe`rün belə peyvəstə şürbidür,
Dedi: Yusif kimi ustadə dərban oldığımdandur.

* * *

Sitəmlərün sənün, ey dəhr, gərçi əfzundur,
Əlacı, sağər içində şərabi-gülgundur.

Şikənci-türreyi-Leylayə dəgmə, ey şanə,

Dağıtma, dərbədər olmış, məqami-Məcnundur.

Fəda olum sana, Məcnun fəraqi-Leyladə,
Məqami-əmn sana dəşti-kuhü hamundur.

Məkatibi-şəbi-hicrani heç kəm bilməz,
Mənim kimi demək olmaz, xətərli məzmundur.

Rəqibə dil verəni, səngdil, gözüm yaşi,
Sənün müfariqətündə ki, rudi-Ceyhundur.

Kəmanə tə`nə urar əgri qaşlarun hərdəm,
Bu çeşmi-məstüvə ahuyi-Çin məftundur.

Təkəbbür etməgilən, yol gedəndə aram ol,
Əyağun altına bax, min kəlim mədfundür.

Gözəlligə eyləmə təkyə, tez gedər əldən,
Gərçi bir-iki gün tale`ün hümayundur.

Təəccüb eylərəm ol şəhi-gədazadə,
Məhali-əmrə səbəb tərhi-dövri-gərdundur.

Şərabi-eşqlə sərməstsən əcəb, Saqib,
Eyləmisən genə bədməst, bağrımız xundur.

* * *

Könül, çox laf vırma aşinadən, aşina yoxdur,
Vücudi-aşina bir kimiyadur, kimiya yoxdur.

İnanma şiveyi-zahidfərib mahrüxsarə,
Verür əğyarə dil, bu səngdillərdə vəfa yoxdur.

Qiyas et Kuhkəndən, naleyi-Məcnuni-rüsvadən,
Mərizi-eşqə, ey dil, mübtəla olma, dəva yoxdur.

Dolanma türreyi-pürpiçinə bu sərvi-azadun,
Bu zəncirün əsiri olmıyan bəxti qəra yoxdur.

Məlamət etməsün heç kim məni yüz dutsam aləmdən,
Nə meydə bir fərəh yoxdur, nə gülşəndə səfa yoxdur.

Rəqibün fitnəsindən yar məndən dutdı yüz axır,

Mənimtək möhnətü ənduhə heç kim mübtəla yoxdur.

Cəhanı dutmaz idi fitneyi-aşub, ey Saqib,
Dutar, əlbəttə, fitnə aləmi, həqq rəhnüma yoxdur.

* * *

Əgərçi ləblərün fikrilə bağrım sərbəsər qandur,
Qoy olsun qan, sənün eşqün yolunda can da qurbandur.

Mühəmməddə(s) nübüvvət xətm olubdur səndə gögçəklik,
Eylə ziba gözəlsən, hüsnüvə ayinə heyrandur.

Gözün sehr eylədi, oldum əsiri-zülfi-pürçinün,
Məni ram eyləyən zənciri-məcnunə bu şeytandur.

Xəbər alma, əmandur, bu dili-viranəmün halın,
Xətü xalın xəyali qarət etmiş, kafəristandur.

Necə tab eylüm, hər bir tərəfdən qəsdi-can eylər,
Biri qaşun qılıncı, birsi də bu tiri-müjgandur.

Pərişanlıq mana neyçün verüb yüz, indi mən bildim,
Səbadən, şanədən yox hüsnüvə zülfün pərişandur.

Sənün əhvalüvə mən vaqifəm, ey binəva Məcnun,
Fəraqi-Leylidə məskən sana kuhü biyabandur.

Keçəndə zahidə təklifi-badə etmə, ey saqi,
Mey içməz, qan içər, ver kasə-kasə, əhli-Qur`andur.

Təfaxür Azər ilə eylə, Saqib, Azəristandə,
Təməllüq rəngi yox məndə, qəzəl təxtində sultandur.

* * *

Mən ki, çox pərişanəm, kakilün pərişandur,
Kakilün pərişandur, dil də kafəristandur.

Qətlimə mənim fərman verməyüb qaşun tiği,
Qətlimə verən fərman, səndə tiri-müjgandur.

Ləblərün xəyalı ilə mey içüb meyaludəm,

Qan oleydi bu badə, içdigim bütün qandur.

Yıxdı hüsn bazarın, dutdı kuyüvi Yusif,
Qiyməti kəlaf oldı, hüsninə peşimandur.

Eyləməz məni azad, şahidim bu xalundur,
Neyləyüm, kəmanəbru, zülfün ənbərəfşandur.

Ayrı düşdi Leyladən, o tikildi Məcnunə,
Hər yanə nəzər qılson, sərbəsər biyabandur.

Kuhkən vırar tişə dağə, bilməyür Şirin,
Dil verübdür əğyarə, bu nə əhdi-peymandur.

Çəkdilər gülin ətrin yanə-yanə, ey bülbül,
Tərk qıl qəfəs küncin, bu nə ahü əfğandur.

Ömr yaridən keçdi, Saqiba, ayıl bir dəm,
Yoxdur əldə sərmayə, səndə bu nə tüğyandur?

* * *

Qaşun görə hər kim, deyəcəkdir ki, kəmandur,
Şahid bu sözə tiri-müjön, afəti-candur.

Zənciri-cünun xəlq deyür zülfüvə əmma,
Künci-ləbivün üstə durub həlqə ilandur.

Yaqutə verüblər ləbüvi nisbət əgərçi,
Lə`lün kimi yaqut necə quti-rəvandur.

Əbrulərivün tərhini kəc çəkdi müsəvvir,
Şəmşir çəkib qaş yerinə, tökdigi qandur.

Bir dəhri-bəla fitnə yatub məst gözündə,
Qıyqacı qıyub baxmağı, ey şux, yəmandur.

Yəğmayə verüb xalü xətün küfrlə dini,
Adəm həvəsin eylədi, rüsvayi-cəhandur.

Sərvün nədür həddi boy ata sərvqədün tək,
Kim desə rəvandur, bu qədün kimi, yəlandur.

Bülbül, bu qədr etmə fəğan künci-qəfəsdə,

Yoxdur xəbərün, soldı gülistan, xəzandur.

Ver Saqibə bir busə bu gülbərgi-ləbündən,
Ey tazə cəvan, piri-xərabati-muğandur.

* * *

Zahid, əlimdə, eyb eləmə, mey əyağıdur,
Hal əhlinün bu taqətidür, həm dayağıdur.

Dəhrün nədür səfasi, ona paybəndsən,
Gər yaxşı fikr eyləyəsən, qan çanağıdur.

Hər bərgi-lalə gül ki, verüb zib gülşənə,
Nə gül degül, nə lalə, Səyavuş yuvağıdur.

Ey şux, böylə kim boy atub sərv qamətün,
Nəşvü nüma verən ona, bu göz bulağıdur.

Sərgəştədür, dalunca gəzər ayü gün müdam,
Gün xərməninə od vıran hüsnün çırağıdur.

Xunabi-həsrətə özüvi qərq eyləmə,
Şah olsa kim bir-iki günün boş qonağıdur.

Fəryadə gəlsə ney kimi Saqib, eyb degül,
Ney kimi ağladan onı bu hicr dağıdur.

* * *

Tərk eyləgilən eşq yolın, rahi-xətadur,
Bax qamətinə Qaf, kəman kimi dütadur.

Dutma bu xətərnak yolın qıl həzər ondan,
Axir qədəmün sərhədi sərhəddi-fənadur.

Məcnun gedübdür bu yolı nəqdi-can əldə,
Avarə qalub, mənzili bilmür ki, haradur.

Fərhad hələ tişə vırar başinə dağdə,
Şirin demür hərgiz, bu nə səsdür, nə sədadur.

Pərvanə yanur, şəm` yanur, heç biri bilmür,

Bu od necə oddur, nə içündür, nə binadur.

Bax əndəlibün halinə bir künci-qəfəsdə,
Gül xarə düşüb, həmdəm ona ahü nəvadur.

Yoxdur bu gözəllərdə vəfa, düş bu həvəsdən,
Kim versə könül, eylə yəqin, bəxti qəradur.

Ali olan insanlara, cəhd eylə, qulam ol,
Şəh olma o naəhlə ki, əcdadı gədadur.

Saqib, özüvi eyləmə rüsvayi-zəmanə,
Giysusi bu məhparələrün dami-bəladur.

* * *

Həzər qıl eşq yolundan, bəla ilən dolıdur,
Bəla ilən doludur, həm nəva ilən dolıdur.

Kimün fəraqinədür bu fəğani-naleyi-ney,
Səda ilən doludur, həm ahü va ilən doludur.

Aparma Leyli adın, qeyrə yar olub, Məcnun,
Başunda quşlar edübdür yuva ilən doludur.

Zəkati-hüsnün alum, yetməyür mana növbət,
Mənim kimi səri-kuyün gəda ilən doludur.

Soruşma, əl gətür, ey şux, könlümün xəbərin,
Yıxıldı qəmzön oxıyla, yəra ilən doludur.

Məni bu halə salub məst gözlərün dərdi,
Sorum bu lə`li-ləbün, qoy, dəva ilən doludur.

Şəbi-fəraqüvə tab eyləmək degül asan,
Ki, hər dəqiqəsi yüz min cəfa ilən doludur.

Dağıtma şanə ilən türreyi-pərişanun,
Cəhanə fitnə salubdur, xəta ilən doludur.

Nədür bu can rəhi-eşqündə olmasun qurban,
Dutubdur əldə bu Saqib fəda ilən doludur.

* * *

Qəm çəkmə, könül, imdi ki, iqbal cünundur,
Batsun yer ilə durmasun heç, bəxt zəbundur.

Zahid məni təkfir eləyür badəpərəstəm,
Bilmür ki, qəmü möhnət ilə dərd füzundur.

Giysu demə, ey şux, tökübsən yüzə əfşan,
Şanə bu qədr vırma ki, zənciri-cünundur.

Ey məh, demə dil hüsnümə ya xalıma verdün,
Hərgiz demək olmaz bu sözi sirri-dərundur.

Kim olsa xəmi-türreyi-mişkinün əsiri,
Həm bəxti qəradür onun, həm tale`i dundur.

Bu xali-siyəhfamə könül verməsəm olmaz,
Rüsva eləmiş adəmi bu nuri-üyundur.

Tərk etməgilən xidmətini piri-muğanun,
Saqib, rəhi-meyxanədə ol rahnümundur.

* * *

Əsir edən məni giysuyi-tabdarundur,
Qoyan bu bağrıma qan, lə`li-abdarundur.

Məni bu vadiyi-heyrətdə eyləyən heyran,
Birisi xalü xətündür, biri üzarundur.

Yatub bu çeşmi-xumarunda bir cəhan fitnə,
Təmam mülki-Xütən ahusi şikarundur.

Çox etmə nalə qəfəs damində, ey bülbül,
Gətür bu nalədən əl, gülistan xarundur.

Təfaxür eyləmə çox hüsnüvə, kəmanəbru,
Sənün degül, gözəlim, bəlkə murü marundur.

Şərabxanə yolın dutma, zahid, əl çək,
Yüz üstə məscidə get, rindü mey kəsadundur.

Demə rəqibə verdi əl o mahvəş, Saqib,

Şikayət etməgilən, ixtiyar yarundur.

* * *

Vəh nə xal, nə siyəh zülf, nə əbruyi-kəmandur,
Birisi danə, biri dam, biri afəti-candur.

Göz degül səndə yaranmış, ona bir sürmə də çəkdün,
Həzər etmək gərək ondan, gözəlim, içdigi qandur.

Səcdə eylər qaşuvun tağinə hər abidü zahid,
Oxşadur guşeyi-mehrabə, vəli əgri kəmandur.

Tökmə bu zülfi-xəm əndərxəmüvi şanə vıranda
Arizi-alüvə, arami-dili-pirü cəvandur.

Birbəbir qətlimə səf-səf düzülüb navəki-qəmzön,
Xunbəha istəyən olmaz belə can qalsa ziyandur.

Qamətün gər əlifə bənzəsə də lovhi-könüldə,
Bəs qiyamət nədür hərdəm eləyür sərvi-rəvandur.

* * *

Könlümün səmtinə bu nə əbruyi-kəmandur,
Ya qılınclardu ki, qanə boyanub tökdigi qandur.

Gözlərün qıyqacı baxdıqda qoyar bağrıma qanlar,
Leyk mümkin ola kim sorsa, ləbün ruhi-rəvandur.

Türreyi-zülfüvə bir ləhzə könül bağlamaq olmaz,
Demə zənciri-cünun, hər biri bir əf`i ilandur.

Sana dil verməmək olseydi əgər verməz idim dil,
Mübtəla eşqüvə, ey şux, sənün pirü cəvandur.

Daneyi-xaluvə dil vermərəm, ey qaşı kəmanım,
Çox xətadidədür, Adəm hələ rüsvayi-cəhandur.

Baği-cənnətdə deyürlər yaramaz qarə qul, olmaz,
Necə olmaz, sana qurban, bu söz əlbəttə yalandur.

Pəs nədür xali-siyəh bu rüxi-alunda sənün var,

Qarə qul qarə xalun, çöhrən əgər baği-cinandur.

Zahida, etmə məlamət, nola, meyxanəpərəstəm,
Tərk edim mən necə meyxanə yolın, darüləmandur.

Saqiba, şikvə çox etmə fələkün cövrindən,
Səbr qıl, səbr eləmək gərçi sana xeyli girandur.

* * *

Vəh nə xalü nə siyəh zülf, nə əbruyi-kəmandur,
Birisi danə, biri dam, biri afəti-candur.

Qoyma sağər öpə ol lə`lüvi, qan oldı könüllər,
Fikr ilə cigərim qanı gözümdən səyəlandur.

Sehr qıldı gözün, ey məh, sənə verdüm dilü dini,
Allah-Allah, bu necə sehr, nə aşubi-cəhandur.

Dili-viranəmi səd çak elədün qəmzə oxilə,
Onsız hər parəsi min parə olub xeyl zəmandur.

Hər təbibə dedim əhvali-dili-zarımi, cana,
Dərdi-eşqə nə olur çarə deyüb xəlqə əyandur.

Dutma, ey qanlu sirişkim, yolın ol afəti-canun,
Gözlər ol səngdili, çeşmi-ümidim nigərandur.

Mən` qılma məni, zahid, mən əgər badəpərəstəm,
Fərəhi-ruhdü mey, nəş`əsi həm ruhi-rəvandur.

Dəri-meyxanədən, ey dil, tələbi-məğfirət eylə,
Vermə əldən dəxi meyxanəni kim, darül-əmandur.

Mərdümi-guşənişinə bu qədər eyləmə tə`nə,
Saqiba, künci-xərabati dolan, gənci-nihandur.

* * *

Əsir zülfüvə, ey şux, tacdarandur,
Mənim kimi nə belə zari-dilfikarandur.

Səbadən arizüvə zülfin olmayub əfşan,

Üzarun fərəhindən ki, biqərarandur.

Nizam ilən düzülüb, qaşlarun kəmandür,
Bu tiri-navəki-müjganlarun həzarandur.

Baş əgmərəm qaşun tağinə, kəmanəbru,
Təəccübəm, necə mehrab tirbarandur.

Qoyarmı öpməgə, ey şux, daneyi-xalun,
İki bu məst gözün, bəski huşyarandur.

Məgəs degül ki, sorar şəhdi-ləblərün hərdəm,
Şərabxanədə sərməsti-meygüsarandur.

Vüsalinə bu məhün yetişmisən,* ey Saqib,
Yetər vüsalə o kimsə ki, bəxt yarandur.

* * *

Zülfün xəmi sərrişteyi-zənciri-cünundur,
Bu damun əsiri kim ola, bəxti zəbundur.

Sorson sən əgər halımi zülfimi sövərsən,
Əl çək demək olmaz onı, bu sirri-dərundur.

Yatmışdı o məh, istədim ol lə`li-ləbindən
Bir busə alam, açdı gözün, tale`i-dundur.

Sevdi səni divanə könül onda nə təqsir,
Vır qəmzə oxıyla çıxa, bais bu üyundur.

Alma xəbər əhvalımi, ey qaşı kəmanım,
Hicründə bilürsən ki, necə dərd füzundur.

Möhtac eləyən bir nəfəsə şahi gədayə,
Bu gərdişi-çərxi-fələki-buqələmundur.

Saqib, eləmə şikvə əbəs düşdün əyağə,
Deyrün işi başdan-əyağə məkri-fünundur.

* * *

Ləbün xəyali ilə şad könlümüz xundur,

---

* Yetişə bilməzsən

Mənim bu halimə vaqif şərabi-gülgundur.

Müdam məstü xərabəm, müdam divanə,
Məlamət etmə məni bəs ki, möhnət əfzundur.

Şikənci-türreyi-Leylayə dəgmə, ey şanə,
Dağıtma, qoy yana rahət, məqami-Məcnundur.

Fəda olum sana, Məcnun fəraqi-Leyladə,
Məqami-əmn sana dəştü kuhü hamundur.

Hekayəti-şəbi hicrani heç kim bilməz,
Mənim kimi demək olmaz xətərli məzmundur.

Rəqibə dil verəni, səngdil, gözüm yaşi,
Sənün müfariqətündə ki, rudi-Ceyhundur.

Kəmanə tə`nə urar əgri qaşlarun hərdəm,
Bu çeşmi-məstüvə ahuyi-Çin məftundur.

Gözəlligə eyləmə təkyə, tez gedər əldən,
Əgərçi bir iki gün tale`ün hümayundur.

Təkəbbür etməgilən yol gedəndə, ey zalim,
Əyağun altına bax, min kəlim mədfundur.

Təəccüb eyləmirəm olsa şəh gədazadə,
Məhali-əmrə səbəb tərhi-dövri-gərdundur.

Şərabi-eşq ilə sərməstsən əcəb, Saqib,
Eyləmisən genə bədməst bağrımız xundur.

* * *

Yetənün fikrini, ey dil, eləmək bicadur,
Xəlqidən qaç, həzər et, rəngə girüb rüsvadur.

Çoxlar əndişeyi-xamə özin aludə edüb,
Bilməyür zərrəcə başındaki nə sövdadur.

Özüvə fikrüvi ver, gör nə tələb səndən edir
Vəqt, gör, bir nə içün şamü səhər qovğadur.

Etmə məğlub özüvi nəfsün əlində, fəhm et,

Məsti-layə`qəl edər, içmə, həman səhbadur.

Künhi-zatə əl atursan, özüvi incidmə,
Qərq eylər səni girsön, bu dərin dəryadur.

Sən nə fikr eyləyisən,* sən deyən olmaz əsla,
Zat özi künhinə, nə oldığına daradur.

Rütbeyi-sane`i-məsnu` nə bilsün naşi,
Hərə bir nəğmə oxur bu sirrə, boş xülyadur.

Kur-kuranə könül verməyüb həqqə həqqbin,
Sən kimi, eylə yəqin, həqqi sevən binadur.

Yaradandur bu təbiət, dedigün bir sözə bax,
Başə düş səhvüvi, səhv eyləmə, kəc mə`nadur.

Ver könül, heç demə Məcnunə gözəldür Şirin,
Deyəcək səhv eləyübsən, gözəlim Leyladur.

E`tina eyləmə, Saqib, bu səbükraylərə,
Əqli-küll kim ola, divanələrə həmtadur.

* * *

Bilmirəm neyçün mənim könlüm sənün yanundadur,
Səndən heç ayrılmayur, peyvəstə fərmanundadur.

Hardadur sədparə könlüm, sorma məndən, əl gətür,
Səngdil, hər parəsi bu tiri-müjganundadur.

Ləblərün fikrilə hər dəm sən anı qan etmisən,
Çarəsin qıl, bari, ey zalim, bu dərmanundadur.

Çox qəfəs küncində, ey bülbül, şikayət eyləmə,
Cümlə hər təqsirlər bu ahü əfğanundadur.

Sorma neyçün fitnə dutmış aləmi, ey qönçələb,
Fitneyi-aləm sənün bu çeşmi-fəttanundadur.

Xali-gəndümçöhrəvə dil verməmək asan degül,
İmdi də Adəm əli, ey şux, damanundadur.
Bu pərirüxsarə tək bir sən degülsən mübtəla,

* Eyləyirsən

Saqiba, xəlqün gözi bu şux canandadur.

* * *

Dil etsə nalə ney kimi hərdəm, yerindədür,
Od dutsa, yansa halinə aləm, yerindədür.

Qəmzön xədəngi min yerə çak etdi bağrımi,
Qaşun qılıncı qılmasa mərhəm, yerindədür.

Çoxdan əsirdür dili-divanə zülfüvə,
Azad qılma, qoy qala möhkəm, yerindədür.

Xalü xətündə qarət olub getdi küfrü din,
Rüsvayi-xəlqdür əgər adəm yerindədür.

Əfşan edəndə hüsnüvə artar gözəlligün,
Çəkmə kənarə, türreyi-pərçəm yerindədür.

Ahim odilə tərləsə gülbərgi-arizün,
Ey məh, təəccüb etmə, bu şəbnəm yerindədür.

Uydun rəqib fitnəsinə, yetdi vəslüvə,
Çəksəm həmişə ahi-dəmadəm, yerindədür.

Ey dil, dedim bu sərvqədün düşmə eşqinə,
Hicründə nalədür sana həmdəm, yerindədür.

Mehrabi-taətə Əli(ə) yox səcdə eyləsün,
Şəmşir əlində urmağa Mülcəm yerindədür.

Saqib, nə qədr möhnət oxın atsa dəhri-dun,
Yox bak məndə, dağ kimi sinəm yerindədür.

* * *

Məhvəşim, qaşun qəmi qəddim kəman etməkdədür,
Lə`li-nabun həsrəti bağrımi qan etməkdədür.

Canımi qurban qaşun tiğinə verrəm, verməzəm,
Ləhzə-ləhzə tiri-qəmzön imtəhan etməkdədür.

Can nədür qurbanun olmaz, ey könüllər behcəti,

Canı qurban aşiqün hər bir zəman etməkdədür.

Türreyi-pürçini açma, yıxma könlüm xanəsin,
Eyləmə avarə bir dəm, qoy, məkan etməkdədür.

Çeşmi-mərdümküşləründən mən necə dad etməyüm,
Səngdil dil kişvərin qarətü talan etməkdədür.

Eşqi təkfir etmə, zahid, guşeyi-mehrabdə,
Vadiyi-heyrətdə Musanı şəban etməkdədür.

Durma yanımda, uzaqdan keç, dutar damanuvi,
Seyl tək giryan gözüm, çün xunfəşan etməkdədür.

Yıx məni meyxanədə, ey saqi, dövri-badəni,
Badeyi-Kövsər içən yoxdur, ziyan etməkdədür.

Saqiba, söz tapmayur Nadir ki, yazsun şe`rdə,
Tapmağa söz cüstücuyi-digəran etməkdədür.

* * *

Dürəfşan zülfi-pürçinün pərişan eyləyən kimdür,
Pərişan eyləyəndə ahü əfğan eyləyən kimdür.

Kəsad etdün cəmali-Yusifi bazari-hüsn içrə,
Məni bu hüsnüvə məbhutü heyran eyləyən kimdür.

Səri-kuyində Adəm aldı cənnət, keçdi kuyindən,
Bu sövdadən sonra anı peşiman eyləyən kimdür.

Məlamət eyləmək Məcnuni olmaz Leyli eşqində,
Məni eşqündə bəs rüsvayi-dövran eyləyən kimdür.

Gülər min naz ilə gülşəndə gül xarun qucağında,
Qəfəsdə əndəlibün bağrını qan eyləyən kimdür.

Qaşun tərhin görüb mehrabi-taət oldığın bildim,
Qəmindən qəddimi kim bükdi, çövkan eyləyən kimdür.

Qızardı lalətək rüxsarı, güldi ol kəmanəbru,
Dedi, get, get bu sirri kəşfü asan eyləyən kimdür.

Nigarım görmək istər surətin hüsnümdə hər saət,

Qul oğlın göz yumub-açınca sultan eyləyən kimdür.

Kim etdi dideyi-Yə`qubi bina bir qəmis ilən,
Züleyxa bağrıni qan, didəgiryan eyləyən kimdür.

Girür hər şəklə ol məhparə, imdi məndə zahirdür,
Belə ziba gözəlçün əmri mizan eyləyən kimdür.

Yazar əş`ari şirin bu əlifba bilməyən Saqib,
Anı tutisifət, şəkkər qəzəlxan eyləyən kimdür.

* * *

Mana hicründə, ey məh, tə`neyi-əğyar həmdəmdür,
Şikayət etmərəm mən səndən hərgiz, sevdigimdəndür.

Nə qədri cövr qılson sən mana, əl çəkmərəm səndən,
Dəmadəm sölərəm, əl çəkmə, bu cövrü sitəm kəmdür.

Azaldar vəsl eşqi, vəslüvə əğyarı qoy yetsün,
Məni ram eyləyən, ey qönçələb, bu zülfi-pərçəmdür.

Həvayi-eşq qoymaz eyləyüm xalun təmənnasın,
Təm`kar ilə həmdəm, həmnəfəs birütbə adəmdür.

Gözüm yaşilə verrəm sərvə su, qədün xəyalilən,
Kəmanəbrulərünçün bari-qəmdən qamətim xəmdür.

Məhəbbət badəsindən içməyüb məst olmıyan zahid,
Meyi-Kövsər xəyalilə həmişə şadü xürrəmdür.

Səbukeş Cəbrəil olmış, Məsiha rindi-meyxanə,
Bəli, meyxanələrdə saqiyi-gülçöhrə Məryəmdür.

Qəzəl tərhini Saqib kəsb edüb Asəf kəlamindən,
Nə hacətdür ki, şahid Nadirə ustadi-ə`zəmdür.

* * *

Bu deyri-fəna mərhəleyi-guşeyi-qəmdür,
Gər abi-həyatı sana versə, genə səmdür.

Vardur qərəzi kim sana bir qətrə su versə,

Şad olma verəndə, demə bu əhli-kərəmdür.

Qıl səcdə mana, yə`ni çi hər vəqt desəm mən,
Azadlıq olmaz belə, bu eyni-sitəmdür.

Ahuləri səyyad salur bəndi-kəməndə,
Nəfsün eləsün şad, görün kim-kimə yəmdür.

Tökmiş biri rüxsarinə xunabeyi-həsrət,
Nail biri öz məqsədinə, böylə rəqəmdür.

Var çoxları bir zərrə vücudindən iş açmaz,
Əldən-ələ düşməz, deyəsən şahi-əcəmdür.

Var çoxları canpərvərdür, ruhi-rəvandur,
Çəkməz nəfəsin, xəstə giriftari-vərəmdür.

Birsi belə bilmir qədəri-dövləti mali,
Netsün biri, min ah ilə möhtaci-dirəmdür.

Fəryad eləmək ney kimi ancaq bizə qaldı,
Ey dil, buna da eylə təşəkkür, bu də dəmdür.

Saqib, ələ al cami-meyi, badeyi-nab iç,
Dərmani-qəmü möhnəti-ənduhü ələmdür.

Mən xadimi-xəlqəm, bu sözi çoxları söylər,
Salmış özini rəngə, vəli əbdi-şikəmdür.

* * *

Arizün, mahvəşim, rəşki-güli-şəbbudür,
Qamətün sərv, ləbün qönçə, tənün pərqudür.

Həvəsi-lə`li-ləbün badəpərəst etdi məni,
Kim içər yoxsa bu qan olmuşı kim, ağudür.

Göstərən hüsnüvin əksini sənün hər ləhzə,
Şəhrdən-şəhrə min avazə ilə güzgudür.

Gözləründən necə mən vahimə etmüm, ey məh,
Biri sərmayeyi-fitnə, birisi cadudür.

Sorsalar həşrdə kim bağruvı qan etdi sənün,

Yanə-yanə deyərəm mən, bu kəmanəbrudür.

Qaşlarun tərhinə mehrab deyürlər gərçi,
Bu qələtdür desə kim, xabgəhi-ahudür.

Ey könül behcəti, divanə nə eylər zəncir,
Dami-zənciri-cünun səndə qəra giysudür.

Xətmdür səndə gözəllik, nə gözəldür Yusif,
Satdılar qul yerinə bəs necə ol məhrudür.

Vaizün qövlinə bel bağlama, Saqib, hərgiz,
Gündə min din evi viranə qılub, bayqudür.

* * *

İki ayinə bilmə arizün nəzzarələnmişdür,
Mühəmməd(s) barmağilə bir qəmərdür, parələnmişdür.

Dönübdür xaneyi-zənburə könlüm tiri-qəmzöndən,
Əmandır, vırma, incitmə, a zalim, parələnmişdür.

Bu çıxmış göz qabağında durarsan, dutgilən fasil,
Budur qorxum ki, dutsun damənün, fəvvarələnmişdür.

Xəbər aldım cərəsdən, naqə neyçün çox fəğan eylər,
Dedi, Məcnundən birəhm Leyla arələnmişdür.

Dedim, ey səngdil, könlüm yerində durmayur neyçün,
Dedi, rüxsarimə giysuyi-pürçin darələnmişdür.

Dedim, eşqün yolında qalmışam avarə sərgəştə,
Dedi, sən kimi çoxlar, əl gətür, avarələnmişdür.

Dedi ol qönçələb, neyçün qaralmış zülfi-pürçinim,
Dedim, bəxti-siyahimdən pərişan qarələnmişdür.

Keçəndə vırma daşı zahidə meyxanə küncindən,
Əlində dağəni-səccadə var, biçarələnmişdür.

Libasi-fəqr ilə aləmlərə fəxr eylə, ey Saqib,
Nəhayət çəkmə həsrət, nanəciblər xarələnmişdür.

* * *

Qan qoyan bağrıma, ey dil, bu kəmanəbrudür,
Qaməti sərv, ləbi lə`l, gözi cadudür,

Necə qan eyləməsün bağrımi ol qaşı kəman,
Deyəsən arizi-gülnarı güli-şəbbudür.

Gör necə naz ilə yatmış qaşuvun tağındə,
Etmə bidar onı, səyyad qovub, ahudür.

Sorma əhvalımi bağrun belə kim qan etmiş,
Deyərəm qan eləyən bağrımi bu bədxudür.

Kim deyür xaldur ol lə`li-ləbün küncində,
Dinü dil məndən alubdur bəççeyi-hindudür.

Vəsfi-rüxsaruvi, ey şux, demişdim mən haçan,
Məndən heç incimə, vəsfin eləyən güzgudür.

Kim sora nalə ilən, hanı cünun zənciri?
Deyərəm səndəki aşüftə qəra giysudür.

Zülfüvə şanə dəgəndə düşərəm təşvişə,
Tarinə bu dili-divanəsifət bağludür.

Kimə izhar elədim, lə`li-ləbündən sordum,
Qoymayursan dəxi zalim deyəni, bu, udür.

Etməsə ahü fəğanım sənə tə`sir əgər,
Nə məlamət eləyürsən, səbəbi bədgudür.

Zahidün qövlünə bel bağlamə, Saqib, hərgiz,
Gündə min din evi bərbad eləmiş, bayqudür.

* * *

Sözün həqiqəti xəlq içrə ixtilafdədür,
Bu ixtilafə səbəb tiğlər qilafdədür.

Biri əlində dutub Yusifin bəhasinə can,
Birisinün hələ ümidi bir kəlafdədür.

Təvafi-Kə`bə sənün, məndən əl çək, ey zahid,

Ki, şəm`i-arizi-canandə dil təvafdədür.

Neçün qaralmısan, ol zülfi-tardən sordım,
Dedi, zibəski yerim ataş içrə rafdədür.

Dağıtma səfheyi-rüxsarə zülfi-pürçini,
Deyərlə, gün dutulub xəlq, inkisafdədür.

Degül xilaf mey içmək, həramdür əmma,
Olanda saqi bu məh, içməmək xilafdədür.

Fəsadlıq ola bilməz təbiətində meyün,
Fəsad içəndədü, badə hicabi-safdədür.

Vücudi-dusti-həqiqi cəhanda yox, ey dil!
İnanma kim desə vardur, kəzafü lafdədür.

Zəmanədən eyləmə şikvə, bəxt yar degül,
Bu iltifat sana, Saqiba, kifafdədür.[*]

* * *

Vətən gedübdür əlündən, həram ləzzətdür,
Nicat verə Vətənə, intiqam ləzzətdür.

Vıranda düşmənə tiği tərəhhüm etməgilən,
Boyanə qırmızı qanə niyam, ləzzətdür.

Vətən əlündə ola, qəmdən olmısan azad,
Kifayətündür, əzizim, müdam ləzzətdür.

Bu taci-səltənətün ləzzəti yox, ey sultan,
Qulamə eyləginən ehtiram, ləzzətdür.

Qazar əyağuvun altını, teyydür ömrün,
Demə bu gərdiş hər sübhü şam ləzzətdür.

Səyavuşun qanıdur, şişəyə dutub dövran,
Deyürlə xəlq, meyi-lə`lfam ləzzətdür.

Yəmanlıq eyləmə, yoxdur yəmanlığun səməri,
Kişiyçün aləmara nik nam ləzzətdür.
Fəda bu canım ola əhli-zövq söhbətinə,

[*] Bu qəzəl "İqbal" qəzetinin 191-ci nömrəsində çap olunmuşdur.

Onun ki, qiyməti yoxdur, təmam ləzzətdür.

Cəhanda xoş güni gər istəyürsən, ey Saqib,
Ki, tərki-ləzzət qıl, vəssəlam, ləzzətdür.

* * *

Nədür bu mahliqa, sərvqamətün yeridür,
Qədi qiyamə gələndə, qiyamətün yeridür.

Əgərçi xəlq deyür qaşuva, kəmandur bu,
Gözün fədası, bu mehrabi-taətün yeridür.

Gözün edər məni gəh bağrıqan, gəhi lə`lün,
Bu hüsn padşəhindən siyasətin yeridür.

Düşüb yerində üzarunda daneyi-xalun,
Gözəldə xali-siyəhdü, məlahətün yeridür.

Sədayi-neydən əgər qanə dönsə dil, nə əcəb,
Nigardən düşüb ayrı, şikayətün yeridür.

Cərəs fəğanun eşid, yatma, bağrıqan Məcnun,
Yetişdi naqeyi-Leyli, bəşarətün yeridür.

Nə qədr istəyisən,* vır mana bu qəmzə oxın,
Bu xəstə könlümə, ey şux, rahətün yeridür.

Deyəndə, incimə, ver kam lə`li-nabundan
Rəqibdən mana gizlin, zərafətün yeridür?

Eşitmişəm eyləyüb tövbə badədən Saqib,
Dutub behişt yolın, bidəyanətün yeridür.

* * *

Eylə sərməsti-mey ol, bilmə bu aləm kimdür,
Vermə yol möhnətə, ənduhü qəmə, qəm kimdür.

Mən sənün daneyi-xalunda əsirəm, ey məh,
Dami-zənciri-cünun, türreyi-pürxəm kimdür.

Qaşuvun tağı arasında yatub məst gözün,

---

* İstəyirsən

Xütən ahusi kimi bilməyür heç rəm kimdür.

Səri-kuyində mana eyləmə cənnət və`zin,
Verməröm kuyivi Adəm kimi, adəm kimdür.

Tiği-qəmzön eləmiş könlimi yüz min yerə çak,
Onı cəm` etmək içün rişteyi-Məryəm kimdür.

Demə qəm saldı əyağdan məni, ey dil, həzər et,
Eyləməz əşk rəvan kim yüzə, xürrəm kimdür.

Fələkün dönməyəcəkdür yüzi, fəryad etmə,
Etgilən istədigün, ahi-dəmadəm kimdür.

Fikrüvi verməgilən heç kimə, iç badeyi-nab,
Mey kimi əhli-dilə məhrəmü həmdəm kimdür.

Yetişüb Saqibə meydani-qəzəl, ey Asəf,
Qoymuş heyrətdə təmam aləmi, Rüstəm kimdür.

* * *

Eylədün aləmi bərbad, həvəsdür, bəsdür,[*]
Tikə bilməz dəxi ustad, həvəsdür, bəsdür.

Atdun əl pərdeyi-namusinə hər tayifənün,
Oldı rüsva, evün abad, həvəsdür, bəsdür.

Tökmə qanı bu qədr sahibi vardur, zalim,
Lə`nət eylər sana cəllad, həvəsdür, bəsdür.

Olmayanda məgər Allah, tökərlər qani?
Rəhmə gəl, naxələf övlad, həvəsdür, bəsdür.

Saldun avarə vətəndən, vətənün övladın,
Eləyürsən kimi dilşad, həvəsdür, bəsdür.

Xabi-qəflətdən ayıl, millətüvün halıni gör,
Yox əlində dəxi heç zad, həvəsdür, bəsdür.

Ayılarsan o zəman, bir yerə bənd olmaz əlün,
Çəkilər xəncəri-fulad, həvəsdür, bəsdür.
Eylə düşmənçilik et, sülh yolını göstərsün,

---

[*] Əbdülxalıq Cənnətinin (1855-1931) “Yetər, ey mürdeyi-cünbində həvəsdür, bəsdür” rədifli qəzəlinə nəzirədir.

Yox sana dust bir əfrad, həvəsdür, bəsdür.

Nə işün din ilə, Allah ilə vardur, əl çək,
Gör nələr xəlq edir icad, həvəsdür, bəsdür.

Bir kəsi dust dutursan ki, sana düşməndür,
Səni heç eyləməyür yad, həvəsdür, bəsdür.

Nəyüvə fəxr eləyürsən, nə olur göstərəsən,
Gülür aləm sana, arvad, həvəsdür, bəsdür.

Ac tovuq darı görər, var bu məsəl aləmdə,
Yuxıda eyləmə fəryad, həvəsdür, bəsdür.

Saqibün pəndi sana zərrəcə tə`sir etməz,
Boş yerə eyləyür irşad, həvəsdür, bəsdür.

* * *

Gizlətdi yar hüsnini məndən, bəhanədür,
Zülf içrə bu bəhanəyə bilməm, bəha nədür?

Tərk eylə dinü dil dedi eşqimdə, eylədim,
Can nəqdi əldə alsun əgər, qəsdi canədür.

Sən eylə şuxsən, necə mən qeyrə dil verüm,
Başdan-əyağə hər bir işün aşiqanədür.

Mehrabə oxşadubla qaşun tiğini, vəli,
Qan dutmış anı, meyli onun cansitanədür.

Avarə dami-zülfün içində bu mürği-dil,
Dami-cünun bunca ona aşiyanədür.

Yox halımi bilən şəbi-hicründə, səngdil,
Vaqif bu sirrə naleyi-ruzü şəbanədür.

Ey dil, təvaf eyləmə xalın bu gülrüxün,
Biçarə Adəmi edən heyran, bu danədür.

Düşdüm əyağə mey kimi sultani-əsrkən,
Yox çarə əldə, xahişi-dövrü zəmanədür.

Saqib nəsihət etsə sana, ey dil, incimə,

Keçmə vətəndən, hər sözi bir taziyanədür.

* * *

Hər kim bu dami-zülfün əlində əsirdür,
Azadəlikdə xosrovi-taci-sərirdür.

Qaşun qılıncı gərçi tökər xuni-aşiqi,
Əmma bu şux gözlərün ondan şərirdür.

Can qəsdin etməgə düzülübdür kəmanuvə,
Müjgan deməzlər, hər biri bir növki-tiridür.

Yusif əgərçi fəth eylədi hüsn kişvərin,
Hüsnün cəhanə fitnə salub, binəzirdür.

Yox dərdi-eşqə çarə, gətür məndən əl, təbib,
Bir dərdə eylə çarə ki, dərmanpəzirdür.

Zahid, məlamət eyləmə sərməsti-badəyəm,
Pirün əsası gülrüxi-rövşənzəmirdür.

Saqib özini mail edübdür cəvanlara,
Ey sərvnaz, baxmagilən, xəstə pirdür.

* * *

Qəmzön oxıyla bu dili-viran yəralidür,
Bitişməz bu yarə mərhəmlə, çox yəralidür.

Tərk eyləyən degül şəbi-hicründə naləni,
Ney kimi hər nəfəs deyəsən kərbəlalidür.

Kimdür əsiri türreyi-pürpiçi-tabuvun,
Ey səngdil, dedim, dedi bəxti qəralidür.

Can nəqdin al dedim, qoy, öpüm lə`li-nabuvi,
Vermək olarmı canə, dedi, get, bəhalidür.

Xalü xətündən, ey dili-divanə, qıl həzər,
Vermiş fərib adəmə, əl çək, xətalidür.

Zəncirə oxşadur özini, gah əf`iyə,

Gahi kəməndə türrələrün, laübalidür.

Məcnun öpəndə it əyağın xəlqə sölədi,
Gəzmiş bu kuyi-Leylidə, məndən vəfalidür.

Şəm`i-rüxündə, qoy, yanə pərvanələr kimi,
Könlüm bəlasını çəkirəm, çox həvalidür.

Bir şuxə vermişəm dili-divanə, Saqiba,
Qədi-sərvnazi bilmərəm əmma həralidür.

* * *

Hərdəm şəbi-hicründə mana möhnəti-qəmdür,
Ey qaşı kəman, səndə bu nə cövrü sitəmdür.

Bari-qəmü eşqə necə tab eyləmək olsun,
Qafun qədi əbruyi-kəmanun kimi xəmdür.

Yandırdı oda laləni bu arizi-alun,
Başdan-əyağə rəşki-güli-bağı-İrəmdür.

Bu daneyi-xali-siyəhün künci-ləbündə,
Qarətgəri-dini-ərəbü türkü əcəmdür.

Şirinligi almış əsəl xami-ləbündən,
Dutma ləbüvün yanına bir dəm anı, səmdür.

Ey şux, dedim bağrımi kim min yerə böldi,
Ahəstə danış, dinmə dedi, növki-müjəmdür.

Əğyarə nəsib oldı, alur kam ləbündən,
Saqib yanub həsrət oduna, ruzisi kəmdür.

* * *

Bu xalü xəti-zahiriyyətə baxma danədür,
Oxşar əgərçi danəyə, əmma bəhanədür.

Yəğmayə verdi dinini biçarə Adəmün,
Tərk etdim anı, meyli həmişə ziyanədür.

Kimdür bu fitnənün səbəbi, ey qan olan könül,

Bərbad oleydi, afəti-can karxanədür.

Şahı gəda, gədayə verən taci-səltənət,
Dövri-zəmanədür, genə dövri-zəmanədür.

Zənbur evinə bənzəsə eyb etmə könlümə,
Çeşmün fədası, tiri-müjöndən nişanədür.

Qılsam fəda bu canımi qaşun qılıncına,
Ey səngdil, de bircə görüm, xunbəha nədür.

Əfşan edən bu türreyi-pürpiçü tabuvi,
Ahim yelindən olma pərişan bu şanədür.

Hər aşiqün ki, sən kimi bir sərvqəddi var,
Qəm çəkməsün ki, sahibi-gəncü xəzanədür.

Gülbərgi-tər ləbündən əgər pir Saqibə,
Bir busə lütf edəndə, deyər aşiqanədür.

* * *

Zəncirə ram edən məni zülfün tənabidür,
Divanənün əzabi tənabun əzabidür.

Meyxanələrdə meyl eləməz camü badəyə,
Hər kim cəhandə nərgisi-məstün xərabidür.

Hər gözləründə məskən edüb bir cəhan bəla,
Şahid gər istəsön, bu cəhan inqilabidür.

Sərgəştə ay dalunca düşüb seyr edər müdam,
Heyran edən onı rüxüvün afitabidür.

Rüsvayi-aləm Adəmi xalundur eyləyən,
Əlbəttə eyləyər, Həbəşistan şəbabidür.

Divanə könlümün qəfəsi parə-parədür,
Bais ona, bu türrələrün piçü tabidür.

Ey şux, hər kim eləyüb izhari-əmri-həq,
Əldə dəlili vardur, hüsnün kitabidür.

Ey söləyən bu bağruvı qan etdi kim sənün,

Bir sərvnaz şivəsidür, lə`li-tabidür.

Saqib, cəhanə fitnə salan cami-mey degül,
Təsbih əldə, zahidi-bixud cənabidür.

* * *

Giysulərüvün türrəsi zənciri-şikəndür,
Hüsnün güli, ey qaşı kəman, rəşki-çəməndür.

Dutmam adını bir də dəxi nərgisi-məstün,
Neylüm, gözəlim, tiri-müjöndən qədəğəndür.

Baş-başə çatub dövri-ləbündə məgəsi-ruh,
Bal çeşməsinə ləblərüvün şəhdi ləyəndür.

Mabeyni-iki qaşun arasındaki xalun,
Səyyadun əlindən qaçub, ahuyi-Xütəndür.

Sərraf bilür qiymətini, sorma yetəndən,
Bu ləblərüvün qədrini, yaquti-Yəməndür.

Divanəsifət kuyüvə yüz üstə sürünnəm,
Əl çəkmək olar, aşiqə can kimi vətəndür.

Bülbül, bu qədr etmə fəğan künci-qəfəsdə,
Bərgi-gül içün aqibəti qanlu kəfəndür.

Dövran sitəmindən bu qədr eyləmə nalə,
Azadələrə bu dirilik beytül-həzəndür.

Çəkmə yüzüvə əllərüvi, qanə dönər dil,
Ayinə degül, rəngi solar, bərgi-səməndür.

Saqi, demə qəm mey gətürür, iç meyi-nabi,
Sağərdən utan, arizi-siminbədəndür.

Xətmi qəzəlün Yusifə, Saqib, yetişibdür,
İnkar eləmə bu sözüvi, şirinsüxəndür.

* * *

Ver bir nigarə könlüvi, hüsni həmişədür,

Əl vırma, tez sınar bu pəriçöhrə, şişədür.

Ey dil, bu hüsnə uymagilən tiri-qəmzəsi,
Meyli ilan kimi onun hər ləhzə nişədür.

Fərhad kimi uyma bu Şirindəhənlərə,
Həmrazı Bisütundə avazi-tişədür.

Boşdur əlün, qabağdə xətərnak var səfər,
Nəxlün həyatinün səbəbi tari-tişədür.

Hər gündə bir libasə girürsən, eyb degül,
Sor e`tiqaduvi, de görüm, hansı kişədür?

Yetmək həqiqətə nə iləndür, xəbər get al,
Meylün əgərçi şamü səhər keyfü eyşədür.

Meyxanə küncidür bizə, Saqib, məqami-əmn,
Aramgahi-şiri-jəyan künci-bişədür.

Fəxr etməsünlər hüsnə firəngün gözəlləri,
Cümlə gözəllərün şəhəri şəhri-Şişədür.

* * *

Saqi nədür, mey nədür, cam nədür, Cəm nədür,
Gah verür min fərəh, gah verür qəm nədür.

Fitnə salub aləmə nərgisi-məstün sənün,
Tə`nə vırar sünbülə, türreyi-pərçəm nədür.

Etmə pərişan yüzə, fitnə dutar aləmi,
Hər dügünündə anun nalə dəmadəm nədür.

Daneyi-xali-siyəh künci-ləbündə sənün,
Tökməgə qan tiğdür, mahi-mühərrəm nədür.

Sirr dəhanunda var, var-yoxuvun nüktəsi,
Yoxdan edər varlıq, İsəvü Məryəm nədür.

Cilvə edər gündə bir rəngdə ol sərvqəd,
Xəlqi salub heyrətə, xəlqdə bu rəm nədür.

Gah deyür Adəməm, cənnəti tərk etmişəm,

Aldadur aləmləri, həzrəti-Adəm nədür.

Nuh deyür ki, özin aləmi qərq eylədi,
Qaçdı özi kəştiyə, bilmədi aləm nədür.

Hüsninə mail olub çıxdı təmaşasinə,
Yusifü Şirin nədür, Leyliyi-xoşfəm nədür.

Gah cünun rəxtinə daldalanub ah ilən,
Qəmzədə Məcnun kimi didəsi pürnəm nədür.

Könlümə bir od vırub, sellə dolub gözlərim,
Bad ilə xakə baxun, onda fərahəm nədür.

Kim dedi müjgandur tiri-cigərçakuvə,
Çarəni kim eyləsün, zəxminə mərhəm nədür.

Bağə əgər bir qədəm gər qoyasan naz ilə,
Lalə əyağun yuvar, lalədə şəbnəm nədür.

Qüdrətinə sane`ün fəhm elə məsnu`idən,
Eyləmə inkarıni, səndə bu çəm-xəm nədür.

Dutma təbiət yolın, azmagilən əqldən,
Yaxşı-yəman fərqini bilməyür, ə`ləm nədür.

Saqi, gətür badəni xüm dolusı Saqibə,
Sağərə meyl eyləməz, ver bura, kəm-kəm nədür.

* * *

Cümlə cəhan əhlini kim dedi huşyardür,
Hər işə iqdam əgər etsə, səzavardür.

Ey mədəniyyət sevən, bil mədəniyyət nədür,
Var adı yoxdur özi, harda məgər vardür?

Bu mədəniyyətmidür, qərq eləyüb cəhani
Qanə, nədür bəhasi, hansı günəhkardür.

Rahət yaşamaq səndə yox, çox mədəniyyət demə,
Ağzuvi pak etgilən bəhrdə, murdardür.

Heç kimün imdadinə zərreyicə yox yetən,

Çarəsi yox, möhnətü dərdə giriftardür.

Bir gögə bax, od dutub, baisi kimdür onun?
Rəhbəri bu millətün qan içənə yardür.

Qan içənə ad qoyub xəlq, kəmal əhlidür,
Aləm olub xərabə, gör, necə biardür.

Səhvüvə iqrar elə, ey mədəniyyət sevən,
Düş başə bu milləti, səndə nə azardür.

Gər mədəniyyət ola xəlqdə rahət yaşar,
Xəlq düşüb dərbədər hər tərəfə xardür.

* * *

Pərişandur könül zülfün pərişan etdigündəndür,
Üzari-aluvə aşubi-dövran etdigündəndür.

Kəməndi-zülfüvə dustaq ola dil, arizu eylər,
Anı bu şanə ilən ənbərəfşan etdigündəndür.

Qiyamət göstərürsən qamətünlə sərvə hər saət,
Səbadən naz ilə bağə xuraman etdigündəndür.

Pərişanxatir olma naləvü fəryadi-bülbüldən,
Ləbün fikriylə qönçə bağrını qan etdigündəndür.

Məlamət tərkin et, görsön əgər, ey şux, giryanəm,
Rəqibi və`deyi-vəsl ilə xəndan etdigündəndür.

Başunda quş yuva dutmazdı, Məcnun, Leyli hicrində,
Dəmadəm ah ilən seyri-biyaban etdigündəndür.

Məlamət etmə, zahid, badəyə künci-səbu dutmuş,
Oxursan nəhy vəsfin böylə böhtan etdigündəndür.

Dəxi cənnət qapusın bir də, Adəm, görməsən[*] hərgiz,
Kəm etdün rütbəvi sən tərki-canan etdigündəndür.

Təəccüb eyləmə Azəristandur şe`rün, ey Saqib,
Əlündə nəqdi-can, qurbani-irfan etdigündəndür.

* * *

[*] Görməzsən

Dil eylər naləni ney tək bağrımi qan etdigündəndür,
Rəqibi güldürüb hər ləhzə xəndan etdigündəndür.

Əsir etdün dili-divanəmi zülfün kəməndində,
Dəmadəm şanə ilən ənbərəfşan etdigündəndür.

Könüllər naləsindən bixəbərsən, sərvi-azadım,
Olubsan hüsnüvə məğrur, tüğyan etdigündəndür.

Pərişan görsön əhvalım, nə hacət sorma heç məndən,
Üzari-aluvə zülfün pərişan etdigündəndür.

Qəbuli-mərhəm etməz, səngdil, sədparədür könlüm,
Anı müjgan oxilə tiri-baran etdigündəndür.

Təmənna eyləsəm də, vermə sən bu lə`li-nabundan
Öpəm, qeyr ilə doğrı əhdi-peyman etdigündəndür.

Təəccüb etmə, ey dil, nalə çıxmaz bəndi-bəndindən
Neyün, hicrində yarun ahü əfğan etdigündəndür.

Məlamət etmə, zahid, xəlq səndən etsə gər nifrət,
Durub mehrabdə Qur`anə böhtan etdigündəndür.

Fəsahət kişvərini şe`r ilə fəth eylədün, Saqib,
Edüb ustadə xidmət kəsbi-irfan etdigündəndür.

* * *

Ey şux, hüsnün ayinədür, mey sitarədür,
Olmaz işıq sitarə ilə, mahparədür.

Bimari-eşqə çarəni sorma təbibdən,
Eşqün mərizi gər ləbüvi əmsə, çarədür.

Qəmzön oxıyla könlümə, gəl, vırma yarəni,
Əbrulərün qılıncı ilə parə-parədür.

Sən hüsn açanda vahimədən çıxmaz ayü gün,
Bazari-hüsnə Yusifi çəkməz, nəkarədür.

Zənciri-zülfüvə özini mübtəla edən,

Qılsun yəqin ki, mən kimi bir bəxti-qarədür.

Qoymaz rəqib öpməgə ol xaki-kuyüvi,
Mən bəxti-qarəni, o da səndən işarədür.

Saqib, çox etmə vəsf mana huri-cənnəti,
Meylim mənim bu sərvqədü gülüzarədür.

* * *

Xəlqün həyati, dadrəsi simü zərdədür,
Simü zərün də meyli, bəli, bəxtəvərdədür.

Düşməndən intiqam əgər almaq istəsön,
Zər dut əlündə daim, həmişə zəfərdədür.

Muri-zəifi zər güci şiri-jəyan edər,
Zərsiz gər əjdəha ola, axır xətərdədür.

Xovf etmə xəlqi-aləm əgər olsa düşmənün,
Zər var cibündə, tiği-düsərtək kəsərdədür.

Zərdür xərabəni edən abad, şəkk yox,
Bax kainatə, gör bu zəri, gör, nə hünərdədür.

Həddi-kəmalə yetməmisən, səndə yox günəh,
Başdan-əyağə bu günəh ümmü pədərdədür.

Vəqtində tərbiyət sana vermüb əzizi-mən,
Bitərbiyət fələkzədədür, şurü şərdədür.

İzhari-nifrət etgilən bəd mürəbbiyə,
Şərdür vücudi, heç nəyə dəgməz, hədərdədür.

Tə\`sir qalmayub demə heç ahü nalədə,
Tə\`siri səbr elə ki, ahi-səhərdədür.

Od şö\`ləsini görmədi rüxsari-yardə,
Musa(ə) yügürdi görməgə guya şəcərdədür.

Hər rəngə girsə, tanur anı həqqbin göz,
Həqbin çünki həq özi daim nəzərdədür.

Hər bir fəsad zahir özin etsə, Saqiba,

Bərbad oleydi, gərdişi-şəmsü qəmərdədür.

* * *

Qiyamət macərası səndəki bu sərvqamətdür,
Qiyamət bir də olmaz, gər qiyam etsə, qiyamətdür.

Xətadur qaş demək, qurban olum mən əgri tağinə,
Ki, qan tökməklik ilə pas dutub tiği, siyasətdür.

Degül şərt gözəllik qaşü göz, ey sərvi-azadım,
Gözəllik cəm`idür rüxsari-alundə məlahətdür.

Əsir etmə dili-divanəmi zülfün kəməndində,
Şəhidi-navəki-müjganuvəm, zalim, kifayətdür.

Qaşun tərhin görəndə zahidə heyranlıq əl verdi,
Rəhi-məscid dutub guya ki, mehrab ibadətdür.

Xəbər alma, rəhi-eşqündə getdi dinü dil məndən,
Xəyali-xalun ilə dinü dil bilmərrə qarətdür.

Kimünçün eyləyürsən, əl gətür, fikri-xilafətdən,
Xəlayiq qəflət içrə sərbəsər, ey dil, cəhalətdür.

Cəhalətdən degülmi, göz yumub-açınca, fikr eylə,
Dəxi tə`mirə gəlməz, çarə yox, viran vilayətdür.

Cəhanə, Saqiba, meyl etmə hərgiz, düşmə təşvişə,
Vəfa bir zərrə yoxdur onda, əl çək, bidəyanətdür.

* * *

Eşq dərdinün əlacı demə Loğmandədür,
Çarəsi bu mərəzün sorulub, canandədür.

Kur idi dideyi-Yə`qub, kim etdi bina,
Düşmə təşvişə, de bircə, necə dərmandədür.

Buyi-pirahəni-ol Yusifi-gümgəştə idi,
Açdı Yə`qub gözin, şahidi Qur`andədür.

Eşq rəsmini gərək kəsb edəsən Məcnundan,

Yoxsa kim, bilmisən heç eşq nə mizandədür.

Bağladi iki gözün, görmiyə Leyla üzini,
Görsə gər xəlqə edər faş xunəfşandədür.

Dedilər sən necə Allahi tanursan, Məcnun,
Dedi, Allah mana Leylidür, hər yandədür.

Ey deyən, əl gətür ol sərvqədün eşqindən,
Əl çəküm mən necə, eşqün əsəri candədür.

Dili-divanəmün alson xəbərin, şirinləb,
Məskəni səndəki giysuyi-pəricandədür.

Tiği-əbrulərüvün zəxminə yoxdur çarə,
Mərhəmi versön əgər navəki-müjgandədür.

Ey soran varmı qiyamət, sən əcəb qafilsən,
Əsəri-ruzi-qiyamət şəbi-hicrandədür.

Vətənün cənnəti tərk eyləmək olmaz, ey dil,
Xunbəhasi onun Allahdə, imandədür.

Şe`ri kəsb eylədi Saqib rəvişi-Yusifdən,
O səbəbdən qəzəli lə`l kimi kandədür.

* * *

Olmaya dami-zülfüvə düşmiş əsiri-bəndədür,
Könlümün oynağı neçün türreyi-pürşikəndədür.

Arizi-aluvi görüb sevdi bu natəvan könül,
Bu gözüm, ey pərivəşim, sanma günah məndədür.

Daneyi-xali-hüsnüvə boş yerə nifrin eyləyür,
Adəm itirdi rütbəsin, təqsir onı səpəndədür.

Fikri-ləbün qan elədi künci-səbudə badəni,
Kakili-ənbərinivün rayihəsi Xütəndədür.

Arizi-rəşki-lalədən eyləmişəm sorağıni,
Bir üzi yasəməndədür, bir üzi də çəməndədür.

Şivə ilə alanda sən dinü dilimi yaxşı idi,

Lə`lü ləbün dedim öpüm, yoxdı dedün, Yəməndədür.

İstədi əgri qaş çəkə, məhv elədün müsəvviri,
Qaş yerinə qılınc çəküb, zəxmi dili-həzəndədür.

Qəbrdə alsalar xəbər, hansı yerün sən oğlısan,
Söləyərəm adı onun qanə batan kəfəndədür.

Dil deməz adın onun olsa da parə-parə gər,
Kim verür ixtiyar ona, bəndə düşübdür, bəndədür.

Rütbə verülmiş hər kəsə, Saqib, onı bilən gərək,
Rütbəyə bax ki, Yusifə hüsn ilə pirəhəndədür.

* * *

Demə, ey sərvnazım, səndə kim, bu sərvqamətdür,
Ki, sərvün böylə olmaz qaməti hərgiz, qiyamətdür.

Gözəllik xətmdür səndə, gəzərsən göz qabağında,
Deyürlər xəlq Yusif içün gözəldür, boş rəvayətdür.

Nə hacətdür verürsən zinəti bu mahi-rüxsarə,
Ləbün küncində xalun naz ilə yatmış, kifayətdür.

Kəmanə çox da oxşar, qönçələb, kim qaşlarun tağı,
Eşitsön, zahidə bildirmə, mehrabi-ibadətdür.

Gözün qurbani, gəlmə təngə ney fəğanindən,
Şəbi-hicran əlindən nalə eyləyər, şikayətdür.

Dağıtma könlümün cəm`iyyətin, çox şanə göstərmə,
Pərişan zülfüvə artıq pərişanlıq nə hacətdür.

Əgər Məcnun olson keçgilən sən kuyi-Leyladən,
Degülsən, keçmə, əl çək, tərk qıl, rahi-zəlalətdür.

Biyaban seyrini Leyladən ötri etmə, ey Məcnun,
Yatub əğyar evində naz ilə asudə, rahətdür.

Yetişdün sərhədi-məqsudə, Saqib, şe`rgulıqda,
Verüb tə`lim Yusif, səndə bu kəşfü kəramətdür.

* * *

Həmrəng ləblərün ilə meyi-lə`lfamdür,
Kim ayrı içsə lə`li-ləbündən, həramdür.

Göstər xəlayiqə ki, qiyamət olur necə,
Bu sərvi-qamətündə qiyamət qiyamdür.

Fərman alubdur qətlimə müjganlarun oxı,
Heç bilməyür ki neyliyə, əzbəski, xamdür.

Tə`lim etməyüb ona kim, məst gözlərün,
Bir dəm ayıq degül, elə məsti-müdamdür.

Aləm kəman deyür qaşüvə, səhv eyləmiş,
Mehrabi-əhli-halə bu pirü qulamdür.

Yoxdı nəhayət hüsndə gərçi ki, Yusifə,
Başdan-əyağə səndə gözəllik təmamdür.

Gördüm ki, yatmısan gecə, sordum dodağuvi,
Uydun rəqibə, səndən alan intiqamdür.

Divanə könlüm ol xəmi-zülfün əsiridür,
Neyçün təəccübəm belə zəncirə ramdür.

Ustad Saqibə, gözəlim, hər yetən degül,
Canım fədası, Yusifi-şirinkəlamdür.

* * *

Ey şux, hüsnüvə məhi-taban qərindür,
Bais odur ki, nur saçur, məhcəbindür.

Gər sorsa ləblərün məgəsruh, əcəb degül,
Abi-həyat çeşməsidür, əngəbindür.

Giysuləründə şanə gəzər dil sorağinə,
Çox vırma şanəni, onı tapmaq çətindür.

Min şanə vır bu kakilün piçü tabinə,
Əl çəkgilə, çətin dağıla, çin-çindür.

Ahənrübani kiprigün eylər dəlik-dəlik,

Əbrulərin kəmanilə həmnişindür.

Adəmfərib daneyi-xalun əsiriyəm,
Künci-ləbündə qibleyi-əhli-yəqindür.

Saqi, şərabi eyləmə təklif zahidə,
İçməz meyi, həram bilür, əhli-dindür.

Mən xanimanxərabi meyün yıx əyağinə,
Məstü xərab eylə məni, qəm kəmindür.

Dəryayi-eşqə girməgilən, Saqib, et həzər,
Qərq oldı kim ki, düşdi zibəski, dərindür.

* * *

Xəlqün nə içün həmişə işi ahü nalədür,
Hər bir dəqiqədə nə olub qəm həvalədür.

Sordum bu sirri əldə sınıq camü badədən,
Vaqif bu sirrə, get, dedi dinmə, piyalədür.

Kimdən edim sorağıni sordum piyalədən,
Verdi cəvab kuzəgər əgər bu halədür.

Bir pir kuzəgər mən ilə oldı həmnəfəs,
Bilmədi xəyalımi mənim ondan sualədür.

Səndə piyalə varmı mənimçün dedim, dedi,
Neyçün sənün bu xahişün əmri-məhalədür.

Sağərü piyalənün adı vardur ki, yox özi,
Xəlqün əbəs yerə həvəsi qeylü qalədür.

Sağər cəmali-Yusifədür, cami-Keyqubad,
Əmma piyalə nisbəti əbru hilalədür.

Kimdür səbuyi-xüm deyərəm tab etmisən,[*]
Cəmşididür, Skəndər heyran bu halədür.

Sövdayi-dami-zülfinə düşmə bu məhvəşün,
Fəxri əgərçi ay kimi hüsnü cəmalədür.

* * *

[*] Etməzsən

Arizün, sərvqədim, lalə kimi rəngindür,
Təlxdür, içmə meyi-nabi, ləbün şirindür.

Oldı qan müşki-tər ahuyi-Xəta nafındə,
Bəs ki, bu türreyi-pürpiçlərün mişkindür.

Mən necə vahimə etmüm, gözüvün qurbani,
Gözləründən biri cəllad, biri şahindür.

Qoyma minnət, mana verdün bu ləbündən busə,
Mənə nə ləzzəti ilə şəkəri-Maçindür.

Dili-divanəmün hərgiz sana yoxdur dəxli,
Mübtəla qul kimi səndə bu qəra saçindür.

Qamətün sərv, qiyamət eləyür hər saət,
Qaşlarun tiğ, ləbün lə`l, rüxün pərvindür.

Zahidün məscidini meykədəyə döndərdün,
Saqiba, səndə əcəb dinü əcəb ayindür.

* * *

Qəmzön xədəngi ilə könül parə-parədür,
Min parə etməgə onı kimdən işarədür?

Salmış cəhanə fitnəni bu məst gözlərün,
Əlbət ki, fitnə zahir edər, bəs ki, qarədür.

Zülfün kəməndinə dili-divanələr əsir,
Bu xali-gəndümün nə deyürsən, nəkarədür.

Sən eylə mahparəsən, ey sərvqamətim,
Hüsnündə ayü gün işığı aşikarədür.

Sordum təbibə zəxmi-dili-parə-parəmi,
Bir ah çəkdi, baxdı dedi, bu nə yarədür?

Əl çəkdi, bildi navəki-müjgan yarasıdur,
Ey şux, çarəsi genə bir ox dübarədür.

Saqib, bu mahparələrün e`tibari yox,

Uymış rəqibə qəlbləri səngxarədür.

* * *

Xəm zülfində əsir oldı dil, itmək kimidür,
Heç kim əhvalını bilməz, işi bitmək kimidür.

İçmə qan olmışı, qan oldı bu qan olmış dil,
Rəşkdən sağərü mey ləblərün əmmək kimidür.

Yıxma, sındırma dili-aşiqi, ey qaşı kəman,
Səngdil, urma cəfa daşını eynək kimidür.

Sinəmi çak eləyüb qəmzə oxun, mahvəşim,
Parə-parə dağılan min yerə könək* kimidür.

Dedim əğyarə, gedürsən səri-kuyi-yarə,
Getmərəm, yox dedi, gördüm məni əkmək kimidür.

Necə xırxun sitəmindən eləmüm mən nalə,
Bitirübdür işimi, un kimi əzmək kimidür.

Yügürür məscidə zahid, gedüb əldən vətəni,
Bilməyür heç nə gəlür başinə, eşşək kimidür.

Ey deyən bilməyəcəksən nə olur iş axir,
Bilürəm mən nə olar, lap hələ bilmək kimidür.

Qiblə də qiblənüma də gedüb əldən, gedəcək,
Örtmə Qur`an ilə imanuvi, ölmək kimidür.

* * *

Səndən yetən hər ləhzə mana cövrü sitəmdür,
Hicründə mana həmnəfəs ənduh ilə qəmdür.

Peyğam elədim könlümə səndən həzər etsün,
Əl çəkmədi, bu cövrün onunçün genə kəmdür.

Tərk etmədün, ey dil, bu kəmanqaşlarun eşqin,
Möhnət yükilə qəddimi, gör, bir necə xəmdür.

Hökm eylədi qəmzön oxına qanımi töksün,

---
* Köynək

Əbrulərüvün tiği əcəb əhli-kərəmdür.

Ey şux, həmişə bu gözəllik sana qalmaz,
Çox da bu rüxün bərgi-güli-baği-İrəmdür.

Dön bir əyağun altına bax, qaşı kəmanım,
Toprağə dönüb, Xosrovü Cəmşid ilə Cəmdür.

Bu deyri-dənidə nə səfa var, nə umursan,
Saqib, bizə hasil olanı dərdü ələmdür.

* * *

Tə`n etməgilə ol kəsə meyxanənişindür,
Şahid bu sözə ayeyi-Qur`ani-mübindür.

Gözlə özüvi, qeyri qiyas etmə özündən,
Pərdə dalısından xəbərün yox, o çətindür.

Sən yaxşılıq eylə, vəli pisdən həzər eylə,
Bir bəhrdü kim, qərq olusan, girmə dərindən.

Ey Leylini gögçək deməyən, gör, necə Məcnun,
Bilmiş anı kim, huriyi-firdovsi-bərindür.

Məcnun kimi mən də nola səhralərə düşsəm.
Bu mahi-cəbin fitnədü, qarətgəri-dindür.

Kim qan elədi bağrımi sordum çün o məhdən,
Göstərdi iki ləblərini, qatil həmindür.

Bu sərvi-qədün kuyinə, ey dil, güzər etmə,
Can qəsdinə əbrulərüvün tiği kəmindür.

Saqib baş əgüb səcdə edər vaizi görcək,
Təhtül-hənəkin eylə bilür həblül-mətindür.

* * *

Kim desə hüsnün sənün nisbət məhü xurşidədür,
Mən anı təhqiq qıldum, şübhəsiz, nadidədür.

Ey deyən, əl çək bu məhvəşdən, könül ver qeyriyə,

Ruzədarun dideyi-ümmidi mahi-eydədür.

Gözlərün kim, meypərəstlərtək xumaralud olub,
Mülki-Çin içrə Xəta ahusi ya xabidədür.

Bəsdür, ey zahid, bu qədri getmə, bəsdür, məscidə,
Bir rəhi-meyxanə dut, orda nələr, gör, çidədür.

Həqpərəstlik naşidür batinpərəstlikdən, vəli,
Aləmi viran qoyub təsbihə kim çəsbidədür.

Deyr içində səcdə eylər kim bütə, kafər demə,
Öz gözilə görgilə anı, nə sahibdidədür.

Eyləmək, Saqib, kəlimullahlıq izharını.
Sanma asandur, həzaran tifli-sərbüridədür.

* * *

Təmənnayi-dili-zarım əgərçi məhliqalərdür,
Nə bilsün mahvəşlər rəsmini, ol bivəfalərdür.

Məlamət guşəsində kimsə bilməz necədür aləm,
Bilən əhvalımi hər sübhdəm badi-səbalərdür.

Könüldə daği-firqət, künci-qəm, qəmdür həmrazım,
Mənə cövr eyləyən əğyardür, yox, aşinalərdür.

Dəmadəm hicridə xunabi-çeşm altında pünhanəm,
Ənisim, munisim, həmdəm mənə bu ahü valərdür.

Qaşun fikrilə, cana, guşeyi-mehrabə meyl etdüm,
Təriqət əhlinə ol iki qaşun rəhnümalərdür.

Girəh dutdıqca zülfün, ey pəri, dil piçü tab eylər,
Əsiri-dilşikəstə zülfüvə bəxti qəralərdür.

Təmənna etmə hərgiz, Saqiba, bu mahvəşlərdən,
Mürüvvət rəsmini meyxanə dut, darüs-səfalərdür.

* * *

Könül bağındə qəddün cənnətün növrəs nihalidür,

Kəmanəbru qaşun mehrabdür ya məh hilalidür.

Məlamət etmək olmaz Adəmi, əl çəkdi cənnətdən,
Anı rüsva edən bu daneyi-xalun xəyalidür.

Qan olmış badə ol lə`lünlə eylər lafi-həmrəngi,
Odur meyxanələrdə min əyağlər paymalidür.

Cəmalun əksi salmış heyrətə surətigəri-Çini,
Hicabi-zülfdən çıx, ayü gün hüsnün misalidür.

Təbiba, heç demə bu dərdi-eşqə çarə müşkildür,
Nə çarə dərdi-eşqə, çarə ol yarun vüsalidür.

Könül, divanələrtək məskən etmə zülfi-yar içrə,
Pərişandur, girəhdür, damidür, həm laübalidür.

Əzizim, buriya tək düşmişəm kuyində yeksanəm,
Könül viranəsi biganədən bilmərrə xalidür.

Küdurət artırur nadan ilə həmsöhbət olmağlıq,
Xərabat əhlinün halın nə bilsün, ol nə halidür.

Cəhanda hər sözə pəjmürdəxatir olma çox, Saqib,
İnanma, bavər etmə ol sözə, əmri-məhalidür.

* * *

Cəhanda fəxri kimün tacdür, kimün fəsdür,
Mənim başimdən, bəli, yar sayəsi bəsdür.

Həyat çeşməsidür ol ləbi-fərəhbəxşün,
Çəməndə sərvi-xuraman qədün görüb pəsdür.

Cəhani əşkilə sirab qıldun, ey çeşmim,
Bu sərv əyağinə tök, bari, sərvi-novrəsdür.

Gətürdi hörməti-mehrabi qaşlarun tərhi,
Zi bəski, ol iki qaşun sənün müqəvvəsdür.

Könül, müqəyyəd olub çəkmə minnət heç kəsdən,
Ələlxüsus, nəmaz əhlidür, müqəddəsdür.

Təvazö` etməgilə cəm`, kimi loğma görüb,

Şikəmpərəst utanmaz, qəribə nakəsdür.

Dila, zəmanə bizə cövr ilə keçüb, keçəcək,
Nə nalədür, bu nə fəryadidür, bu nə səsdür.

Kəsadidür bizə bazari-eşq, ey Saqib,
Bu deyri-qəmdə nədür çarə, tale`ün pəsdür.

* * *

Təvafi-Kə`beyi-ərbabi-həq, ey şux, kuyindür,
Qaşun mehrabidür taətgəhim, həm qiblə ruyindür.

Dedim, ey sərvnazım, kuyüvə əğyar yol tapdı,
Dedi, get, eyləyən agəh məni hayi-huyundür.

Ləbün tər qönçə bağrın qan edüb etməz təmənnasın,
Qəfəs küncində bülbül valehi-ruyi-nikuyindür.

Dəmadəm nalə qılsam ney kimi ey şux, var vəchi,
Dələn göz mərdümin neştər kimi, ey şux, muyindür.

Zəmanə, sazigar heç olmadun əhli-hal ilə,
Mana qismət qılan xuni-cigər bu qanlu cuyindür.

Bizə darül-əmandur, Saqiba, meyxanələr künci,
Gətür mey, saqiya, həmdəm mənə camü səbuyindür.

* * *

Sənün bu zülfüvi zəncir edən eşqi-cünunimdür,
Deməz xəm qaşlarun bu qamətimçün rəhnümunimdür.

Ləbündən almadum kam, olmadı əbrulərün mane`,
Gözün qurbanı, mane` kim mənim iqbali-dunimdür.

Sanur mülki-Süleyman(ə) görsə kim viranələr künci,
Sənün eşqündə getdi təxtü tac, sərnigunimdür.

Degül meyxanə içrə cami-mey kim sərnigun olmış,
Əlində saqiyi-gülçöhrənün bəxti-zəbunimdür.

Müsəlmansan, sorar məndən bizim bu zahidi-kəcbin,

Nə dəm mən, ey müsəlman, hər nəyəm, sirri-dərunimdür.

Ləbün bimari-eşqə çarədür, Saqibdən heç sorma,
Nə bilsün qədrini, qədrin bilən dərdi-füzunimdür.

* * *

Qıldum həzar tövbə mey içmüm, zərər verür,
Rənci-xumarə çarə nədür, dərdsər verür.

Etsəm məgər qiyamət olur, tövbə tövbdən,
Mənsiz həriflər içə, ləzzət məgər verür.

Keçmək olurmı söhbəti-ərbabi-haldən,
Ruhun qəzası yari-müvafiq səmər verür.

Çoxdur cəhanda silsileyi-kimiya əsər,
Yüz min Məsihə ruhi-rəvan sərbəsər verür.

Məcnun, cərəsdən eyləmə Leyli sorağıni,
Hər yerdə olsa, naləm ona tez xəbər verür.

Tuf, nanəcibi-dəhrün ola e`tibarinə,
Ol nanəcib nanəcibə taci-zər verür.

Saqib, şərab dürdinə səccadə ver girov,
Meyxanə piri mey sənə şamü səhər verür.

* * *

Mey sağərin öpər, mana ol məhliqa verür,
Zəhr olsa, nuşi-can edərəm, aşina verür.

Dürdi-şərabi versə mey üftadəsinə kim,
Qılsun yəqin ki, pirün əlinə əsa verür.

Bimar gözlərün eləyüb xəstə könlümi,
Əmma ona bu lə`li-ləbün tez dəva verür.

Kim bağlasa könül xəm zülfün kəməndinə,
Eylər ziyadə ömrini, bəxtin qəra verür.

Qıl ehtiraz qəmzə oxından bu məhvəşün,

Ey dil, itər qanun, sana kim xunbəha verür?

Kəsmə gözümdən ol səri-kuyün qübarıni,
Göz mərdüminə sürmə çəkəndə, ziya verür.

Səndən üzəndə dil, kimə mən dinü dil verüm,
Dil heç utanmayur, necə pəndi mana verür?

Təklif məscidə məni, zahid, çox eyləmə,
Başdan-əyağə sən kimi buyi-riya verür.

Tək bir işarə ilə nəlur, imtəhan qıl,
Eşqün yolında canıni Saqib fəda verür.

* * *

Əşkim bu sərvi-qədüvə nəşvü nüma verür,
Əmma mana qiyamə gələndə bəla verür.

Lə`lün həvasi çəkdi məni xüm əyağinə,
Gəh dərd artırur mana, gahi dəva verür.

Çəksəm əcəb degül gözə bu xaki-kuyüvi,
Ayinəyə cila, gözə nurü ziya verür.

Sən eylə mahparəsən, ey sərvqamətim,
Hər kim bu tiri-qəmzəvə canın fəda verür.

Qatdı fəğan naləmə ney ahü naləsin,
Hicründə aşinayə səda aşina verür.

Ey mahparə, xəncəri-qəmzön şəhidiyəm,
Qaşun qılıncı istəməmiş xunbəha verür.

Sövdayi-eşqi tərk eylə, ey bəxti qarə dil,
Məcnun başında quşlara viran yuva verür.

Rüsvayi-eşq şikvəyə dil açmasun gərək,
Möhnət yüki kəman kimi qəddin düta verür.

Ey bixəbər, cəhandə təqazayi-eşqdən,
Musayə bax, əsa yerinə əjdəha verür.

Bu buriyani məscidə, gəl çəkmə, zahida,

Aldatma xəlqi, sən kimi buyi-riya verür.

Şe`rin Füzulidən eyləmiş Saqib iqtibas,
Bais odur qəzəlləri ruhə səfa verür.

* * *

Nə qədr var qəmü qüssə dili-naşadə gəlür,
Şəbi-hicründə sənün ney kimi fəryadə gəlür.

Mən girov badeyi-gülfamə dilü din verdüm,
Zahidün yadinə təsbih ilə səccadə gəlür.

Sana aci görünür, rəşki-şəkərdür Şirin,
Acı olsa nə qədr, xoş genə Fərhadə gəlür.

Tab vermə, xəmi-əbrulərüvi oynatma,
Tağі-mehrab sınar, naləvü fəryadə gəlür.

Etmə sərkeşligi kakil kimi, ey şirinləb,
Görgilən sağərə badə necə üftadə gəlür.

Verdün əğyarə könül, ahım odın gizlətdim,
Heyfim, ey məh, mənim ol hüsni-xudadadə gəlür.

Saqibə tə`n eləyür xəlq, neçün badə içür,
Vay o kəs halinə bir də bu qəmabadə gəlür.

* * *

Sənün gümanun əgərçi bu xəttü xalə gəlür,
Mənim gümanım odur qalmasun zəvalə, gəlür.

Göröndə hüsnüvi ayinədə baxub gülmə,
Bu gülməgün dalı vardur, min ahü nalə gəlür.

Demə həmişə qalur gül kimi ləbim, solmaz,
Solar, tələsməgilən bir yerə xəyalə gəlür.

Bu məstlikdən ayıl bir, cəmali-Yusifdür,
Şərab ilə dolu meyxanəyə piyalə gəlür.

Məlahətin yeri qalmaz, olar qübaralud,

Əgərçi xəlq təmaşayə bu cəmalə gəlür.

Bəsirətün gözin aç, diqqət ilə eylə nəzər,
Zəval, ey könül arami, aydan-ayə gəlür.

Gəl, imtəhan eylə, bir ləhzə əzmi-bazar et,
Solub satılmağa bir pulə qönçə, lalə gəlür.

Minnət eyləmə, sərkeşlik etmə şəm` kimi,
Durub kəməndə cəllad guşmalə gəlür.

Məlamət eyləmə, zahid, dəxi əman günidür,
Şərabi-biğəşi Saqib içəndə halə gəlür.

* * *

Heyf bu bəzmə ki, dildar gedüb, badə gəlür,
Yarsız badeyi-gülfam necə yadə gəlür?

Təngdil olma təhidəstligündən, ey dil,
Sərvə bax, bağə necə naz ilə avarə gəlür.

Kimdür ol bir nəfəs aram degül hər dəmdə,
Bənd-bəndində neyün naləvü fəryadə gəlür.

Firqəti-Leylinün avarəsi Məcnundur ol,
Qəmi-hicranı desön xidməti-Fərhadə gəlür.

Hər yerə qaçsa gər ahu, genə yoxdur çarə,
Dami-səyyadə özin salmağa üftadə gəlür.

Kim bu dünyayə gəlür bilməsün eymən özini,
Dərdü qəm çəkməgə hər ləhzə bu bərbadə gəlür.

Özüvi düşkini-nəfs eyləmə, pəhriz eylə,
Ey nüfuzın itirən, kim sana imdadə gəlür?

Vırulur zülfi-girəhgirüvə məşşatə əli,
Şanə, göz yaşı ilə su verə şümşadə gəlür.

Saqibin dürdi-şərab ilə əlin dut, saqi,
Əhli-hal ilə kim içsə, ağız dadə gəlür.

* * *

Bazarə kim ki, əldə dutubdur dirəm gəlür,
Nadan də olsa, xəlq deyər, möhtərəm gəlür.

Pozmaz təbiətini, sataşma təbiətə,
Nə istəsə edər, nə ziyadü nə kəm gəlür.

Əmri-məhalun eyləmə heç arizusini,
Düşsön bu fikrə, aqibətindən vərəm gəlür.

İqbal həmişəlik sən ilə olmaz, əl gətür,
Saqi əlində zəhr dolar, cami-cəm gəlür.

Sail bəkəfligi özüvə adət eyləmə,
Get, işlə, dişlə, heç demə əhli-kərəm gəlür.

Səhrayi-eşqi çox də dolan, intəhası yox,
Getsön nə qədr bu yolı, sərhəd ədəm gəlür.

Girəm ki, vəslə nail olursan bir anidə,
Seylab kimi tez yerinə dərdü qəm gəlür.

Məğrur etməsün səni, ey məh, gözəlligün,
Badi-müxalif əssə, qədü sərü xəm gəlür.

Bel bağlama təlatümi-cuyi-zəmanəyə,
Ki, şərbət onda cuşə gəlür, gah səm gəlür.

Ey ruzigarı xəlqə edən təng, bir ayıl,
Bir gün olar yeründə sənün xoş qədəm gəlür.

Əş`ar cəm`in etmək içün qorxma, Saqiba,
Təşvişə düşmə zərrəcə, mişkin qələm gəlür.

* * *

Neylədim zülfüvə, ey şux, məni etdi əsir,
Demədim zənciri-divanə, dedim mişki-əbir.

Dedim, ey dil, bu pərivəşlərə bel bağlama çox,
Leyliyə naleyi-Məcnun haçan etdi tə`sir.

Tökəsən qanıni bu navəki-müjgan oxilə,

Əl gətürməz genə səndən, degül heç pəndpəzir.

Qaş degül səndə belə xameyi-təqdir çəküb,
Tağí-mehrabdə oxşar, vəli çəkmiş şəmşir.

Dil məni çəkdi səri-kuyüvə, ey şirinləb,
Dutma məndən yüzüvi, məndə yox hərgiz təqsir.

Demə, zalim, məni tərk eylə, könül ver qeyrə,
Eşqi tərk eyləmək olmaz, yox ona bir tədbir.

Hüsn məğrur eləyübdür səni, qalmaz səndə,
Mən düşən halə düşərsən, olasan aləmgir.

Hüsnüvə xəlq təmaşa eləyür, qoy etsün,
Tazə ayə eləyər xəlq təmaşa bir-bir.

Saqibə etmə məlamət mey içür, ey zahid,
Onı bir mən bilürəm, bir də bilür əhli-bəsir.

* * *

Təvaf eylər üzarun şəm`ini pərvanələr bir-bir,
Mənimtək atəşi-rüxsarüvə, qoy, yanələr bir-bir.

Xəbər heç dutmayursan, sərvqəd, divanə könlümdən,
Dəgəndə türreyi-pürpiçə hərdəm şanələr bir-bir.

Dəmadəm mey içəndə cam öpər bu lə`li-nabundən,
Oleydi kaş viran, sərbəsər meyxanələr bir-bir.

Girov yadi-ləbünlə getdi hər meyxanə küncində,
Əlindən zahidün səccadəvü səddanələr bir-bir.

Rəhi-eşqün dutanlar müttəsil Məcnunə tə`n eylər,
Olub rüsvayi-aləm aqilü divanələr bir-bir.

Gedəndə seyrgahə naz ilə, ey sərvi-azadım,
Mənilə aşinaləndi bütün biganələr bir-bir.

Açanda hüsnüvi bazar içində düşmə təşvişə.
Yağanda hər tərəf şabaş çün dürdanələr bir-bir.

Olur azad qəmdən mey içəndə xüm əyağində,

Dəgəndə bir-birinə sağərü peymanələr bir-bir.

Həqiqət aləmi, Saqib, yetişdi, yatma, bidar ol,
Əcəb mətruk olub əfsürdəvü əfsanələr bir-bir.

* * *

*Füzuliyə nəzirə*

Necə canan yolında canı qurban eyləmək olmaz,
Olur can tərkin etmək, tərki-canan eyləmək olmaz.

Pərişan eyləmə giysu, könüllər düşdi təşvişə,
Ki, zənciri-cününi pərişan eyləmək olmaz.

Xəcalət sərvə verdün bağdə bu sərvi-qamətlə,
Necə sehr etmisən, sərvi xuraman eyləmək olmaz.

Görüb göz, sevdi dil, mən neyləyüm itsə rüxsarun,
Bu parə-parəni incidmə, viran eyləmək olmaz.

Ləbün fikrilə içdim badəni mən, qanə qan etdim,
Əzizim, yoxsa heç nahəq yerə qan eyləmək olmaz.

Demün Məcnunə, əl çək Leylidən, rüsvayi-aləmsən,
Edər rüsva səni, anı peşiman eyləmək olmaz.

Çağırma məscidə, zahid, məni meyxanə küncindən,
Bu tədbir ilə heç kafər müsəlman eyləmək olmaz.

Əziyyətdür əbəs naəhlə, əl çək, tərbiyət vermə,
Həqiqət böylədür, nadanı insan eyləmək olmaz.

Deyür zahid mana, qıl tövbə meydən sən müsəlman,
Dedim sənsən müsəlman, xəlqə böhtan eyləmək olmaz.

Təəllüq cəhandan et, ignə kimi tarə bu bənd olma,
Yükün ağır olanda kəsbi-irfan eyləmək olmaz.

Həzər qıl, Saqiba, dil vermə, əl çək mahvəşlərdən,
Vəfası yoxlar ilə əhdi-peyman eyləmək olmaz.

* * *

Təbibim, dərdi-eşqə hiç dərman eyləmək olmaz,

Əgər dərman da olsa, tərki-canan eyləmək olmaz.

Təqazayi-məhəbbət eylədi Məcnuni sərgərdan,
Ayırmaq Leylidən olmaz anı, qan eyləmək olmaz.

Nədür bu neydə nalə, ey mana tə`n eyləyən, əl çək,
Necə hicrində yarun ahü əfğan eyləmək olmaz.

Gedirdim bir gül içün gülşənə, vay, dərdilər getdi,
Dəxi bundan sora seyri-gülistan eyləmək olmaz.

Çıxeydi gözlərim rüxsarun əksin görən yerdə,
Dil oldı mailün, neylim, peşiman eyləmək olmaz.

Nəfəs çəkməkligə qoymaz məni, ey şux, hicranun,
Deyəydün uyma eşqə, tabi-hicran eyləmək olmaz.

Yarubdur bağrımi yüz min yerə əbrulərün tiği,
Dəxi qəmzön oxıyla anı tir-baran eyləmək olmaz.

Dağıtma könlümün cəm`iyyətin bu dami-zülfündə,
Əsirün xatirin artıq pərişan eyləmək olmaz.

Gözün köz eylədi, al busə ol məhvəş dodağından,
Öpüm, qoy, hiç xilafi-hökmi-sultan eyləmək olmaz.

Gedürsən məscidə, zahid, buyur meyxanə qoy qalsun,
Mənimçün getmə sən, heyvani insan eyləmək olmaz.

Qəzəl tərkibini, Nadir, gəl, ögrən pir Saqibdən,
Məniyyətlə, əzizim, kəsbi-irfan eyləmək olmaz.

* * *

Necə hicrində yarun ahü əfğan eyləmək olmaz,
Rəqibün tə`nəsinə tab bir an eyləmək olmaz.

Ayırma Leylini Məcnundən, Məcnuni Leyladən,
Tərazu yox bu ağır barı mizan eyləmək olmaz.

Sənün eşqün yolında eylədim mən dinü dil tərkin,
Könül mülkinə səndən qeyri sultan eyləmək olmaz.

Gedir zülmatə içsün abi-heyvan Xızri-biçarə,

Ləbün yanında meyli-abi-heyvan eyləmək olmaz.

Demə hüsn əhliyəm, keyfim nə istər eylərəm, ey məh,
Əzizim, sərviqəddim çox də tüğyan eyləmək olmaz.

Nə qafilsən, gözün qurbanı, dəhrün inqilabindən,
Vəfası yox, onilə əhdi-peyman eyləmək olmaz.

Alar bir göz yumub-açınca səndən hüsn sultanın,
Satar qul oğlına, rə`yin peşiman eyləmək olmaz.

Kəmalın artırur mey xüm içində köhnə olduqca,
Odur bais, anı həm bəzmi-nadan eyləmək olmaz.

Çağır məscidə bu Saqibi, ey vaizi-xudbin,
Qəssalə söhbətindən ruhi-reyhan eyləmək olmaz.

* * *

Meyxanədə, sağərdə şərab olmasa, olmaz,
Saqi mey içüb məsti-şərab olmasa, olmaz.

Bədməstligi eyləmə hərgiz mey içəndə,
Səndə mey içməgligə tab olmasa, olmaz.

İçmə meyi-nabi, nə də meyxanəyə getmə,
Meydə nə olur nəş`ə, kəbab olmasa, olmaz.

Ey şux, pərişan eylə rüxsarüvə zülfün,
Göz dəgməsün, hüsnündə niqab olmasa olmaz.

Bənd et məni bu türreyi-mişkin kəmənddə,
Divanəyə zəncirü tənab olmasa, olmaz.

Keçmə Əraqü Kabilə, biçarə müğənni,
Dəf alma ələ, tərki-Rəhab olmasa, olmaz.

Vermə yelə namusuvi, təqliddən əl çək,
Həmxabuvi hifzi-hicab olmasa, olmaz.

Zahid, mana eyb eyləmə çox badəpərəstəm,
Duzəxdə əgər əhli-əzab olmasa, olmaz.

Mizan dağılar, hiç yerində dura bilməz,

Saqib, rəvişi-əhli-kitab olmasa, olmaz.

* * *

Qəddün qəmi-hicran ilə xəm olmasa, olmaz,
Eşq əhli gər aludeyi-qəm olmasa, olmaz.

Çox çıxmagilən nəğmə ilə şiddə, müğənni,
Hər nəğmeyi-cansuz ilə bəm olmasa, olmaz.

Asayişi olmaz bu cəhan mülkinün hərgiz,
Avarə qalar, əhli-qələm olmasa, olmaz.

Məqsudə yetərsən o zəman, ey dili-zarım,
Hərdəm sana min cövrü sitəm olmasa, olmaz.

Min il edəsən səcdəni bir faidə verməz,
Dut fəqrün əlin, səndə kərəm olmasa, olmaz.

Çox da ərəbün elmi-xəyalati genişdür,
Şe`ri-qərihi-ruhi-əcəm olmasa, olmaz.

Cami-mey alma ələ, içmə meyi-nabi,
Meyxanədə, Saqib, bu sənəm olmasa, olmaz.

* * *

Yarun səri-kuyinə güzar eyləmək olmaz,
Bir ləhzə təmaşa rüxi-yar eyləmək olmaz.

Əğyarun əlindən hara mən yüz dutum, ey dil,
Ey qanə dönən, tərki-diyar eyləmək olmaz.

Dutdırdı mənim bağrımi el tə`nəsi qanə,
Hicran gecəsi naləvü zar eyləmək olmaz.

Meyl etmə dedim mən sana bu qaşı kəmanə,
Vermiş könül əğyarə, şikar eyləmək olmaz.

Bir dil ki, əsir oldı xəmi-zülfüvə, ey məh,
Müjgan oxına bir də düçar eyləmək olmaz.

Şəbxun vırar hər ləhzə mana navəki-qəmzön,

Dildən anı mərhəmlə kənar eyləmək olmaz.

Bənd atmısan rəmzi-Müxalifdən Həsarə,
Ey tarzən, ahəngi-Qətar eyləmək olmaz.

Gər tiri-qəza etsə tələb canuvi səndən,
Nə verməmək olmaz, nə fərar eyləmək olmaz.

Şükr eyləgilən hər nəfəsə rahəti-candur,
Qət` olsa nəfəs, leyli nəhar eyləmək olmaz.

Zahid, mən ölüm, gəl, məni-divanədən əl çək,
Mey tövbəsini fəsli-bəhar eyləmək olmaz.

Xümlə meyi ver Saqibə, ey saqiyi-gülrüx,
Bir sağər ilə dəf`i-xumar eyləmək olmaz.

* * *

Can afətidür eşq, dəvam eyləmək olmaz,
Ey dil, gətür əl, sərkeşi ram eyləmək olmaz.

Bənd eyləmisən könlümi zülfün girehində,
Azad anı, ey Yusifi-nam, eyləmək olmaz.

Şəbxizlərün naleyi-ahindən həzər qıl,
Məhvindən usan, sübhüni şam eyləmək olmaz.

Səndən nə tələb etsə təqazayi-zəmanə,
Verməm demə, bərəks qiyam eyləmək olmaz.

Hər naşiyə tapşurmagilən var-yoxı, fəhm et,
Hər bir yetəni xəlqə imam eyləmək olmaz.

Zahid, mana təklif eləmə məscidə, dur gəl,
Meyxanədəyəm, püxtəni xam eyləmək olmaz.

Nəhy etdi meyi əhməqə qanuni-şəriət,
Hal əhlinə bir zərrə həram eyləmək olmaz.

Zalim, nolu,[*] bir az verəsən nəfsüvə təğyir,
Qəflətdən ayıl, zülmi müdam eyləmək olmaz.
Dövran nə qədr Saqibi gər salsa əyağə,

[*] Nə olar

Hər nanəcibə anı qulam eyləmək olmaz.

* * *

Əngur şürbin içə kim, onda qəm olmaz,
Min il yaşasa, heç ürəgində vərəm olmaz.

Dildar oturub, tarü müğənni, xüm əyaği,
Saqi, qədəhün ver, mey içim, böylə dəm olmaz.

Gül yaprağına tə`nə vırar arizi-alun,
Bu rəngdə hərgiz güli-baği-İrəm olmaz.

Azadəligün var adı, ancaq özi yoxdur,
Azadəligün aləmi olsa, sitəm olmaz.

Hər ləhzə ki, azadəlik oldı bu cəhanda,
Kamında ilanun dəxi bir zərrə səm olmaz.

Afaqı dutub fitnə dəvamı genə, ey dil,
Beş günlükdür rahət olur, möhtərəm olmaz.

Qarunsifətün süfrəsinə keçmə, təm` etmə,
Başından aşa dövləti, sahibkərəm olmaz.

Fəqr əhlini görsön, ona, dur, eylə təvazö`,
Gər şah olasan eyb eləməz, rütbə kəm olmaz.

Zahid çağırur Saqibi, meyxanəyə getmə,
Məscid yolına, bilmür ərəbdən əcəm olmaz.

* * *

Rəhi-meyxanə dut, meyxanələrdə çunü çənd olmaz,
Şərabi-nab tək qəmxar yox, nə dərdmənd olmaz.

Gözün qurbanı, saqi, cam ver, al dinü dil məndən,
Məhəbbət əhlinün imanı olmaz, dinə bənd olmaz.

Küdurət artırur keyfiyyəti-dünyavü mafiha,
Xəyalın etsə kim aqil deməzlər, bəhrəmənd olmaz.

Təvazö`lə, bəli, aləmdə hər kəs artırur qədrin,

Kişi sərkeşlik etməz, eyləsə hiç sərbülənd olmaz.

Giriftari-xəyali-zülfün hər kim olsa aləmdə,
Dəxi, ey sərvi-novrəs, bəndi-zəncirü kəmənd olmaz.

Ayırmaq mümkin olmaz Leylini Məcnuni-şeydadən,
Qəbul etməz nəsihət kargər, üşşaqə pənd olmaz.

Sana çün guşeyi-mehrabdür məqsud, ey zahid,
Hərimi-bargahi-yarə məhrəm hər gəvənd olmaz.

Xəyali-cənnət ilə səcdə qılma, heç nə verməzlər,
Edər batil təmənna səcdəni irfanpəsənd olmaz.

Təvazö` eyləsön bihudə hərgiz şə`nün əksilməz,
Əgər gün düşməsə toprağə, böylə sərbülənd olmaz.

Qəbul etmək olurmı hər Mühəmməd namdən həqqi,
Rəyasət eyləmək istərsə hər kim, ərcümənd olmaz.

İtaət etmək olmaz hər şəhə, bir əmri-müşkildür,
Ədalət olmasa, ünsiyyətü üns pərənd olmaz.

Rəiyyət başdən zülm görsə, dəf`i vacibdür,
Ədalət göstərən olsa, nişi-əqrəbdə gəzənd olmaz.

Təriqi-şe`ri, əhsən, Saqiba, Yusifdən ögrəndün,
Ki, lə`li-Yusifə şe`rün kimi şirin qənd olmaz.

* * *

Sənün lə`li-ləbün tək rahəti-can lə`li-nab olmaz,
Bu meydən içsə hər kim, süst olur, əmma xərab olmaz.

Dağıtma səfheyi-rüxsarüvə bu zülfi-pürçinün,
Təmaşa eyləsün aləm, gözlərdə hicab olmaz.

Dutulsa gün yüzi, övza`i-aləm iztirab eylər,
Yaraşmaz, mahvəş, xurşidi-hüsndə niqab olmaz.

Demə, gəl kuyimə, mümkin degül, ey sərvi-azadım,
Giriftar olsa hər kim eşqüvə, cismində tab olmaz.

Bu qədr eyləmə fəryad ney tək natəvan könlüm,

Şəbi-hicran qəmindən aşiq hərgiz kamyab olmaz.

Açıldı, qönçeyi-xəndan oldı, bülbül, sübhədək yatdun,
Demə mən aşiqəm, aşiq gözündə nazi-xab olmaz.

İçər övqaf qanın kasə-kasə künci-məsciddə,
Fəqihi-mədrəsə neyçün gedüb məsti-şərab olmaz.

Ədalət ismidür xəlqün dilində sölənür hərdəm,
Özi yox olseydi, xəlqə zalim intixab olmaz.

Təəccüb eyləmə dutmış cəhani fitnə, ey Saqib,
Mürüvvət xəlq içində olsa, hərgiz inqilab olmaz.

* * *

Giriftari-kəməndi-zülfüvə xoş gün nəsib olmaz,
Qəfəs küncində hərgiz şadü xürrəm əndəlib olmaz.

Nə çarə dərdi-eşqə, ey dil, çarə müşkildür,
Ki, dərdi-eşqi çarə eyləsün, heç bir təbib olmaz.

Məlahət şərtdür olsun gərəkdür kim, gözəllərdə,
Olur aşubi-aləm, zərrəcə möhtaci-zib olmaz.

Girov ver badəyə səccadəvü təsbihi, ey zahid,
Mey iç, sağərpərəst ol, meypərəstlərdə fərib olmaz.

Könül ol yarə ver, dutmuş cəhanı iki mim ilə,
Hərimi-kuyinə biganədür məhrəm rəqib olmaz.

İtaət eyləməklik fərzdür sultanə can ilə,
Vəli, dair bu əmrə müşkil işdür, nanəcib olmaz.

Şəh olmaq təxtü tac ilə degül, ey dil, xəyal etmə,
Gər olseydi, Vətən mülkində bu Saqib qərib olmaz.

* * *

Ey kuhkən, eşqün rəvişi tişədə qalmaz,
Mey, meykədə ovbaşı içər, şişədə qalmaz.

Şirin sana dil verməsə, get, qeyrə könül ver,

Divanə kimin şəxs bir əndişədə qalmaz.

Azadəligün vəqti yetişmüb, yetişəndə,
Batmaz əyağə xarü tikan, nişi də qalmaz.

Şəh dərsə rəiyyət bağınun meyvələrindən,
Nəxlin də qulami çıxarar, rişə də qalmaz.

Ey sevgili yarım, demə mən mahliqayəm,
Bu hüsn gedər, şahə də dərvişə də qalmaz.

Laçin gözün bir qeyidüb qıyqacı baxsa,
Taqət eləməz şir, qaçar bişə də qalmaz.

Təng olsa cəhan mülki sana, səbr elə, Saqib,
Dut fəqrü fənani, kişi təşvişdə qalmaz.

* * *

Kam alardım lə`li-nabundan sənün, ey sərvnaz,
Vəqt yoxdur, ah, səd əfsus, neylim, ömr az.

Firqətündə həmdəmim bu naleyi-cansuzdür,
Oldı giryan halimə, ey bixəbər, neyü çəngü saz.

Dutmaz idi quş yuva Məcnun başında ah ilən,
Olsa idi səngdil Leyla əgər bir dilnəvaz.

Canıni tərk eyləyəndə qalmadı can qəsdinə,
Sölədi Məhmud, hanı, gəlmədi neyçün Əyaz?

Olma eymən dəhri-dunun dövrinə bel bağlama,
Rəngdür başdan-əyağə, rəngdür həm hiyləsaz.

Almaram mən kam səndən, gərçi sən də almasan,
Tez solar hüsnün güli, fəxr eyləmə, çox etmə naz.

Ey qoyan qan bağrıma hərdəm qəmi-hicran ilə,
Vermə dil əğyarə, ahimdür mənim aləmgüdaz.

Fəsli-güldür, ey müğənni, Saqibün sor halını,
Sevdigi nəğmə cəhanda Şurdür bir Şahnaz.

* * *

Natəvan könlüm əcəb divanədür, ey sərvnaz,
Arizuyi-tiri-qəmzön eylər, etməz ehtiraz.

Qalmadı könlümdə taqət, bir dəm ərzi-ariz et,
Çək kənarə türreyi-pürpiçüvi, çox etmə naz.

Dərdi-eşqə çarə yox, əl çək əlacimdən mənim,
Bir də sən dərd artırursan, ey təbibi-çarəsaz.

Kuhkən Şirin sevər, Məcnun Leyla, mən səni,
Şəm` odın pərvanələr, bülbül güli, Məhmud Əyaz.

Vahimə etmüm necə qıyqaci gər baxson mana,
Məsti-nazım, gözlərün eylər şikari-şahbaz.

Verməz idi qeyrə dil ol sərvqədlər məhvəşi,
Od duteydi, dil yaneydi, etməseydi kəşfi-raz.

Səngdil, asan degül tab eyləmək hicranuva,
Naləmə heyran qalub fəryadi-çəngü tarü saz.

Nail ola məqsədə başım da getsə şəm`tək,
Tiği-xunəfşan ilən, əfsus, ey dil, ömr az.

Saqiba, bənd olma tari-zülfinə ol məhvəşün,
Başuvı salma uzun sövdayə, eylər ömri az.

* * *

Dərdimə tiğindən özgə bilsə idim çarəsaz,
Səndən etməzdim təmənnasın dəxi, ey sərvnaz.

Tiğ səndə, navəki-dilduz səndə, məndə can,
Canım al, aşiqlər içrə qıl məni bir sərfəraz.

Danə səndə dami-giysu içrə, ey adəmfərib,
Dinü dil al məndən, hərgiz etmərəm ifşayi-raz.

Qəmzə səndə, naz ilə başdan-əyağə qəmzəsən,
Almısan canım, degülsən, neyləyüm, aşiqnəvaz.

Qaşlarun mehrabinə meyl eyləməz zahid, nola,

Qibleyi-İslamə kafər yüz dutar, qılmaz nəmaz.

Düşsə hər kim neyləsün sövdayi-zülfün daminə,
Bu mühəqqəqdür cünun zənciri eylər ömri az.

Sərfiru qıl, Saqiba, sərgərmi-camü badəyə,
Tapmasan meyxanədə zahid kimi əhli-məcaz.

* * *

Cəfadən özgə bu məhvəş vəfa nədür blimæz,
Könül rəqibə verüb, aşina nədür bilməz.

Əl atma, ey dili-divanə, tari-giysuyə,
Edər əsir səni, mübtəla nədür bilməz.

Dolanma kuyinə ol mahparənün, əl çək,
Gədanun oğlı gədadur, gəda nədür bilməz.

Desön bu səngdilə, qəlbi-aşiqi yıxma,
Rəqibə vermə könül, e`tina nədür bilməz.

Desön əyağun öpüm, qətlüvə verür fərman,
Qanun aradən itər, xunbəha nədür bilməz.

Təbib eyləməsün, dərdi-eşqə yox çarə,
Əlacı yar ləbində, dəva nədür bilməz.

Vətən yox əldə, genə arizuyi-hur eylər
Fəqihi-mədrəsə, ey dil, həya nədür bilməz.

Oxur həram mana vəsfi-badəni, saqi,
Gətür piyaləni, ruhə səfa nədür bilməz.

Həqarətün gözilə baxma Saqibə, zahid,
Sənün kimi degül, əl çək, riya nədür bilməz.

* * *

Dili-Məcnuni Leyli hicrdə qan oldığın bilməz,
Biyabanlarda heyran, zarü giryan oldığın bilməz.

Deyür bir qaşü gözdür məndə var, ol sərvi-azadım,

Bu qafil heç birin aşubi-dövran oldığın bilməz.

Tökübb giysulərin rüxsarə, könlümdən xəbər dutmaz,
Yerün viranə yer, sənün ənbərəfşan oldığın bilməz.

Pərişandır görüb əhvalımi bu səngdil, əmma,
Üzarə telbətel zülfün pərişan oldığın bilməz.

Yaralu könlümə əbruləri tiğ ilə qəsd eylər,
Düşüb dildən, şəhidi-tiri-müjgan oldığın bilməz.

Mana meyxanədə məscid yolıni göstərür zahid,
Meyi-gülfam yox məsciddə, heyvan oldığın bilməz.

Qəzəl məxsusdür bu Saqibə, övladi-Azərdə,
Özin təxti-qəzəl üstündə sultan oldığın bilməz.

* * *

Şərabun nəş`əsin sərməstü məxmur olmayan bilməz,
Süleymandə nə rütbə vardur, mur olmayan bilməz.

Nə qədri gözdə var nur, hərgiz bilməsən qədrin,
Nədür nur aləmi, Yə`qub tək kur olmayan bilməz.

Nədür tə`sir həqqün kəlməsində hər yetən bilməz,
Gərək əvvəl çəkilsün darə, Mənsur olmayan bilməz.

Mühəmməd(s) eylədi "şəqqül-qəmər",[*] sən eylə inkarın,
Libasi-cəhldən bu nüktəni ur olmayan bilməz.

Onı bilmək gərək, kim eylədi izhari-həqiqət,
Nübüvvət barinə can ilə muzdur olmayan bilməz.

Nə ləzzət var vüsali-yaridə, ey dil, xəbər alma,
Şəbi-hicran qəmindən zarü rəncur olmayan bilməz.

Əbəs baş ağrı vermə boş yerə kim, mən də sultanəm,
Süleyman(ə) tək bu əmrə rindü mə`mur olmayan bilməz.

Necə mən əhli-haləm mey içəndə bilmisən, zahid,
Mənilə guşeyi-meyxanədə cur olmayan bilməz.
Qəzəl zövqini bilmək, Saqiba, asan degül hərgiz,

[*] Məhəmməd Peyğəmbər (s) tərəfindən ayın iki yerə bölünmə hadisəsi

Qəzəl zövqini Azər kimi məşhur olmayan bilməz.

* * *

Dərdi-eşqə çarə yoxdur, etmə dərman, istəməz,
Ey müalic, aşiq hərgiz rahəti-can istəməz.

Keçməsə canından aşiq aşiqi-sadiq degül,
Kim ki, candan keçməsə, əlbəttə, canan istəməz.

Daneyi-xalun görüb təsbihi verdim badəyə,
Olsa kim bu badə məsti, dinü iman istəməz.

Görsə şirin gülməgün, ey qan qoyan bu bağrıma,
Qönçəsin bilmərrə bülbül şadü xəndan istəməz.

Xidmət eylər qamətün sərvini görsə bağban,
Bağ içində naz ilə sərvin xuraman istəməz.

Bir nigah ilə dağıddun könlümün mə`murəsin,
Padşahim, şahi-adil mülki-viran istəməz.

Görsə hüsnün əksini ayineyi-mehrabdə,
Dutmaz üz mehrabə zahid, huri-qılman istəməz.

Atəşi-rüxsarüvə pərvanə canın yandırar,
Şəm`ə yandırmaz özin, şəm`i-şəbistan istəməz.

Saqiba, ol mahvəş əğyarə vermiş meylini,
Eyləmə hicründə neytək ahü əfğan, istəməz.

* * *

Xoş ol məsti-xərabə, dəhrdə bir zərrə qəm çəkməz,
Dutub meyxanə küncin, qəm əyağindən qədəm çəkməz.

Eşitməz, fikr verməz, qisseyi-Məcnunü Leylayə,
Nə eşqün aləmin bilməz, nə ahi-dəmbədəm çəkməz.

Desön, ey bixəbər, gər bu cəhanun inqilabindən,
Xəbər dutdun, deyər, yox, hiç qəm bu möhtərəm çəkməz.

Dağılsun külli-aləm, fikr verməz heç nə olmuşdur,

Yüz oğlun öldürər, hərgiz gözi bir qətrə nəm çəkməz.

Heyf, biarlıq düşməz ələ, bir yaxşı dövlətdür,
Məni ağuşinə ol bimürüvvət, bircə dəm çəkməz.

Əyağ altında qaldım paymali-möhnətü dərdəm,
Bu ağır bari məntək kişvəri-Cəmşidi-Cəm çəkməz.

Əlimdə sağəri-mey, içməmiş mey döndi qan oldı,
Belə bədbəxtlik təsvirini heç bir qələm çəkməz.

Əcəb həngamədür, bir mahvəş eşqində rüsvayəm,
Məni kuyinə bir dəm, neyləyüm, ol qönçə xəm çəkməz.

Cəhənnəm qorxısın yad eyləmə, dur, mey iç, Saqib,
Məzacı tiryaki aləmdə heç bir fikrü qəm çəkməz.

* * *

Bəlayi-dil çəkər nahəqq yerə bülbül, qəfəslənməz,
Verür Məcnunə Leyli müjdəsin naqə, cərəslənməz.

Təmənna etmiş əhli-mürüvvətdən verür canın,
Nə bir can, varü yoxdan əl çəkər, zərrə pəslənməz.

Gətürməz boynına minnət yükin mərd, qeyrət çəkər,
Yeyər xuni-cigər, eylər qənaət, mültəmislənməz.

Baş əgmə nanəcibə, göz yum ondan, çıxsa gər canun,
Dil açma nakəsə, dövlətdə Qarun olsa, kəslənməz.

Özün pərvanə kimi vır oda, kəsbi-məaş eylə,
Dəninün süfrəsinə tikmə göz, ənqa məgəslənməz.

Kişi gül iynəməz, şəmşirdə düşmən qanın iynər,
Vətən əldən gedəndə, seyri-gülzarə həvəslənməz.

Başunda asimanun, çəkmə heç qəm, sayəsi bəsdür,
Təməllüq eyləmə namərd əlilə mərd bəslənməz.

İtirməz qiymətin nadan əlində dürri-nasüftə,
Düşər sərraf əlinə buriyatək xarü xəslənməz.

Zəmanə Saqibə baran yerinə daşı yağdırsa,

Öpər sağər ləbindən, məst olur, ney kimi səslənməz.

* * *

Dünya yer ilə bir nəfəsün yarinə dəgməz,
Beş gün qalacaqsan, qəmün azarinə dəgməz.

Dünya dolısı lə`lün ola, ver meyi-nabə,
Dürdi-meyün üftadəsinin varinə dəgməz.

Dünyadən utanma, sana heç nə edə bilməz,
Dünya dəlilər məqdəminün xarinə dəgməz.

Çox verməgilən meylüvi bu dari-fənayə,
Ahi-səhərün ahi-şərarbarinə dəgməz.

Girəm ki, qul oldı sana bu cümlə xəlayiq,
Müzdi kəfənin ignəsinün tarinə dəgməz.

Tökmə bu qədr qanları bir loğma yeməkçün,
Bu keşməkeşün bir itün ətvarinə dəgməz.

Şah olmağuva fəxr eləmə, bircə nəfəsdür,
Qəbrün evinün mur ilə həm marinə dəgməz.

Bir yerdə ki, mey qandu, onun nuşi də qandur,
Bu qan çanaği əhli-dilün karinə dəgməz.

Məscidə nə var həq ora getsün, yüzi yoxdur,
Bütxanələrün rişteyi-zünnarinə dəgməz.

Asəf qoya heyrətdə əgər Asəfi-dəhri,
Bu Saqibün hərgiz çürük əş`arinə dəgməz.

* * *

Kim ahü fəğanım görüb ondan həzər etməz,
Bir gün dutar ahim onı axır, xəbər etməz.

Ahım odı yandırdı daşı, ey daşürəkli,
Gögçəksən, onunçün sana ahim əsər etməz.

Aləmlər alur kam sənün lə`li-ləbündən,

Yansun oda, neyçün mana bəxtim güzər etməz.

Məcnuni məlamət eləmə çöllərə düşmiş,
Dildardən ayrı, kimi qəm dərbədər etməz?

Səndən gilə etməm nə qədr cövr gər etsön,
Canım sana qurban edərəm mən, zərər etməz.

Ey vadiyi-eymən şəbanı, yaruvi tanı,
Bu sirridən agəh səni nari-şəcər etməz.

Dildar gəzir, aç gözüvi göz qabağında,
"Ərni" dedigündən utan, ol məh nəzər etməz.

"Lən" kəlməsini dağ eşitdi, dağ ərürdi,
Tə`sir sana zərrəcə aya məgər etməz?

Zahid, eləmə Saqibi təkfir mey içmiş,
Qəlbini onun bu sözün hərgiz kədər etməz.

* * *

Əbəs divanə könlüm naleyi-biixtiyar etməz,
Necə divanədür ol, görsə yari ahü zar etməz.

Sağalmaz daği-hicran sinədən, heyhat, müşkildür,
Həzər ahim odundan, ah ol birəhm yar etməz.

Demə hicran qəmin birəhmlər yanında, ey Məcnun,
Mürüvvətsizlərə heç ah odı bir zərrə kar etməz.

Utan, zahid, mənim meyxanələrdə e`tibarım var,
Sana səccadəni məscidə heç kim e`tibar etməz.

Məhəbbət rəsmini, aşiqligi pərvanədən ögrən,
Qəfəs küncində nalə etmə, bülbül, yarə kar etməz.

Dila, pərvanətək nari-fəraq ixtiyar eylə,
Məhəbbət əhli heç bir an rahət ixtiyar etməz.

Məni namərdə möhtac etməyincə çəkməz əl məndən,
Əzizi xar edübdür zəmanə, xarı xar etməz.

* * *

Qəzayi-ruh hərgiz səbheyi-səddanədən gəlməz,
Bütün buyi-riya zahiddədür, meyxanədən gəlməz.

Edərsən gülsitandə naləvü fəryad, ey bülbül,
Fəğan yandıqca şəm`ə zərrəcə pərvanədən gəlməz.

Cünun zəncirini vermiş mana giysulərün fikri,
Belə fəryadrəslik, sərvnazım, şanədən gəlməz.

Mana yetməkdədür hər ləhzədə səndən əziyyətlər,
Bu lütfü mərhəmət əksilməsün, biganədən gəlməz.

Məni sövdayi-zülfün eyləmiş zülfün giriftari,
Vəli gər abü danə olmasa quş lanədən gəlməz.

Çağırma zahidi meyxanəyə məsciddən, ey saqi,
Qədəh təklifini etmə, bayqulər viranədən gəlməz.

Fəqihün qövlünə, Saqib, inanma, e`tibar etmə,
Həqiqət əhli ol, həqqün sözi əfsanədən gəlməz.

* * *

Olmasa şirin, ey dil, söləmə təkrar söz,
Eyləsön təkrar, olur biqədrü bimiqdar söz.

Açma söz, ləbbəstə əgləş gər süxənsənc olmasa,
Etmə nadanun yanında, heyfdür, izhar söz.

Kimdə vardur qabiliyyət, fikr verməz hər sözə,
Dut qulağun, söləsə gər birsi nahəmvar söz.

Sözlə sözdə fərq vardur, hansıdur bilmək gərək,
Etməgə izhar xəlqə birbəbir axtar söz.

Var söz İsa(ə) kimi əmvatə hərdəm can verür,
Kasə-kasə içdirür, var bir də zəhrimar söz.

Sözlə izhar eylədi e`caz Xətmi-ənbiya(s),
Xəlqə cüz bildirməyibdür Əhmədi-Muxtar(s) söz.

Saqiba, meyl etməz idim şe`rə, yoxdur əhli-hal

Bu işə, əl çəkmədi məndən, edüb vadar söz.

* * *

Divanəsifət dami-səri-zülfüvə tuşuz,
Xali-xətüvə qul kimi həm həlqə bəguşuz.

Eşqündə sənün tərk elədim varü yoxı, ey məh,
Gör, vadiyi-heyrətdə necə xanəbəduşuz.

Zahid, mana eyb eyləmə, məsti-meyi-nabəm,
Olsam nə qədər məst, genə sahibi-huşuz.

Girəm ki, olub nəhy bizə şər`idə əmma,
Qurban meyi-müğbəçeyi-badəfüruşuz.

Açma məni-üftadəyə çox çeşmi-həqarət,
Ərbabi-həqəm, vaqifi-əsrari-süruşuz.

Dövran bizə nə eyləsə təqsim, qoy etsün,
Nuş eyləyərəm zəhr ola, ləbbəstə xəmuşuz.

Tək bir sana bu dəhridə mən təlxməzacəm,
Min əhli-dilə can kimi, şəkkər kimi nuşuz.

Bir cami-səbuhilə məni yad elə, saqi,
Peymanəkeşi-rənci-xumari-şəbi-duşuz.

Saqib, yüzüm heç gülməyəcək qəbrə gedincə,
Başdan-əyağə möhnətü ənduhə nüquşuz.

* * *

Divanəsifət məsti-meyi-“qalu bəla”yüz,
Həmməşrəbüz  hər rindü xərabatə fədayüz.

Saf olmasa, saqi, mey əgər künci-səbudə,
Bir qətrə də olsa, ver içim, dərdə rizayüz.

Ey sürməli göz, dut məni zülfündə, əsir et,
Quldan-qula satdur məni, kuyündə gədayüz.

Dərdim kimə izhar eləyüm zülfün əlindən,

Etsəm, eşidən yox, elə kim, bəxti qərayüz.

Leyla dedi Məcnunə, dur, al kam ləbimdən,
Məcnun dedi, dur get, rəhi-eşq içrə fənayüz.

Zahid, mana göstərməgilən məscidi, əl çək,
Bu dairə təyy oldı bizə, qiblənümayüz.

Rəm etmə bizi məstü meyaludə görəndə,
Ey bixəbər, aludeyi-xuni-şühədayüz.

Möhnət nə qədr bağrımızi qan edir etsün,
Etməm gilə, fərmanbəri-təqdiri-qəzayüz.

Saqib, mana təklif eləmə əmri-cədidə,
Biz böylə pəyamavər içün rahnümayüz.

* * *

Zahid, meyü mə`şuqəyə dildadələrüz biz,
Məsti-dəri-meyxanədə üftadələrüz biz.

Həqqün sözini aç, demə sərbəstə, əzizim,
Sən kimi müdəqqiq degülüz, sadələrüz biz.

Yatmışlarun açdun gözini, dutdı cəhani,
Açma gözüvi, sölə ki, rö`yadələrüz biz.

Nə tiri-bəla gəlsə qəzadən deyərəm, gəl,
Yox bakimiz əsla, elə amadələrüz biz.

Xaki-qədəmi-saliki-ərbabi-vəfayuz,
Nə talibi-mehrab ilə səccadələrüz biz.

Zülfi-siyəhi-türreyi-canan mana göstər,
Təsbihə məni bağlama, azadələrüz biz.

Simü zərün avarəsi düşmüş dəxi dildən,
Sərgəşteyi-rüsvayi-qızıl badələrüz biz.

Meyxanədə sordım qədəhə, sən kimə quldun,
Sənsən dedi qulzadə ki, şəhzadələrüz biz.

Saqib, demə bir də görərüz gördigimizdən,

Heyhat, çətindür, qurı xülyadələrüz biz.

* * *

Kəman degül qaşun, ey şux, tiğdür xunriz,
O qədr qan töküb, etməz təəccübəm, pəhriz.

Nizam ilə düzülüb tiği-navəki-qəmzön,
Hücumə hazır olub çinanki ləşkəri-Çingiz.

Gəzər dalunca təmaşayi-hüsnün eylər gün,
Qulamdür sana Yusiflə Xosrovi-Pərviz.

Gözündə tə`biyədür fitnə bir cəhanaşub,
Kəməndi-zülfün əsiri şəhü qulamü kəniz.

Bir Adəm eyləməyüb xalun təmənnasın,
Bütün xəlayiqə təng eyləyüb ki, rahgiriz.

Ədəb mülahizə et, sağəri alanda ələ,
Qulami-həlqəbəguşin degül, olub naçiz.

Gözlərün ləbi-yaquti, sərvi-qamətidür,
İçərsən onda dəmadəm gözəl şərabi-təmiz.

Təlatüm eyləmə, bir sağər ilə mey içsön,
Hərifi-meykədə rindi deyər sana, bərxiz.*

Tökülməsün yerə ərvah qanidür, saqi,
Vıranda badə yerə, cami eyləmə ləbriz.

Fəqihə hur ilə Kövsər şərabi qismətdür,
Məni-fələkzədəyə lə`lvəş şərabi-möviz.

Kəmali-həmnişin etmiş bu Saqibə tə`sir,
Nəfəs çəkincə yazar gündə şe`ri-şurəngiz.

* * *

Ey şux, ləbüvün sirrini kimdür bilə sənsiz,
Bilsəm, genə pünhani gətürməm dilə sənsiz.

Gər olmasa qəddün fərəhi, sərv boy atmaz,

* Qalx, dur

Atmaz sədəf heç bir dürini sahilə sənsiz.

Göz mərdümi, ey məh, dili-zarimdən içər qan,
Töksəm yüzimə göz yaşını, bir gilə sənsiz.

Sorma nə içün aləmi aşub dutubdur,
Məşşatə vırub şanəni bu kakilə sənsiz.

Hicründə sənün düşdi biyabanlara Məcnun,
Ləng oldı, gəl, ey Leyliveşim, qafilə sənsiz.

Əbrulərivün tiği verüb qətlimə fərman,
Lə`lündən haçan istəmişəm mən, silə sənsiz.

Bir bərqi-cəhansuzə dönər atəşi-ahim,
Çəksəm mən əgər bir nəfəs ildən-ilə sənsiz.

Saqi mana təklif elədi badeyi-nabi,
Qanə dönə mey, sağəri alsam ələ sənsiz.

Saqib şəbi-hicründə gəlüb naləyə ney tək,
Səndən, gözəlim, bir kəsə etməz gilə sənsiz.

* * *

Hicründə qalmadı dəxi səbrü qərarımız,
Keçsün nə qədr ah ilə leylü nəharımız.

Hicrin bu isə yetmərəm əsla muradimə,
Qəm yüz verəndə, qəm güni yox qəmküsarımız.

Zəncirə ram ola dili-divanəmiz nola,
Zülfin əlinə çünki keçüb ixtiyarımız.

Verdüm göz üstə yer səri-kuyin gədasinə
Eşqündə, səngdil, bu bizim e`tibarımız.

Verdün fərib könlümə ümmidi-vəsl ilə,
Əğyar yetdi vəslüvə, ey nazlı yarımız.

Kim verdi nəş`ə badəyə sordım, o məh dedi:
Ey bağrıqan, bu lə`li-ləbi-abidarımız.

Zalim, dedim, de, min yerə kim böldi sinəmi?

Göstərdi qaşların: bu iki zülfiqarımız.

Saqib, məhəbbət aləmi asan degül, bəli,
Bundan bətər keçür bilürəm ruzigarımız.

* * *

Rəhi-eşqündə sənün getdisə dünyalığımız,
Dəgər aləmlərə, ey şux, bu sövdalığımız.

Verdim adəmligimi mən səri-kuyində heçə,
Olur ə`mayə haçan kəşf bu binalığımız.

Hərə bir yarə verüb dil, sənə verdüm dilü din,
Həm bu dünyalığımız var, həm o dünyalığımız.

İsməti-pirəhəni-Yusifə əl atma, könül,
Olu rüsvayi-cəhan kim, bu təmənnalığımız.

Etmə öz rütbəvi mə`nadə Züleyxa kimi kəm,
Nə rəvadur düşə dildən-dilə rüsvalığımız.

Məni meyxanədə zahid görə təkfir eylər,
Zahidə kəşf degül surəti-mə`nalığımız.

Saqiya, badə gətür, gərçi həram etdi fəqih,
Meyi-minadədü, eşq əhliyüz, ehyalığımız.

* * *

Bidar, bəsdür, eyləmə Məcnuni, ey cərəs,
Leyla gedüb rəqib evinə ahü nalə bəs.

Qılmış yuva başunda sənün quşlar, əl gətür,
Məcnun, rəqibə yarun uyubdur, əlaqə kəs.

Mümkin degül vəfa görəsən əhli-hüsndən,
Uyma həvayi-nəfsə, nədür səndə bu həvəs.

Xunabi-həsrət etdi səni qərq hicrdə,
Fəryad etmə səs, səsüvə verməz hiç kəs.

Xasiyyətün təbiəti möhtac edər səni

Kəmrütbəyə, başunda ola tac, ya ki, fəs.

Çox da gözəllər içrə gözəl sərvnazsən,
Məhparə, arizün olacaq tö`meyi-məgəs.

Canun də çıxsa, heç kimə baş əgmə, Saqiba,
Biabiru həmişə olar əhli-mültəməs.

* * *

Nalə tərkin et, könül, yoxdur sana fəryadrəs,
Dut məlamət küncini, məskən sana ol gənc bəs.

Verdi zənciri-cünun avazeyi-hüsnün mana,
Yetməsün, ya Rəbb, görüm, Məcnun qulağinə bu səs.

Bənd-bəndimdən çıxar ney tək fəğanım hicrdə,
Çəkmədün əl bivəfalərdən, dedim peyvənd kəs.

Ey deyən tərk et fəğani, bəsdü fəryad eylədün,
Yox mənə həmdərd, həmavaz cüz bangi-cərəs.

Atəşi-hicranilə yandum əbəs hicran güni,
Bilmiş idim kim, olur bu mahvəşlər hüsni pəs.

Hüsnüvi xət paymal etdi sənün, ey səngdil,
Al ələ ayinəni, gör, noldı bəs ol basü kəs.*

Saqiba, əhli-xərabat ilə, get, həmrəng ol,
Fəxrdür əhli-xərabat ilə olmaq həmnəfəs.

* * *

Vadiyi-heyrətdə verməzdi cərəs Məcnunə səs,
Daşürəkli Leyli olseydi əgər fəryadrəs.

Hiç kim bilməz nədür eşq aləmin Məcnun kimi,
Eşqdən dəm vırmasun Məcnundən özgə hiç kəs.

Öpdi Məcnun it əyağın, Leyli kuyindən keçüb,
Aləmi-eşqə gərək kim böylə etməklik həvəs.

Eşqdən dəm vırmasun hər bir yetən, asan degül,

---

* Basıb-kəsmək

Quş yuvası vardı Məcnun başında xarü xəs.

Gözlərini bağlamışdı, sölədi əğyardur,
Görməsün yarun yüzün, eşq əhlinə bu rütbə bəs.

Dağlara rüxsari-Şirini çəkibdür kuhkən
Xəlq görsün, pak edər bu eybi dərya, ya Ərəs?

Od dutarsan, şəm` kimi eyləmə sərkeşligi,
Taci-Kavusi alub dövran, başə kəc qoyma fəs.

Etmə minnət nakəsə hərgiz, ürək qanın, get iç,
Çıxsa canı, loğma içün meyl eyləməz ənqa məgəs.

Varü yox tərk et qumari-eşqə, heç eyb eyləməz,
Həft kişvər cəm`ini etməklik içün olma pəs.

Rəncsiz, Saqib, müyəssər gənc hərgiz olmıyub,
İmtəhan olmış, olar kəmrütbə əhli-mültəməs.

* * *

Ey dil, zəmanədən əlüvi çək, əlaqə kəs,
Meyxanə künci, saqiyi-gülçöhrə, cam bəs.

Uyma həvayi-nəfsüvə, rüsva edər səni,
Yetmüb muradə istədigi qədr hiç kəs.

Giysuləründə olmaz idi mübtəla könül,
Cadu gözlərün əgər olsa idi dadrəs.

Meyxanələrdə mən ləbivün meypərəstiyəm,
Şəkkər olanda yığışur, rəsmdür, məgəs.

Pərvanə vırmaz idi özin şəm`ə sübhədək,
Nərdi-məhəbbətə uduzub olmaseydi pəs.

Hicran odını söndürə bilməz min il əgər,
Dildən təlatümə gələ kim, çeşmeyi-Ərəs.

Köçmək zəmanidür, dəxi çox yatma, Saqiba,
Ləng etmə qafilə, yola düş, söləyür cərəs.

* * *

Sərbəsər bicadur, eşqə, ey könül, etmək həvəs,
Ehtiraz et, bülbüli-miskinə verdi kim qəfəs?

Yar səndən yüz dutub əğyarə getdi, verdi dil,
Tə`neyi-əğyar eşitmə, can nədür peyvənd kəs.

Vadiyi-heyrətdə sərgərdandür Məcnun hənuz,
Paymali-möhnəti-qəm, yox ona fəryadrəs.

Verdi əğyarun əlinə naqə Leyli məhmilin,
Yetməsün Məcnun qulağinə bu səs, lal ol cərəs.

Xəlq cəm` oldı təmaşa etməgə rüxsaruvə,
İncimə, şəkkər görən vəqtdə hücum eylər məgəs.

Tab yox məndə təmam etsün mana gər qəmzəni,
Dinü dil gər istəsön almağa, nim qəmzə bəs.

Badə müzd içün verürsən, Saqiba, bir gün gəlür,
Heç təfavüt eyləməz ya tac ola, ya olsa fəs.

* * *

O gün ki, eylədün, ey şux, təxti-hüsnə cülus,
Çalındı kişvəri-Rumü Firəngdə naqus.

Kəməndi-türreyi-pürpiçüvə əsir oldum,
Səd heyf, pir zəmanımda eylərəm əfsus.

Cəvanlıq aləmi heç bilmədim haçan getdi,
Yerində qaldı dəmadəm fəğani-"ya Qüddus".

Necə mən eyləməyüm nalə bəndi-bəndimdən,
Yox ixtiyar, kəmü bişdən olmışam mə`yus.

Əlacın etmək olur, düşmənün kim olsa əgər,
Əlacı pirligün yox ki, gəlsə Calinus.

Ki, qədbəqəd bükülüb qəd ki, sərvi-novrəsdi,
Çirağı-şəm` ki söndi, gərək degül fanus.

Kifayət eyləyər, ey mahparə, bir bu sözüm,

Qocaldı şəxs kim, ondan bütün gedər namus.

Bu halə düşməgimə çox təəccüb etməgilən,
Bu halı sən də görərsən, sana çalarlar kus.

Sana nə nəf` verür, əl gətür məniyyətdən,
Əyağlar altda olub paymal şövkəti-Tus.

Çü zülf düş əyağə, gəl, olma sərkeşdür,
Məniyyət eylədi, məhv oldı qövmi-ləşkəri-Rus.

Həqiqətün sözini, Saqib, etmərəm inkar,
Başımi min yerə gər bölsə tiği-Dəqyanus.

* * *

Olmaseydi, gözəlim, səndə bu əgri iki qaş,
Verməz idim sana dil, incisə də gər nəqqaş.

Zahid örtər gözini arizüvi görməkdən,
Gün çıxan vəqtə qaçar, tab edə bilməz xəffaş.

Badə qan oldı səbudə bu ləbün fikrindən,
Qaldı heyrətdə görüb lə`li-ləbün lə`ltəraş.

Gördi göz sevdi səni, dil, məni çox incidmə,
Görməyeydim bu güni, qanə döneydi dil, kaş.

Nə müqərrər sana əzzəldən olubdur, o yetər,
Azı çox eyləyərəm heç demə, etsön də təlaş.

Sevdigün getsə əlündən, demə neyçün getdi,
Gedəcəksən ki, gedüb tökmə dəxi gözdən yaş.

Degül asan yetəsən məqsədüvə, ey Saqib,
Yetməsən sevdigüvə ta ki, Xuda almaya baş.

* * *

Qan bəhasinə verür badə bizə badəfüruş,
Qan bəhasinə necə badə içə xanəbəduş?

Qan bəhasinə verilməzdi bizə badeyi-nab,

Piri-meyxanəyə olseydük əgər həlqəbəguş.

Bu sözi açma, nihan dut, həzər et, vəqt degül,
Ey dil, azad degülsən hələ, gəl, ol xamuş.

Bu sənün yaxşı günündür, buna da şükr eylə,
Badəsiz məstü xərabati olarsan, mədhuş.

Hiç nəfəs çəkmə, qəmü möhnətə ol aludə,
Sana bir faidə verməz, eləmə cuşü xüruş.

Göstərür vəqt gədayə eləsün şəhzadə,
Gündə min dəf`ə baş əgsün, eləsün həm kürnuş.

Yarsız Saqibə təklifi-mey etmə, saqi,
Tök yerə abi-həyat olsa əgər, olmaz nuş.

* * *

Çeşmi-məstün nigəhi nərgisi-şəhladən xoş,
Tiği-əbruyi-kəcün taği-kəlisadən xoş.

Lə`li-nabun sora kim, mürdəni ehya eylər,
Ey könül behcəti, e`cazi-Məsihadən xoş.

Vəsfi-hüsnündə sənün nazil olub ayeyi-"Nur",*
Görünən həzrəti-Musayə təcəlladən xoş.

Gərçi çoxlar səri-zülfündə əsiründü, vəli,
Dözməyüb kimsə bu damə məni-rüsvadən xoş.

Yatma, Məcnun, dəxi dur, məhmili-Leyla keçdi,
Dil bu məhparəyə ver, şivəsi Leyladən xoş.

Musiya, tərk elə, çox qoymagilən Turə qədəm,
Bu məhün kuyinə gəl, vadiyi-Sinadən xoş.

Müstəfa barmağı "şəqqül-qəmər" etmiş nə əcəb,
Ey səvadi-xətü xali şəbi-yəldadən xoş.

Həqqi qal əhlinə qandursa kim, e`caz odur,
Kim açub bu dügini ol şəhi-Bəthadən xoş.
Vay qal əhli ilə durma, oturma, ey dil,

* Qurani-kərimin "Nur" surəsinin 35-ci ayəsinə işarədir

Bir kəsük dırnağı dut, mərdümi-bicadən xoş.

Saqiba, kargər oldı sana dövran sitəmi,
Künci-meyxanəni dut, yox meyi-minadən xoş.

* * *

Edərəm lə`li-ləbün yadı ilə badəni nuş,
Bu xəyalilə səbu, mey özi olmış mədhuş.

Gəlsə göftarə əgər lə`li-gühərpaş ləbün,
Olur əlbət ki, şirinsüxən tuti xəmuş.

Etdi eşqün məni rüsvayi-cəhan, şirinləb,
Almısanmı xəbər oldum nə içün xanəbəduş.

Qədəğən badəni kim eylədi, zahid, əl çək,
Qədəğən olsa idi, bilərdi onı bu badəfürüş.

Qəmi-hicranə dəvam eyləgilən, ey könlüm,
Vermiş əğyarə dil ol mahliqa, etmə xüruş.

Desələr yar rəqibə dəxi dil verməyəcək,
Sana bir fayidə verməz, eləmə hər sözə guş.

E`tibar eyləmə, Saqib, bu pərirüxsarə,
Gördüm əğyar ilə sərməsti-meyü həmağuş.

* * *

Ləbün fikri məni meyxanəyə, ey gözəl, çəkmiş,
Vəli bu saqiyi-gülçöhrəni məndən əzəl çəkmiş.

Üzarun əksi salmış heyrətə surətgəri-Çini,
Bu tərhün məhviyəm, ey sərvi-dilcu, necə əl çəkmiş.

Əcəbdür sinəmi çak eyləmiş ol tiği-əbruyun,
Anı üşşaq içün kilki-əzəl tiri-əcəl çəkmiş.

Degül xali, ey pəri, künci-ləbündə xalə bənzətmə,
Bəli, zənburdür lə`lünara nəqşi-əsəl çəkmiş.

Kəsad etdün cəmali-Yusifi bazari-hüsn içrə,

Züleyxa Yusifin tərk eyləmiş, bilmərrə əl çəkmiş.

Dəhanun sirri ilə urdı İsa(ə) lafi-həmrəngi,
Kəməndi-zülfin anı darara ziri-bəğəl çəkmiş.

Cəhanda incimə heç, Saqiba, yarun cəfasından,
Səni bədbəxtlik lövhində aşiqlər məsəl çəkmiş.

* * *

Əzəl nəqqaşidür əbrulərün tərhini xəm çəkmiş,
Bu tərhi çəkməgə ol tiri-müjganun qələm çəkmiş.

Necə eşqün yolındə etməyüm mən dinü dil tərkin,
Məlahət kişvərində xosrovi-hüsnün ələm çəkmiş.

Əlim dut, ey gözün qurbanı saqi, bir əyağ ilə,
Dəri-meyxanədən biganələr çoxdan qədəm çəkmiş.

Üzari-aluvun, ey sərvqəd, kim olmaz heyrani,
Müsəvvir məst olub, əbrulərün tərhin xəm çəkmiş.

Şərabun qədrini sən bilmisən, ey zahidi-xudbin,
Dutub can nəqdi əldə həsrətin Cəmşidü Cəm çəkmiş.

Bu viranxanədə hiç kim nəfəs asudə çəkmübdür,
Peşimandur gələnlər, nalə neytək dəmbədəm çəkmiş.

Məlamət eyləmə bu könlümi ney tək fəğan etsə,
Fərağundə rəqibün tə`nəsindən çox sitəm çəkmiş.

Təməllüq badəsin nuş etmədim meyxanə küncində,
Dənilər süfrəsindən gözlərin əhli-kərəm çəkmiş.

Xəbər Saqibdən aldım aləmi dutmış neçün fitnə,
Dedi, giysulərinə şanəni bu qönçeyi-fəm çəkmiş.

* * *

Qızıl gül arizi-alun görüb gülşəndə bulənmiş,
Alıbdur ləbləründən nəş`əni, badə səbulənmiş.

Mana təklif qılma seyri-gülşən, bağban, əl çək,

Məgər bu sərvqəddi görməyürsən lalərulənmiş?

Təəccüb etmə könlüm qanə dönmüş, ey kəmanəbru,
Ləbündən sormağa, qoy, qanə dönsün, arizulənmiş.

Həram olmış neçün mey, bilməz bu zahidi-kəcbin,
Hədisi-ləblərün meyxanələrdə göftügulənmiş.

Şərabi-safını təklif qılma zahidə, saqi,
Dutub məscid yolın, təsbihi var əldə vüzulənmiş.

Qəmi-hicranuva tab eyləmək, ey şux, müşkildür,
Həzər qıl göz yaşımdan, seyltək hicründə culənmiş.

Dili-divanəmi giysulərində yarun, ey Saqib,
Vıranda şanəni məşşatə, tel-tel cüstüculənmiş.

* * *

Etmə yüzüvə zülfi pərişan, gözi çıxmış,
Bəsdür, elədün könlimi viran, gözi çıxmış.

Məğrur bu gögçəklik edübdür səni, zalim,
Qalmaz sana çox da belə dövran, gözi çıxmış.

Bu qaşlaruvun tağinə asdım dili-suzan,
Göstərmə mana navəki-müjgan, gözi çıxmış.

Rüsvayi-cəhan eylədi eşqün məni getdi,
Rüsva olasan, gözləri ceyran, gözi çıxmış.

Xalun həvəsi saldı məni dami-bəlayə,
Aləmlər olubdur sana heyran, gözi çıxmış.

Bir busə verincə mana, qan bağrıma qoydun,
Canım sana olsun genə qurban, gözi çıxmış.

Zalim, könül əğyarə verincə məni öldür,
Rəhm eyləmə, ver qətlimə fərman, gözi çıxmış.

Heç bilməyəcəksən nə qədr qan eləyürsən,
Bəsdür, bu qədr eyləmə tüğyan, gözi çıxmış.

Kim alsa xəbər bağruvı kim qan eləyübdür,

Saqib, degilən, bir gözəl oğlan, gözi çıxmış.

* * *

Yetirməseydim əgər sidq ilə sana ixlas,
Qaşun qılıncı mana böylə etməz idi qisas.

Əsirdür dilü divanə dami-zülfündə,
Bu damdən belə divanə heç olurmi xilas?

Məni məlamət edir xəlq oldum heyranun,
Bu hüsn sən də ki var, görməyübdür bir əşxas.

Əlün yetişməyəcək bərdi-gövhəri-eşqə,
Bu bəhrə girməgilən, qərq olursan, ey qəvvas.

Məlamət etməsün heç kim məni, meyaludəm,
Yetirür məqsədə namərdi çərxi-kəcrəqqas.

Gözüm düşür o kəsə, gündə dal dutub vətənə,
Bateydi gözlərimə, kaş, nizeyi-Vəqqas.

Əzizi-xəlq olursan, inangilən, Saqib,
Cəhanda etməgilən heç kim ilə əhdi-təqas.

* * *

Vəsfi-Şirin söləmə, Məcnunə Leyladür qərəz,
Dürdi-mey üftadəsinə cami-səhbadür qərəz.

Məryəmün rüsvayi-aləm oldığından baki yox,
"Nəfxi-min ruhi"* deməklikdən Məsihadür qərəz.

Səd həzaran tifli-sərbüridə olmaq səhldür,
Sərbəsər bunlar bəhanə, əsl Musadür qərəz.

"Rəbbi ərini" söləmək Musayə yüz min eybdür,
Rütbəsin güm eyləmiş, bica təmənnadür qərəz.

"Lən tərani" kəlməsi eyb oldığın isbat edir,
Hüsni-yari göstərür hər zərrə binadür qərəz.

Yusifün pirahənin çak etməgün min vəchi var,

* "...ruhumdan üfürdüyüm..." (Qurani-kərim, Hicr, 29)

Olsun hər dillərdə rüsva ol Züleyxadür qərəz.

Tərk qıl zahirpərəst olmaqlığı, zahirpərəst,
Tapgilən mə`na yolın, həqbinə mə`nadür qərəz.

Düşmə rəngə, qıl həzər, ey dil, gedüb birəng ol,
Baxma xəlqə, hər yetəndə nisyə sövdadür qərəz.

Daşə, zahid, başuvi çox urma, çıx mehrabdən,
Huri-cənnət arizusi, fikri-bicadür qərəz.

Sidqi təhsil etmək ilə sən yetərsən məqsədə,
Salmasun gər sidq ilə, bihudə xülyadür qərəz.

Xilqəti-insan neçündür, hiç kimsə bilməyür,
Bir-birinə boş yerə bica təmaşadür qərəz.

Əslə heç kim verməyür dil, fər`lə məşğuldür,
Payimali-nəfsi-dun olmış, həyuladür qərəz.

Növ` qanın tökməgə həmnöv`lər dilşaddür,
Bivəfa hər fərdə bu murdar dünyadür qərəz.

Sağərin, Saqib, yenə boşdur, rəhi-meyxanə dut,
Bilmiş idim səndə, zalim, səbr dəryadür qərəz.

* * *

Eşqüvi tərk etmərəm əflakü xakə tiksə naf,
Gərçi bari-eşqdən dönmiş kəmanə qəddi-Qaf.

İnqilabından cəhanun şikvə, ey dil, eyləmə,
Baxma çox bu hərci-mərcə, tez yatar bu ixtilaf.

Yanə-yanə eşq rəsmin kəsb qıl pərvanədən,
Yanmasa gər oda, etməz şəm`i-rüxsarın təvaf.

Çəkmə qəm düşdin əyağə naşilər tapdağilən,
Qiymətin tərk eyləməz sərraf əlində lə`li-saf.

İncimə bu dəhri-dun dövrindən hərgiz zərrəcə,
Yusifə qiymət verüb gəh Misri, gahi bir kəlaf.

Etməsön gər tərki-can canan yolında şövq ilən,

Yetməsən canana, get, aşiqligündən vırma laf.

Kor gözə, eyb eyləyərlər, çəkmə sürmə, heyfdür,
Dur müqabil düşmənə tiğ ilən, neylər boş qılaf.

Qərqdür dəryayi-elmə xəlq, zahid, əl gətür,
Bir nəticə hasil olmaz, qurma dami-e`tikaf.

Dutmaz idi bu cəhan mülkini fitnə, Saqiba,
Eyləyən olseydi kim təqsiri-cəhlin e`tiraf.

* * *

Cəzbeyi-eşq çəkər aşiqi dildarə tərəf,
Zövqi-güldür aparan bülbüli gülzarə tərəf.

Dutdı dil daməni-zənciri-cünun məşşatə,
Şanələr çəkdigiçün türreyi-tərrarə tərəf.

Ey deyən eşqidə tə`sir hanı, pərvanələri
Yanə-yanə aparur şəm`idəki narə tərəf.

Vəsfi-Leylanı de Məcnunə demə Yusifdən,
Çəkməz əl Leylidən, aləm gedə odlarə tərəf.

Bisütun düşsə idi başinə Fərhadun əgər,
Gedəcəkdür genə Şirini-şəkərbarə tərəf.

Bixəbərdür bu pəriçöhrə vəfa rəsmindən,
Canı versün demə getməz dəxi əğyarə tərəf.

Saqiba, etmə məlamət bu qədr Mənsuri,
Olmasa eşq çəkərdi onı kim darə tərəf.

* * *

Mey tək əyağə saldı məni bəxti-naxələf,
Rüsvalığımdan ötri çalur cümlə xəlq dəf.

Hüsnilə Yusif aləmi salmışdı heyrətə,
Əmma zəmanə qiymət ona verdi bir kələf.

Dərya yüzündə seyr eləyür xarü xəs müdam,

Gövhər sürüldi qə`ri-yəmə, tapdı kəf şərəf.

Xuni-dil ilən ömrümi verdüm fənayə mən,
Dəhrün cəfası etdi məni möhnətə hədəf.

Min can içində bəslədüm, ey şux, eşqüvi,
Dürri-yətimi hifz eləyür necə kim sədəf.

Divanə könlümi xəm zülfün əsir edüb,
Qətlimdən ötri navəki-qəmzöndə urdı səf.

Zahid, şərabi-Kövsərə salladma qaş-qabaq,
Gəl əqlə, zalım oğlı, sana heyfdür ələf.

Hiç bimədim günüm necə keçdi, gecəm necə,
Ömri-əzizi boş yerə mən eylədim tələf.

Saqib, əcəb degül mey içüb məstsən müdam,
Gör kimlərün əlində qalub türbəti-Nəcəf.

* * *

Vıranda kişvəri-hüsnə bu zülf ilə beydəq,
Mühəmməd(s) eylədi əngüşt ilə qəmər münşəq.

Görəndə gülşənara rəngi-arizi-alun,
Öpər əyağun, edər tə`nə laləyə zənbəq.

Yüz üstə kuyüvə, ey şux, olsa da, gəlləm,
Qəmi-fəraqüvə qalmayub könüldə rəməq.

Məlamət eyləmə, fəryad ney kimi etsəm,
Bu tiri-qəmzön öpər hər qoyub baxanda nəsəq.

Çox ixtiyarı verübsən bu tiği-əbruyə,
Cəhanı qərq eləyüb qanə, tökmə qan nahəq.

Həramidür meyi-gülfam şər`idə, söz yox,
Var onda sirri-nihan, yə`ni içməsün əhməq.

Əcəb degül içənə əmri-həq qəsas etsə,
Edər fəsad, qarışdı meyə zibəski ərəq.

Rəqib yetdi sənün vəslüvə, kəmanəbru,

Bizim nəsibimiz hicründə nalədür əncəq.

Zəmanə içrə yox ərbabi-hal, ey Saqib,
Cəhan kitabinə baxson əgər vərəqbəvərəq.

Deyürlər Leyli də Məcnunə aşiq olmuşdı,
Gözəllərün nə vəfası, yalandur mütləq.

* * *

Salmubdur hələ sayəsin əflak müntəbəq,
Sən kimi gözəl sərvqədü məhvəşə mütləq.

Sürmə gözüvə çəkmə, dutar fitnə cəhani,
Onsız də dutub fitnə, nə hacət dəxi rövnəq.

Rüxsaruvi açson sən əgər bağə girəndə,
Oynar qabağunda, sevünər laləvü zənbəq.

Mənsur görüb hüsnüvi ayineyi-dildə,
Hökm etdi ona, sölə, "ənəlhəq, ənəlhəq".

Dil səndən üzüb qeyriyə vermək degül asan,
Hüsn aləminə kim vıracaq sən kimi beydəq.

Səndən yetən, ey məh, yetür kamə dəmadəm,
Hicründə yetən ahü fəğandur mana əncəq.

Kimdür deyən ayi iki parçə edən olmaz,
Bəs kim eləmiş mahi-üzarun belə münşəq.

"Şəqqülqəmər"ün ayəsi* neydəndür ibarət,
Xətmi-rəsul e`cazinədür əmri-müsəddəq.

Yusif eləyür boş yerə də`viyyi-gözəllik,
Olmaz sana qul eyləsə də`viyi-nahəq.

Açılmıyacaqsan bilürəm qüssədən, ey dil,
Məskən sana cənnət ola ya baği-müşəvvəq.

Gül fəsli yetüb, Saqibə ver rovhi-rəvani,
Saqi, xüm ilə, yə`ni meyi-lə`li-mürəvvəq.

* * *

---

* Qurani-kərimin Qəmər surəsinin 1-ci ayəsinə işarədir.

Ey didə, bəsdür, etmə belə əşkbarlıq,
Mey nəş`əsini yıxdı bu rənci-xumarlıq.

Ey qan olan könül, dəxi tərki-məhəbbət et,
Tə`sir eyləməz ol məhə bu ahü zarlıq.

Çox istədüm kəsəm, könül, ol məhdən ülfəti,
Kuyinə çəkdi çün məni bu ixtiyarlıq.

Təşvişə düşdi görüb hüsnündə zülfüvi,
Ey zülfi-qarə, yoxmı sənünçün qərarlıq.

Qaşun işarə eylədi bir busə vermədün,
Əbruləründə imiş nə bilüm kəcmədarlıq.

Rəşk, öldür məni görəm ol mahvəş yüzin,
Məşşatə, bəsdü, eləmə ayinədarlıq.

Lə`lün həvasi çəkdi məni qəm əyağinə,
Ey təxti-hüsnün üstə edən şəhriyarlıq.

Meyxanə künci darüləman, saqi həmdəmim,
Yox dərdimdən özgə mənə qəmküsarlıq.

Bəxtündən inci, bəxt müxalifdü, Saqiba,
Bitməz bu yarə eyləməsə bəxt yarlıq.

* * *

Eşqdən dəm urma, ey dil, bağrımi qan etdi eşq,
Hər nəfəs Məcnun ahını bərqi-suzan etdi eşq.

Söhbətin heç etmə eşqün, əl verür divanəlik,
Eylə bir yükdür ki, qəddi-Qafi çövkan etdi eşq.

Eşqdən dəm vırmaq istərsən əgər, Məcnunə bax,
Düşdi dildən-dillərə, rüsvayi-dövran etdi eşq.

Yandırub Qur`anı Sən`an, heç məlamət eyləmə,
Çoxlarun həqqində yüz min böylə tüğyan etdi eşq.

Yetmisən məqsudivə, dil vermə şirinləblərə,

Bisütun dağında çox Fərhadı heyran etdi eşq.

Bilmək olmaz sirri-eşqi, bir kəlafə saddırur,
Yusifi bir göz yumub-açınca sultan etdi eşq.

Doldur gülzarə xarı, incisün qoy bağban,
Əndəlib ilə əzəldən böylə peyman etdi eşq.

Hiç kəsdən çəkməz əl, rüsvayi-aləm etməsə,
Çox Süleymani-zəmani murə dərban etdi eşq.

Yanə-yanə güldürür gəh şəm`i, gahi ağladur,
Eşqdən qaç, gör kimi giryan, xəndan etdi eşq.

Hər nəfəs hər an Xəta müşkinə eyb etsəm, nola,
Türreyi-pürpiçü tabun ənbərəfşan etdi eşq.

Ehtiraz et, ey dili-divanə, əl çək eşqidən,
Saqibi bir an içində xanəviran etdi eşq.

* * *

Zühur eylədi Məcnundə həqiqəti-eşq,
Onun vücudilə tapdı rəsmi-şöhrəti-eşq.

Nədən müxəmmər olub eşq, sorma Leyladən,
Bilürmi hüsninə məğrur, etmə söhbəti-eşq.

Bu rəmzi-eşqdən agahdür özi Məcnun,
Olub müxəmmər Məcnun ilə təbiəti-eşq.

Əbəs başındə tiküb aşiyan məgər quşlar,
Dəvam eyləmək olmaz, bu təriqəti-eşq.

Od oldı qəlbi-Züleyxadə bilmədi Yusif,
Çəkəndə eşq anı eyləyərdi nifrəti-eşq.

Bəla ilə doludur eşq, kim dəvam eylər,
Kim olsa eşqün əsiri çəkər əziyyəti-eşq.

Şad olmağa səni bir ləhzə bir nəfəs qoymaz,
Əzzəl güni yaranıbdur bu növ` tinəti-eşq.

Vırardı tişəni gəh başinə, gəhi dağə,

Qan etdi kuhkənün bağrıni gəh zərbəti-eşq.

Birini eylədi divanə hicri-Leyladə,
Yüz üstə çəkdi birin payi-darə qisməti-eşq.

Yaraşmaz aşiqə təsbihü rəngi-səccadə,
Fəqihi-mədrəsə eylər odu məzəmməti-eşq.

Təəccüb eyləmə Sən`anə yandırub Qur`an,
O bəxti qarə nə etsün edəndə şiddəti-eşq.

* * *

Qaşun tərhin çəküb nəqqaş tiği-xunfəşanlar tək,
Qəmindən qamətim, gör, bir necə xəmdür kəmanlar tək.

Cünun zəncirinə bənd oldı dili-zülfün xəyalilən,
Gəlür fəryadə ney tək, olur əf`i ilanlar tək.

Güli-rüxsarüvün yadilə qıldım gülistan tərkin,
Gözüm yaşilə verrəm laləyə su bağbanlər tək.

Nola xunab töksəm seyl tək, el damənün dutsun,
Gözümdə məskən etmiş navəki-qəmzön tikanlar tək.

Sənün eşqün yolında tərk qıldım dinü dil, getdi,
Əyağ altında qaldım, bilmədün, bərgi-xəzanlar tək.

Əmandur, qoyma baxsun, dildə tabü taqətim yoxdur,
Mana hərdəm baxanda gözlərün karvanqıranlar tək.

Qəzəl inşası içün, Saqiba, ustadə xidmət qıl,
Əl atma çör-çöpə şe`ri yazanda xurdədanlar tək.

* * *

Gözə gər çəkməsəm mən xaki-kuyin tutiyalər tək,
Ağarsun gözlərim, düşsün yerə bu xaki-palər tək.

Dolaşub boynuva, dil tab qılmaz, zülfi-pürçinün,
Vırub lə`li-ləbün küncində həlqə əjdəhalər tək.

Zəkati-hüsnüvi ver, müstəhəqqəm, ey kəmanəbru,

Gələndə kuyüvə ahəstə-ahəstə gədalər tək.

Rəqibün fitnəsindən vadiyi-heyrətdə giryanəm,
Səri-kuyin dutam, qoymaz məni badi-səbalər tək.

Qəmim izhar edim, gəl, gör nədür hicründə əhvalım,
Səni göz pərdəsində saxlaram ağü qəralər tək.

Cəhan mülkin dolanma aşinaçün bağrıqan könlüm,
Deyür, aşina nayab olubdur kimiyalər tək.

Qocaldun, Saqiba, əl çəkgilə bu sərvqədlərdən,
Cəhan mülkində yoxdur mürüvvət məhliqalər tək.

* * *

Güzarım kuyüvə düşseydi gər badi-səbalər tək,
Çəkərdüm çeşminə xaki-rəhündən tutiyalər tək.

Oyatma, kakilündə fitnələr yatmış sənün, ey məh,
Qiyamət fitnəsi, ey fitnəcu, seyli-bəlalər tək.

Dili-divanələr pabəndidür zənciri-zülfündə,
Çəkibdür kaminə, azad qılmaz əjdəhalər tək.

Fəqihi-mədrəsə nəhy eyləsün qoy badənün vəsfin,
Gözümdə saxlaram mey dürdini cantək, ziyalər tək.

Dila, düşməndən umma, eyləsə düşmənlik izharın,
Təməllüqlə sana düşmənlik etməz aşinalər tək.

Kəlamullah əlində od salub şər`i-şərif içrə,
Bu şəhrün vaizi pamal qılmış xaki-palər tək.

Fəda qıl canuvı kim, mərdümi-baqeyrətə, ey dil,
Vücudi çox çətin düşsün ələ, yox, kimiyalər tək.

Genə çox nanəcib dövlətlilər başındə tacəm ki,
Nolub dövran məni salmış əyağə buriyalər tək.

Cəhanda, Saqiba, çox nakəsi zər sərbülənd etmiş,
Xəm etmə onlara qamət, görüb, alimnümalər tək.

* * *

Tökər su gözlərim bu sərvi-qəddün hər zəman görcək,
Verər su bağban, əlbəttə kim, sərvin rəvan görcək.

Görüb xəm qəddimi, əl çəkməyür naseh nəsihətdən,
Necə xəm olmasun bir sən kimi əbrukəman görcək.

Bu könlüm məskən etmiş türreyi-pürpiçü tabundə,
Dutar, ey şux, məskən dərbədər quş aşiyan görcək.

Qəfəs küncində giryan əndəlib min ahü zar eylər,
Haçan badi-xəzandan arizi-güldə nişan görcək.

Təəccüb eylərəm hərdəm bu pirü natəvan könlüm,
Nəhayətsiz olur xürrəm gözəl, növrəs cəvan görcək.

Məlamət etməsün heç kim məni yüz dutsam aləmdən,
Cəfa daşın vırar hər yerdə zalim natəvan görcək.

Çağırma, zahid, əl çək, məscidə meyxanə küncindən,
Verər imanını Saqib şərabi-ərğəvan görcək.

* * *

Əgərçi şər`idə badə həramdür içmək,
Ki, sənsiz oldı həram, ey əziz, rəşki-mələk.

Rəqib kuyüvə yol tapdı, mən ki, tapmamışam,
Nədür bu qıyqacı baxmaq, nədür bu qan tökmək?

Boy atmağa, gözəlim, sərvi-nazını qoymaz,
Sənün bu qamətüvi görsə idi bağı-Fədək.*

Təəccüb eyləyürəm xəlqi-aləmün sözinə,
Cünun zəncirinə ad qoyubdurlər: birçək.

Zəman-zəman özimi eşqə mübtəla görürəm,
Olursan aləmə rüsva, gəl, ey könül, əl çək.

Qiyas eylə Züleyxadən, hüsni-Yusifdən,
Peyəmbər olsa da, zalimdü səngdil göğçək.

Vəfa yolın nə bilürlər bu sərvqamətlər,

* Məhəmməd Peyğəmbərin (s) qızı Həzrət Fatiməyə bağışladığı Mədinə yaxınlığındakı bağın adı.

Bütün cəhani dolan, gəz, tapulmaz heç bir tək.

Bu deyri-dunidə əhli-kəmalə qiymət yox,
Budur həmişə, bəli, arizuyi-rəsmi-fələk.

Vətəndən ötri əgər canı qılmason qurban,
Başuva bağlagilən fəs yerinə köhnə ləçək.

* * *

Oleydi mümkin əgər lə`li-nabuvı öpmək,
Deməm bu cümlə cəhan padşahinə ləbbeyk.

Tapardı çeşmeyi-abi-cəhani İskəndər,
Məhaldür bu ləbi-lə`li-nabuvi əmmək.

Təvaf kuyivi etməklik istədi Musa(ə),
Deyildi hey ona Musa(ə) ki, "fəxlə` nə`leyk".*

Bu eşq aləmi bir oddur, özgə aləmdür,
Çətindü, rahi-xətərnakdür, könül, getmək.

Fəzayi-Leyliyə Məcnun olmason getmə,
Başunda tikməsə quş aşiyanə gər, əl çək.

Təriqi-eşq degül Bisütun dağın yıxmaq,
Həvayi-kuhkənə qaldı tişə künd etmək.

İlan kimi dili-divanə piçü tab eylər,
Tökəndə şanə ilən mahi-hüsnə sən birçək.

Əbəs degül sana, ey sərvnaz, dil verdüm,
Gözəllərün şəhisən, tacdarisən, gögçək.

Gələndə kuyüvə eylər hücum qəmzə oxun,
Dəvam eyləmək olmaz ki, dəgməsə tək-tək.

Xəyanət eyləmə başun də getsə gər təndən,
Bir belə meyl eləsön zərrə qədri nanü nəmək.

Şikayət eyləmə bəd ruzigardən, Saqib,
Haçan xoş ülfət edübdür birilə çərxi-fələk.

---

* "...nəleynini çıxart..." (Qurani-kərim, Taha, 12)

* * *

Şərtdür olmağa, ey şux, gözəllikdə nəmək,
Cəm`dür səndə gözəllik, düzi, ey rəşki-mələk.

Sən elə mahliqasən, könül heyranundur,
Sən kimi sərvqədə harda salub sayə fələk.

Vadiyi-eşqə bu təsbih ilə getmə, zahid,
Vadiyi-eşqdə yoxdur nə səlamü nə əleyk.

Bu həman vadidür, istədi Musa(ə) keçsün,
Verdi hey hatifi-qeybi ki, "fəxlə` nə`leyk".

Bu həman vadidür verdi cünun zəncirin,
Dili-Məcnun nə dedi Leyliyə, Məcnun ləbbeyk.

Gözümün yaşı dutub damənimi hicründə,
Qan olub dil, ləbüvi olmadı mümkin əmmək.

Saqiba, şe`r əyari zəri-xalis kimidür,
Can fəda, Azərinün toprağıdu səngi-məhək.

* * *

Dil tənurində verüb lə`li-ləbün atəşə rəng,
Qaşlarun tərhini görmüş xəm olub qaməti-çəng.

Zülfün əndişəsi məh çöhrəsini etdi zəif,
Dəhənün şövqi edüb gülşəni tər qönçeyi-təng.

İçərəm badeyi-gülrəng ləbüvün fikriylə,
Lə`li-nabun kimi yaqut ola bilməz həmrəng.

Dil təmənnayi-vüsalunla yanar şəm` kimi,
Rəvişi-şivəni dutma dəxi, ey şux, qəşəng.

Sinəmi qəmzön oxı eylədi rovzən-rovzən,
Eyləməz bu qələti navəki-dilduzi-xədəng.

Bisəbəb saqiyə təklifi-mey etməm hərgiz,
Ol zəman kim, oluram, yar, ləbünlə diltəng.

Məhvəşa, ahim odundan həzər eylə, necə kim,
Ahi-Məcnun elədi qafileyi-Leylini təng.

Sərfiru eyləmə, Saqib, dənilər süfrəsinə,
Çünki it loğmasına meyl eləməz şirü pələng.

* * *

Nədür şərabdə nəş`ə, xümardən xəbər al,
Müğənni naləsini çəngü tardən xəbər al.

Əsir harda gərək kim Müxalifi etmək,
Qətar hökm eləyər, get, Həsardən xəbər al.

Şəbi-fəraq qəmin Leylidən xəbər alma,
Bu sirri-məxfini Məcnuni-zardən xəbər al.

Qəfəsdə ətri-güli əndəliblər bilməz,
Nə ətr var gülü gülşəndə, xardən xəbər al.

Əsir bu dili-divanəmi sən etməmisən,
Kəməndi-türreyi-pürmüşki-bardən xəbər al.

Nə hal var bu dili-parə-parədə, ey məh,
Bu tiri-qəmzə nə bilsün şikardən xəbər al.

Cəhanı nəylə qılıncsız müsəxxər etmək olur,
Bu mö`cizi qələmi-müşkbardən xəbər al.

Qəzəldə zövq nədür, sən də bilmisən, Saqib,
Münirini* edən heyran bəhardən xəbər al.

* * *

Saqiya, etməgilən sağəri çox malamal,
Nə içüm badeyi-gülfami pərişanəhval.

Və`də vermiş o pərivəş, tökərəm qanuvı mən
Tiği-əbrulər ilə, məndə hanı ol iqbal.
Gedirəm kuyinə can nəqdi ilə xaki-rəhin
Öpməgə, dutdum əcəb yerdə genə əmri-məhal.

---

* Şair Ağadadaş Müniri (1863-1940) "Məcməüşşüəra" ədəbi məclisinin üzvü, Haşım bəy Saqibin yaxın dostu olmuşdur.

Tiri-müjganuvı, ey məh, görə hər kim qafil,
Vəhm edər şir bu rüxsarüvə vırmış çəngal.

Ey deyən vermə dil ol məhvəşə, əğyarə uyub,
Əl gətür, bir qəmi-hicranə yanursan məhü sal.

İxtiyar olsa idi məndə könül verməz idim,
Bu bəlayə məni dil saldı, oleydi pamal.

Eşq sövdası məni eylədi rüsvayi-cəhan,
Hasilim olmadı, yox çarəsi cüz dərdü məlal.

Mümkin olmaz yetişəm vəslüvə, ey şirinləb,
Nə qədr səndə var, ey şux, bu zülfi-xətü xal.

Hünəri-şe`rdə Yusif kimi sabitqədəm ol,
Saqiba, kişvəri-şe`ri eləyərsən işğal.

* * *

Yar edəndə xəm giysulərün, ey Leylimisal,
Dutaram daməni-Məcnuni pərişanəhval.

Tiri-müjganun hücum eylədi dil kişvərinə,
Ləşkəri-küfr genə Kə`bəni etdi işğal.

Çəkmə damən, səni görcək tökərəm göz yaşın,
Şəh gələn vəqtdə edər xəlq onı istiqbal.

Qanə döndi dili-divanə ləbün fikriylə,
Canı çıxsun, eləmiş arizuyi-əmri-məhal.

Qaşlarun tərhini kim görsə təəccüb eylər,
Kim görübdür ki, bir ayda görünə iki hilal.

Düşsə dildən-dilə avazeyi-hüsnün nə əcəb,
Bax bu ayinəyə, var səndə necə hüsnü cəmal.

Necə rüsvayi-cəhan olmayum eşqündə sənün,
Mən könül qeyrə verüm, qoydı məgər bu xətü xal?

Tiği-əbru ilə bildün nə qədər qan etdün,
Aşiqün qanıni, zalim, sana kim etdi həlal.

Eylə bildim yetərəm vəslüvə can verməklə,
Verdün əğyarə dil, etdim nə içün xam xəyal.

Seyli-qəm axdı başımdan, məni meyxanəyə çək,
Saqiya, sağərü peymanəni qıl malamal.

Zahidün daneyi-təsbihinə uydun, Saqib,
Bu degül şiveyi-arayişi-ərbabi-kəmal.

* * *

Şirin ləbün kimi ola bilməz əsəl-məsəl,
Ey mahparə, yox sana hərgiz bədəl-mədəl.

Kim mail olmaz hüsnüvə, ey sərvqamətim,
Yoxdur zəmanəmizdə sənün tək gözəl-mözəl.

Göz görcəgin səni, könül oldı mailün,
Yox xatirimdə, mail idim mən əzəl-məzəl.

Kuyün təvafını edər idim bu can ilə,
Bir dəm əman verəydi mənə gər əcəl-məcəl.

Pabənd qıl gözəlləri zənciri-zülfüvə,
Əfşan yüzinə etmiyə zülfün keçəl-meçəl.

Ol minbər üstə kim, oxunardı kəlami-Həq,
Mütriblər imdi orda oxurlar qəzəl-məzəl.

Yetməz muradə əhli-həqiqət, əcəb degül,
Yandırdı, sönməz atəşi-fitnə, dəğəl-məğəl.

Həmsöhbət olma tazə cəvanlarla, Saqiba,
Get, həmpiyalə tap özüvə bir əfəl-məfəl.

* * *

Bu dami-zülfüvə hərdəm vıranda şanə, gözəl,
Cərəs kimi dili-zarım gəlür fəğanə, gözəl.

Alışdıran oda şəm`i bu hüsnüvün odıdur,
Əcəb degül qala pərvanə yanə-yanə, gözəl.

Kəsərdim ülfəti səndən gözəllərin gözəli,
Əlimdə olmaseydi gər mənim bəhanə, gözəl.

Yatub bu guşeyi-çeşmündə bir cəhan fitnə,
Demə ki, fitnə düşübdür neçün cəhanə, gözəl.

Xəmidə qaşlaruvun fikridür bu qamətimi,
Təəccüb etməgilən, döndərüb kəmanə, gözəl.

Dedim dodağun öpüm, yox dedün, əyağımi öp,
Gətürmə, gəl, mana sən gündə bir bəhanə, gözəl.

Sirişki-həsrətə qərq oldı bağrıqan Saqib,
Ləbündən alsa nolur busə aşiqanə, gözəl.

* * *

Bilməz çoxı cəhanda nə şeydür qəzəl-məzəl,
Şair qoyubdur ad özinə hər keçəl-meçəl.

Dana sözinə zərrəcə qiymət qoyan hanı,
Xəlqün içində rütbə tapubdur dəğəl-məğəl.

Qismət olundı söz qanana xuni-dil müdam,
Qanmaz başından açdı töküldi əsəl-məsəl.

Yox ehtiramı saliki-həqqün qarışqacə,
Təkfir eyləyür onı hər dəm bədəl-mədəl.

Biar də olsa tazə cəvanlar gərək bizə,
İş verməyür, zəmanı keçübdür, əfəl-məfəl.

Keçmiş zəmanun imdiki vəqtə nə dəxli var,
Millət satan yox idi, nə hasil əzəl-məzəl.

Saqib, şəhididür içə hər kimsə bu zəman,
Cəllad əlilə zəhrli cami-əcəl-məcəl.

* * *

Baxma yetənün fikrinə, get, əhli-yəqin ol,
Başun gedə təndən də əgər, qorxma, həmin ol.

Xəlqün sözinə aldanub heç fikrüvi vermə,
Təkfir edə zahid səni, qoy, yarə qərin ol.

Yağsa başuva səngi-nədamət, həzər etmə,
Təqrir özüvə verməgilən, qaçma, mətin ol.

İstərsən əgər sərhədi-məqsudə yetişmək,
Canü dil elə tabe`i-Qur`ani-mübin ol.

Təqva tələb et, meykədənün cami-cəmindən,
Sərməsti-meyi-lə`li-ləbi-mahi-cəbin ol.

Din olmasa səndə, onı bil namusun olmaz,
Nə hökm sana eyləsə, fərmanbəri-din ol.

Hər nakəsü bihudə sözin alma qulağə,
Yaxşı-yəmanun fərqini bil, ruhüləmin ol.

Nahəqqlə həqqi tanı, dut daməni-məqsəd,
Bu rütbə ilə qatili-şeytani-lə`in ol.

Heç bir kəs içün açmagilən çeşmi-həqarət,
Gördün yıxılubdur biri, dut, yarü mü`in ol.

Şəxsün şərəfi əsli-nəsəbdür, demə hərgiz,
Yaxşı əməlündür şərəfün, yə`ni çənin ol.

Saqib, ədəbi kəsb elə meyxanə yolından,
Dönmə rəhi-məscid, dəxi meyxanənişin ol.

* * *

Ərzi-rüxsar etdün, ey məh, oldı bimiqdar gül,
Bağə girmə, olmasun bülbül gözinə xar gül.

Çıxma, yarım, pərdədən, gəl pərdə çək rüxsarüvə,
Xəlqə eylər hüsnüvün vəsfini hər nə var gül.

Girmə bazari-lətafət içrə, ey sürxun belə,
Bir kəlafə satulur gül qədri Yusifvar gül.

Zülf açub badi-səbayə vermə buyi-zülfüvi,
Qoymaz ol badi-səba gülşəndə bir asari-gül.

Lövhi-dildə tərhi-rüxsarun çəkübmin şövq ilə,
Gül görüb, gül iynəməz, ey gül, dəxi əttar gül.

Bağə girdi fəsli-gül ol sərvi-siməndam kim,
Bir çəmən gül sərnisarın eylədi aşcar gül.

Əndəlibə zahiri-seyrani-bağı-arizün,
Etməsün künci-qəfəsdə naleyi-didari-gül.

Xuni-dildən, Saqiba, su ver vətən gülzarinə,
Xuni-ərbabi-vətən güldür, həmi səttar gül.

* * *

Dutma əziz canuvı, canun sənün degül,
Sahibqiranlığı bu cəhanun, sənün degül.

Beş gün qonaqsən, başə ver ömri nikü bəd,
Çəkmə qəmini yaxşı-yəmanun, sənün degül.

Heç şey verilməyüb, onı bil, ixtiyaruva,
Hərdəm nəfəs çəkəndə, bir anun sənün degül.

Muri-zəifə baxma əgərçi zəifdür,
Etməz dəvam onda təvanun sənün degül.

Dünya güc ilə keçsə də gər ixtiyaruva,
Qalmaz əlündə muyi-filanun sənün degül.

Ey xunbəha dil tələb eyləyən, kəc xəyaldür,
Qoy, sahibi tələb edə qanun, sənün degül.

Ey əndəlib, çəkmə qəmin bərgi-lalənün,
Tərk etgilən bu ahü fəğanun, sənün degül.

Əttar ətrini çəkəcək, yanə-yanə qal,
Künci-qəfəsdə qoy çıxa canun, sənün degül.

Dil vermə sərvqədlərə, çox bivəfadular,
Cəlladidür ki, pirü cəvanun sənün degül.

Meyxanə künci dut, meyi-nab ilə məst ol,
Ta həşr ayılma, xeyrü ziyanun sənün degül.

Meyxanələrdə iç meyi ərbabi-hal ilən,
Fitvasıdur ki, piri-muğanun, sənün degül.

Təb`i-rəvanuva eyləmə fəxr, Saqiba,
Ruhülqüds deyüb, bu bəyanun sənün degül.

* * *

Min nəqdi-canə busə ləbündən bəha degül,
Sən eylə şuxsən, sana kim can fəda degül.

Oldum əsir türreyi-zülfün kəməndinə,
Azad eyləməz, necə damü bəla degül.

Qəmzön oxıyla eyləmə sədparə könlümi,
İncidmə, səndən özgəyə ol mübtəla degül.

Vəslün xəyalilə fəraqunda tab edər
Tə`ni-rəqibə, sən kimi dil bivəfa degül.

Məcnunə vermə müjdeyi-Şirini, kuhkən,
Məcnun onilə səhv eləmə, aşina degül.

Dünya dağılsa tərk eləməz eşqi-Leylini,
Sən kimi dağları yıxan aşiqnüma degül.

Daşə çəkəndə surəti-Şirini xəlq içün,
Fəryad qıldı tişə sana, bu rəva degül.

Əğyardür yonarsan özünçün bu surəti,
Bu keşməkeşdən incidi Şirin, riza degül.

Yox, aşina vücudini axtarma, Saqiba,
Kimdür deyən vücudi onun kimiya degül.

* * *

Aşiqə canan tərkin eyləmək asan degül,
Necə canan tərkin aşiq eyləsün kim, can degül.

Bilmisən sən, ey müalic, dərdimün dərmanını,
Dərdi-eşqə çarə yoxdur, əl gətür, dərman degül.

Dərdi-eşqün çarəsi ancaq ləbi-canandür,
Böylə dərman qiymətindən vaqif ol, Loğman degül.

Yar kuyindən qədəm çək, yetmək olmaz vəslinə,
Kuy mənə cənnət özi, nə huriyi-qılman degül.

Rütbeyi-Məcnuni bilsön, dəm vırarsan eşqdən?
Bilməz ol kim, vadiyi-heyrətdə sərgərdan degül.

Canıni pərvanə şəm`ə yandurdı, yox onda tab,
İstəsə rahətlik aşiq, talibi-canan degül.

Eşq rəsmini gedüb tə`lim qıl Məcnundən,
Hər bəlayi-eşqə vardur tabi, rugərdan degül.

Vırma dəm, ey bağban, tər sünbülündən dəmbədəm,
Türreyi-can kimi, əl çək, əbirəfşan degül.

Ahü nalə etmə çox künci-qəfəsdə, əndəlib,
Dərd səndə zəxmi-tirü navəki-müjgan degül.

Qaşlarun tiğinə qanım tökməgə hökm eyləmə,
Tiri-qəmzön anə töksün, necə fərman degül.

Badeyi-gülfamı təklif etmə, saqi, zahidə,
Əldə var təsbihi, içməz badəni, heyvan degül.

Kim desə meyxanənün ovbaşı Saqibdür, inan,
Başun içün, incimə məndən, bu söz böhtan degül.

* * *

*Füzuliyə nəzirə*

Hiç qönçə qönçeyi-lə`lün kimi rəngin degül,
Acılıq var qönçədə, kimdür soran, şirin degül.

Qeytəni sındırarsan, şanəni ahəstə ur,
Nafeyi-ahuyi-Çin zülfün kimi mişkin degül.

Bağbanlar verməsün su göz yaşilə sünbülə,
Kakilün tək sünbülün giysuləri çin-çin degül.
Bağibani-arizi-alun bilər gül qədrini,
Baği-cənnət bağibani mən kimi gülçin degül.

Zahidi-bixud qaşun tağinə etməz səcdəni,
Guşeyi-mehrabə eylər səcdə, əhli-din degül.

Eyləyür naseh mana kuyində vəsfi-cənnəti,
Mülki-cənnət əhliyəm, naseh özi həqbin degül.

Dinü dil tərk eylədim eşqində ol məhparənün,
Saqiba, tə`n eyləmə, səndən ki, bu gizlin degül.

* * *

Kim ki, qədrin bilməsə, heç qabili-insan degül,
Qabil insan odur kim, qədrinə rugərdan degül.

Qeyr ilə hərdəm nədür, cana, həmağuş olmağun,
Bimürüvvət, bu mənimlə etdigün peyman degül.

Ey qılan rüsva məni, eşqində Məcnun eyləyən,
Mən kimi Məcnun belə heyranü sərgərdan degül.

Ey fəqihi-mədrəsə, Məcnunə söylə Leylidən,
Payibəndi-bağі-cənnət, huriyi-qılman degül.

Məscidə təklif qılma dürdi-mey üftadəsin,
Saqiyi-sağərdən əl çəkmək ona asan degül.

Bənd-bəndimdən çıxar neytək fəğanım hicrdə,
Neyləyüm agəh bu halımdan mənim canan degül.

Tiği-əbruyi-nigarə çox dedim, al canımı,
Almadı, çeşmi-xumarından dedi, fərman degül.

Məzhəri-həqqün zühurin göstərür hüsnün, vəli,
Kim desə sən məzhəri-həqsən, bəli, böhtan degül.

Müşkil işdür Saqibi təsbihə kim, ram eyləmək,
Daneyi-əngurdən keçməz mələk şeytan degül.

* * *

Ayinəyə, bəsdür, bu qədr durma müqabil,
Rəşk öldürər axir məni, ey mahşəmail.

Əksi-rüxüvi oğrasa avazeyi-hüsnün,
İldən-ilə düşməz dəxi qoyma ola hayil.

Təsxir eləsün hüsnüvi tezdür xəti-mişkin,
Bir busə ilə kam, könül, qoy, ola hasil.

Övcə nə qədr çıxsa günəş, batmağı vardur,
Hüsnündə belə, mahvəşim, etmə təğafil.

Çox fəxr eləmə hüsnüvə, ey qaşı kəmanım,
Heç kimsənə olmub, onı bil, məqsədə nail.

Meyxanə yolın dutmagilən, zahidi-kəcbin,
Məscid yolı dut, olmamısan sən hələ qail.

Gər saliki-həq məst ola, içsə meyi-nabi,
Eyb eyləmə əmri-Həqə, ey naşiyi-cahil.

Yoldan o gəlibdür, ona yol göstərəcəksən,
Vır əqlüvə, Qur`an ki, sana olmadı nazil.

Qəflət yuxısın tərk elə, gör, bir nə xəbər var,
Səddanə ilən eyləmisən əqlüvi zail.

Əmrün ilədür əmri edirsən, nə deyürsən,
Həqqün rəvişinə həzər et, qılma mədaxil.

* * *

Ta əbəd mədhuş olur gər sorsa lə`lün Cəbrəil,
Xızrdur xalun kim, ol meyxanəyə düşmiş dəxil.

Dərdkeşlər söhbətindən mən` edər zahid məni,
Ey dil, ol bihudə göftarından olmazmı xəcil.

Badə dut, mey nəş`əsindəndür, dila, təfrihi-ruh,
Saqiya, ver cami-mey, qoy, zahid içsün Səlsəbil.

Görməsə zahid nola dildar əksin camdə,
Çeşmeyi-xurşidara xəffaşə kim olsun dəlil?

Mənzəri-çeşmim dutub çox olma hayil, ey sirişk,
Ey gözüm, ol sərvi-novrəs məqdəminə qıl səbil.

Mərdsən, dil dut, dənilər süfrəsinə dikmə göz,
Abiru bir loğmaya tökmək nədəndür, ey bəxil?!

Tiği-hürriyyətdədü sərçeşmeyi-abi-həyat,
Müstəbidlər tiği-istibdad ilə olsun qətil!

* * *

Qaşlarun tiğilə, ey zalim, məni, gəl, qıl qətil,
Əddəxil, ey sərvnazım, rəhm eylə, əddəxil.

Bir qiyam eylə bu qamətlə qiyamət olmasun,
Verməsün su sərvnazə bağban, olsun xəcil.

Mən təm`karəm, ləbün şirindür şəkkər kimi,
İstərəm bir dəm soram, qoymaz məni aləm bəxil.

Atəşi-hicranı canımdan mənim yox söndürən,
Atəşi-Nəmrudi neyçün gördi bəs gülşən Xəlil.

Hüsnüvün gülzari solmış, çox mana naz eyləmə,
Sən dedün məğlub olmaz mur əlində məst dil.

Ləblərün yadilə içdim badeyi-ənguri mən,
Zahid etsün mən` məndən, qoy, şərabi-Səlsəbil.

Yol uzaq, yetmək degül mümkin, əyağlar ləngdür,
Əl qısa, dərmək çətin, şirin xurma bir nəxil.

Hər yetən etməkdədür həqqiyyətün izharını,
Xəlqi narahət edüb, yoxdur əlində bir dəlil.

Kim deyər bu rəngdə şirin-şəkərlər tək qəzəl,
Vəsfi-hüsnündür sənün, Saqib deyüb ya Cəbrəil.

* * *

Ey pərivəş, olmaz oldı səndə bu hüsni-cəmil,
Sən nə zibasən, anun vəsfində aciz Cəbrəil.

Hüsn bazarinə girmə, hüsn səndə xətmdür,
Necə xətm oldı Mühəmmədə(s) nübüvvət hər qəbil.

Atəşi-rüxsarüvün vəsfindədür bu ayə kim,
Müshəfi-Qur`andə oddan alur zövqin Xəlil.

Tiri-qəmzön eyləmiş bu sinəmi min yerdə çak,
Bu sözin isbatinə bu tiği-əbruyün dəlil.

Mən əzəldən məst çeşmün valehü heyraniyəm,
Öpməgə xaki-dərün qoymaz, olub aləm bəxil.

Kakilün bir tari kim yüz min cünun zənciridür,
Daneyi-xalun fərib, bülbəşər, ey məh, xəcil.

Ey məni təkfir edən, əl çək, mey içmə, eybdür,
Xızrlar dutmış dəri-meyxanəyə heyran dəxil.

Daməni-səccadə çəkmə guşeyi-meyxanəyə,
Pak qılmaz abi-Kövsərlə şərabi-Səlsəbil.

Şahkən düşdüm əyağə buriya tək, Saqiba,
Neyləyüm bu bağrıdaş dövran məni etmiş zəlil.

* * *

Dili-divanə edər hər nəfəs əndişeyi-xam,
Verəcək kam ləbindən mana ol siməndam.

Çəkmərəm əl, o pəriçöhrə uyub əğyarə,
Olmaz hər ləhzə ki, səyyad görən ahu ram.

Yetdi əğyar sənün vəslüvə, ey şirinləb,
Qoygilən, bari, əyağun öpə bu pir qulam.

Dövri-rüxsaruvi təsxir eləmiş xalü xətün,
Deyəsən Rumi əhatə eləmiş ləşkəri-Şam.

Rütbəsin Kə`bə bu qayətdə taparmıydı məgər,
Kə`beyi-kuyüvə mən bağlamaseydim ehram.

Ləbüvə qarşu durub bamidə bu badeyi-nab,
İmdi mə`lum olub badə neçün oldı həram.

Düşdi meyxanə o gün məst ləbün meyl etdi,
Meyi-gülfamə öpər lə`li-ləbün cam müdam.

Kişvəri-küfrü din, ey şux, gedər yəğmayə,
Bir də sən naz ilə gər eyləyəsən qəmzə təmam.

Saldı sövdayi-cününə məni bu şanə ilən,
Etdün əfşan yüzə zülfi-siyəhənbər xam.

Şah bir zərrəyicə düşkini-nəfs olsa əgər,
Dağılar kişvəri, qalmaz dəxi asari-nizam.

Eşqüvün tərkini Saqib edə bilməz hərgiz,
Gündə min dəf`ə qiyamət ona gər etsə qiyam.

* * *

Həvəsi-sağərü meydür mana hər ləhzə müdam,
Degüləm meykədə küncində ayıq sübh nə şam.

Naşilər içdi meyi, eylədi bədməstligi,
İçməsün bir də dəxi, naşiyə mey oldı həram.

Saqi, təklif eləmə badəni zərfi tünükə,
İçsə bir qətrə meyi, bir nəfəs olmaz aram.

Vaizün qövlinə bel bağlama, ver badeyi-nab,
Məstlik eyləmərəm, eyləsə gər həşr qiyam.

Baş-əyağın tanımaz, fərqini bilməz hərgiz,
Özini xəlqidə bica yerə eylər bədnam.

Hər yetən qədri-şərabi ki, çətindür bilməz,
Qədri-ətrə özini eyləmiş əttar qulam.

Ey pəriçöhrə, sənün qiymətüvi mən bilürəm,
Verməräm qeyrə könül, verməyəsən də mana kam.

Dutdı aram könül türreyi-mişkinündə,
Çeşmi-məstün ona hökm etdi, olubdur ona ram.

Eyləməzdi hərəmi-Kə`bəni hüccac təvaf,
Kə`beyi-kuyüvə mən bağlameseydim ehram.

Dolanum başuva, zülfündə əsir eylə məni,
Qətlimə tiri-müjön dutmaya ta bir də nizam.

Dolanur kuyüvə can nəqdi əlində Saqib,
Tapa yol vəslüvə, əmma qılub əndişeyi-xam.

* * *

Şər`i-şərif edübdü əgər badəni həram,
Xəlvətdə xüm əyağun öpər pəs neçün imam?

Dinü dil eylədüm mən əgər sərf badəyə,
Əhkami-şər`i vaiz edüb xar, vəssəlam.

Nə cənnət arzusın edərdüm, nə Kövsərün,
Mey dürdi bəsdü, doldura saqi, gətürə cam.

Səddanə ilə ram eləmək olmaz hər kəsi,
Mə`lumdür bu, vaizi-kəcbin qurubdu dam.

Ey dil, bu sərvnazdən umma ümmidi-vəsl,
Əğyar didə kim ola hərgiz olurmı xam.

Baqeyrətün yolında nə varundu sərf qıl,
Fəxr eylə aləmə, səni gər istəsə qulam.

Saqib, cəhanda yaxşıya canun fəda elə,
Hərgiz inanma kim desə bədnamı niknam.

* * *

Qan ağlayur neçün dili-viranə sübhü şam,
Əlbəttə ağlayar, nə qədr almub intiqam.

Afaqə od düşüb, onı bir söndürən gərək,
Məşğuldür xəlayiq hələ eyşə, vəssəlam.

Zülmün nəhayəti ola bilməz, yəqindür,
Övladi-naxələf əlilə itdi intizam.

Bərbad etdi aləmi kim, nəfs düşkini,
Yoxdur bu dərdə çarə dəxi, müxtəsər kəlam.

At ölsə, itlərə verəcək müjdə tülkilər,
Hər kimsə olsa nuş eləyər, yağlıdur təam.

Neyçün ki, gərək dutmaya aşub aləmi,
Bir nəfs varmıdur, eyləsün pirə ehtiram.

Xunxarlər, əlbəttə, keçübdür məqami-əmn,
Göz qorxudan yumarmı məgər şah, ya qulam.

Gəl, ey əcəl, əman günidür, vermə bir nəfəs,
Saqib nə qədr dərdü qəmə eyləsün dəvam.

* * *

Eşqün yolunda var-yoxı verdüm, soyulmuşam,
Hicründə tab qalmadı məndə, yorulmuşam.

Kimdür hərif halımi bilsün nədür mənim,
Bu təngnayi-aləmi-qəmdə boğulmuşam.

Kuyündə dutdı yer yetən, ey sərvqamətim,
Uydun rəqibə, neyləmişəm mən qovulmuşam.

Çeşmün fədası, heç demə halun nədür sənün,
Əğyar tə`nəsin eşidəndə pozulmuşam.

Saqi, əyağ dutma mana, məndə tab yox,
Möhnət əyağilə rəməqim yox, uçulmuşam.

Ram olmaram bu türreyi-mişkinfamüvə,
Zənciri-eşqə bəndü əsirəm, qoşulmuşam.

Saqib, gər eyləsön məni azad bir zəman,
Bu mahparənün zülfi əlilən dutulmuşam.

* * *

Hər zəman qamətün, ey şux, sənün etsə qiyam,
Gözləməz xəlq qiyamət dəxi nə sübh, nə şam.

Bu gözəllik ki, sənün vardur, ey şirinləb,
Ola bilməz sana Yusif bu gözəllikdə qulam.

Meyi-əngurün həram olmağı isbat degül,
Badeyi-qəflət olubdur bizə məşhud həram.

Nim qəmzə elədün, tərki-dilü din etdim,
Aləmi fitnə dutar qəmzəni, gəl, etmə təmam.

Çox təəccüb edürəm mən mey içən məst olur,
İçməmiş mey nə içün məstsən hər ləhzə müdam.

Ey könül, əl gətür ol sərvqədün eşqindən,
Könül əğyarə verübdür, sana heç olmaz ram.

Ey mənim bağrımi əğyarə uyub qan eləyən,
Acı bir busə verincə bu necə həqqi-səlam.

Yox deyən vaizə aləm ki, yatub məsciddə,
Nə nəsihət eləyürsən, dəxi tul etmə kəlam.

Vəsfi-cənnət bu qədr eyləmə çox, xəlq bilür,
Nə deyürsən onı hər kimsə qanur, yoxdur xam.

Qanımi tökməgə ustad qılınc çəkmişdür,
Qaşlarun tərhini aləm desə gər mahi-siyam.

Düşdi əldən-ələ, ey dil, o pəriçöhrə dəxi,
Getməgə kuyinə bica yerə etmə iqdam.

* * *

Qoydı Məcnun nə içün daireyi-eşqə qədəm,
Kuhi-Qafun qədini eşq yüki eylədi xəm.

Sən də, ey dil, məni eşqün odına yandırdun,
Uydun ol mahvəşə, oldı mana qəm həmdəm.

Dinü dil tərk elə, təsbihə, mey iç, əl urma,
İmdi ki, eşq binasın elədün müstəhkəm.

Tapmasun kuyüvə yol, vermə könül əğyarə,
Ey qoyan bağrıma qan, xali fəribi-Adəm.

Basıram bağrıma mən navəki-müjganun oxın,
Səndə bu xalü xətü türreyi-giysuyə qəsəm.

Zülfi-pürçini-pərişan yüzə tökdün, bəsdür,
Dutdı aləmləri başdan-əyağə möhnətü qəm.

Sana dil verməmək olseydi, könül verməz idim,
Xosrovi-hüsnün urub kişvəri-hüsn içrə ələm.

Ləblərün yadı ilə aldım ələ sağəri-mey,
Künci-meyxanədə sərməsti-şərabəm hərdəm.

Saqiba, dil necə verdün bu pərirüxsarə?
Eləyür səngdil hər ləhzə sana cövrü sitəm.

* * *

Səndən ötri bütün aləmləri bərbad edərəm,
Göz yaşilə o qədr naləvü fəryad edərəm.

Seyd qılsam əgər ahuni gözüm yaşiylə,
Bir doyunca öpərəm ləblərin, azad edərəm.

Qəddüvə oxşadığıyçün sənün, ey şirinləb,
Öpərəm sərv əyağın, xidməti-şümşad edərəm.

Eyləsün daneyi-təsbih ilə söhbət zahid,
Daneyi-xalun ilə sübhəcə övrad edərəm.

Əşk xunabəsinin sorson hübabın məndən,
Özümə beytül-həzən guşəsi bünyad edərəm.

Soracaqsan dedilər halımi hicründə nədür,
Bu xəyal ilə həmişə özümi şad edərəm.

Demə, naseh, mana, gəl məscidə, vəqtim yoxdur,
Xəlqi meyxanəyə mey dürdinə irşad edərəm.

Baxaram mən necə ol piri-muğanun yüzinə,
Gündə min dəf`ə bu mey tövbəsini yad edərəm.

Növbətün keçdi sənün imdi mənimdür, Saqib,
Əqli heyrətdə qoyan şe`rlər icad edərəm.

* * *

Gög yüzində, demə mən, qürsi-qəmərdür görürəm,
Dolanur başimizə fitneyi-şərdür görürəm.

Gör bu həngaməni, nadan eləməz meyl, şükr,
Əhli-halun yedigi xuni-cigərdür görürəm.

Oldı möhtac zərə, xanənişin oldı Əli,
Abirusi kişinün sim ilə zərdür görürəm.

Biləcək çox da varundur hanı, yox simü zərün,
Çəkmə bu zəhməti-bicani, hədərdür görürəm.

Həqqi isbat Peyəmbər elədi zər gücinə,
Zər ilə məqsədinə yetdi Peyəmbər, görürəm.

Dirhəmün olsa olur dust sana düşmən can,
Olmasa düşmən olur yaxşı bəradər görürəm.

Rüstəmün Rəxşi qalub köhnə palanə həsrət,
Tövqi-zərrinə təfaxür eləyür xər, görürəm.

Müzdi-süd verməyəsən, süd yerinə zəhr verər,
Qanuvı su tək içər, sevgili madər görürəm.

Ata baxmaz yüzüvə zərreyicə olson əgər,
Kül tökər başuva, Qur`an həqi, xahər görürəm.

Az qalubdur fələgün fitnəsünün sönsün odı,
Müxtəsər, rahəti-can, aləmi-digər görürəm.

Saqiba, çoxdan ayıqsan, yemə qəm, badeyi-nab
İçəcəksən, səni sərməsti-qələndər görürəm.

* * *

Rəhi-eşqün dutub Məcnunsifət, ey şux, məhşurəm,
Məlamət etməsün heç kim libasi-əqldən urəm.

Xəyali-vəslün ilə könlümi şad eylədüm hərdəm,
Nə cənnət arizusin eylərəm, nə talibi-hurəm.

Əsir etdim dili-divanəmi zənciri-zülfündə,
Neçün sultani-eşqün hökminə mən böylə mə`murəm.

"Ənəlhəqq" kəlməsin hər bir nəfəsdə eylərəm izhar,
Vırubdur başimə sevdayi-eşqün, əsrə Mənsurəm.

Şərabi-Kövsəri təklif qıldun bəsdür, ey zahid,
Qulami-meykədə, həm bağbani-taki-əngurəm.

Müğənni, tari çək ağuşuvə, al dinü dil məndən,
Bu xoş avaz ilə hər sübhdəm heyrani-Mahurəm.

Kəmançə nəğməsindən, ey məni mən` eyləyən naseh,
Qoy, alsun ixtiyarım, söhbəti-naəhldən durəm.

Necə kuyün təvafın etməyüm, ey sərvi-azadım,
Əsiri-türreyi-zülfün, xərabi-çeşmi-məxmurəm.

Fəqihün qövlini inkar eyləsəm, eyb etmə, ey Saqib,
Müsəlmanəm qoyubdur ad özinə, mən də mə`zurəm.

* * *

Nəxli-dərdü möhnətəm, kim der səmərdən düşmüşəm,
Bərqi-aləmsuzdür ahim, şərərdən düşmüşəm.

Keçmərəm həqqün sözindən getsə başım tiğ ilən,
Xəlq elə fikr edür ki, yeksər hünərdən düşmüşəm.

Yoxdur əl açsun məni, çürmüş qılafə bağluyam,
Bir qılıncam çox iti, sanmun kəsərdən düşmüşəm.

Ey Məsiha, fəxr qılma oğluyam mən Məryəmün,
Mən gərək fəxr eyləyüm sülbi-pədərdən düşmüşəm.

Ehtiraz et bərqi-ahimdən, rəqibə vermə dil,
Bir odam, Musayə görsənmiş şəcərdən düşmüşəm.

Şah idim, kim bilməyür hökmüm rəvandı aləmə,
Mən sənün eşqündə təxtü taci-zərdən düşmüşəm.

Lə`li-nabun fikri ilə guşeyi-meyxanədə,
Məstü sərxoş xüm əyağinə səhərdən düşmüşəm.

Kuzəgər zalım ki, cam etmiş məni, qoy eyləsün,
Al xəbər sərrafdən dürrü gühərdən düşmüşəm.

Qədrdan yox, Saqiba, xəlq e`tina etməz mana,
Mərdümazarun söziylə mən nəzərdən düşmüşəm.

* * *

Məndən əl çəkməyəcəksən, genə məhbusi-qməm,
Gör, əsir eyləmisən sən kimi, Cəmşidi-Cəməm.

Gərçi xali-siyəhün qarəti-küfrü din edüb,
Çəkmərəm əl, vəli dilbəsteyi-bu zülfi-xəməm.

Kam alur lə`li-ləbündən sənün əğyar müdam,
Ruzidən ruzi-əzəldən məni-bədbəxt kəməm.

Məni rüsvayi-cəhan eylədi eşqün, getdi,
Rəhi-eşqün dutanı, gör, necə mən xoşqədəməm.

Can nədür olmaya qurban, gözün qurbani,
Səri-kuyin itinə hökm eylə, əhli-kərəməm.

Tab yox görməgə rüxsaruvi, göstərmə mana,
Gözlərün fikri məni heyrətə salmış ədəməm.

Qanım, aləm ola bərbad dəgişməz hərgiz,
Saqiba, türkdür əslim, nəinki əcəməm.

* * *

Zahid, şərabxanədə rindi-səbukeşəm,
Məsti-xərabi-badeyi-gülfami-biğəşəm.

Təklifi-tövbə eyləmə, tərki-mey etmərəm,
Yandırmaz od məni, mən özüm əhli-atəşəm.

Tə`rif eyləmə mana çox huri-cənnəti,
Dilbəsteyi-əsiri-bu zülfi-müşəvvəşəm.

Bimar nərgisi mana göstərmə, bağban,
Zahidfərib valehi-çeşmi-bu məhvəşəm.

Eşqün yolunda şeş cəhətim ahü nalədür,
Azad eyləyən məni yox, bəndi-bu şeşəm.

Mən öylə dinü dil sana, ey şux, vermişəm,
Qaşun qılınci töksə əgər qanımi, xoşəm.

Məğlub ilə Müxalifi etdim Həsarə bənd,
Əl çək, müğənni, talibi-Mənsuri-Dilkeşəm.

Saqib, yüzüm gülər məgər aləmdə bir nəfəs,
Nəqqaşi-möhnətün qələmilə münəqqəşəm.

* * *

Xətü xalun xəyalımda dolanur zülfi-pərçəm həm,
Hücum eylər mana bu tiri-müjganun dəmadəm həm.

Qaşun ki, əgrilik kəsbini aldı tağі-mehrabun,
Bu sövdayə düşüb, ey sərvqəd, mahi-mühərrəm həm.

Məni rüsvayi-aləm eyləyən xali-siyahundur,
Özini mən kimi rüsvayi-aləm etdi Adəm həm.

Verür su bağban qəddün görübdür sərvi-şümşadə,
Tökər seylab tək, ey gözlərün qurbanı, didəm həm.

Əcəb səyyadsən bir tiri-qəmzön seyd edüb könlüm,
Kəmandar olmayubdur sən kimi tarixdə Rüstəm həm.

Qəmi-hicrün mana eylər kifayət, ey kəmanəbru,
Rəqibün tə`nəsi bu zəxmədür guya ki, məhrəm həm.

Məni bu dəhri-dun, qoy, qəmdən azad etməsün bir dəm,
Gəlür bir qan olur aludeyi-qəm, şadü xürrəm həm.

Kəməndə çəkməyübdür bir məni bu zülfi-pürçinün,
Giriftari olub Mənsur tək İsa ibni Məryəm(ə) həm.

Məlamət eyləmə mey düşkinin meyxanə küncində,
Şərabun düşkinidür, Saqiba, Cəmşid ilə Cəm həm.

* * *

Durdı müjganlarun tiri kəmanəbru ilən bahəm,
Alurlar qətlimə fərman səni-bədxu ilən bahəm.

Giriftar eyləmə bu könlümi zülfün kəməndində,
İlanı salgilən damə qəra giysu ilən bahəm.

Giribani-rəşkdən çak eylərəm bir dəf`ə gər görsəm
Cəmalun əksini, ey səngdil, güzgu ilən bahəm.

Gözün qurbanı olmaq istəyür dil qan olan yerdə,
Dutar kim ülfəti, divanədür, cadu ilən bahəm.

Salubdur heyrətə əttarı kim, rüxsaruvun ətri,
Məgər seyr eyləyübdür gülşəni şəbbu ilən bahəm.

Qübari-məqdəmün göz yaşımi eldən-elə paylar,
Uşaqlar oynayar yağmur olanda su ilən bahəm.

Su qatma, qanə dönsün, badeyi-gülfamə, ey saqi,
Baş ağrar içsə hər kim, badə olmaz su ilən bahəm.

Əlündə cami-mey var, Saqiba, təsbihə əl vırma,
Olub mehrabdə zahid kimi bayqu ilən bahəm.

* * *

Məlahət var yüzündə türreyi-tərrar ilə bahəm,
Təəccübdür, dutub ülfət mələk şəhmar ilə bahəm.

Kəsad etdün cəmali-Yusifi bazari-hüsn içrə,
Olanda daneyi-xalun bu məhrüxsar ilə bahəm.

Məlamət etmək olmaz əndəlibə nalə gər etsə,
Qəfəs küncində necə qönçə olsun xar ilə bahəm.

Əzabi-məhşəri hərdəm mana vəsf etmə, ey zahid,
Budur məhşər əzabi, yar olub əğyar ilə bahəm.

Var özgə aləmi, get, iç meyi meyxanə küncində,
Müvafiq əhli-hal ilə, sədayi-tar ilə bahəm.

Necə meydür verürsən, saqiya, bu cami-sağərdə,
Təəccüb etməyürsən mey su olmaz nar ilə bahəm.

Şikayət etmə, Saqib, eybdür, meyxanə pirindən,
Sana mey verməyür, görmüş səni dindar ilə bahəm.

* * *

Qoymadı zahid əlimdə dolı bir cam dutum,

Məst olum guşeyi-meyxanədə aram dutum.

Qoyma qan bağrıma, əğyarə könül verməgilən,
Kə`beyi-kuyüvə qoymaz məni ehram dutum.

Qoy,sorum lə`li-ləbündən sənün, ey şirinləb,
Mən də səndən nolur əğyar kimi kam dutum.

Bu pəriçöhrəni ram eyləmək olmaz, ey dil,
Gündə min dil görüb, əl çək ki, degül xam dutum.

Bu qədr ahü fəğan eyləmə hicran gecəsi,
Neyləyüm mən bu gözəl olsa əgər ram, dutum.

Tökdün, ey göz, bu qədr qanlı sirişki, bəsdür,
Sakit ol bir, səri-kuyi-bu dilaram dutum.

Saqiba, küfr dutubdur necə gör İslami,
Mən necə bir də dəxi şiveyi-İslam dutum.

* * *

Əğyar yetüb vəslüvə hicranla, inandum,
Hicranuva bu naleyi-əfğanla, inandum.

Mehrabə vırar tə`nə ol əbruyi-hilalun,
Hökm eylədi bu navəki-müjganla, inandum.

Viranəligin bilməz idim könlümün, ey məh,
Tökdün yüzə giysuyi-pərişanla inandum.

Heç bilməz idim eşq belə afəti-candur,
Sərgəşteyi-Məcnuni-biyabanla, inandum.

Bir danəyə bildim ki, behişti satub Adəm,
Bu xali-siyəhfamü zənəxdanla, inandum.

Yəğmayə gedər, sərvqədim, kişvəri-hüsnün,
Yoxdur, adı var Yusifi-Kən`anla, inandum.

Rahət yaşayan sərhədi-məqsudə yetişməz,
Ta verməsə cananinə can, canla inandum.

Pərvanə özün şəm`ə vırar istədigiyçün,
Canan tələbinə belə fərmanla inandum.

Lə`li-ləbüvün fikri ilə badəpərəstəm,
Meyxanə yolında dolı peymanla, inandum.

Get, Kə`bə evində mey iç, eyləmə azar,
Saqib ki, ola mən ona vicdanla inandum.

* * *

Səba dəgdigdə zülfün yüzdə əfşan oldığın gördüm,
Sərasər xatiri-xəlqi pərişan oldığın gördüm.

Töküb rüxsarə bu növ` ilə zülfün, gizlədüb qaşın,
Hilali-yekşəbə əbr içrə pünhan oldığın gördüm.

Qəmi-hicran ilə kim, zə`f qılmış bu təni-zarım,
Hilalasa rəqibə yarü mehman oldığın gördüm.

Cəmalun tərhini aqildü hər kim mahə oxşatmış,
Olub heyrani hüsnün mahi-Kən`an oldığın gördüm.

Səri-kuyün sənün vermiş əgər Adəm alub cənnət,
Bu sövdadən anı axir peşiman oldığın gördüm.

Keçən gördüm keçən gün zahidi meyxanə səmtindən,
Bihəmdillah gedüb kafər müsəlman oldığın gördüm.

Müxalif dəhri-dun salmış əyağə buriyalər tək,
Mən çox nanəcibi dəhrə sultan oldığın gördüm.

Əzizim, sorsa kim səndən, hanı ol Saqibi-miskin,
Əlində nəqdi-can, de, yarə qurban oldığın gördüm.

* * *

Əgər mümkin oleydi aləmi bərbad eylərdüm,
Bir özgə aləm içün tazədən bünyad eylərdüm.

Cəhani bilməseydim bivəfa peymanşikənlərdən,
Dili-qəmginimi aləmdə bir gün şad eylərdüm.

Neçün bu bir-iki günçün gəlim cəm` eyləyüm xatir,
Keçən ömrimdən ötri dadü fəryad eylərdüm.

Təfavüt etməz hərgiz aqil ol, yainki divanə
Xəlayiqçün və gər nə xidməti-ustad eylərdüm.

Əgər mən bilseydim bu cəvanlıq bir iş verməz,
Anunçün mən özümi rəhmsiz cəllad eylərdüm.

Necə mən bilmərəm, zahid, nəmazə heç nə verməzlər,
Əgər bir şey verilsə, xəlqi mən irşad eylərdüm.

Gedər əldən bilürdüm varü yox bilmərrə, tərk etdim,
Əgər mümkin oleydi, müflisəm, bir zad eylərdüm.

Atadən ötri qəlbi bir nəfəs yanseydi övladun,
Ölüncə, həşrəcən fikrü qəmi-övlad eylərdüm.

Atam bir buğdayə satdı behişti, huriyü qılmani,
Mən olseydim satardum arpayə, bir ad eylərdüm.

Məni möhtac qıldı çərxi-dun meyxanə küncində,
Dənilər caminə mən bu güni heç yad eylərdüm.

Bu nəsli-Adəmi it surətində xəlq eylərdüm,
İti şəkli-mələkdə, munisi-əkbad eylərdüm.

Vəfa bir zərrə səndə olmasun, ey Adəm övladı,
Ürək daş, qan içən, heç mən səni icad eylərdüm?!

* * *

Bir sərvqəd eşqində təmənnalərə düşdüm,
Çəkdi bu təmənna məni səhralərə düşdüm.

Diqqət gözilə bax mana, salma məni gözdən,
Beş gün olur, xaki-rəhi-palərə düşdüm.

Ey sevgili canan, eşidim vəsfi-cəmalun,
Gəh məscidə, gəh deyrü kəlisalərə düşdüm.

Ahim odı hicründə olub şəm`i-şəbəfruz,
Yandırdı məni, vadiyi-Sinalərə düşdüm.

Gəh bərgi-şəcərdə od olub cilvələr etdim,
Gəh döndüm əsayə, yədi-Musalərə düşdüm.

Gəh istəyürəm lə`lün öpüm, gəh rüxi-alun,
Düşməz ələ, bica belə sövdalərə düşdüm.

Mən eylə bilürdüm alaram kam ləbündən,
Əğyar alub, boş belə xülyalərə düşdüm.

Xalun həvəsi verdi mana rütbeyi-Adəm,
Cəm` oldı bəla başimə, qovğalərə düşdüm.

Hali degüləm, urma əyağ dürri-yətimdən,
Biqədr sədəf tək ləbi-dəryalərə düşdüm.

* * *

Ərindi eşqün odundan hədid olan könlüm,
Əsər görəndə səni, bərgi-bid olan könlüm.

Əsirdür genə bu dami-küfr zülfündə,
Ki, tiğ qaşlarun ilə şəhid olan könlüm.

Məlamət eyləmə, kuyüvün təvafını etsəm,
Çəküb fəğan ilə dərdi şədid olan könlüm.

Müqəyyəd etdi, üzin dutdı kafəri-eşqün
Fəqihə, hər nəfəs hər an mürid olan könlüm.

Vır imdi qəmzə oxın, gözdə qoy məkan dutsun,
İtüb bu zülfün içində pədid olan könlüm.

Məni mürid şərabə ləbün xəyali edüb,
Kim ilə həmdəm ola bu vəhid olan könlüm.

Əyağə düşdi əcəb köhnə buriyalər tək,
Sənün müfariqətündə cədid olan könlüm.

Görür ki, sən necə əğyarə olmusan mail,
Genə sana inanur naümid olan könlüm.

Bu Saqibi genə salmaqlıq istəyür qanə,
Deyər ki, öp ləbi-yari, pəlid olan könlüm.

* * *

Ləbün fikriylə könlüm, səngdil, qan oldı, mən neylüm,
Şəhidi-navəki-bu tiri-müjgan oldı, mən neylüm.

Vıranda şanə zülfüvə, vırgilən ahəstə-ahəstə,
Pərişandur könül bir də pərişan oldı, mən neylüm.

Təqazayi-məhəbbət eylədi Məcnuni avarə,
Biyabanlardə kim rüsvayi-dövran oldı, mən neylüm.

Könül əğyarə verdün, kam alur bu lə`li-nabundan,
Fəraqundan dili-divanə viran oldı, mən neylüm.

Əsiri-daneyi-xalun sənün rüsvayi-aləmdür,
Cəhanə fitnə salmış, xəlq heyran oldı, mən neylüm.

Şəbi-hicranuva tab eyləmək, ey şux, müşkildür,
Görüb əhvalimi Məcnun giryan oldı, mən neylüm.

Züleyxa rütbəsin kəm eylədi Yusif xəyalilən,
Cırub pirahənin, çaki-giriban oldı, mən neylüm.

Səri-kuyin behiştə verdi Adəm, ey kəmanəbru,
Bu sövdadən olub rüsva peşiman oldı, mən neylüm.

Yüzün göstərmədün bu Saqibə, ey sərvi-azadım,
Rəqibün bəzminə şəm`i-şəbistan oldı, mən neylüm.

* * *

Könül, bu mahvəş əğyar ilə yar oldı, mən neylüm,
Mana hicrində həmdəm tə`ni-əğyar oldı, mən neylüm.

Qəfəs küncində, bəsdür ahü nalə eylədün, bülbül,
Əsüb badi-xəzan tər qönçələr xar oldı, mən neylüm.

Satıldı bir kəlafə qul yerinə Yusif, ey Yə`qub,
Züleyxa firqətində didəxunbar oldı, mən neylüm.

Çıxeydi gözlərim, etdim neçün xalun təmənnasın,
Kəməndi-zülfüvə könlüm giriftar oldı, mən neylüm.

Müsəvvir qaş çəkirdi, oldı bu lə`li-ləbün məsti,
Dəmadəm tökməgə qan tiği-xunxar oldı, mən neylüm.

Ləbündən kam alurdum qoymadı bu navəki-qəmzön,
Başımdan bu açulmaz mərdümi-azar oldı, mən neylüm.

Səni, ey müddəi, rəşk öldürür bu bağrıqan Saqib,
Qəzəl zövqin bilür, ustadi-əş`ar oldı, mən neylüm.

* * *

Şəbi-hicründə sənün naləvü əfğan etdim,
Naləmə ney kimi aləmləri giryan etdim.

Varü yox tərk elədüm mən rəhi-eşqündə sənün,
Sən ilə ruzi-əzəldən belə peyman etdim.

Yandırur bu məni, uydun nə içün əğyarə,
Səndən özgə kimi dil mülkinə sultan etdim?

Etmədi tab qəmü firqətə miskin Məcnun,
Düşdi səhralərə, tabi-qəmi-hicran etdim.

Dərdimə olmadı dərman kimə yüz döndərdim,
Çoxlarun dərdinə mən canilə dərman etdim.

Dedim, ey şux, düşüb dil nə içün təşvişə,
Dedi, rüxsarimə giysuləri əfşan etdim.

Etmədün dərdimə çarə bu ləbi-lə`lünlə,
Düşmüşəm eşqüvə, yox çarə, məgər qan etdim.

Mana bir eyb budur badəyə verdim dilü din,
Bir qələt eyləmişəm mən, demirəm qan etdim.

Bəndeyi-piri-muğanım belə fitva verdi,
Mey ilə daməni-səccadəni əlvan etdim.

* * *

Düşdi dildən-dilə lə`li-ləbün yad etdim,
Qamətün xatiriçün xidməti-şümşad etdim.

Seydi-ahuyi-Xəta eylədim, ey şirinləb,
Gözlərün düşdi mənim yadimə, azad etdim.

Əndəlibi elədim lal qəfəs küncində,
Firqətündə o qədər naləvü fəryad etdim.

Nuh tufanı cəhan mülkini gər etdi xərab,
Gözlərim yaşı ilə mən genə abad etdim.

Kuhkən dəhrdə ad qoydı öziçün, Fərhad,
Sənün heyranun olub mən də belə ad etdim.

Dedim əhvalımi səndən nə cəfalər çəkdim,
Ah ilən ahimə aləmləri naşad etdim.

Saqiba, etmə təəccüb qəzəlim şirindür,
Xuni-dil sərf elədim, xidməti-ustad etdim.

* * *

Qaşun tərhini görcək tiği-atəşbarə bənzətdim,
Kəmanmış, səhv qıldım, tiğə, ey məhparə, bənzətdim.

Xütən ahusi tək yatmış qaşun tağında naz ilə,
Gözün səyyad cövrindən qaçub xunxarə bənzətdim.

Vırubdur tar zülfün həlqə bu rüxsari-alunda,
Cünun zəncirini, ey qönçələb, şəhmarə bənzətdim.

Kəməndi-kakilindür gərdəni-minadə bənd olmış,
Degüldür cəm` fikrim, rişteyi-zünnarə bənzətdim.

Qiyamət bir də olmaz, göstərür qəddün qiyamətlər,
Qiyamət göstərürmi, sərvi-xoşrəftarə bənzətdim.

Çəküb səf, qətlimə fərman alub müjganlarun tiri,
Hücumə hazır olmış ləşkəri-küffarə bənzətdim.

Olub zülfün əsiri mürği-dil xalun xəyalilən,
Biyabanlarda Məcnun tək qalub avarə bənzətdim.

Təbiba, əl gətür, bu dərdi-eşqə çarə qılmazlar,
Sənün dərmanuvi lə`li-ləbi-dildarə bənzətdim.

* * *

Vəfasız bilmədim, ey məh, səni heç dad etməzdim,
Şəbi-hicründə ney tək naləvü fəryad etməzdim.

Əgər bilseydi lə`lün oxşayur gül bərginə, könlüm,
Məgər mən anı göz yaşım ilə bərbad etməzdim?

Kəmanəbru, bileydim xalun zülfin əsir eylər,
Onun vəsfin dəmadəm hər zəman övrad etməzdim.

Bileydim qətlimə fərman verür əbrulərün tiği,
Dilim yansun, anı mehrabə mən ustad etməzdim.

Bileydim gözlərün bu gözlərivə oxşadur ahu,
Dutub azad qılson, minnəti-səyyad etməzdim.

Məgər bildim ki, şanə diş salar bu zülfi-mişkinə,
Yıxardum ah odilə, xidməti-şümşad etməzdim.

Bəlayə başımi Adəm salub, ey sərvi-azadım,
Mən Allah olseydim, Adəmi iycad etməzdim.

Bileydim, Saqiba, meyxanələrdə e`tibarım yox,
Şərabun dürdinə, hərgiz meyə mö`tad etməzdim.

* * *

Eşq dərdindən gər olseydun xəbərdar, ey həkim,
Dutmaz idün nəbzimi, bari, ol huşyar, ey həkim.

Mən desəm də sən inanma, məndə yoxdur dərdi-eşq,
Bildirür çün eşq dərdin rəngi-rüxsar, ey həkim.

Eşq dərdinün əlacı zəxmi-tiri-qəmzədür,
İstəyür kim böylə dərmani bu bimar, ey həkim.

İncimə ney naləsindən bənd-bəndindən çıxır,
Ayrıla kim yardən, əlbəttə ağlar, ey həkim.

Eşq bilməz zərrəcə peyğəmbərün nə oldığın,
Bir kəlafə Yusifə olmuş xəridar, ey həkim.

Odda Qur`an yandırub Sən`an, məlamət eyləmə,
Bu günahə etmiş ani eşq vadar, ey həkim.

Sölə Leyli vəsfini Məcnunə, Şirindən demə,
Söləsön, yüz döndərür səndən, deyər var, ey həkim.

Eşq rəsmin istəyürsən fəhm qıl pərvanədən,
Çəkməz əl şəm`ün odından canı ta var, ey həkim.

Eşq ilən başdan-əyağə olmışam təxmir mən,
İmtəhan et, istəyürsən bağrımi yar, ey həkim.

Paybənd olsam cünun zəncirinə, eyb etmə kim,
Vəsfi-tari-zülfi-yari eyləyür tar, ey həkim.

Olmaseydi Saqib aləmdə əgər rüsvayi-eşq,
Söləməzdi hər nəfəsdə şirin əş`ar, ey həkim.

* * *

Dərdi-eşqə olmuşam, əl çək, giriftar, ey həkim,
Nəbzimə əl vırma, yoxdur çarəsi, var, ey həkim.

Çarə qılson dərd olur, tədbiri-bica eyləmə,
Bilməyürsən dərdimi vardur nə miqdar, ey həkim.

Vadiyi-heyrətdə heyran olma, əhvalım görüb,
Eşq eylər aşiqin, əlbəttə bimar, ey həkim.

Saxla pünhan, eylə kim bildün nədür dərdim mənim,
Tab qılmaz, xəlqə izhar etmə, zinhar, ey həkim.

Zəxmi-tiri-qəmzeyi-dilduzi-yarə çarə yox,
Qoy məni öz halimə, çox vermə azar, ey həkim.

Çarəsi vardur demün, fikr ilə dönmüş qanə dil,
Çarə olmaz sormasam lə`li-şəkkərbar, ey həkim.

Sorma əhvalım mənim, əğyar tə`nindən saqın,
Bildirür əhvalımi bu rəngi-rüxsar, ey həkim.

Hansı dərdün sən əlacın eyləyərsən, bir degül,
Naleyi-hicran qəmin, ya tə`ni-əğyar, ey həkim.

Qaməti yarun qiyamətdür, görüb qamət demə,
Qıl həzər, vardur qiyamət, eylə iqrar, ey həkim.

Mən necə ah eyləmüm, əğyarə dil verməkdədür,
Kim deyübdür bu gözəllərdə vəfa var, ey həkim.

Kafəristan oldı, get, Saqibdən etmə ehtiraz,
Kişvəri-İslam içində bağla zünnar, ey həkim.

* * *

Görüb zənciri-zülfün bu dili-divanə abadım,
Ucaldı naleyi-naqus tək əflakə fəryadım.

Şəbi-hicranara seylabi-əşkim damənim dutmış,
Bu qədr xunfəşanlıq etmə, ey göz, yıxdı bünyadım.

Fəğanım bəndi-bəndindən çıxar hicran güni ney tək,
Məlamət etmək olmaz aşiqi, ey sərvi-azadım.

Dila, sərmənzili-məqsudə yetmək xeyli müşkildür,
Bu həm bir dərd bilməz halımi heç ol pərizadım.

Nə istər bu dili-divanədən zənciri-giysulər,
Tiri-peykanlarun zəxmi kim, ey birəhm səyyadım.

Məni sərgərm görsön badədən mən` etmə, ey zahid,
Tapub mey nəş`əsindən tərbiyət abavü əcdadım.

Zəmanə bağrımi qan etmiyincə çəkməz əl məndən,
Xoşam bu halilə dəhri-müxalif eyləmiş yadım.

Əcəbdür cami-mey, Saqib, əlimdə sərnigun olmış,
Ölünca çəkməz əl məndən, bənd olmış xudadadım.

* * *

Ey rahəti-can, ruhi-rəvan, sevgili yarım,
Sənsiz gedüb əldən, dəxi yox səbrü qərarım.

Əğyar ilə sən şamü səhər seyrü səfadə,
Fəryadü fəğan ilə keçir leylü nəharım.

Hicranun odı şö`lələnür şəm`tək hərdəm,
Yox söndürəni, bu oda yandı dili-zarım.

Bəsdür bu qədr qan elədün bağrımi, zalim,
Düşməz dəxi ol kuyüvə ölsəm də, güzarım.

Eşqün məni avarə salub dəşti-cününə,
Heç bir xəbərim olmadı, tərk eylədi varım.

Dünyanı mana təng eləyüb tə`neyi-əğyar,
Vır qəmzə oxın, canımı al, laləüzarım.

Pabənd elə bu Saqibi zülfün girehində,
Başımdan onı rədd elə, ey şux nigarım.

* * *

Degülsən guşeyi-meyxanədə cam ilə yoldaşım,
Gətür əl məndən, ey zahid, degülsən heç sirdaşım.

Çağırma məscidə mey məstini meyxanə küncindən,
Dutub sağər əlində, gəlmək olmaz bu kəman qaşım.

Gərək mey dürdinə mən eyləyəydim dinü dil tərkin,
Çəküb təsvirimi ruzi-əzəldən böylə nəqqaşım.

Əsir etdün dili-divanəmi zülfün kəməndində,
Degül mümkin olam azad, ey lə`li-gühərpaşım.

Könül əğyarə versön də genə əl çəkmərəm səndən,
Məlamət tiği ilə şəm` kimi getsə gər başım.

Həzər ahimdən eylə, sormısan halım fəraqunda,
Dutar damanuvi, qorxum budur, gözdən axan yaşım.

Eşit bu pəndimi, fəhm eylə, bir dəm pir Saqibdən,
Qəzəl ustadinə, get, xidmət eylə can ilə Haşim.

* * *

Tökəndə əşki-xunin, eyb qılma çeşmi-giryanım,
Şəbi-hicrün əlindən qan tökər boynumdadur qanım.

Yetər fəryadimə, ey Leylirüx, əğyar tə`nindən,
Eşitsə vadiyi-heyrətdə Məcnun ahü əfğanım.

Gətür əl, ey müalic, dərdi-eşqə çarə heç yoxdur,
Ləbi-dildardür dərman, tapulmaz səndə dərmanım.

Məlamət etməsün heç kim məni ahü fəğan etsəm,
Verüb əğyarə dil, asan degül, birəhm cananım.

Pərişan zülfün atmış arizə, dil piçü tab eylər,
Necə cəm` eyləyüm bir yerdə mən hali-pərişanım.

Yaneydun oda, ey dil, Saqibi odlarə yandurdun,
Dedim, əl çək bu zalimdən, çəkər ah ilə dövranım.

* * *

Bölindi min yerə dil, çarə yoxdur, tiri-müjgandan,
Əlacın, ey müalic, eyləmə bihudə dərmandan.

Əlac etmək olur bu dərdimə, əmma degül mümkin,
Necə öpmək olur lə`li-ləbi-gülbərgi-canandan.

Apardı məhmili-Leylani naqə kuyi-əğyarə,
Biyabanlar yoruldı, əl gətür, Məcnun, biyabandan.

Gedibdür dinü dil yəğmayə bu xalun xəyalilə,
Nə istər bimürüvvət tiri-qəmzön kafəristandan.

Xəbərdar olmadım, oldum necə eşqün giriftari,
Bəla eşqün yolunda başimə cəm` oldı hər yandan.

Həlal etdim sana bu qanımi, əğyarə dil vermə,
Qaşun tiğilə tökdün ləxtə-ləxtə, kim keçir candan.

Əsüb badi-xəzan, bülbül, solub, gülzarə meyl etmə,
Alursan buyi-gül künci-qəfəsdə ahü əfğandan.

Deyür zahid mana mey tövbəsin et künci-məsciddə,
Əcəb divanədür, təqva umur rüsvayi-dövrandan.

Gərək tə`lim ala əş`arı Vahid[*] pir Saqibdən,
Qəzəl sərriştəsin kəsb etməsün tifli-dəbistandan.

---

[*] Ustad şair Əlağa Vahidə (1895-1965) işarədir

* * *

Əl gətür sahibi-nazü zərü sim olmaqdan,
Çəkinürsən görürəm əhli-səlim olmaqdan.

Nəfsə malik ola bilməz o ki, cəm`i-zər edər,
Aləmə feyz yetər təb`i-kərim olmaqdan.

Eylədün Şimrə müsəllət onı kim, sanisi yox,
Xəlqə nə faidə var böylə rəhim olmaqdan.

Eylədün tərki-şəbanlıq nə içün, ey Musa(ə),
Noldı məqsəd sana aləmdə kəlim olmaqdan.

Qərqi-dərya elədün növ`üvi yüz minlər ilə,
Yox sana nəf`i biri əhli-cəhim olmaqdan.

Adəm övladı gərək vəhşiligi kəsb etsün,
Həzz alur cümlə cəhan əhli bəhim olmaqdan.

Biri Fir`oni deyür rəbb, biri sən deyəni,
Özi bilsün, sana nə, keçmə fəhim olmaqdan.

* * *

Yetər bir gün, düşər qəddün sənün sərvi-rəvanlıqdan,
Mənim tək pir olarsan, zərrəcə qalmaz cəvanlıqdan.

Hanı ol sərv kimi qamətün, gün kimi rüxsarun,
Əyağun dutmayur imdi bir bax natəvanlıqdan.

Düzülmüş qaşlarun tağı əlif tək, bax bu güzguyə,
Nə hasil eylədi qaşun qılıncı cansitanlıqdan.

Ağarmış türreyi-pürpiçü tabun, bir xəcalət çək,
Dəxi dəm vırmayur, min şanə vır ənbərfəşanlıqdan.

Səni bədnam edər, göstərmə üz heç xahişi-nəfsə,
Cəhan mülkində kamə yetməyüb heç kim yəmanlıqdan.

Haçan ağü qəranun fərqini sən bildün, ey zahid,
Vırarsan dəm təəccüb eylədim mən nüktədanlıqdan.

Uzaq ol, Saqiba, əhli-həsəddən ehtiraz eylə,
Həmişə dəm vırar, bədbəxtdür, daim ziyanlıqdan.

* * *

Günəş dutuşdı oda hüsnüvün çırağından,
Şərarəsi görünür lalənün yuvağından.

Təəccüb etməgilən, xaki-kuyüvi öpsəm,
Əsiri-Leyli neçün öpdi it əyağından.

Qədün qiyamə gələndə, gərək qiyamət ola,
Su vermişəm bu səhi sərvə göz bulağından.

Əyağ urdı məni, xüm əyağinə düşdüm,
Əlim üzüldi genə dürdi-mey əyağından.

O qədr qəmzə oxın atdı könlümə şəbxun,
Ölüncə ağrısı getməz dəxi dimağından.

Boyandı qanə həsəddən səbudə badeyi-nab,
O gün ki, sağər öpüb bu məhün dodağından.

Dedim rəqibə könül vermə, dutdı yüz məndən,
Bu səngdil mana göstərdi qaş-qabağından.

Çətin degül, dağıddı Bisütun dağın Fərhad,
Hünər var onda, dağıtsun fəraq dağından.

İlan vıran kimi, Saqib, necə fəğan etmüm,
Əsib xəzan yeli, gül soldı ömr bağından.

* * *

Kəsmə qəmzön oxıni bu dili-naşadımdan,
Bimürüvvət, həzər et, naləvü fəryadımdan.

Qoyma əğyarı dedim kuyüvə, ey şirinləb,
Verdün əğyarə könül, çıxmayacaq yadımdan.

Lövhi-sinəmdə əlif qəddüvün aldım dərsin,
Səhv edübdür, degüləm razi mən ustadımdan.

Göstərür gündə qiyamət, bu necə qamətdür,
Saçılur həşr odınun şö`ləsi bünyadımdan.

Qoydı heyrətdə kəman xanə qaşun mehrabi,
Çəkəcəkdür deyəsən əl mənim irşadımdan.

Mübtəla oldı kimün eşqinə divanəsifət,
Səngdil, yox xəbərün bu dili-bərbadımdan.

Bağban verməz idi sərvinə göz yaşilə su,
Xəbəri olsa idi qaməti-şümşadımdan.

Rəbb mərbubə əbəs fəxr eləyür hər saət,
Məgər hasil nə olubdur mənim icadımdan?

Oxuma tövbeyi-mey Saqibə, əl çək, zahid,
Sağəri mən necə almum bu pərizadımdan.

* * *

Xəbərdar olmadun, ey səngdil, ahü fəğanımdan,
Şəbi-hicran nə istər dəxi, əl çək, bu canımdan.

Dutuşdı atəşi-rüxsaruvə tər lalə gülşəndə,
Məni yandırdı, zalim, qıl həzər, çox keçmə yanımdan.

Günahım yoxdur qanım tökər əbrulərün tiği,
Deyürsən boynuma gəlməz, keçübdür kim bu qanımdan.

Dedim, ey qönçələb, nə müşkdür bu ahu nafında,
Dedi, kəsb eyləmiş bu türreyi-ənbərfəşanımdan.

Dedim, bu guşeyi-mehrab neyçün böylə xəm olmış,
Dedi, Qafun da qədi xəm olub əbru kəmanımdan.

Məsiha can verür, ey məh, dedim biruhə hər saət,
Dedi bir dəf`ə səndən gizlin öpmüş bu dəhanımdan.

Əlimdən alma, zahid, sağəri-mey, vırma, sındırma,
Ayırma sən məni, bax tariyə, ruhi-rəvanımdan.

Gedürsən "lailahə" kəlməsilə məscidə, dur, get,
Eşitmə küfri-zülfi-yari bu virdi-zəbanımdan.

Məlamət eyləmə, Saqib, məni rüsvayi-eşq oldum,
Yox əldə ixtiyarım, keçmişəm sudü ziyanımdan.

* * *

Ey xali-siyahariz, bu əbrukəmandan,
Əl çəkgilə bir, ey üzi qarə, bu məkandan.

Rüsva elədün Adəmi, dildən-dilə düşdi,
Şərm eyləmədün ol pədəri-pirü cəvandan.

Bir gün həbəşi qullar tək damə düşərsən,
Zülfi-xəmi-canan ilə keçməzdi gümandan.

Fitva sana kim verdi bu rəhzənligi etdün,
Nə sehr ilə üzdün əlini huri-cinandan.

Azad kim eylər səni bu damun əlindən,
Müjgan oxı durmış başın üstündə haçandan.

Hicrün qəmi bu bağrımi qan eylədi, getdi,
Bir yanda açum göz necə aşubi-cəhandan.

Ümmidi-vüsal ilə rəhi-eşqüvi dutdum,
Əğyar yetüb vəslüvə, oldum dilü candan.

Eşqün nə imiş tə`siri cüz naleyi-cansuz,
Heç kimsəyə mə`lum degül nəf`i ziyandan.

Bilseydim əgər eşq belə afəti-candur,
Salmazdım özimi əbəs heç tabü təvandan.

İstərsən əgər düşməyəsən dami-bəlayə,
Heç kimsəyə izhar eləmə sirri-nihandan.

Saqib nə təəccüb sana gər gəlsə mürəbbi,
Şəhzadə olan yerdə gələ nəsli-şəbandan.

Qəhbə fələkün gərdişi öz bildigin eylər,
Qüssə özüvə vermə, umursan nə piyandan.

* * *

Dutuşdı lalə oda, yandı hüsni-alundan,

Hilalə düşdi qəmər laləvəş hilalundan.

Əgərçi rəsm budur, gündən ay alur işığın,
Alur günəş işığ əmma, bu məh cəmalundan.

İlan kimi dolaşub boynuma mənim zülfün,
Nə bir qələtdü mən etdim öpəndə xalundan.

Nə yaxşı sən bu məhə verməd ün könül, zahid,
Qoyardı bağruva qan, keçmə bu kəmalundan.

Bu qədr ahü fəğan, bəsdür eylədün, ey dil,
Şəbi-fəraq dutan yox xəbər bu halundan.

Demə yetər mənim ol daməni-vüsalə əlim,
Yetən degül öləsən, keçməsün xəyalundan.

Qəmi-fəraqə mənim tək dəvam et, Saqib,
Xəlayiq incidi, bəsdür, bu qeylü qalundan.

* * *

Qıl ehtiyat mənim çeşmi-xunfəşanımdan,
Dutar bu damənüvi, keçmə bir də yanımdan.

Qaşun qılıncıyla qanımi tök, eyb etməz,
Tökəndə qəmzə oxun keçmərəm bu qanımdan.

Şəbi-fəraqüvə tab eyləmək degül asan,
Ki, xəlq təngə gəlüb naləvü fəğanımdan.

Hücum edər mana hər ləhzə tiri-müjganun,
Çəkərsən əl sən haçan bu yaralu canımdan.

Müsəvvir əgri çəküb gərçi qaşlarun tərhin,
Tapub bu əgriligi qaməti-kəmanımdan.

Öpəndə ləblərüvi camü badeyi-gülfam,
Həsəd odında yanar, od çıxar nihanımdan.

Vəfa uman degüləm, Saqiba, gözəllərdən,
Keçərmi heç məgər zərrəcə gümanımdan.

* * *

Nə əcəbdür lə`lvəş bağrım mənim gər olsa qan,
Ələman hicran əlindən, ahü fəryad, ələman.

Necə tə`n eylər mana əğyar hərdəm, ey könül,
Zərrəcə gər aşiqinə yar olsa mehriban.

Ey deyən Leyla içün həmraz idi Məcnun ilən,
Bəs neçün Məcnun başında tikdi quşlar aşiyan.

Çox qəfəs küncində, bülbül, ahü fəryad eyləmə,
Bağə girməz eyləyüb çaki-giriban bağban.

Yanə-yanə od içində çəkdilər ətrin gülün,
Lalədən, güldən, güli-şəbbudən hərgiz yox nişan.

Gör, necə aludeyi-qəm oldı hər bir yasəmən,
Bağban gülşəndən əl çəkdi, xəzandur ərğəvan.

Bisütun dağinə tişə vırma çox, ey kuhkən,
Verdi dil əğyarə Şirin ahi-həsrət çəkmə yan.

Ey soran məndən, neçün qəddün bükülmüşdür sənün,
Bari-möhnət Qaf qəddin döndərüb etmiş kəman.

Vadiyi-heyrətdə Saqib ruzü şəb avarədür,
Yardən kim ayrı düşsə, eyləməzmi tərki-can?

* * *

Fikri-ləbün bağrımi qan etdi qan,
Qəddimi qaşun xəmi qılmış kəman.

Cənnətə getməz rüxi-alun görən,
Öpsə əyağun əgər huri-cinan.

Daneyi-xalun həvəsin etsə kim,
Navəki-qəmzön ona verməz əman.

Türreyi-pürpiçüvə dil mübtəla,
Şanə görəndə olar ənbərfəşan.

Tiri-müjön qəsdi-dilü can edər,
Nərgisi-məstündə bəla bir cəhan.

Sərvi-qədün etsə qiyamət əgər,
Səcdə edər qəddüvə sərvi-rəvan.

Ey könül arami, könül taqəti,
Aşiqə olma belə namehriban.

Xətm olundu bu gözəllik sana,
Ayü günə tə`nə edər hər zəman.

Bir məni etmüb sənün eşqün əsir,
Mail olubdur sana pirü cəvan.

Eylə nəzər bir gözümün yaşinə,
Vermə dil əğyarə əmandur, əman.

Saqibi rüsvayi-cəhan eylədün,
Kam verürsən ona sən bəs haçan?

* * *

Doymaq olarmı, zahida, badeyi-lə`lfamdən,
İçdikicə xoşım gəlür cam ilə bu həramdən.

Tərk elə məscidün yolın, rahi-şərabxanə dut,
Səbhəni ver girov meyə, düşmisən ehtiramdən.

Eylə pozubdur halımi ayrılığun, pərivəşim,
Fərqini bilmərəm nədür, zərrəcə sübhü şamdən.

Kim sana mail olmasun, səndə qəribə hüsn var,
Ay deyəsən tülu edüb pəncəreyi-xiyamdən.

Bu qəddü qamət ilə sən məhvi-qiyamət eylədün,
Sərvi də bir də qıl xəcil naz ilə bu xuramdən.

Navəki-tirü qəmzövə tən necə tab eyləsün,
Vay halıma çıxsa əgər tiğ qaşun niyamdən.

Ver bu zəkati-hüsnüvi mən ki, gədayi-kuyüvəm,
Çəkmişəm, ey pərivəşim, əl zərü simü xamdən.

Oldum haçan əsir mən zülfüvə hiç bilmədim,
Ey dil, üzün qəra ola, kim qutarar bu damdən.

Fitnə dutub zəmanəni, söləmə bir də, Saqiba,
Var yeri yansa gər cəhan, xəlq çıxub nizamdən.

* * *

Dolanum başuva, sal boynuma bir tar zülfündən,
Ləbün sirrün bilüm bu leylətül-əsrar zülfündən.

Ləbün dövrində daim böylə neyçün həlqələnmişdür,
Yetər hər ləhzə ol canpərvərə azar zülfündən.

Düçar et bu dili-sədparəmi qəmzön xədəngində,
Bıraxma öz başinə istəsə, zinhar, zülfündən.

Nə hacət zinətə, məşşatəyə, ey şux, dil açma,
Tapub asayişi bu arizi-gülnar zülfündən.

Xəyali-zülfün ilə daməni-təsbihə bənd oldum,
Bilüb bu rütbəni təsbih ilə zünnar zülfündən.

Könül fəryad eylər ney kimi, ey sərvi-azadım,
Təəccüb eyləmə, görcək qaçar şəhmar zülfündən.

Fəribi-daneyi-xalun idim, çıxmaz xəyalimdən,
Qaşun tiğinə qurban et, məni qurtar zülfündən.

Könüllər naləsindən vəhm qılmaz, ehtiraz etməz,
Degül mümkin qutarsun kafər dindar zülfündən.

Şəbi-hicran qəmin Saqib sana izhar eylərdi,
Əgər olseydi onda, bari, bir miqdar zülfündən.

* * *

Dili-divanəmi, gör, qorxmayur zəncir zülfündən,
Nə görmüş bilmirəm bu əf`i şəbgir zülfündən.

Yetişməz axirə, kutah olmaz qisseyi-zülfün,
Yaz belə həşrədək hər rəngdə təfsir zülfündən.

Xəta ahusinün nafında olmaz müşkün asarı,
Olar qan ləxtə-ləxtə tapmasa təğyir zülfündən.

Giriftar olmasun kafər sənün bu dami-zülfündə,
Xilas olmaz, əsiri olsa gər min şir zülfündən.

Gözəllər, ey pərivəş, vəsfi-rüxsarunda heyrandur,
Necə azad olar pabənd olan təsxir, zülfündən.

Təriqi-küfri dutdum, türreyi-zünnarə dil verdim,
Edər zahid məlamət, eylədim tə`bir zülfündən.

Necə sehr etmisən olmuş əsirün, ey kəmanəbru,
Dili-divanələr, ögrənməsin tədbir zülfündən.

Kəm olmaz damənindən zahidün təsbih, var vəchi,
Eşitdi arizündə kəlmeyi-təkfir zülfündən.

Verür can qaşlarun tiğinə pirü natəvan Saqib,
Öpər rüxsaruvi hərdəm görüb təqsir zülfündən.

* * *

Dil açılmaz, ey müğənni, nəğmeyi-Mahurdən,
Şurə gəl, könlüm açılsun, qıl təğənni Şurdən.

Ehtiyat et, nəş`eyi-mey var, başımdan uçmasun,
Rastxanlıq et, ayırma Dilkeşi Mənsurdən.

Dəhri-dunun e`tibarın görmüşəm, bel bağlama,
Çox kəlimi eyləmiş avarə kuhi-Turdən.

Ey deyən var tacü təxtim, həft kişvər şahiyəm,
Yox əlamət zərrəcə İskəndərü Fəğfurdən.

Aləmi beş gündən ötri tökmə qan dəryasinə,
Bu sözi dərk eyləyərsən naleyi-tənburdən.

Salma muri, ehtiraz eylə, bu şirlər mülkinə,
Şir qorxar, bixəbərsən, ittifaqi-murdən.

Nəfsüvə ram eylə xəlqi, xəlqlən ülfət xoş et,
Eyləmə hərgiz məniyyət, vırma dəm çox zurdən.

Sanc xəlqi, eybi yoxdur, bir də vermə zəhri-qəm,
Xəlqi sancar, bal yedirdər, ibrət et zənburdən.

Aləmi-İslamə, Saqib, əl gətür, bel bağlama,
Zərrəyicə, nuri-çeşmim, umma çeşmi-kurdən.

* * *

Bu sərvqədün əgər dəm ura qiyamətdən,
Qiyamətni qiyamət görər bu qamətdən.

Gözəl deyüblə sənün tək gözəl degül Yusif,
Yox idi heç xəbəri Yusifün qiyamətdən.

Müqabil hüsnüvə, ey şux, ayü gün durmaz,
Təvaf kuyivi eylər, qaçar cəmaətdən.

Dağıtma səfheyi-rüxsarə zülfi-pürçini,
Günəş dutulsa, xəlayiq qaçar vilayətdən.

Dağıtdı xar əyağinə çəməndə badi-səba,
Üzari-alun ilə lalə dəm vıra lətafətdən.

Eşitmişəm tökəcək qanımı qaşun tiği,
Könül açıldı fəraqundə bu bəşarətdən.

Cəhani fitnə dutub bixəbərsən, ey zahid,
Qiyamət oldı, ayıl, guşeyi-ibadətdən.

Hicab ayəsinin* vəqti keçdi, bəhs etmə,
Gözəllər açdı yüzin pərdeyi-cəhalətdən.

Şərabi-biğəşi tövbə edübsən, ey Saqib,
Eşitmişəm, gətür əl bir də bu zərafətdən.

* * *

Yaraşur laf vırsa sərvqəddün gər qiyamətdən,
Nə fitnə istəsön zahir olar, ey məh, bu qamətdən.

Sən eylə bir gözəlsən, hüsnüvün heyranı aləmdür,
Necə hüsnün yanında dəm vırar Yusif məlahətdən?

* Qurani-kərimin "Nur" surəsinin 31-ci ayəsi nəzərdə tutulur.

Gələndə hər zəman göftarə bu lə`li-gühərpaşun,
Məsiha əl çəkər, ey şux, e`cazü kəramətdən.

Əcəb sehr eyləmiş cadu gözün bu daneyi-xalun,
Olub qarətgəri-din, fitnələr çıxmaz vilayətdən.

Sana bu tərləmək sanma, nigarım, istilikdəndür,
Həmişə tərləyər gülzar içində gül lətafətdən.

Qaşun mehrabını qəsb eyləmiş bu çeşmi-bədməstün,
Təəccübdür ki, kafər dəm vırar rükni-imamətdən.

Düzübsən qətlimə səf-səf genə bu müjganlarun tirin,
Könüllər nalə eylər ney kimi, qorxar siyasətdən.

Xəlayiq, xaliq inkar edərsən künci-məsciddə,
Oxursan xəlqə, zahid, hər nəfəs əmri-risalətdən.

Cəhan mülkində, Saqib, inqilab hər ləhzə olmuşdur,
Qoy olsun, baş qarışsun, çəkmə damən sən cəhalətdən.

* * *

Hüsnün işıqlıdur, gözəlim, aftabdən,
Var həqqi, gör, nə xəlq olunubdur türabdən.

Qəmzön oxilə dil neçə min yerdən oxlanub,
Əl çəkməyür genə məni-xanəxərabdən.

Oldum əsir dami-girəhgiri-zülfüvə,
Azad eləsün məni kim bu tənabdən.

Salmış cəhanə fitneyi-aşub gözlərün,
Bais odur ki, xali degül inqilabdən.

Zahid, məlamət etmə edəm səndən ictinab,
Sən ictinab neçün edirsən şərabdən?

Saqi, əyağun alta ölüm, məst qıl məni,
Doldur piyalə badeyi-gülgunniqabdən.

Saqib, cəhanə fəxr elə ustadi-şe`rsən,
Tə`lim aldun Azəri-alicənabdən.

* * *

Cəhanı fitnə dutmuş təxti-sultan istəyənlərdən,
Nə hasil oldı bu dünyanı viran istəyənlərdən.

Məlamət künci dut, Məcnunsifət rədd ol xəlayiqdən,
Məsiha kimi qaç əflakə nadan istəyənlərdən.

Zəmanə inqilabın göstərür bir göz yuman saət,
Pozulmuş nəfsçün nahəq yerə qan istəyənlərdən.

Əziyyət eyləmə həmnöv`üvə, bir nəfsi incidmə,
Mürüvvət ismini dut, olma şeytan istəyənlərdən.

Yəhud ilə müsəlmanun, de, hansı kəlmədür fərqi,
Eşit bu nüktəni, ey naşı, vicdan istəyənlərdən.

Cəhan bir, Rəbb bir, mərbub birdür, sən nə sölərsən,
Nə Qur`an istəyənsən sən, nə bürhan istəyənlərdən.

Aradən ixtilafun kəlməsin bilmərrə məhv eylər,
Eşid həqqün sözüni əsl Qur`an istəyənlərdən.

Cəmali-Leylini sən sevməyəndə çəkməz əl Məcnun,
İnanma çəkməz əl, olson da canan istəyənlərdən.

Vırarsan Leylidən dəm, səndə yox Məcnunlıq asari,
Uzaqdur kuyi-Leyli sən kimi can istəyənlərdən.

Özüvi etmisən əhli-qərəz renginə aludə,
Əgər olson cəhan mülkində insan istəyənlərdən.

Yügürmə məscidə, ol ənkəbutun lanəsin tərk et,
Tapulmaz orda heç bir zərrə iman istəyənlərdən.

Qaçurma canuvı həqqün yolunda yağsa min peykan,
Dəmadəm canuvı ver, canı qurban istəyənlərdən.

Get, insan ol, yapuşma daməni-mövhumə, ey Saqib,
Ədəb kəsbini eylə, elmü irfan istəyənlərdən.

* * *

Gər söləyəsən sən mana düşnam ləbündən,

Aldım deyərəm, mahvəşim, kam ləbündən.

Sorsa nə əcəb ləblərüvi kim, məgəsi-ruh,
Şirinligi almış bu bəşər xam ləbündən.

Qan etməgilən bağrımi, ey qaşı kəmanım,
Bir busə verincə mana ən`am ləbündən.

Sağərdə meyim həsrəti-xunabə qarışdı,
Meyxanədə hər ləhzə öpər cam ləbündən.

Əbrulərüvün tiğinə min can ola, verrəm,
Müjganun oxilə yetə peyğam ləbündən.

Can verdi Məsiha ləbi-əmvatə əgərçi,
Ey şux, yetübdür ona ilham ləbündən.

Aləm mey ilə məst düşər xüm əyağinə,
Saqib həməvəqt məst düşüb tam ləbündən.

* * *

Getdi girova şəhri-Səmərqənd ləbündən,
Alsa nə əcəb şəhdi-Səmərqənd ləbündən.

Əmvatə həyatı verə bilməzdi Məsiha,
Ta olmasa idi ona peyvənd ləbündən.

Tuti nə bilür etsün ədayi-kələmati,
Şəkkər kimi olmış bu şəkərxənd ləbündən.

Bu daneyi-xalun eləmiş Adəmi rüsva,
Etməzdi təmə` versə idün pənd ləbündən.

Kam almağa qoymaz məni ol navəki-qəmzön,
Bir busə nədür istədim hərçənd ləbündən.

Zülfün qəmi vermiş mana zənciri-cünuni,
Ey şux, vıruldı mana bu bənd ləbündən.

Mey məst eləmüb Saqibi meyxanə yolında,
Bu nəş`ə yetübdür ona xursənd ləbündən.

* * *

İçseydim əgər bir dolı peymanə ləbündən,
Qan olmaz idi bu dili-divanə, ləbündən.

Lə`lün həvəsilə mey içdüm, demə qanmış,
Düşdüm genə bica yerə mən qanə ləbündən.

Tökmə mana bir busə içün qaşü qabağun,
Hər ləhzə alur kamını biganə ləbündən.

Nə nəş`ə var, ey şux, sənün lə`li-ləbündə,
Sərməst düşübdür meyü meyxanə ləbündən.

Hicran qəmini yad eləməzdim dəxi bir də,
Alseydim əgər busəni bir danə ləbündən.

Min mö`cizə göstərsə Məsiha, nə əcəbdür,
Yetmiş ona bir zərrədür, əfsanə ləbündən.

Mərdanə gəl iç, Saqib ilə badeyi-nabi,
Məst olson, alar busəni mərdanə ləbündən.

* * *

Əgər mən olsa idim tərki-canan eyləyənlərdən,
Mana zahid deməzdi tərki-iman eyləyənlərdən.

Təbibim, dərdi-eşqə çarə yox, əl çək əlacimdən,
Ləbi-dildarı gördüm dərdə dərman eyləyənlərdən.

Deyürlər qaşuvı oxşar sənün mehrab tağinə,
Qələtdür, görməyürsən tiğdür, qan eyləyənlərdən.

Nə fərman eyləyürsən etgilən bu tiği-əbruyə,
Mənəm ol qədəmdə canı qurban eyləyənlərdən.

Qiyamət göstərür bu qamətün gülzar seyrində,
Deyürlər qoyma gəldi sərvi heyran eyləyənlərdən.

Xəbərdar olmayursan gülistandə açma rüxsarun,
Olar gül rəşkdən çaki-giriban eyləyənlərdən.

Əyağə badə düşdi öpməgə bu lə`li-nabundan,
Nələr gör baş verər aləmdə tüğyan eyləyənlərdən.

Yetən sölər mana, neyçün sənün halun pərişandur?
Əcəb qafildülər giysu pərişan eyləyənlərdən.

Şərabi içməyür, zahid deyür tərk eyləmiş Saqib,
Necə mən nifrət etmüm xəlqə böhtan eyləyənlərdən.

* * *

Ey sevgili can, ülfəti kəs tən qəfəsindən,
Nə faidə vardur nəfəsün pişü pəsindən.

Şirin həmağuşdür, ey kuhkən, əl çək,
Əğyar ilə, bidar eləmə tişə səsindən.

Leyladə vəfa yox elə tərk eşqini, Məcnun,
Get, sor bu sözi naqeyi-Leyla cərəsindən.

Dəhrün nə sevərsən gözəlin, mahliqasın,
Mehr ummagilən zərreyicə hiç kəsindən.

Bari-qəmdür qəddimi döndərdi kəmanə,
Qan ilə dolub kaseyi-dil dadrəsindən.

Saqi, məni hər ləhzə şirin mey ilə öldür,
Yox vahiməmiz fani vücudin nəfəsindən.

Saqib, eləmə heç kimə aləmdə təməllüq,
Başun gedə, lal eylə dilün söz həvəsindən.

* * *

Vəqt oldı olaq məst meyi-cami-əcəldən,
Yox əldə, hanı, zərreyicə xeyrüləməldən.

Var hansı əməl səndə təqərrüb də umursan,
Səs gəlməz, əzizim, bu məsəl var bir əldən.

Arayişü zinət sana məşşatə nə versün,
Eylərlər tələb arizi-dibani gözəldən.

Giysu, gözələ mişki-fəşan olmasa, boşdur,
Nəqqaş çəkübb tərhi belə ruzi-əzəldən.

Göz əgri, ağız əgri, ləbün bərgi-bənəfşə,
Qamət xəm olub gözləmək olsun nə əfəldən.

Yox tiri-müjə fərqdə asari-saçun yox,
Məşşatə qaçar şanə ilən kurü keçəldən.

Bazarə gedən cib dolusi simü zər istər,
Kim müftə verür, çıxsa canun, qillət əsəldən.

Ta key bizə nəql eyləyəcəksən gecə-gündüz,
Minbər ətəgində oturub hərbi-Cəməldən.

Gör, vəqt nə istər, onı nəql et bizə, zahid,
Səccadəni bir dəm yerə qoy ziri-bəğəldən.

Səcdə eləyürsən kimə, yox səcdəgəh əldə,
Verdün hərifə, müftə alar kim bu bədəldən.

Saqib, qəzəlün zövqini bilmək degül asan,
Hər naşi yazar, dəm vırar əş`arü qəzəldən.

* * *

Hərdəm eləyəndə bu könül yad gözündən,
Amadə olur hökm ola cəllad gözündən.

Müjganlarun tirinə vırsun mana şəbxun,
Olsun mana hardan dəxi imdad gözündən.

Giysulərivün daminə təslim olardım,
Olseydim əgər bir nəfəs azad gözündən.

Əbrulərüvün tağinə gər qaçmasa ahu,
Pabəstə olar mən kimi səyyad gözündən.

Aşubi salub aləmə, bu fitnə yatarmı,
Göstərməgilən sürməni, ey dad, gözündən.

Bərbad elədün könlümi bir nim nigəhlə,
Zahir olar hər fitnə bu ustad gözündən.

Saqib bu təmənnayə düşüb, bir gözün öpsün,
Ey qaşı kəman, ver ona bir zad gözündən.

* * *

Gözləmə mehrü vəfa zülfi çəlipalərdən,
Könül əğyarə verüb, keç bu təmənnalərdən.

Eşq sərmayəsi rüsvayi-cəhan olmaqdur,
Alma bu fitnəni Məcnun kimi rüsvalərdən.

Qəmi-hicranə necə tab edəcəksən, ey dil,
Getməyüb naleyi-Məcnun hələ səhralərdən.

Kim Kəlimə deyə bir kuyinə get dildarun,
Hasilün oldı nə ol vadiyi-Sinalərdən.

Asiman seyrini elmün hünəri seyr eylər,
Fəxr çox eyləmə, əl çək, yədi-beyzalərdən.

Zahida, Saqibə və`z eyləmə, tə`sir etməz,
Sözlərün gər ola şirin mürəbbalərdən.

* * *

Dil çəkməz əl, bu türreyi-pürpiçü tabdən,
Bilməm nə istəyür məni-xanəxərabdən.

Dami-cününə, gör, necə divanə ram olub,
Aləm əsirdür bu qəranlıq tənabdən.

Vəslə yetərsən, ey dili-divanə, ol zəman,
Xəffaş nurin oğrasa gər aftabdən.

Min inqilab fitnəsi çeşmündədür sənün,
Xali degül zəmanə odur inqilabdən.

Aldanma mehrinə fələkün, e`tibarı yox,
Sordum bu sirri naleyi-çəngü rübabdən.

Saqib, gələndə saliki-həqq nabələd degül,
Hər əmrdən vüzu edə dürdi-şərabdən.

* * *

Dili-divanə məndən, türreyi-ənbərəfşan səndən,
Əsir dut, qoyma qaçsun, navəki-tirü sinan səndən.

Dolannam başuva göz yaşı ilə bağbanlar tək,
Ki, sirab etməgə bu qaməti-sərvi-rəvan səndən.

Girəndə gülsitanə nərgisi dindirmə, bimar et,
Xəcalət bülbülə ver, çeşmi-məsti-dilsitan səndən.

Məni divanə görsön, əl gətür tə`nü məlamətdən,
Dəgər min tiri-qəmzə, ey büti-namehriban, səndən.

Fəğan etdüm şəbi-hicründə, lütf et, uyma əğyarə,
Gözün qurbanı, zalim, gözlərəm bir dəm əman səndən.

Təvaf etmək səri-kuyində məndən şəm`i-rüxsarun,
Dəmadəm yanə-yanə hüsnüvi etmək nihan səndən.

Qaşun tiğinə qurban nəqdi-can məndən, kəmanəbru,
Tərəhhüm eyləmə, al canımi, et imtəhan səndən.

O qədri qan töküb əbrulərün tiği batub qanə,
Rəhm hiç yoxmı səndə, incüb pirü cəvan səndən.

Qəmü hicrünlə yox tabü təvan biçarə Saqibdə,
Əlacın etməgə lə`li-ləbi-ruhü rəvan səndən.

* * *

Ey dil, elə peyvəstə həzər əhli-qərəzdən,
Zəhr iç, yemə gər versə şəkər, əhli-qərəzdən.

Od vırdı cəhan mülkinə ol nəfsün əsiri,
Hasil bizə oldı bu səmər əhli-qərəzdən.

Tərk et, eləmə düşkini-nəfs ilə əlaqə,
Şər gözləgilən, xeyr itər əhli-qərəzdən.

Peyğəmbəri olsa bu cəhanun, genə əl çək,
Bir fayidə umma ki, yetər əhli-qərəzdən.

Ölsön də sana zərreyicə nəf` yetirməz,
Sən gözlə zərər şamü səhər əhli-qərəzdən.

Rahətlik olar gürg ilə ahu edər ülfət,
Gər olmasa aləmdə əsər əhli-qərəzdən.

Gər dutsa əlün, kəs əlüvi, qoyma ki, dutsun,
Yum göz təmə`inə, nə düşər əhli-qərəzdən.

Dutmış bu cəhan mülkini neyçün belə aşub,
Yetmüb belə sərfitnə məgər əhli-qərəzdən.

Eylər səni aludə özinə, həzər eylə,
Yoxdur bu yaranmışda yetər əhli-qərəzdən.

Saqib, bu sözi virdi-zəban eylə dəmadəm,
Olmaz səməri bitsə şəcər əhli-qərəzdən.

* * *

Rüxsarüvə bu zülfüvi əfşan eləməkdən,
Əl çək, dili-divanəmi viran eləməkdən.

Pas dutmayub əbrulərüvün tiğini, zalim,
Qanə boyanubdur, həzər et, qan eləməkdən.

Sorson mənim halımi pərişan nə içündür,
Bu türreyi-mişkini pərişan eləməkdən.

Gər layiq ola, canımi qurbanun edərdim,
Ver müjdə mana qətlimə fərman eləməkdən.

Bülbül qəfəsün küncini məskən neçün etmiş,
Min nəğmeyi-cansuz ilə əfğan eləməkdən.

Naqə aparub Leylini əğyarun evinə,
Məcnun sevünür seyri-biyaban eləməkdən.

Qarətgəri-dindür sənün ol daneyi-xalun,
Yox vahiməsi aləmi talan eləməkdən.

Meydən elədim tövbə, deyür zahidi-bixud
Xəlqə, heç utanmır belə böhtan eləməkdən.

Hicrində bu məhparənün, ey Saqibi-miskin,
Bir fayidə yox çaki-giriban eləməkdən.

* * *

Çəkmisən əl nə içün bağrımi qan etməkdən,
Qəddimi əgri qaşun kimi kəman etməkdən.

Təngə gəldi şəbi-hicründə sənün, şirinləb,
Xəlqi-aləm dili-divanə fəğan etməkdən.

Ey verən qətlimə fərman qaşun tiğilə,
Etmisən vahimə qəsdi-dili-can etməkdən.

Dutulub gün, deyəsən xəlq düşüb təşvişə,
Arizi-aluvi zülf içrə nihan etməkdən.

İnciməzsən məgər heç navəki-müjgan oxilə,
Hökmi-qətli-bu qədr pirü cəvan etməkdən.

Qorx o gündən duta bu damənüvi qanlu başım,
Mana hər ləhzə, utan, cövrü filan etməkdən.

Saqiba, etmə məlamət məni, qəmxarımdur
Yüz verəndə mana qəm, şe`ri bəyan etməkdən.

* * *

Cəmalun ehtiyacı yoxdur, ey məh, zibü zinətdən,
Verürsən zinəti pərqu ilə, əl çək, əziyyətdən.

Məlamət etmə, ey zahid, məni bu sərvi-azadə
Giriftar olmışam, əl çəkmərəm, keçmiş nəsihətdən.

Əgər bir ixtiyar olseydi məndə, tərkin eylərdim,
Nə çarə eyləyüm mən kim, qaçub əmri-məhəbbətdən.

Nə hacətdür mana cənnətdən ötri çox də yalvarmaq,
Atamız mülkidür, ey naxələf, qalmış şəriətdən.

Gətür baş guşeyi-mehrabdən, ey zahidi-kəcbin,
Məgər heç doymısan* daş ilə bu bibəhrə söhbətdən?

* Doymursan

Nə var aləmdə, bari, diqqət eylə, gör, nə aləmdür,
Bir az keç, tari həqqi, arizuyi-huri-cənnətdən.

Əziyyət eyləmə nahəqq yerə bir nəfsə, müşkildür,
Bu rəngi alma hərgiz, qıl həzər, zalim təbiətdən.

Yanaşma sayəsinə nakəsün canun əgər çıxsa,
Hüseyndən ibrət al, dut daməni-namusü qeyrətdən.

Qaçam gər, qəhbəyəm, həqqün yolunda getsə gər başim,
Vırar namərdlər dəm qorxudan hərdəm həzimətdən.

Könül bir cür`ə al, iç badəni, meyxanə pirindən,
Meyün ya safi olsun, ya ki dürdi, qaçma qismətdən.

Əlündən varü yox bilmərrə getdi, Saqib, huşyar ol,
Ayılmazsan məgər ta həşr olunca eyşü işrətdən.

* * *

Əzəldən olmışam təxmir bu möhnət siriştindən,
Xəbərdar olmadum bir dəm cəhanun xubü ziştindən.

Yetən eylər məlamət, məskənim künci-nədamətdür,
Məluləm, bivəfa həmdəmlərün peymanşikəstindən.

Qədəm öz xahişimlə qoymadum bu deyri-viranə,
Qəzanun qaçmaq olmaz bir qədəm bu sərniviştindən.

Varımdur öz qəmim, öz dərdimə aludəyəm, ey dil,
Xəbər dut kim, deyərlər zahidün hurü behiştindən.

Mey olsa, bəqədri meyl eylərəm, gər saqi yar olsa,
Piyalə olsa idi xoş düşər meyxanə xiştindən.

Zühuri-həqqi bilmək, ey könül, bir əmri-müşkildür,
İnanmaq heç olur zahir ola bütlər kiniştindən.

Gözətsən, Saqiba, həq gəlür olur peyda,
Ayıl, qafil, təməllüq kəsgilə, viranə dəştindən.

* * *

Əğyarə könül vermə, düşərsən nəzərimdən,

Eylə həzər, ey mahvəş, ahi-səhərimdən.

Hicründə sənün hər gecə, ey sevgili yarım,
Sirab olur səhni-çəmən əşki-tərimdən.

Dildə oturub içməgə qan navəki-qəmzön,
Zalim deyəsən doymadı xuni-cigərimdən.

Ney tək necə, ey dil, eləmüm ahü fəğani,
Əğyar alur kamını ol simi-bərimdən.

Məcnun yolunı dutma, soruşma nədür halım,
Ahim səni yandırdı, çəkil rəhgüzərimdən.

Əhvalımi heç sorma, nihali-qəmü dərdəm,
Divanə olur nuş edə hər kim səmərimdən.

Saqib, məni dövran əyağa saldı, nə gördüm
Bir faidə cəm` eylədigim simü zərimdən.

* * *

Mey aldı nəş`əni bu ləbi-lə`lfamdən,
Sən meyl edəndə badəni səs gəldi camdən.

Divanə eylədi məni sövdayi-kakilün,
Fərq etmərəm, odur səbəbi, sübhi şamdən.

Qəmzön xədəngi oxladı sədparə könlümi,
Dutmub məkan gözümdə, çıxub nizamdən.

Dutmun bərabər hiç ərəqi cami-badəyə,
Gər başı ərşə dəgə, şəh olmaz qulamdən.

Dəm vırma eşqdən, hanı, yox səndə bir əsər,
Boş lafdur bu, keçməmisən ehtiramdən.

Məcnun kimi, hanı, necə rüsvayi-dəhrsən,
Fəxr eyləyürsən hər kəs içün nik namdən.

Əş`ar zövqini eylədim kəsb, Saqiba,
Yetdim muradə Yusifi-şirinkəlamdən.

* * *

Təmənna etmə, ey dil, aşinayi-bivəfalərdən,
Dəyanət gözləmək olmaz gəda oğlı gədalərdən.

Vücudi-aşinaçün gəzmə, əl çək bu təmənnadən,
İnanma kim desə vardur, bəhadur kimiyalərdən.

Məlamət daşı yağdı başimə, hər yanə yüz dutdım,
Əlacım dəf`in umdım, görmədim bir aşinalərdən.

Xəbərdar olmadım əzbəski ömrim keçdi möhnətlə,
Şərabun nəş`əsindən, sağəri-gitinümalərdən.

Sən eylə sərvqəd, qaşı, gözi, zülfi qərasən kim,
Sorağ etməm dəxi qaşı, gözi, zülfi qəralərdən.

Kəmanun yağdırur peyvəstə ox, canımdan əl çəkməz,
Xəta bu atdığun ox etməz, əl çək binəvalərdən.

Xəta ahusinin nafında döndi müşk tər qanə,
Eşitdi buyi-zülfün hər səhər badi-səbalərdən.

Günahun boynuma, bir dəf`ə gəl, meyxanə dut, zahid,
Gətür məsciddən əl, bəsdür yapuşdun bu riyalərdən.

Cəhan mülkində, Saqib, etgilən fəqrü fəna fəxrin,
Cəhanə düşdi od yandırdı zalim əğniyalərdən.

* * *

Nə qədr yetsə, ey arami-can, cövrü sitəm səndən,
Əgər min canım alson, çəkmərəm hərgiz qədəm səndən.

Əlimdə nəqdi-canım gəlmişəm, öldür, xilas eylə,
Gözün qurbaniyəm, şəmşirtək əbruyi-xəm səndən.

Təmənna eyləsəm lə`lündən öpmək, dutma yüz məndən,
Vəfa rəsmin unutma, istəmək məndən, kərəm səndən.

Dili-divanə məndəndü, qaçardı e`tibar etmə,
Əsir etməkligə zənciri-zülf, ey qönçə, xəm səndən.

Girov verməzdüm meyə, al din məndən, badə ver, saqi,
Dolanum başuva, sındırma qəlbim, camü cəm səndən.

Çıxar ney tək fəğanım, ey müğənni, bənd-bəndimdən,
Təəccüb etmə çıxsa, nəğmeyi-cansuzi-bəm səndən.

Könül xəndan olur tər qönçə tək, ey sərvi-azadım,
Yetəndə tiri-qəmzön ləhzə-ləhzə, dəmbədəm səndən.

Mühəmmədə(s) nübüvvət xətm olubdur, səndə gögçəklik,
Sana qul Yusif olmaz, necə olson möhtərəm, səndən.

Müğənni, tarı çək ağuşə, bir dəm əzmi-Mahur et,
Təhəyyür məndən olsun, nəğmeyi-cansuzi-bəm səndən.

Dedim dildarə, Saqib, pay qıl, şirin qəzəl məndən,
Könül lövhində anı yazmağa zərrin qələm səndən.

* * *

Məlamət mülkinün sultaniyəm, miskin məzacimdən,
Degül artuq Skəndər tacı bu pəşminə tacimdən.

Qənaətlə müyəssər eylədüm fəqrü fəna küncin,
Odur bir zərrə keçməz gənci-Qarun ehtiyacimdən.

Baş əgməm yeddi şahə, süfreyi-namərdə meyl etməm,
Dila, çək minnətin, şükr eylə kim, bir parə sacimdən.

Təbiba, heç demə bu dərdi-eşqə çarə müşkildür,
Fəna rəxtilə məhşurəm, təəllüq kəs əlacimdən.

Cəhanda sim içün namərdə, Saqib, sərfiru qılma,
Yedim xuni-cigər, baş əgmədüm namərdə acimdən.

* * *

Eylə həzər, ey qaşı kəman, ahi-səhərdən,
Mən aşiqi-xali-xətüvəm, salma nəzərdən.

Musanı məlamət eləmə, sölədi "ərini",
Hüsnün odı görsəndi ona bərgi-şəcərdən.

Ahım odına yandıraram dursa müqabil,
Rüxsarüvə hər ayinə düşmübdür əsərdən.

Eşqün yolıni tərk elə, ey dil, həzər eylə,
Xali degül ol vadiyi-qəm xovfü xətərdən.

Asan degül ol sərhədi-məqsudə yetişmək,
Məcnun kimi ta içmiyəsən xuni-cigərdən.

Rahətlik ilə düşməz ələ istədigün heç,
Ta dutmayasan qəbzeyi-şəmşir kəsərdən.

İnsanlıq ilə kəsb elə sən şanü şərafət,
Yox dəxli sana, dəm vırasan ümmü pədərdən.

* * *

Gözəldür arizün ayineyi-gitinümalərdən,
Vırar dəm türreyi-giysulərün dami-bəlalərdən.

Giriftarəm, necə fəryad qılmum dami-zülfündə,
Məni azad edən yoxdur bu kami-əjdəhalərdən.

Məni bu cəzbeyi-eşqün çəkibdür kafəristanə,
Alub cəzbiyyəti-tə`lim məgər ahənrübalərdən?

Edüb qan ləxtə-ləxtə bağrımi kim, ləblərün fikri,
Gözün qurbanı, bari, qoy sorum bu xunbəhalərdən.

Səni məğrur hüsnün eyləyübdür, sormısan* halım,
Həmişə səndə qalmaz, əl gətür cövrü cəfalərdən.

Sənün eşqün yolunda tərk qılmış dinü dil, getdi,
Səri-kuyün dutan, bir dəm xəcalət çək gədalərdən.

Dedim, ey dil, sana sövdayi-eşqə düşmə, rüsvasən,
Vəfa heç kimsə görmüb bu gözi-qaşi qəralərdən.

Cəhan mülkin dolanma aşinaçün, boş təmənnadür,
Vücudi-aşina yoxdur, bəhadür kimiyalərdən.
Xəbərdar olseydi xanəbərduşün fəğanından,
Cəhan olmazdı viran bimürüvvət əğniyalərdən.

---

* Soruşmursan

Vətən getməzdi əldən, Saqiba, Allahə and olsun,
Oleydi safdil əlsiz-əyağsız canfədalərdən.

* * *

Qəbrim olseydi əgər meykədə məxrubindən,
Dəxi asılmaz idim duzəxi-qəm çubindən.

Arayur xəlqün üyubatını bica yerə dil,
Xəbəri yoxdu yəqin zərrəcə üslubindən.

İxtilaf olmasa xəlq içrə sözin həqqi itər,
Ayırur Yusifi-gümgəştəni Yə`qubindən.

Girəm, etdi birisi imdi nübüvvət izhar,
Necə hali edəcək qanmaza mətlubindən.

Əndəlib, eyləmə fəryad qəfəs küncində,
Qönçələr oldı xəzan xar ləgədkubindən.

Ey vıran dəm boş həqiqətdən bihudə yerə,
Vaqif heç olmamısan zişti ilə xubindən.

Zahida, bəsdü məni məscidə təklif etdün,
Xəbərün yoxdu sənün aləmün aşubindən.

Rəxti-təqva ilə dutdum genə meyxanə yolın,
Saqiya, ver meyi-nabun mənə mərğubindən.

Ey deyən cami-meyi tərk elə, içmə meyi-nab,
Aşiqi-zar çətindür keçə məhbubindən.

Saqiba, hər kəsün öz məsləki xoşdur özinə,
Dəm vırur birsi köpəkdən, o biri tubindən.

* * *

Genə bu zülfüvi rüxsarə niqab eyləmisən,
Dili-divanəmi bilmərrə xərab eyləmisən.

Necə əbrulərüvün tiğinə qurban olmum,
Görürəm mən onı qan ilə xizab eyləmisən.

Rəşkdən guşeyi-meyxanədə xüm oldı şikəst,
Öpdi sağər ləbüvi, əzmi-şərab eyləmisən.

Xəbər alma dili-sədparəmi, düşmiş dildən,
Tiri-müjgan ilə əzbəski əzab eyləmisən.

Bisütun tab eləməz bari-qəmi-hicranə,
Necə, ey dil, bu qəmi-möhnətə tab eyləmisən.

Şurə gəl, nəğmeyi-Şur ilə gətür şurə məni,
Ey müğənni, nə içün meyli-Rəhab eyləmisən.

Xəlq hər məqsədinə nail olubdur, Saqib,
Sən də qəflət meyilə naz ilə xab eyləmisən.

* * *

Qədimi əgri qaşun kimi kəman eyləmisən,
Ləblərün fikri ilə bağrımi qan eyləmisən.

Xəlq səndən, dili-divanə, gəlibdür təngə,
O qədr hicr güni ahü fəğan eyləmisən.

Eylədün varü yoxı tərk bu məhparə içün,
Sevinür xəlq bu sevdadə ziyan eyləmisən.

Müşk bazarı kəsad oldı Xəta mülkində,
Dami-giysulər ilə müşk fəşan eyləmisən.

Bilməmiş həqqi verüllər sizə huri-cənnət,
Zahida, boş sözi sən virdi-zəban eyləmisən.

İçsə kim badeyi-gülfami, yanar duzəxdə,
Başun içün bu sözi yaxşı güman eyləmisən.

Demə, Saqib, bu qədər həqq dutar yüz məndən,
Sidq ilə həqqə sən iqrar haçan eyləmisən?!

* * *

Qədimi əgri qaşun kimi kəman eyləmisən,[*]
Şəbi-hicründə gözüm yaşini qan eyləmisən.

---

[*] Misra təkrardır

Olasan pir mənim tək, gözüvün qurbani,
Hüsnüvə məhv dili-pirü cəvan eyləmisən.

Mən sənün eşqüvə düşdüm neçün, ey şirinləb,
Varə-varə məni rüsvayi-cəhan eyləmisən.

Dögünür dil duta zənciri-cünun damənini,
Yüzə əfşan bu qəra zülfi haçan eyləmisən?

Düşmə sevdayi-səri-zülfinə yarun, ey dil,
Səni divanə edər, harda məkan eyləmisən.

Verməsən sən mana, zahid, bilürəm tövbeyi-mey,
Etmərəm tövbeyi-mey, yaxşı güman eyləmisən.

Dutdı el damənüvi hicr güni, ey Saqib,
Gözüvün yaşini əzbəski rəvan eyləmisən.

* * *

Saqiya, dur, eylə ləbriz, gətür sağəri sən,
Meyi-gülfamun elə ruhi-rəvan cövhərisən.

Arizu hər nə tələb eyləsə səndən, ver ona,
Verməsön də alacaq, tabe`vü fərmanbərisən.

Qüvvə yox səndə gedüb tərki-itaət edəsən,
Əl-qolı bağlı əsiri, qulısan, çakərisən.

Arizuyə əsər etməz, onı sən eylə yəqin,
Rüstəmi-əsrün əlinə verəsən xəncəri sən.

Arizu qəl`əsini fəth eləmək müşkildür,
Hazir etsön də bu dünya dolısı ləşkəri sən.

Ölümə hökm eləsə, ölməgə ol amadə,
Bir kömək eyləyə bilməz, çağır İskəndəri sən.

Arizudur salan afaqə odın şö`ləsini,
Sən də bu odda yanursan, dura bildün geri sən?
Var kimün cür`əti etsün özini azadə
Arizudən, onı sən bəlkə qulami-dərisən.

Arizudur səni şair eləyən, ey Saqib,

Doldurubsan qəzəl ilə vərəqü dəftəri sən.

Arizu ilə alur xəlq bütün istədigin,
Arizu ilə salubsan ələ bəhrü bəri sən.

Arizu fəth elədi məmləkəti-Azərini,
İmtina eyləməyürsən şəhi, nə Qeysəri sən.

Ey Vətən şö`ləsi, yandur məni pərvanə kimi,
Yanə-yanə genə sən bu dilimün əzbərisən.

Müxtəsər, qaçmağa yer yox sana ver var-yoxuvı,
Gərçi aləmlərün arayişi, taci-sərisən.

Dindən çıxmağa əmr eyləsə, əlbəttə ki, çıx,
Yad qılma dəxi heç mə`rəkeyi-məhşəri sən.

* * *

Gözəlsən, neyləyüm mən, bivəfasən,
Rəqibə, bimürüvvət, aşinasən.

Məlahət kişvərin təsxir qıldun,
Bu hüsn ilə zibəski məhliqasən.

Məni azad qıl, ey zülfi-mişkin,
Atıl başımdan, ol dami-bəlasən.

Ləbin yad etmə yarun, ey dil, ey dil,
Dönərsən qanə, əl çək, binəvasən.

Sorub əğyar, qalmub ləzzət onda,
Əgərçi dərd əlində mübtəlasən.

Dedim kuyinə getmə yanə-yanə,
Sana görsənməz ol sultan, gədasən.

Gülün ətrin çəküb əttar, bülbül,
Qəfəsdə etmə çox ahü nəva sən.

Vırub həlqə yarun lə`li-ləbində,
Məgər gənc üstə yatmış əjdəhasən.

İtirdüm dinü dil eşqün yolında,

Gedüb əğyarə oldun aşina sən.

Əyağ ilə əlim dut, saqi, mey ver,
Məni meyxanəyə çək, rəhnümasən.

Səni kuyinə yol verməz bu məhvəş,
Mənim tək, Saqiba, bəxti qərasən.

* * *

Giysulərüvi tökmə bu qədr üzarə sən,
Qoy xəlqi baxmağa, çək anı bir kənarə sən.

Bazari-hüsni Yusifə hüsnün kəsad edüb,
Min fitnə salmış görürəm hər diyarə sən.

Çox fəxr qılma hüsnüvə, ey sərvqamətim,
Qalmaz əlündə, görməyəcəksən dübarə sən.

Xət qarət eylər hüsnüvi, çox naz eyləmə,
Bu dərdə çarə yox, edəsən yüz də çarə sən.

Bildirdün axırda aləmə, ol şuxə mailəm,
Ey dil, görüm ki, tez olasan parə-parə sən.

Sən gördigün o mahliqa qeyrə yar olub,
Pərvanə kimi, kaş, yaneydun şərarə sən.

Gül fəsli yetdi, saqi, gətür camü badəni,
Bəsdür, bu qədr etməgilən istixarə sən.

Bir dəm, müğənni, keçmə bu ahəngi-Şurdən,
Mizrabi urma Dilkeş içün bu dütarə sən.

Topraq olur qızıl nəzərün düşsə, Saqiba,
Bədbəxtsən, zəmanə ara bəxti qarə sən.

* * *

Əfsus, könül, bəndəsən, azadə degülsən,
Azad özüvi etməgə amadə degülsən.

Sərkeşligə güc vermə, düşərsən tez əyağə,

Təklifüvi bil sən ki, belə sadə degülsən.

İnsanlığa hərgiz sənün həqqün ola bilməz,
Meytək nə qədr sağərə üftadə degülsən.

Hər məsləkə gündə özüvi müftə satursan,
Canü dil ilə həqq sözə dildadə degülsən.

Zahid sözinə ram özüvi eyləmə hərgiz,
Sən imdi ki, barkeşi-səccadə degülsən.

İnsanlara qatma özüvi, guşənişin ol,
Meyxanədə sərməst hələ badə degülsən.

Saqib, əlivün rənci ilə kəsbi-məaş et,
Müftə yeməgi tərk elə, şəhzadə degülsən.

* * *

Bəh-bəh nə gözəlsən, şəhi-xubani-zəmansən,
Arami-dili-xəlqsən, aşubi-cəhansən.

Əbrulərüvə kim desə mehrab, yalandur,
Ey canımun arami, qılınclardu, inan sən.

Piçidələnür dil səri-zülfündə ilan tək,
Ey türreyi-şəbrəng, məgər əf`i ilansən.

Qəmzön oxına min can ola, verməmək olmaz,
Al canımı qurtar, dəxi qoyma nigəran sən.

Bir şivə ilə məndən əcəb dinü dil aldun,
Tək bir qurı can qaldı, alursan, de, haçan sən?

Əksi-rüxün səcdəsin etdümsə rəvadur,
Bax səfheyi-rüxsarüvə, gör, bir necə cansən.

Xəlqə hələ cənnət yolı, həm Kə`bədü məqsud,
Dur, saqi, gətür badeyi-yaquti-rəvan sən.

Saqib, sana dindar deyür xəlq, yalandur,
Nə olduğuvı etməgilə xəlqə əyan sən.

* * *

Düşdi damaninə bir-bir şərəri-suzəfkən,
Eşq ahəngəri zənciri-cünun işlərkən.

Vurmısan bu dili-sədparəmə bir qəmzə oxın,
Sana min dəf`ə əgər eyləsəm izhari-həzən.

Uydun əğyarə ki, dildən-dilə saldun özüvi,
Səni rüsva edər, ey məh, demədimmi sana mən.

On rəqibə verəsən busə ləbün küncindən,
Səngdil, və`də yalandan niyə verdün mana sən.

Çox dedim bu dili-divanəmi, ey divanə,
Dami-zülfündə bu şuxun, həzər et, dutma vətən.

Tiği-əbruyilə allam, demədün canuvı mən,
Almısan* bəs nə içün canımi, ey əhdşikən?

Xahiş etdüm tökəsən hüsnüvə giysulərüvi,
Tökmədün, tab eləməz görməgə bu piri-kühən.

Saqibə etmə təəccüb qəzəl inşalar edüb,
Verdi tə`lim ona çün Yusifi-şirinsüxən.

* * *

Meyxanələrdə içməsə kim mey əyağ ilən,
Meyxanəyə girəndə vırarlar əyağ ilən.

Qalmaz həmişə, hüsnüvə çox fəxr eyləmə,
Heç kimsə sübhin eyləməyübdür çirağ ilən.

Eşqün yolında var-yoxı tərk eyləsəm nola,
Bazari-hüsnə gər çıxasan bu səyağ ilən.

Şirin dodağıni sorar əğyar dəmbədəm,
Fərhad tişəni eləyür künd dağ ilən.

Ey qan qoyan bu bağrıma, əğyarə vermə dil,
Sənsiz məgər könül açılar seyri-bağ ilən.

Bülbül çəməndə tərk elədi bərgi-laləni,

---

* Almırsan

Seyr eyləyəndə bağı bu lalə yuvağ ilən.

Var vəchi şikvə eyləsəm, ey bəxti qarə dil,
Qoymaz fələk birin yaşasun tər dimağ ilən.

Mey nəş`əsi başundan uçar, ehtiyat qıl,
Saqib, danışma məst olanda oyağ ilən.

* * *

Könlümi bənd etmisən zülfi-əbirəfşan ilən,
Qəsdi-can etmək nə hacət navəki-müjgan ilən.

Ey qoyan bağrıma düşdüm xəyali-vəslüvə,
Ruzigarım başə gəldi min şəbi-hicran ilən.

Tiri-qəmzə mübtəlası etməz idim könlümi,
Əhdi-peyman etməsəydim mən əgər canan ilən.

Gözlədim ta sübhədək, gəlləm demişdün, gəlmədün,
Yanə-yanə şəm`vəş bu dideyi-giryan ilən.

Badə içdim yarsız, məst etmədi meyxanədə,
Sağərün ləbriz oleydi, saqiya, al qan ilən.

Heç demə nöqsan yetişməz hüsnimə, ey qönçələb,
Verməsün çox hüsnün ol məhi-taban ilən.

Xət gəlür rüxsaruvun ayinəsin məhv eyləyər,
Görmüsən Saqib sana halın deyür əfğan ilən.

* * *

Xuramə sərv gəlür qamətün xuram ilən,
Qiyaməti xəcil eylər yarım qiyam ilən.

Əcəb degül rüxi-alunda daneyi-xalun,
Ki, şah seyr eləyəndə çıxar qulam ilən.

Süfufi-kiprigüvi görsə qafil hər kimsə,
Sanur ki, ləşkəri-Rumi görüb nizam ilən.

Yatub bu guşeyi-çeşmündə bir cəhan fitnə,

Yəqin ki, ülfət edüb qan içən həram ilən.

Zəmanə təngə gəlüb naləvü fəğanimdən,
Edər hücum qəmün gündə sübhü şam ilən.

Eşitməz, eyləmə Məcnunə vəsfi-Şirini,
Öpər əyağuvi, ver müjdə Leyli namilən.

Məni bu deyri-xərabə gətürdi xanəxərab,
Xərab eylə məni, saqi, badeyi-cam ilən.

Bu tiri-qəmzövə tab eləmək degül asan,
Əsir qıl məni, bari, bu zülfi-dam ilən.

Qəzəldə Şahin* edər fəxr gərçi Zakirlən,
Bu Saqib eyləyər ol Yusifün kəlam ilən.

* * *

Əsir eylə məni türreyi-müşəvvəş ilən,
Necə əlaqə edim mən bu çeşmi-sərkeş ilən.

Hekayəti-xəmi-zülfün, uzun hekayətdür,
Təmam eyləmək olmaz anı bu şeş-beş ilən.

Ayılmaz həşrə kimi, məst olur qiyamətdə,
Dodağuvı sora hər kim, şərabi-biğəş ilən.

Dutuşdı arizi-alun odına şeş cəhətim,
Təəccüb eyləmə pərvanə yansa atəş ilən.

Müğənni, əl gətür ol nəğmeyi-Müxalifdən,
Al ixtiyarımi əldən həvayi-Dilkeş ilən.

* * *

Ömrim yetişdi axirə suzü güdaz ilən,
Bir dəm mey içmədim bu qədr sərvnaz ilən.

Mən dinü dil girov verərəm dürdi-badəyə,
Zahid, sən istə Kövsəri razü niyaz ilən.

Məhmud öləndə səltənətün fikrin etmədi,

* Nardaranlı şair Mirzə Abbas Şahinə (1862-1909) işarədir

Təslim etdi canını fikri-Əyaz ilən.

Ey dil, yügürmə məscidə, meyxanə künci dut,
Durma, oturma bir nəfəs əhli-nəmaz ilən.

Meyxanənün yolında məni dəfn eyləyün,
Avazi-Şəhnaz ilə tənburü saz ilən.

Ləzzət aparmaq istəsön ömri-əzizdən,
Ömri-əzizi sürməgilən bədməcaz ilən.

Saqib, qəm etmərəm əgər ol yari-dilfərib,
Bir dəf`ə canım alseydi eşqdə naz ilən.

* * *

Könlümi zəncirə çək, giysuyi-mişkəfşan ilən,
Çak qıl, ram olmasa bu navəki-müjgan ilən.

İstədi su gözlərim ol qaşuvun şəmşirinə,
Qoymadım, su içməgi neylər, boyanmış qan ilən.

Qoymadun kuyün dutam, əğyar yetdi vəslüvə,
Könlümi şad eylərəm mən naleyi-hicran ilən.

Hər dənilər minnətin çəkdim dəmadəm şah ikən,
Kim nə eylər bivəfa dutmış yüzi dövran ilən.

Kimdədür təqsir bir-bir, gəl, sana mən göstərüm,
Ey əsiri-huri-cənnət, ayeyi-Qur`an ilən.

Kim deyür, Saqib, cəhan mülki məqami-əmndür,
Ruzigarun başə gəldi naləvü əfğan ilən.

* * *

Saqi, gətür piyaləni, doldur şərabi-əmn,
Bir göz yumub-açınca edim bəlkə xabi-əmn.

Dutmış cəhani fitneyi-aşub sərbəsər,
Bir gün tülu` eyləməyüb aftabi-əmn.

Aləm gedərdi bir yol ilə ixtilafsız,

Vaiz, noleydi bir dəm açeydun kitabi-əmn.

Dil döndi qanə, şahidi-məqsəd yüz açmadı,
Məhtab kimi pərdəyə girdi niqabi-əmn.

Küldür qədim ocağda, vətən naxələfləri,
Bu hərc-mərci münşilər etmiş hesabi-əmn.

Gəl Şurə, ey müğənni, Müxalifdən əl gətür,
Bənd etsə Həsarə tar ilə göstər rübabi-əmn.

Sən də əsir eylə məni dami-zülfüvə,
Xəlqün yüzinə imdi ki, bağlandı babi-əmn.

* * *

Saldım əbəs yerə başımi qeylü qalə mən,
Oldum əsiri-zülfi-bu əbru hilalə mən.

Əğyar yetdi vəslinə ol mahparənün,
İzhari-dərd eyləmərəm laməhalə mən.

Tə`sir eləməz sana, ey şuxi-səngdil,
Ney kimi eyləsəm nə qədr ahü nalə mən.

Kim söləsün sana şəbi-hicran hekayətin,
Tab etmisən ki, düşmüşəm, ey dil, nə halə mən.

Dövran qəmindən eylərəm azad könlümi,
Saqi əlindən alsam əgər bir piyalə mən.

Asudə eylədim özümi, saqi, badə ver,
Təsbihi zahidə genə etdim həvalə mən.

Meyxanədən çağırma məni künci-məscidə,
Zahid, yetmişəm dəxi həddi-kəmalə mən.

Saqib, əlac yox eləyüm eşq tərkini,
İqdam eləyüm necə əmri-məhalə mən.

* * *

Ləblərün yanında verməm ləb meyi-gülfamə mən,
İçməsün, peyğam qıldım bu dili-nakamə mən.

Çeşmi-mərdümküşlərün çoxdan susuzdur qanimə,
Gəlmiyeydim rast, kaş, böylə xunaşamə mən.

Sən simintənü səmənrüxsarü sərvqəddsən,
Sənsiz hərgiz vermərəm dil qeyri güləndamə mən.

Xəlq məndən nifrət eylər, oldum heyranun sənün,
Səndən ötri nifrət etdim cümlə nikü namə mən.

Ruzü şəb hərdəm sən ilə xatirim məşğuldür,
Hər nə etsön baxmaram bu gərdişi-əyyamə mən.

Zahid istər eyləsün nahəq məni təsbihə ram,
Paybəndəm bilməyür giysuləründə damə mən.

Saqiba, zahid deyür meyxanədən gəl məscidə,
Bağluyam bilmir dəri-meyxanədə ehramə mən.

* * *

Bu qamət ilə bağə çıx, ey dilnəvazi-mən,
Qəddi-sərüvi qoyma bir də çəkə sərvnazi-mən.

Kutah olan degül xəm zülfün hekayəti,
Bu fikr ilə təmam olub ömri-dirazi-mən.

Yox dərdi-eşqə çarə, əlac etmə, ey təbib,
Yarun əqiq lə`li-ləbi çarəsazi-mən.

Məhmud ol zəman ki, verüb ahü zar ilə,
Cani-əzizi kim, dedi noldı Əyazi-mən.

Ayati-hüsnün oxuram vəsfin hər zəman,
Xalundan özgə yox, bəli, razü niyazi-mən.

Tə`sir etmədi şəbi-hicründə, səngdil,
Ta sübh olunca naleyi-aləmgüdazi-mən.

Həqqün yolunda başimə yüz min bəla gələ,
Bir zərrə, Saqiba, genə yox ehtirazi-mən.

* * *

Məst olmunca gəlmərəm, ey saqi, halə mən,
Verməm qulaq mədrəsədə qeylü qalə mən.

Zahid, əlimdən alma bu sınmış piyaləni,
Kövsər şərabını sənə etdüm həvalə mən.

Mehrab guşəsin mənə göstərmə, ey fəqih,
Dil vermişəm o məhvəşi-əbruhilalə mən.

Vaiz yügürmə məscidə, meyxanə künci dut,
Verdüm meyə ibadəti-həftadsalə mən.

Divanələrlə həmnəfəs olsam əbəs degül,
Yox əhli-hal, halı deyüm əhli-halə mən.

Kəşfi-niqab eylədi hüsnündə həq sənün,
Məhvəm, odur bu xali-xətü bu cəmalə mən.

Tərk etməz idim həşrə kimi ahü naləni,
Mümkin oleydi yetməgə bir dəm vüsalə mən.

Mən künci-qəmdə, daməni-vəslün rəqibdə,
Qoy, bari, ney kimi eləyüm ahü nalə mən.

Saqib, ölüncə xaki-dəri-yarə səcdə qıl,
Yetsəm nola kim, ol büti-novrəs nihalə mən.

* * *

Lalədür arizün, ey şux, və ya bərgi-səmən,
Görsə hər kimsə sənün hüsnüvi, sölər, əhsən.

Əksi-rüxsarüvə ayinəni heyran etdün,
Qamətün sərvə xəcalət verür, ey qönçədəhən.

Hər zəman eyləsön əfşan yüzə giysulərüvi,
Deyər aləm, dutulub gün, edər izhari-həzən.

Vahimə eyləyərəm gözlərüvə baxmaqdan,
Ox dutub qətlimə könlüm evin etsün məskən.

Əldə can nəqdi, üz üstündə gətürrəm qapuva,

Sana qurban, təki sən olmayasan əhdşikən.

Lə`li-nabun həvəsilə içərəm badeyi-nab,
Qoymaram meykədə küncində yerə sağəri mən.

Yatub asudə əcəb qaşlaruvun tağındə,
Gözlərün sanki yatub naz ilə ahuyi-Xütən.

Necə mən tərk eləyüm eşqüvi, ey şirinləb,
Almaram gül ələ sənsiz, eyləməm seyri-çəmən.

Etsəm izhar əgər, etmə məlamət, Saqib,
Azəridə hanı Yusif kimi xəllaqi-süxən?

* * *

Çəksün əl candan gərək didari-canan istəyən,
Vırmasun dəm eşqdən, aşiq degül can istəyən.

İnciməz xarun cəfasından, dolanur başinə,
Qönçəsin gülzar içində şadü xəndan istəyən.

Olgilən zindan əsiri Misridə Yusif kimi,
Ey dəmadəm həsrət ilə təxti-sultan istəyən.

Sevdigün dildar içün, get, nəqdi-canı əldə dut,
Od dutar pərvanə tək şəm`i-şəbistan istəyən.

İgnə kimi paybənd olma təəllüq daminə,
Varü yoxdan keçməli ol ruhi-reyhan istəyən.

Olmason Məcnun əgər, dəm urma hərgiz Leylidən,
Göz yaşilə su verür sərvin xuraman istəyən.

Tərk qıl məscid yolın, təsbihə çox bel bağlama,
Dutgilən meyxanə küncin, olson iman istəyən.

Yaxmaz idim baği-ömri ahi-aləmsuzimə,
Olsa idi bu cəhan mülkində insan istəyən.

Zəhməti-bicayə, Saqib, ömri bərbad eylədün,
Əl gətür, yox müştəri, kimdür qəzəlxan istəyən.

* * *

Ey dəmadəm dili-viranəmi viran eləyən,
Türreyi-zülfüni rüxsarə pərişan eləyən.

Qan içər gözlərün, əmma eləməz can qəsdin,
Qıyqacı baxmağıdur qəsdi-dilü can eləyən.

Tiği-əbru ilə bildün nə qədər qan etdün,
Bu qədr tökmə, dutar qan səni, ey qan eləyən.

Məni rüsvayi-cəhan eylədi eşqün, getdi,
Ah, min ah bu dərdə hanı dərman eləyən?

Yanasan eşq oduna sən də mənim tək, zalim,
Biləsən ta nə çəkir naləvü əfğan eləyən.

Ləhzə-ləhzə məni hicran odına yandırdun,
Həzər et ahım odından, belə tüğyan eləyən.

Dutum od mən nə qədr bu şəbi-hicran odına,
Ey Xəlilə odı gülzarü gülistan eləyən.

Hüsni Leylayə verüb, eşqün odın Məcnunə,
Sən kimi olmayub heç kim belə divan eləyən.

Getməz idi Vətənün daməni əldən, Saqib,
Sidq ilə olsa idi canını qurban eləyən.

* * *

Tiği-əbruyilə qətlimə fərman eləyən,
Dutar axırda səni qan, bu qədr qan eləyən.

Mən də bu hüsnimə sən kimi edərdim fəxri,
Aldı məndən onı, hüsnün məhi-taban eləyən.

Qalmaz asari, gözəllik səni məğrur etmiş,
Xət gəlür qarət edər hüsnüvi, tüğyan eləyən.

Olur, əlbəttə peşiman, onı sən eylə yəqin,
Rəhi-eşqündə sənün canını qurban eləyən.

Gəzərəm nalə ilə kuyüvi hicran gecəsi,

Demisən[*], ney kimi kimdür belə əfğan eləyən?

Sorsalar həşrdə kim bağruvı qan etdi sənün,
Deyərəm bu sözi, ey ədl ilə divan eləyən.

Bu pəriçöhrə dəmadəm elədi qan bağrım,
Olmadı zərrəcə bu dərdimə dərman eləyən.

Dutaram çaki-giribanuvi min naləm ilə,
Neylədim mən sana, ey könlümi viran eləyən.

Saqibün pəndin eşit, aşiqüvə etmə sitəm,
Həzər et, cövrinə aləmləri heyran eləyən.

Yandırar bu güli-rüxsaruvı ahim odına,
Nari-Nəmrudi bir ahimlə peşiman eləyən.

Bağı-hüsnim demə solmaz, yetənə, şirinləb,
Kimdür ol sərv kimi qəddimi çovkan eləyən.

* * *

Ey xəyali-ləblərilən bağrımi qan eyləyən,
Aləmi hüsnin təmaşasında heyran eyləyən.

Şah idim aləmlərə, imdi gədayi-kuyüvəm,
Var şəhi mur eləyən, muri Süleyman(ə) eyləyən.

Ey edən öz aşiqin ehsan zövqindən naümid,
Qeyrini yüz lütf ilə amaci-peykan eyləyən.

Sorma neyçün fitneyi-aşub dutmış aləmi,
Ey dəmadəm arizə zülfin pərişan eyləyən.

Etməsəm bu daneyi-xalun təmənnasın, nola,
Adəmi kimdür təmənnadən peşiman eyləyən.

Yandıran kimdür dedim, eşq atəşilə aşiqi,
Dedi, pərvanəyə var şəm`i suzan eyləyən.
Atəşi-hicranüvə yandırma, zalım, çox məni,
Var Xəlilə nari-Nəmrudi gülistan eyləyən.

Dərdimi sordum müalicdən, dedi yox çarəsi,

[*] Demirsən

Qoy, sorum bu ləblərün, var bəlkə dərman eyləyən.

Eyləsün qoy şəm` sərkeşlik, özini yandurur,
Yetməyüb məqsudinə bir zərrə tüğyan eyləyən.

Ney kimi hicran güni kuyində etdüm naləni,
Heç xəbər dutdunmı kimdür ahü əfğan eyləyən?

Saqiba, səbr etgilən dövran sana cövr eyləmiş,
Yusifi şah eylədi pabəndi-zindan eyləyən.

* * *

Çox gözləmə, ey dil, gələcək sevgili yarun,
Gəlməz, uyub əğyarə nədür naleyi-zarun.

Dildardən ayrı düşənün çarəsi olmaz,
Yoxdur gözüm zərreyicə fəsli bəharun.

Dildardən ayrı düşənün naləsi yatmaz,
Neyçün belədür, bir xəbər al, naləsi tarun.

Yıxmaz məni, ey mahvəşim, navəki-qəmzön,
Əmma məni bitaqət edüb çeşmi-xumarun.

Səndən necə mən dil üzüm, ey qaşı kəmanım,
Heyrətdə qoyub ayü güni mahi-üzarun.

Gördün birini məst düşüb şişeyi-meylə,
Qoy halinə, incitməgilən, onda nə karun.

Gül var nə qədr bağdə, bülbül, onı sən bil,
Gülşəndən üzülməz əyağı zərrəcə xarun.

Başindən uçar nəş`eyi-mey, etmə əziyyət,
Söz qatmagilən söhbətə badə kəsadun.

* * *

Dami-cünundur bu giysuyi-tabdarun,
Heyrətdə qoydı, baxma, ayinəni üzarun.

Künci-ləbündə, ey məh, xalun dutardı məskən,

Tə`siri olsa idi bir zərrə ahü zarun.

Tər qönçə bəhs edəndə yaqut ləblərünlə,
Badi-səba dağıddı, tapdağı oldı xarun.

Gülzari seyr edəndə hərdəm bu qamət ilə,
Şümşadə ver xəcalət, sərv ola sayədarun.

Düşdüm əyağə mey tək dəhrün sitəmlərindən,
Olsun yüzi qazan tək qarə bu ruzigarun.

Ey bülbül, etmə nalə künci-qəfəsdə hərdəm,
Badi-xəzan əsəndə soldı güli-bəharun.

Bir ləhzə kam alarsan dövrani-bivəfadən,
Fəxr etmə, tez görərsən, tərk oldı cümlə varun.

Hər nəqşə kim çəkərsən könlündə sən, yəqin et,
Bərəks olar, əzizim, yox əldə ixtiyarun.

Məscid yolı dutuldı, qəm çəkmə, qoy dutulsun,
Meyxanədə varundur nə eybi e`tibarun.

Çərxün bu sübhü şami nə nəf` verdi xəlqə,
Neyçündür hər nəfəs bəs, fəryadü ahü zarun.

Əflak kim dolanur, bir inqilab içündür,
Salsun cəhanə fitnə, olsun bu qəm kəsadun.

Saqib cəhanə qoymaz bir qılca qədrü qiymət,
Fikri nə olsa olsun, ol çərxi-kəcmədarun.

* * *

Yoxdur vəfası zərrəcə əbrukəmanlarun,
Ey dil, neçündür ah ilən ahü fəğanlarun.

Xunabi-həsrətə özüvi qərq eyləmə,
Əğyar sorsa lə`lini qönçədəhanlarun.

Dami-cününə ram ola könlüm, əcəb degül,
Şanə görəndə türreyi-ənbərfəşanlarun.

Verməz rəqibə o pəriçöhrə ol zəman,

Tə`siri olsa naleyi-ruzü şəbanlarun.

Bir mən şikayət etmirəm səndən, ey gözəl,
Hədsiz nədür şikayəti pirü cəvanlarun.

Çox daldalanma sayəsinə hər dənilərün,
Vardur bəlali sayəsi həft asimanlarun.

Olmış əsiri-künci-qəfəs, Saqib, əndəlib,
Neymiş günahı aşiqi-bixanimanlarun.

* * *

Səri-zülfün kimi könlüm pərişan olsa, qoy olsun,
Xəta yığnağı bir mə`murə viran olsa, qoy olsun.

Dedim, əl çəkmədi, mən neyləyüm, ey sərvi-azadım,
Sənün eşqündə dil rüsvayi-aləm olsa, qoy olsun.

Təmaşa etməgə qoy xəlqi bu zülf içrə gizlətmə,
Cəmalun əksinə aləmlər heyran olsa, qoy olsun.

Yanaşmam qaşlarun tağinə, oxşar taği-mehrabə,
Hədəf göz mərdüminə növki-müjgan olsa, qoy olsun.

Rəqibə verməərəm dil, dün demiş ol mahrüxsarım,
Yalandur dil verüb, ey dil, peşiman olsa, qoy olsun.

Fəqihi məst gördüm mey içüb meyxanə küncində,
Atub səccadəni, kafər müsəlman olsa, qoy olsun.

Zəmanə yaxşını heç sevməyübdür, sən də heç sevmə,
Cəhanun qanmazı, nadanı sultan olsa, qoy olsun.

İnanma zərreyicə gərdişinə çərxi-bədmehrün,
Onun rəftarı ilə bağrımız qan olsa, qoy olsun.

Vəfa bir zərrə yoxdur, Saqiba, bu sərvqamətdə,
Rəqibin bəzminə şəm`i-şəbistan olsa, qoy olsun.

* * *

Nə gözəl, düsər əlimdə dolu camü badə olsun,
Ləbi-yar ləblərimdə, bu dimağımız tər olsun.

Gələcək bəhar fəsli meyi-ərğəvani, saqi,
Elə saxla dürdi, canə dəgə, ruhpərvər olsun.

Mana bir də badə versön, içərəm səbu-səbu, ver,
Məni min əyağ yıxmaz, dolı xüm müqərrər olsun.

Könül, incimə cəfadən, sana ol pərivəş etsə,
Budur adət hər gözəldə, içə qan, sitəmgər olsun.

Dözərəm nə qədr cövrün mana eyləsön dəmadəm,
Sana hər könül verənlər nə olur ki, kafər olsun.

Desə kim vəfası vardur bu gözəllərün, nigarım,
Deyərəm yalandur, bu deyən peyəmbər olsun.

Məni-zarü natəvanə sitəmün əlin uzatma,
Dəxi adət etmişəm mən, sitəmün mükərrər olsun.

Dut əlin yıxılsa hər kəs, sitəm etmə, lütf göstər,
Necə sən rəva görürsən ki, biri mükərrər olsun.

İçərəm ilan zəhrin mana versə gər mərd, Saqib,
Verə nakəs, əmandur, təmə` etmə, şəkkər olsun.

* * *

Nadan, içmə meyi sən, qoy, şişədə qalsun,
Hal əhli içün şişə də əndişədə qalsun.

Fərhad bilür qiyməti-Şirin, hanı Fərhad?
Qoy, bu sözi ya dağdə, ya tişədə qalsun.

Ey düşkini-sərvət, xüm əyağında yerün yox,
Cəm` eylədigün, qoy, genə dərvişə də qalsun.

Bidar eləmə düşmənüvi, qoy, yata rahət,
Yol vermə evə, şir gərək bişədə qalsun.

Qət` eyləmə gər meyvə umursan bir ağacdan,
Su ver ona, Saqib, dəxi də rişədə qalsun.

* * *

Qaşun kimi qədimi döndərüb kəmanə fəraqun,
Gətürdi canə məni, qoydı yanə-yanə fəraqun.

Şəbi-fəraqüvə tab eyləmək degül asan,
Əcəb degül sala od şö`ləsin bu canə fəraqun.

Xərabi-xanə məni etdi, ey kəmanəbru,
Gətürməz əl genə məndən xərabxanə fəraqun.

Vüsal xatirinə açmaram dil əğyarə,
Qaşun qılıncı ilə çəksə imtəhanə fəraqun.

Əgər əlimə düşə, firqətün qanın tökərəm,
Göz üstədür, verərəm, olsa xunbəha nə fəraqun.

Ləbündən edəmməzdim çarə dərdimə, ey məh,
Bu bağrımi belə döndərməseydi qanə fəraqun.

Dutanda damənüvi çəkmə bağrıqan, Saqib,
Əman haçan verəcək piri-natəvanə fəraqun.

* * *

Mey içirdim əldə sağər, birdən oldı sərnigun,
Toprağə mey sölədi: "İnna ileyhi raciun".[*]

Meydə gördüm hüsni-yari, mən də içdüm badəni,
Siz də meyli-mey edün, "ya əyyühəl-müntəfriqun".[**]

Hərçi fəryad eylədüm çəkmə bu dəhri-dun qəmin,
Dəhr çün divanədür, aləm olub "la yəsməun".[***]

Göz yumub-açınca sultan oldı hər divanələr,
Neyləmək, yox çarəsi, üqbalər olmış rəhnümun.

Arizuyi-vəslin ilə canə yetdüm, ah, kim,
Qoymayur kam almağa, əzbəski tale`dür zəbun.

Dərdi-eşqə çarə yox, bica əlac eylər təbib,

---

[*] "Biz Allahın bəndələriyik və ona tərəf qayıdacağıq..." (Qurani-kərim, Bəqərə, 156)
[**] Ey təfriqə salanlar
[***] "Onlar eşitməzlər..." (Qurani-kərim, Ənfal, 23)

Çarəsi lə`li-ləbi-dildardur, ey bəxti dun.

Mən kimün eşqində rüsvayəm, demək mümkin degül,
Yoxdur hal əhli, könüldə qaldı sirri-əndərun.

Arturur içdikcə qəm təklifi-sağər eyləmə,
Qanə dönsün verdigün, saqi, şərabi-lə`lgun.

Ey deyən hərdəm mana, halun pərişan olmasun,
Var qulağunda sədayi-tarü çəngü ərğənun.

Çərxi-bədmehrün əlindən kimsə azad olmayub,
Rahət olmaz xəlqi-aləm olmasa ta vajegun.

Saqiba, xümxanədən əl çəkmə, canun çıxsa da,
Vermə əldən sağəri, olduqca gər möhnət füzun.

Eyləmə nadanə hörmət, fərq qoymaz zərrəcə,
Ya ona sən zəhr ver, ya vergilən maül-üyun.

* * *

Təqsiri nədür yar ilə bu pirü qulamun,
Yetmir mana, ey saqi, neçün bir dolı camun.

Zahid, demə, içmə, meyi-gülfami genə, dur,
Neyçün bizə yetdi, de görüm, hökmi həramun.

Gər olsa qiyamət, demə sən heç sözün həqqin,
Əlbət ki, deməzsən itirüb həqqi imamun.

Nadanə olub nəhy, itər əqli içəndə,
Meyxanədə qurbanı olum mən bu həramun.

Sərmayə mana bir-iki-üç rətli-girandur,
Yıxmaz məni, ey saqi, gətür rətlü gıramun.

Qal əhlinə təklif eləmə şəh də gər olsa,
Salma əyağə qədri-meyi, pozma nizamun.

Dutma əlin hər xanəxərabun, həzər eylə,
Dillərdə məbada ki, sənün bəd ola namun.

Saqib, həzər et, əhli-fəsad ilə mey içmə,

Eylər səni bədnam, budur xətmi kəlamun.

* * *

Zülfün xəyalın etdim, göstərdi ox kəmanun,
Versün cəvabını kim, zalim, bu xunfəşanun.

Lə`li-ləbün xəyalın et, bari, qan da olsa,
Divanə, dil sorarsan, itməz aradə qanun?

Xəlq eyb eyləsün qoy, oldum əsiri-zülfün,
Tərkini eşqün etməm, sən tək gözəl cəvanun.

Bərgi-gülə əl atma, gülzarı seyr edəndə,
Zəhmət çəküb, yıxarsan qəlbini bağbanun.

Çəkdi gülün gülabın əttar yanə-yanə,
Bülbül, nədür qəfəsdə bu naleyi-fəğanun.

Getdi cəvanlıq əldən, bir göz yumub-açınca,
Yox qılca e`tibarı bu bivəfa cəhanun.

Yusifdən iqtibas et, Saqib, qəzəl yazanda,
Əsrin Füzulisidür, kəc getməsün gümanun.

* * *

Cünuni-əsr mənəm, keçdi növbəti-Məcnun,
Mən ögrədəm gərək əhli-məhəbbətə qanun.

Başunda eylədi, Məcnun, sənün yuva quşlar,
Mənim başımda tiküb lanə çərxi-buqələmun.

Dəvam eyləmədi dərdü möhnəti-eşqə,
Əgildi yay kimi kuhi-Qaf qaməti-nun.

Əcəb degül sənün hicründə, ey kəmanəbru,
Gözümdən olsa rəvan rudi-Dəcləvü Ceyhun.

Məlamət etmə məni ney kimi fəğan etsəm,
Bu tiri-qəmzön urar dəmbədəm mana şəbxun.

Səbəb gözəlligün olmış, mana cəfa etdün,

Alar gözəlligüvi padşahi-kunfəyəkun.

Oleydi mümkin əgər, səndən əl çəkərdim mən,
Yox ixtiyar, sana eylə olmuşam məftun.

Məbada oynayasan, abiru gedər səndən,
Qumarə tab eləməz olsa dövləti-Qarun.

Günahı boynuma, iç badeyi-fərəhbəxşi,
Gər istəsön olasan lə`l kimi saf dərun.

Qul oğlı padşəh oldı, zəmanə etdi nələr,
Fəqət bu Saqibi-biçarə oldı bəxti zəbun.

* * *

Yetdi nə məqamə, nəzər et, tale`i-Məcnun,
Başında yuva eylədi quş, çətri-humayun.

Məcnunə gedüb kuhkəni dutma müqabil,
Yerdən gögə var fərqi, degül aşiqə qanun.

Əksi-rüxi-Şirini çəküb dağdə Fərhad,
Aləm görə tə`n etdi ona sakini-hamun.

Əmma gözini bağladı Məcnun dedi, hərgiz
Razi degüləm görməgə yari, o cigərxun.

Öpdi it əyağın, dedilər neyçün öpürsən,
Divanəsən, əlhəq kim olubdur itə məftun.

Gəzmiş gecələr it əyağı kuçeyi-Leyli,
Yetməz bu itün dırnağına dövləti-Qarun.

Kur eylədi Yə`qub gözin firqəti-Yusif,
Hər ləhzə edərdi ona möhnət oxı şəbxun.

Neydə nə içündür bu qədr naleyi-cansuz,
Çaldıqca könüllərdə edir möhnəti əfzun.

Min nalə ilə oldı cüda sevgilisindən,
Bu fitnəni salmış araya gərdişi-gərdun.

Eşqün mərəzi çarəpəzir olmayub, olmaz,

Acizdür əlacında onun gəlsə Fülatun.

Saqib, əlüvə almagilən daməni-zahid,
Pak eyləyə bilməz onı min çeşmeyi-Ceyhun.

* * *

Bənd olub könlümə bu zülfi-əbirəfşanun,
Nə olur halım hücum etsə əgər müjganun.

İstəsön canımi almaqlığa, ey şirinləb,
Qəmzə peykanı ilə al can, edərəm qurbanun.

Nəqdi-can dutmışam əldə, gözəlim, hökm eylə,
Ey qoyan bağrıma qan, gözləyürəm fərmanun.

Nə olur qanım itəndə, sana qurban olsun,
Qoyma sorsun dəxi əğyar ləbi-xəndanun.

Gözümün yaşı ətək çək ki, dutar damənüvi,
Gör, nə halə məni salmış ələmi-hicranun.

Olmaz idi bizə bu badeyi-gülfam həram,
Zahid, olseydi əgər zərreyicə imanun.

Nə həzər eyləyüm ol qəmzə oxun görsə əgər,
Qanımi kim deyəcək, itdi aradən qanun.

Necə hicran gecəsi eyləməyüm ahü fəğan,
Olmadı mümkin, öpeydim əyağın cananun.

Saqiba, yangilən hicran odına şəm` kimi,
Vəsldən qət` elə ümmid, çıxınca canun.

* * *

Həzər qıl ah odından, eyləmə cövri-firavanun,
Nə oldı bəs mənimlə etdigün ol əhdi-peymanun.

Həmavazəm cünun zəncirinə dəşti-cünun içrə,
Ona məşğul edübdür fikri-zülfi-ənbərəfşanun.

Özinə hər kişi məğrur ola, məğlub olur axır,

Özin alçaq dutan, axır olur sultanı dünyanun.

Qol atma, sərkeş olma, fəxr qılma təxti-Cəmşidə,
Hanı, viran olub bayqunişin mülki Süleymanun.

Həzər qıl, bərqi-aləmsuzdür məzlumlər ahi,
Deyüb başdan-əyağə, baxgilə, ayatı Qur`anun.

Yüzüvə sili kim ursa, yüzün dut bir də kim, vursun,
Qəbul etməz, nə çarə eyləmək, qoy, Məsihanun.

Fəğan çək, Saqiba, qəflət yuxusi bəsdür İslamə,
Ayılmaz xabi-qəflətdən, budur təklifi nadanun.

* * *

Nə oldı bəs mənilə etdün əhdi-peymanun,
Tökülməsün yüzüvə zülfi-ənbərəfşanun.

Dedün ki, şanə dəxi vırmaram bu giysuyə,
Vıranda tab eləməz ol dili-pərişanun.

Dağıtmasun yüzüvə telbətel, pərişandur,
Odur ki, yatmayur heç fitnəsi bu dövranun.

Deyürlə xəlq, həmağuşəm hər nəfəs sənlə,
Nəsibdür mana tə`ni-rəqib, hicranun.

Sana bir künci-qəfəs bəsdür, bağrıqan bülbül,
Solub nə ahü fəğandur, güli gülistanun.

Əmanətün yükinə tab etmədi əflak,
Qəbul eyləmədi, tabı vardur insanun.

Sorardı Leylini Məcnun əlində can nəqdi,
Başında quşlərə lanə, əsiri Leylanun.

Təməllüq etməgilən çərxi-duni-bədmehrə,
Ye, xuni-dil sana bəsdür, yox onda dərmanun.

Çəkərdi kim bu yüki olmaseydi gər Məcnun,
Necə mən olmaram, ey sərvnaz, qurbanun.

Sınıq piyaləyə bir qətrə badə almam,

Əgər verülsə mana kişvəri Süleymanun.

Əlün yetişməyəcək heç daməni-vəslə,
Fəraq bəs sana, Saqib, çıxınca bu canun.

* * *

O gündən kəşfi-rüxsar eylədün, mən oldum heyranun,
Vəli, etmiş pərişan könlümi zülfi-pərişanun.

Məlamət etməsün heç kim sana mən dinü dil verdüm,
Məni biixtiyar etmiş sənün bu çeşmi-fəttanun.

Nigara, girmə bağə, etməsün qan qönçələr bağrın,
Dəxi qan eyləmiş bağrım mənim ol lə`li-xəndanun.

Şəbi-hicranara bu əşkim damənim dutmış,
Qiyamət göstərür, ey səngdil, bu leyli-hicranun.

Qəmi-hicranun ilə başə gəldi ruzigarım kim,
Gözümdə məskən etmiş, çarə yoxdur, qanlu peykanun.

Dedim, ey dil, nigarun navəkilə rubəru durma,
Qan olmış, parə-parə olmısan axır itər qanun.

Mənə təklif qılma, zahid, ol Kə`bə mehrabın,
İbadətgah lazım ola, var əbrusi cananun.

Cigər qanilə, ey dil, qıl qənaət, şahə baş əgmə,
Əyağə düşmişəm, neylüm, qərarsun yüzi dövranun.

Əman, Saqib, inanma heç kimə, izhari-dərd etmə,
Fəqirə rəhm qıl, göz yağı ver, ya vergilə canun.

* * *

Bükdi qədimi Qaf tək əbruyi-kəmanun,
Düşdim oda, yandırdı rüxi-laləfəşanun.

Qiymət verülüb Yusifə gər Misr bəhasi,
Quldur sana Yusif gözəlisən bu cəhanun.

Sən eylə gözəlsən, sana dil verməmək olmaz,

Aramisən, ey mahliqa, pirü cəvanun.

Yox güldə təravət, əzilüb xar əyağında,
Bülbül, dəxi bifaidədür ahü fəğanun.

Oxlanmısan, ey dil, o məhün qəmzə oxından.
Çox ahü fəğan etməgilən, çıxdı zəbanun.

Çox etmə şikayət şəbi-hicran ələmindən,
Azad olursan o zəman kim, çıxa canun.

Məscid yolunı vəqf elədim zahidə, Saqib,
Dut guşeyi-meyxanə, odur darül-əmanun.

* * *

Firqətündə tökərəm göz yaşı Ceyhun-Ceyhun,
Yanar əhvalıma Fərhad ilə Məcnun, Məcnun.

Bisütun dağı gətürməz qəmə taqət-taqət,
Tökülüb üstümə möhnət yüki hamun-hamun.

İstəyüm çarəni mən dərdimə kimdən-kimdən,
Vırar hər ləhzə mana qəm oxı şəbxun-şəbxun.

Vay əlündən sənün, ey atəşi-hicran-hicran,
Şəm`tək yandı, dutuşdı oda kanun-kanun.

Daği Fərhad yıxub eylədi viran-viran,
Zərrəsin yıxmadı dövləti-Qarun-Qarun.

Qəmi-hicranə əlac etmədi badə-badə,
Sənsiz içdim dəri-meyxanədə peymun-peymun.

Şəm`vəş hicrdə yandı oda könlüm, könlüm,
Olmayeydi sana hərgiz belə məftun-məftun.

Sorar əğyar ləbündən genə şirin-şirin,
Yandı həsrət odına bu dili-məhzun, məhzun.

İnqilabun odı şiddətlənür hər gün, hər gün,
Olmasa birlik ilə, ədl ilə qanun, qanun.

Eşqi-mə`şuqəyə meyl eyləmə, Saqib-Saqib,

Qorx o gündən sana zahid deyə məl`un-məl`un.

* * *

Təxmir olundı qənd ilə, cana, məgər ləbün,
Sındırdı qiyməti-şəkkəri bu şəkkər ləbün.

Dövrü bəründə həlqələnüb zülfi-pürxəmün,
Əfsunsuz, təəccübəm, əf`i dutar ləbün.

Sormaq mana məhaldür, əğyar görməsün,
Ta hər nəfəs içirdməsə xuni-cigər ləbün.

Abi-həyat çeşməsinə meyl eyləməz,
Xızrun həyatıni tapar, hər kim əmər ləbün.

Tə`lim etdi mö`cizi İsabni Məryəmə(ə),
Göftar edəndə mö`cizə izhar edər ləbün.

Heyrətdə qoydı bülbüli şirin təkəllümün,
Lal etdi tuti nitqini, ey simbər, ləbün.

Qarun xəzinəsinə təfaxür çox etməsün,
Gövhərfəşanlıq etmədədür bəxtəvər ləbün.

Sağər öpəndə ləblərüvi qan olur könül,
Qoyma şərabi meyl edə şamü səhər ləbün.

Künci-səbudə bəhsin edir bu dodağuvun,
Gülçöhrə saqilə genə mey içər ləbün.

Yadi-ləbünlə meyi salmış əyağinə,
Meyxanəyə məni o səbəbdən çəkər ləbün.

Saqib bu bəhsdən elədi badə tövbəsin,
Bağrın odur ki, qan eləyür lə`li-tər ləbün.

* * *

Haci gedür ziyarəti-Beytül-həram içün,
Meyxanəni təvaf edərəm mən də cam içün.

Zahid, qulaq verən degüləm vəsfi-cənnətə,

Gəl, bu duanı, get oxı, napüxtə xam içün.

Meyxanə pirinə eləsəm sərfiru, nola,
Tə`zim edərlər xəlq gələndə imam içün.

Verrəm girov kim istəsə mehrabü minbəri,
Səccadəni, əziz meyi-lə`lfam içün.

Hər niknamlıq mana eşqün yolundadur,
Çoxlar verüb özin ölümə nik nam içün.

Bazari-hüsn içində düşər xəlq heyrətə,
Ey mahvəş, sən əzm eləyəndə xuram içün.

Nəzzarəsinə qaşlarınun xəlq cəm` olub,
El, rəsmdür, baxar məhi-eydi-siyam içün.

Qan tökməgi bu navəki-müjganlarun sənün,
Rumın sipahi tək düzülübdür nizam içün.

Dil saxlamadı həq sözi, Saqib, sən hər zəman,
Bəslənməyüb qılınc otursun niyam içün.

* * *

Zahid durar qiyamə rüku`i-qiyam içün,
Durram qiyamə mən bu qədi xoşxuram içün.

Durmuş nizamə navəki-müjganlarun sənün,
Bir-bir gözün fərib verüb qətli-am içün.

Xalü xətündən aslıdur, ey məh, gözəlligün,
Gör, var nə rütbə bircə bu qarə qulam içün.

Barmaqla əgri qaşlaruvı xəlq göstərür,
Mahi-siyamə gəlməyə bir də siyam içün.

Sərraf görməyüb bu gümüş tək biləklərün,
Görseydi gəzməz idi dəxi simi-xam içün.

Gər xəlq versə daneyi-əngurdən zəkat,
Mən vəqf elədim bu meyi-lə`lfam içün.

Saqib ölincə tərk eləməz ahü naləni,

Hər sübhü şam Yusifi-şirinkəlam içün.

* * *

Yaraşur, zülfüvi rüxsarə pərişan etdün,
Bu pərişanlıq ilə könlümi viran etdün.

Gəh tökürsən yüzüvə, gahi çəkürsən yanə,
Dinü dil xəlqdən aldun, məni heyran etdün.

Ögrədüb kim sana bu şivəni, ey şirinləb,
Bir qoyub baxmaq ilə qıyğacı min qan etdün.

Sürmə çəkdün gözə qarətgəri-küfri din olub,
Fitnə aləmləri dutmuş dəxi, tüğyan etdün.

Hüsn bazarıni sındırdı cəmalun əksi,
Tərk edüb Leylini, Məcnuni peşiman etdün.

Sana dil verməmək olseydi, könül verməz idim,
Qaşlarun tiği ilə sən mana fərman etdün.

Dedim, əğyarə könül vermə sorar lə`li-ləbün,
Acığımdan ona min busəni ehsan etdün.

Gözlə bir gün bitər, ey xari-müğilan, hüsnün,
Deyəcəklər sana, bəsdür, dəxi tüğyan etdün.

Əhsən olsun sana, ey Yusifi-şirinsüxən,
Natəvan Saqibi sən böylə qəzəlxan etdün.

* * *

Genə bu türreyi-mişkini pərişan etdün
Hüsnüvə, bu dili-divanəmi viran etdün.

Tiri-müjgan ilə qəsdi-dilü can eylərsən,
Dutar axır səni, bəsdür, bu qədr qan etdün.

Çıxma, yarım, gecə, qoy ay bata, ey şirinləb,
Əksi-rüxsarüvə heyran məhi-taban etdün.

Bağban çəkdi əlün sərvə, xəcalət verdün

Bağə, bu qəddi-qiyamətlə xüraman etdün.

Qoyma qan bağrıma bu lə`li-ləbün fikrilə,
Evimi yıxdun, əcəb dərdimə dərman etdün.

Soldı gülzar, nə cəh-cəh eləyürsən, bülbül,
Bilmədün qədri-güli, tərki-gülistan etdün.

Gülistan oldı xəzan, künci-qəfəsdə, bülbül,
Bəsdür, əl çək, bu qədr naləvü əfğan etdün.

Saqiba, sərf elədün ömri həvayi-nəfsə,
Uyma əfsanəyə, bəsdür dəxi tüğyan etdün.

* * *

Hərdəm qiyam edəndə sənün sərvi-qamətün,
Peyğam eylərəm dilə, qopdı qiyamətün.

Künci-səbudə badəni məst etdi ləblərün,
Ey şux, etdi Yusifi heyran məlahətün.

Etdün əsir könlümi zülfün kəməndinə,
Yatmış gözündə fitnəsi hər bir vilayətün.

Dəm vırma eşqdən, demə əhli-məhəbbətəm,
Pərvanə kimi olmasa gər istiqamətün.

Ey bülbül, eyləmə bu qədr ahü naləni,
Gülzar içində imdi ki, yox tabü taqətün.

* * *

Ey şux, gər qiyam edə bu sərvi-qamətün,
Görməz bu xəlq bir də qiyamın qiyamətün.

Dinü dil aldı dil genə səndən dönən degül,
Zalim, sənün bu qəmzələrün, bu nəzakətün.

Təkdi zəmanə içrə əgər Leyli hüsndə,
Artuqdu Leylidən sənün, ey məh, məlahətün.

Viranə könlümüz necə bir yerdə cəm` ola,

Şəh zalim olsa sahibi olmaz vilayətün.

Əğyardidəsən, səni ram etmək olmayur,
Can qoymayubdu heç dəxi məndə bu halətün.

Müjgan oxilə oxlanasan, ey könül, əgər,
Yox rəhm yardə, kimə olsun şikayətün.

Peymanşikənlərün səri-kuyinə getmə çox,
Ey dil, əmandu, tərkin eylə böylə adətün.

Aləm təmam kafər ola heç əcəb degül,
Vaiz əlinə çun keçüb əmri-risalətün.

Saqib, baş əgmə məscidə, mehrab küncinə,
Meyxanə küncidür yeri əhli-səlamətün.

* * *

Zahid çox eyləyür mana vəsfin qiyamətün,
Eylər qiyaməti mana bu sərvi-qamətün.

Yəğmayə getdi daneyi-xalunla küfrü din,
Sən fitnə saldun, oğrısısan sən vilayətün.

Söz yoxdur, hüsn xətm idi Yusifdə, Yusifim,
Yusifdə yoxdı  zərrəyicə bu məlahətün.

Yalvarma yarə, türreyi-zülfün əsiriyəm,
Tə`sir yarə eyləməz, ey dil, şikayətün.

Azad eyləməzlər əsiri, qaçub gedər,
Yox e`tibar səndə də, qaçmaqdur adətün.

Zahid, dolanma məscidə buyi-riya ilə,
Tərk et riyani, başuva dəgsün ibadətün.

Saqib, hərifi görsön əgər, dikmə baş yerə,
Bibaksən zəmanədə, yoxdur xəcalətün.

* * *

Əsiri-zülfün olum, verməz ixtiyar gözün,
Xədəngi-qəmzövə etmiş məni düçar gözün.

Çəməndə laləyə od vırdı arizi-alun,
Kim etdi nərgisi bimar, bu xümmar gözün.

Qaşun qılınca hökm etdi qanımı töksün,
Bu ləblərün soraram, etməz e`tibar gözün.

Necə mən eyləmüm vahimə, kəmanəbru,
Çəkəndə sürmə, mana qıyqacı baxar gözün.

Qaşun işarə edər, busə al bu məhvəşdən,
Alınca, bağrıma bir busə qan qoyar gözün.

Kəməndi-zülfüvə böylə əsir olmaz idim,
Nə etməli ki, edüb könlümi şikar gözün.

Məbada kəc baxasan, Saqiba, əman günidür,
Kim olsa gər sana ustad, tez yıxar gözün.

* * *

Cəhanə saldı əcəb fitnə, inqilab gözün,
Nə sehr eylədi bu xanimanxərab gözün.

Ayılmaz, olsa qiyamət, dutar səbu küncin,
Şərabi məst elədi məsti-nimxab gözün.

Əsirdür dili-divanə dami-zülfündə,
Bu iltifatı anə eyləmiş hübab gözün.

Xədəngi-navəki-qəmzön ki, qəsdi-can eylər,
Dəgəndə uf demərəm, etmiş intixab gözün.

Qaşun qılıncı tökər qanımı mənim, zalim,
Qan içməgə bu qədr etməsün şitab gözün.

Mey içməmiş mana bədməstlik sən eylərsən,
Vay halimə ola gər badədən xizab gözün.

Verdi rəqibə dil ol dilbəri ki, sən sevdün,
Oleydi kaş sənün, Saqiba, kəbab gözün.

* * *

Xərab qıldı məni məsti-nimxab gözün,
Cəhanə fitnə salub xanimanxərab gözün.

Xumar-xumar baxub yıxdun aləmün evini,
Qədəh-qədəh deyəsən meyl edüb şərab gözün.

Baxanda qıyqacı hərdəm yerindən oynar dil,
Xəta görüb salacaq əksi-inqilab gözün.

Gətürməm gözümi, sərvnazım, hüsnündən,
Gözüm gözündə qalub, qoydı məndə tab gözün.

Edərdi könlümi azad zülfi-pürçinün,
Kimə pənah aparum, qoymadı hübab gözün.

Açıldı qəmzön oxıyla könüldə rövzənlər,
Edüb bu navəki-cansuzi intixab gözün.

Gözəllərə eyləmə meyl, bivəfalərdür,
Şəbi-fəraq çəkər, Saqiba, əzab gözün.

* * *

Əgərçi nərgisi-bimarə oxşar, yar, gözlərün,
Xəta ahusinə bənzər vəli, dildar gözlərün.

Durubdur qətlimə bir-bir mənim müjganlarun tirin,
Həzər qılmaq gərək mərdümküşi-xunxar gözlərün.

Xumaraludə etmüb mey məni meyxanə küncində,
Mana məxmurlıq əl verdi bu xümmar gözlərün.

Könül mülkinə qıyqacı baxdun, getdi yəğmayə,
Gəlüb zinharə aləm səndəki səhhar gözlərün.

Gözümdən ayrı dut rüxsaruvı, yox tab görməkdə,
Günə kim qarşudursa, tez olur bimar gözlərün.

Pərişan eylə zülfün hüsnüvə, ey sərvi-azadım,
Həzər qıl bədnəzərdən, əf`i tək sancar gözlərün.

Nolur julidə görsön Saqibi, tə`n etmə, ey naşi,

Qəzəl ustadinə, görməz gözün, oxşar gözlərün.

* * *

Sərvə göstər sərvi-qəddün, sərv balalənməsün,
Ariz aç, gülzar içində lalə rə`nalənməsün.

Eyləmə azad, əsir et zülfüvün zəncirinə
Xaluvi qullar kimi, Adəm təmənnalənməsün.

Hüsn bazarın kəsad eylə bu məhrüxsar ilə,
Vadiyi-heyrətdə Məcnun bir də Leylalənməsün.

Lə`lə göstər ləblərün, bilsün ki, quti-candür,
Qıl xəcil yaquti də, qiymətdə ə`lalənməsün.

Bağban, gəl, girmə bağə, vırma əl gül bərginə,
Bülbüli-şeyda qəfəs küncində qovğalənməsün.

Eyləmə sərgərmi-badə, saqi, mey üftadəsin,
Guşeyi-meyxanədə aləmdə rüsvalənməsün.

Nərgisi gülşəndə, ey məh, eylə bimar etgilən,
Bir nigəhlə çeşmi-məstün kimi şəhlalənməsün.

Saqiba, məst et qəzəl səhbasi ilə aləmi,
Guşeyi-meyxanədə çirkab minalənməsün.

* * *

Kimdür hər ləhzədə min ahü fəğan eyləməsün,
Gözünün yaşını qan-seyl rəvan eyləməsün.

Daşürəkli fələyə kim deyə, zalim, bəsdür,
Bu qədr qəsdi-dili-pirü cəvan eyləməsün.

Verməkərəm dil sana, Şirin, degilən Fərhadə,
Özini boş yerə rüsvayi-cəhan eyləməsün.

Nə bəlali gün imiş mən sana heyran oldum,
Bari, bu lə`li-ləbün bağrımi qan eyləməsün.

Nə qədr eylə fəğan, yar uyacaq əğyarə,

Məqsədə yetməyəcək, kimsə güman eyləməsün.

Ömr beşgünlikdür, düşmə, könül, təşvişə,
Qoy, səni salmasun ağlarə, filan eyləməsün.

Saqiba, ahü fəğan ilə keçər ömr müdam,
Bir nəfəs xoş keçər, heç kimsə güman eyləməsün.

* * *

Şəm`i-rüxündə yax məni, pərvanə bilməsün,
Zülfün əsiriyəm demə, bu şanə bilməsün.

Müjgan oxını düzmüsən, ey şux, qətlimə,
Əbruləründə əgri kəman xanə bilməsün.

Divanə könlümün, nəzər et piçü tabinə,
Şanə vıranda zülfüvə, pəri, şanə bilməsün.

Mürği-dil uçdı türrələrün aşiyaninə,
Künci-ləbündə məskən edən danə bilməsün.

Sordım bu lə`li-nabuvı, məst eyləmiş məni,
Saqi əlində, qoy, dolı peymanə bilməsün.

Ey dil, gedəndə kuyinə ol sərvqamətün,
Ahəstə getgilən, dəxi biganə bilməsün.

* * *

Heyraniyəm bu qaşı kəmanun, bu məhvəşün,
Hüsni olurmı belə məgər abü atəşün.

Qıldım əsir könlümi zülfi-kəməndinə,
Halı keçər nə növ`, görüm, bu bəlakeşün.

Çox qoyma yanə-yanə məni, sərvqamətim,
Əğyarə uyma, axırı yox bu keşakeşün.

Sənsiz nə seyri-bağ edərəm, nə gül iynərəm,
Sənsiz nə ləzzəti meyi-gülfami-biğəşün.

Qəmzön oxilə qanımi tök, etmə vahimə,

Olmaz günahı sən kimi bir şux sərxoşun.

Ey dil, inanma gər desə vermən rəqibə dil,
Yox e`tibarı heç bu zülfi müşəvvəşün.

Saqib, piyalə al ələ, meyxanə künci dut,
Vəqti şərab ilə keçə, qoy, ömri-şeşbeşün.

* * *

Güli-rüxsarüvə badi-xəzan, ey məh, əsər bir gün,
Kəməndi-ahimə naləm səni, zalim, çəkər bir gün.

Qaçar səyyaddən ahu, görəndə çox da ram olmaz,
Fəzanun daminə, əflakə gər çıxsa, düşər bir gün.

Qəfəs küncində, bəsdür, eyləmə fəryad, ey bülbül,
Xəsü xaşak ilən həmzar olar güli-bərgi-tər bir gün.

Utan, ey çərxi-dun, bu bağrımi çox qanə döndərmə,
Bu dövründən fəğansız açmadım hərgiz səhər bir gün.

Tökər xunabi-həsrət gözlərim hicründə hər saət
Səni qərq etməgə, çox damənün çəkmə, dutar bir gün.

Vırar yaqutə tə`nə lə`li-nabun, ayə rüxsarun,
Gəlür bir dəm ki, səndən iksi də etsün həzər bir gün.

Cəhani çox də təsxir eylədün kəskin qılınc ilə,
Düşər əldən-ələ yeksər, gedər səndən hünər bir gün.

Çox əgri qoyma taci başuva, şövkətli sultanım,
Gedər yəğmayə, baxma, təxtü cahü taci-zər bir gün.

Təvəkkül damənindən, Saqiba, qət` etmə ümmidün,
Qəmə aludə ikən xoş xəbər səndən gəzər bir gün.

* * *

Heyran eləmiş məni hüsnün, şəmailün,
Etmə məlamət, olsa əgər xəlq mailün.

Ey sərvnaz, eylərdüm mən qeyrə dil əsir,

Azad eyləməz məni bu dami-kakilün.

Kən`anlər təfaxür edər hüsni-Yusifə,
Sən kimi dilrübasi var hansı qəbailün?

Ey dil, dolanma kuyinə ol sərvqamətün,
Yetdi rəqib vəslə, fəraq oldı hailün.

Zahid, hədisi-eşqdən heç bəhs eyləmə,
Bir zərrə rəmzin anlamasan* bu məsailün.

Gəldün bu deyri-möhnətə, Saqib, fəğan ilə,
Ruzi-əzəldən oldı sənün qəm həmailün.

* * *

Aləm təmam məhvi-cəmalundürür sənün,
Divanə eyləyən məni xalundürür sənün.

And olsun ol kəman qaşuvun əgri tağinə,
Adəmfərib daneyi-xalundürür sənün.

Ey mahparə, pirlik etmüb kəman qədim,
Xəm eyləyən bu əbru hilalundürür sənün.

Şad eylərəm bu könlümi vəslün xəyalilə,
Əmma rəqibə yar, vüsalundürür sənün.

Sordum, əqiqdür bu lə`ldür, dedi,
Dərmani-ahi-dərdi-məlalundürür sənün.

Sormaq olar dedim ləbün, ey şux, yox dedi,
Bu fikrə düşmə, nəqsi-kəmalundürür sənün.

Saqib, fəqihi-mədrəsə çox səhv eyləyüb,
Sölər şərabi içmə, həlalundürür sənün.

* * *

Pərişan eyləsön rüxsarüvə giysulərün tarın,
Kəsad eylərsən, ey mişkingiysu, mişk bazarın.

Xəcalət sərvə ver bu qamət ilən seyri-gülşəndə,

* Anlamazsan

Gözündən salgilən hər bağbanun sərv rəftarın.

Yüzün künci-qəfəsdə bülbülə, ey laləru, göstər,
Gözündə ləhzə-ləhzə xarə döndər qönçə rüxsarın.

Sana quldur, buraxma Yusifi bazari-hüsn içrə,
Gedüb bir qəmzə ilən sən peşiman et xəridarın.

Alınca ləblərindən kami-dil, bədxulığı tərk et,
Necə mən tərk qıldım dəhrdən Məcnun miqdarın.

Meyə meyl etmərəm, ey saqi, bu meyxanə küncində,
Salandə yadimə ol dilrübanun çeşmi-xümmarın.

Səbu küncində döndi qanə badə, düşdi təşvişə,
O gün sağər öpübdür bu məhün lə`li-şəkkərbarın.

Şəbi-hicrün qəmindən eylərəm ahü fəğan neytək,
Kəmançə tərk qıldı suzi-ahın, naleyi-zarın.

Müğənni, tari çək ağuşuvə, Dilkeşdən əl çəkmə,
Oxı sərgərmi-badə, şur ilə bu Saqib əş`arın.

* * *

Saqi məgər nolub verür özgəyə cam badəsin,
Gözləməyür nədür səbəb mən kimi bir fütadəsin.

Əhli-dilə nicat yox dutsa əlində nəqdi-can,
Bəxt ona qismət eyləmiş dərdü qəmün ziyadəsin.

Əşki-riyani, zahida, məscidə tökmə seyl tək,
Fahişə məscidə atar tifli-həramzadəsin.

Kim nə bilür bu gün-səba nə olacaqdur, ey könül,
Dövri-zəmanənün çətin bilmək olur iradəsin.

Kim sana vırsa silini, etmə şikayət heç kəsə,
Dəgməz əyağə daş əgər doğrı gedirsə cadəsin.

Əşhəbi-tizrəvilən kim yetişübsə mənzilə,
Sındırar at əyağını gözləməyən piyadəsin.

Xəlqə sözi dərin demə, diqqət elə, nə faidə,

Şe`ri yazanda, Saqiba, yaz sən həmişə sadəsin.

* * *

Mişki-tər bilseydi zülfün ənbərəfşan oldığın,
Xəlqə izhar eyləyərdi hər nəfəs qan oldığın.

Çox dedim bu könlümə eşqün təmənna etməsün,
Eyləmiş bilmir dəxi bilmərrə viran oldığın.

Mail olmazdım sana, tərk eyləməzdim dinü dil,
Bilməseydim hüsnüvi aşubi-dövran oldığın.

Verdi cənnət bağinə bu kuyüvi Adəm sənün,
Çox təəccüb eylərəm bilmüb peşiman oldığın.

Kə`bənün mehrabinə zahid çox eylər səcdəni,
Neyləsün biçarə, bilmir kafəristan oldığın.

Eyləmə mey tövbəsin təklif, zahid, könlümə,
İstəməz, əl çəkgilən, kafər müsəlman oldığın.

Eyləməzdi hər yetən həqqiyyətün izharıni,
Eyləyən xəlqün bilüb kim, məhzi-nadan oldığın.

Gər desəm halım mənim hərgiz pərişan olmayub,
Göstərür rüxsar o yarım pərişan oldığın.

Vaizi-bixud deyür, Saqib ki, Qur`an əhliyəm,
Bilməmişdür bu sözi Qur`anə böhtan oldığın.

* * *

Necə mən eyləyüm, ey dil, bu əbruyi-kəman tərkin,
Çətindür, eyləmək olmaz mənə təklifi-can tərkin.

Gözündə bülbülün yer dutsa ox tək xar min dəf`ə,
Öpər xarun əyağın, hərgiz etməz gülsitan tərkin.

Xəta ahusınun nafında olmaz müşkün asari,
Əgər giysuyi-yarun eyləsə ənbərfəşan tərkin.

Necə hicrün qəmindən nalə etmüm, ey kəmanəbru,

Haçan can yandıran ney eyləmiş ahü fəğan tərkin.

Ləbündən ayrı içeydim badəni, ümmül-fəsad oldı,
Verüb piri-muğan fitva, gərək etmək bu qan tərkin.

Biyabanlarda məskən dutmaz idi bağrıqan Məcnun,
Əgər mən etsə idim ol büti-namehriban tərkin.

Mana, zahid, deyürsən, içmə mey meyxanə küncində,
Məgər sən eyləyübsən huriyi-baği-cinan tərkin?

Gərəksiz çakərin sultan nə xeyri etməsün tərkin,
Əbəsdür eyləmiş Adəm məgər külli-cəhan tərkin?

Vətən girdab içində qərq olubdur, zahidi-kəcbin
Deyər, Saqib, gəl eylə, naleyi-ahü fəğan tərkin.

* * *

Demə bu ləblərim yaqutdür, arami-candur bu,
Nə var yaqutdə, ey qönçələb, ruhi-rəvandur bu.

Deyürsən sünbülü mişkindür bu zülfi-pürçinün,
Cünun zənciridür, dami-bəlayi-nagəhandur bu.

Xəmü əbrulərün oxşar əgərçi tağı-mehrabə,
Dedim baş əyməsün zahid ki, tiği-cansitandur bu.

Təvaf eylər sənəmlər kuyüvi, sən eylə məhvəşsən,
Bu hüsnün görsə kim sölər, məgər huri-cinandur bu?

Dili-sədparəmin halı nədür, gəl, sorma heç məndən,
Xəyali-ləblərünlə qanə dönmüş natəvandur bu.

Könül əğyarə verdün, sordı lə`lün, oldı qan bağrım,
Deyürlər sənünçün, səngdil, namehribandur bu.

Çağırma məscidə, əl çək, məni meyxanə küncindən,
Şərabi-Kövsəri vəsf eyləmə, yoxdur, yalandur bu.

Qəzəl arayişin məşşatə bilməz sən kimi, Saqib,
Bu nə təb`i-rəvandur var səndə, dürri-fəşandur bu.

* * *

Deyərdüm qaşlarun tərhini tiği-cansitandur bu,
Mana göstərdi bir-bir tiri-müjganun, kəmandur bu.

Desünlər üzmüşəm bu könlümi zülfün kəməndindən,
Desəm hüsnündəki ol daneyi-xalə, yalandur bu.

Utanmub Adəm etmiş daneyi-xalun təmənnasın,
Təmənna etmək olmaz gənci-hüsnə bağbandur bu.

Təəccüb eyləmə göz yaşi töksəm qamətün görcək,
Verür bu sərvnazə sərvqəddim bağbandur bu.

Gözündə sürməsiz, ey səngdil, min fitnələr yatmış,
Oyadma fitnəni, sərfitneyi-axirzəmandur bu.

Eşitdim qətlimə fərman alub əbrulərün tiği,
Gözündən canımi qurban edəydim mən, haçandur bu.

Cünun zənciri derlər zülfüvə gər görsə əfsungər,
Deyər gülzari-hüsn içrə düşüb əf`i ilandur bu.

Xəbər alma dili-sədparəmi, ey sərvi-azadım,
Xəyali-ləblərünlə göstərüm, gəl, gör, nə qandur bu.

Cəhanun şikvə etmə hər nə isə inqilabından,
Nə möhnət yüz verə, səbr et, məqami-imtəhandur bu.

Mana təklifi-tövbə etmə, zahid, əl gətür məndən,
Ayılmam məstlikdən, xidməti-piri-muğandur bu.

Yügürmə məscidə, Saqib, dolan meyxanə küncində,
Fəqihün qövlinə bel bağlama, darül-əmandur bu.

* * *

Demə, ey sərvnazım, türreyi-ənbərfəşandur bu,
Dili-üşşaq çün ram eylədi, nagəhandur bu.

Əcəb səyyaddür bu tiri-qəmzön qəsdi-can eylər,
Şikayət etməm ondan, rahəti-ruhi-rəvandur bu.

Xətadur gər desəm mən, qamətün çün sərvi-novrəsdür,

Qiyamət göstərür hər dəm, qiyamətdən nişandur bu.

Xəta ahusinə bənzər demə bu çeşmi-xunxarım,
Cəhanə fitnə salmış afəti-pirü cəvandur bu.

Tökər xunabi-həsrət, çeşmi-giryanım fərağundə,
Dutar el damənün, ey bixəbər, dəryayi-qandur bu.

Şəbi-hicran qəmin Məcnun bilər, keç, sorma Leyladən,
Haçan Məcnunə sordı, səndə nə ahü nəvadur bu?

Deyür çəksün hicran cəfasın, yetməsün vəslə,
Xəbər Məcnundən aldım, sölədi, get, get, yalandur bu.

Dedim, ey dil sana, bu mahvəş əğyarə dil vermiş,
Gətür əl, bivəfadur səngdil, namehribandur bu.

Şikayət etmə, Saqib, naləvü ənduhi-hicrandan,
Mana bu guşeyi-möhnətdə daim həmzəbandur bu.

* * *

Əksilməsün şərab ilə meyxanədən səbu,
Kövsər şərabını edərəm yoxsa arizu.

Biixtiyar sərfi-meyi-nab eylərəm,
Yadə düşəndə ləblərün, ey şuxi-mahru.

Bu qamətün xəyali ilə bağbani-dəhr,
Gözdən tökər sirişk, verür sərvnazə su.

Faş etdi xəlqə əksi-rüxün, vəsfi-arizün,
Ayinə ilə durma dəxi bir də rubəru.

Diş salmaseydi türreyi-pürpiçü tabuvə
Şanə, cəhanı dutmaz idi fitnə mubəmu.

Mən düşkini-bu meykədəyəm, camü badəyəm,
Zər xatirinə eyləmərəm şahə sərfiru.

Saqib cəhanda tərk eləyər e`tibarını,
Əlbəttə, qədrini itirür olsa kəm rücu.

* * *

Ayinə ilə durma çox, bəsdür, bu qədr rubəru,
Mail olursan hüsnüvə başdan-əyağə mubəmu.

Şanə ilə açılmaz ol zülfi-siyahdən girəh,
Mən açaram bir ahilə min dügün olsa pubəpu.

Görməgə istərəm səni dutmışam əldə nəqdi-can,
Eyləyərəm sorağuvi kuçəbəkuçə, kubəku.

Laləsifət fəraqdə göz yaşın eylərəm rəvan,
Dutmağa damənün sənün çeşməbəçeşmə, cubəcu.

Hansı gül arizün kimi bağdə rəngi-bu alub,
Eyləmişəm mən imtəhan laləbəlalə, bubəbu.

Vırdı rəqib Saqibə tə`nə şəbi-fəraqdə,
Oldı nəsibi sübhəcə naləbənalə, hubəhu.

* * *

Kim şanə vırdı zülfüvə, ey şuxi-mahru,
Dutmış cəhani fitnəvü aşubü hay-hu.

Cəm`iyyətin dağıtma bu divanə könlümün,
Sölə itəndə kimdən edim bir də cüstücu.

Çox etmə fəxr hüsnüvə, beş gün dəvam edər,
Çeşmün fədası, bax, edərəm şərh mubəmu.

Sordum üzari-Leylivü Şirinü Yusifi
Dün kuzəgərdən, ağladı fəryad qıldı u.

Camü piyalə arizi-Şirinü Leylidür,
Gəl, gör, cəmali-Yusif olub sağərü səbu.

İbrət göziylə eyləgilən xakə bir nəzər,
Bir vəqt xəlqə işvə satan sərvqəddü bu.

Gər istəsön ki, olmağa aləmdə eybsiz,
Öz eybüvi gör, olmagilən qeyrə eybcu.

Qıldım sücud qaşlaruvun əgri tağinə,

Başım kəsilsə eyləmərəm şahə sərfiru.

* * *

Gözümdə məskən etmiş navəki-peykanun, ey məhru,
Olub dəryalərə qarşu gözümdən qanlu axar su.

Kəməndi-zülfüvi görmək, könül min iztirab eylər,
Edər fəryad səyyadi görüb guya ki, bir ahu.

Əcəb sehr eylədi çeşmün, əlimdən dinü dil aldı,
Ki, heyran qaldı batil etmədi əfsungəri-cadu.

Dağıtma səfheyi-rüxsar ara ol zülfi-pürçini,
Əzizim, çin-çin et sal boynuma, dami-cünundur bu.

Demə ayineyi-hüsnümdə bu xali-siyahımdur,
Bu adətdü ki, oynar güzgu ilə bəççeyi-hindu.

Görürsən qamətim xəm, sanma pirəm, böylə xəm olmuş,
Qəmü hicrün büküb qəddim kəman tək, ey kəmanəbru.

Dedim, ey dil, təmənna etmə heç bir busə ol məhdən,
Vırubdur həlqeyi-matəm necə, bax, ol qəra giysu.

Məlamət eyləmə çox, ey deyən bəsdür, fəğan etmə,
Edüb divanə eşqində məni bir ənbərin giysu.

Eşitməz naləvi, Saqib, o məhvəş tərki-eşq eylə,
Məlamət künci dut hicran güni, çək naleyi-yahu.

* * *

Dildarə dedim, eyləmə əfşan yüzə giysu,
Qorxma dedi, nə əf`i, nə zəncir degül bu.

Sərriştəsidür ömrüvün, ey aşiqi-zarım,
Həmbu ola bilməz onilə bir güli-şəbbu.

Sən öylə pəriçöhrəsən, ey qaşı kəmanım,
Heyranun olar görsə bu rüxsaruvı güzgu.

Ögrəndi bu qıyğacı qıyub baxmağı səndən,

Ram olmamağı dəşti-Xəta içrə hər ahu.

Ol xal degül lə`li-ləbün küncini dutmış,
Kövsər bulağı üstə durub bəççeyi-hindu.

Gül yaprağına tə`nə urar arizi-alun,
Şahid bu sözə navəki-qəmzöndür bu abru.

Sövdayi-səri-zülfüvə düşdüm, qələt etdüm,
Azad eləməz məst gözün, eylədi cadu.

Eşqün məni rüsvayi-cəhan eylədi, getdi,
Hicründə çəküm mən nə qədr naleyi-yahu.

Ey saqi, görüm qanə döneydi, meyi-nabun,
İçdikcə mana qəm gətürür, vermə, bu ağu.

Mehrabdə vaiz eləyür xəlqə nəsihət,
Min dinün evin eylədi bərbad bu bayqu.

Saqib, nə qədər eyləyəsən naleyi-cansuz,
Əğyarə verübdür könül ol dilbəri-bədxu.

* * *

Çeşmi-məstün görə hər kim sənün, ey atəşru,
Mülki-Çin içrə sanur naz ilə yatmış ahu.

Dutaram nalə ilə daməni-zənciri-cünun,
Eyləyəndə yüzə, ey şux, pərişan giysu.

Qaşlarun tiği edüb sinəmi yüz min yerə çak,
Bənd dutmaz qıla kim rişteyi-Məryəmlə rüfu.

Sorma görcək səni göz yaşı rəvan etsəm əgər,
Bağban sərvin əyağinə tökər rəsmdü, su.

Sanma zülfündü urub həlqə ləbün küncində,
Dutdun əfsunsuz ilanlar, əcəb etdün cadu.

Düşdi dildən-dilə lə`li-ləbün fikrindən,
Dutdı meyxanə yolın əldə sürahivü səbu.

Nola hicran güni əhvalımi bir dəm görəsən,

Çəkərəm hicrün əlindən necə yahu-yahu.

Naşi bilmə rəvişin saliki-həqqün, zahid,
Əmri-həqdür ki, edə dürdi-şərab ilə vüzu.

Vaizün qövlinə bel bağlama, Saqib, hərgiz,
Gündə min din evi viranə qoyub ol bayqu.

* * *

Günəşin arizinə vırdun od, ey atəşru,
Ay necə tab eləsün, tök yüzə tari-giysu.

Bağə bu arizi-gülfamilə bir eylə xuram,
Yügürər öpməgə gül bərg əyağından şəbbu.

Çeşmi-məstün görə hər kim deyər, ey şirinləb,
Tağı-mehrabdə guya ki, yatubdur ahu.

Gələcəksən gər eşitsəm sorasan əhvalım,
Pişvaz eyləyərəm əldə sürahilə səbu.

Əlüvi dutdun üzə, tərlədi gül rüxsarun,
Hansı ustad sənün tək çıxarub oddan su.

Demə zülfim vırub həlqə bu ləbim küncində,
Dutdun əfsunsuz ilanlar, necə etdün cadu.

Sorma məndən, nədür halun sənün hicran gecəsi,
Firqətündə deyərəm sübhəcə, "yahu-yahu".

Naşi bilmə rəvişi-saliki-həqqi, Saqib,
Əmri-həqdür gər edə dürdi-şərab ilə vüzu.

* * *

Hekayəti-xəmi-zülfün olan degül kutah,
Uzun hekayətdür, lailahəilləllah.

Ləbün xəyalıni kim eyləsə, düşər qanə,
İtər aradə qanı, hər kim olsa da xunxah.

Cəza günündə sual etsələr gər məndən

Sitəm sana kim edüb, sölərəm bu zülfi-siyah.

Genə gözümdədür, ey şux, gördi rüxsarun,
Görəndə sevdi səni, sölə, məndə var nə günah?

Cəhanı fitnə odı yandırdı, təmam etdi,
Əsiri-nəfsə hanı çarə, neyləsün Allah.

Qədün qiyam edəndə qiyamətün günində,
Genə qiyam-qiyamətdən olmasan agah.

Az aç bu arizi-alun, könüllər heyrandur,
Dayanma göz qabağında, yoruldı çeşmi-nigah.

Kəmanə tə`nə vırar qaşlarun, yüzün ayə,
Həramzadədür əmma, iki gözün gümrah.

Gözümdə məskən edüb tiri-navəki-qəmzön,
Səbəb odur edərəm ahü naleyi-cangah.

Səni əlimdən alar, rəşk öldürür xəlqi,
Mənimlə olmagilən, sərvqamətim, həmrah.

Könül rəqibə verüb yar, əl gətür, Saqib,
Vəfası olmayana hərgiz ömri etmə təbah.

* * *

Neçün bu ahü fəğanımdan olmusan[*] agah,
Şəbi-fəraqdə bir lailahəilləllah.

Uduzmışam nə ki vardur, qumari-eşqündə,
Neçün məlamət edürsən, sən oynadun dilxah.

Yüzün işıqlığıdur bu günəş yuvağında,
Səbəb odur ki, alur pərtövini ondan mah.

Könül üzüm necə mən səndən, ey kəmanəbru,
Əsir edüb məni məcnunsifət bu zülfi-siyah.
Əsər ki etməyəcək, eylə bimürüvvətsən,
Nə qədr çəksəm əgər ahü naleyi-cangah.

Sorar rəqib ləbi-lə`li-nabuvi hərdəm,

[*] Olmursan

Əbəs yerə rəhi-eşqündə oldı ömr təbah.

Oxur həram ləbün yadı ilə mey içsəm,
Əlində daneyi-səddanə, zahidi-gümrah.

Cəhani məhv edüb övladi-Adəmün sitəmi,
Səbəbsiz olmamışam cümlə xəlqdən ikrah.

Müsəlman aləmini tərk qılgilən, Saqib,
Yetmiş muradə, apar küfr aləminə pənah.

* * *

Könüllər lə`li-nabun fikrilə qan oldı getdikcə,
Cəmalun əksinə ayinə heyran oldı getdikcə.

Dili-divanələr eşqün yolında, ey kəmanəbru,
Süleyman(ə) mülki tək bilmərrə viran oldı getdikcə.

Təqazayi-məhəbbət eylədi Məcnuni avarə,
Biyabanlarda həm rüsvayi-dövran oldı getdikcə.

Məlamət etmə, zahid, dinü dil məndən xəbər alma,
Şərabaludə verdim vəqfi-xuban oldı getdikcə.

Kimə izhar edim bu dərdimi, dərd anlayan yoxdur,
Vətən övladi bir-bir qanə qəltan oldı getdikcə.

İgirmi əsr ilən, ey fəxr edənlər, gör, nə aləmdür,
Biyabanlar sərasər qəbri-insan oldı getdikcə.

Vır imdi başuva həsrət əlilən, ağla qan, Saqib,
Dəlilər əgləşüb təxt üstə, sultan oldı getdikcə.

* * *

Lə`lün xəyalı ilə qan oldı xümdə badə,
Salmaq çətindür anı, ey sərvnaz, yadə.

Oxşatdı mey özini həmrəng ola ləbünlə,
Etdi həram anı zahid həramzadə.

Kim eyləsə təmənna sorsun bu lə`li-nabun,

Ey mahvəş, mənim tək qanı itər aradə.

Səndən könül üzərdim sevdayi-küfrü zülfün,
Taqət əgər qoyeydi mən zarü mübtəladə.

Gülrüx sənəmlər eylər daim təvaf kuyün,
Qoymaz bu tiri-qəmzön mən eyləsəm iradə.

Sən eylə məhliqasən, dil verməmək olarmı,
Yusif sənün qulamun, qul şahü şahzadə.

Xalü xətün xəyalın etmək xətalı işdür,
Rüsvayi-aləm oldı, Adəm qalub bəladə.

* * *

Dəri-meyxanədə görsön birini üftadə,
Əyağ ilən onı vırma, demə içmiş badə.

Ehtiram eyləgilən, niyyəti mə`lum degül,
Əlini dutmağa etmə özüvi amadə.

Girəm, içmiş meyi, tə`n eyləmə hərgiz, əl çək,
Özi bilsün, kişi aləmdə gərək azadə.

Sən də məscid qapusında yıxılursan hər gün,
Heç deyən yox sana, vermə əbəs ömrün badə.

Şərti-insaf degül incidəsən bir nəfsi,
Həzər et, uymagilən nəfs kimi cəlladə.

Diqqət et hər sözə, aldanma, həqiqət yolu dut,
Yetməsən* məqsədüvə, olmagilən çox sadə.

İmtəhan eyləməmiş vermə könül hiç kəsə,
Rəhi-eşqindən əyağ çək, ola gər şəhzadə.

Künci-xüm dutmasa, mey içmə, onı saf degül,
Başuvi ağrıdar içsön, qala qoy minadə.
Nə qədr badə duta künci-xümi safi-nüşur,
Saf olandan sora içsön, gəlür ağzun dadə.

Başuva tişə vırar söləməsön Şirindən,

* Yetməzsən

Vəsfi-Leylani nə hacət, eləmə Fərhadə.

Dutsa Saqib, nə əcəb, daməni-zənciri-cünun,
Türreyi-zülfüvi, ey şux, salandə yadə.

* * *

Zahid oxur şərabun vəsfin həramzadə,
Mə`nayi-"nəf`i-nas"ə* heç etməyür iradə.

Dutduqca künci-məscid eylər qəsalə bəxşin,
Yaqutə tə`nə eylər qaldıqca xümdə badə.

Zahid, məlamət etmə aludeyi-şərabəm,
Neylüm səni görəndə dərdim olur ziyadə.

Dün kuzəgər əlində gördüm sınıq piyalə,
Aldım xəbər bu kimdür, ney kimi gəldi dadə.

Təsxir etmiş idi aləmləri, əzizim,
Keyxosrovi-zəmandur, oxşatma Keyqubadə.

İskəndər harda qalmış sordum, bir ah çəkdi,
Ayırmaq olmur ondan uymış həvayə, badə.

Dünyayi-bivəfanun yox qılca e`tibari,
Saqib, rəhi-fəna dut, qalmaq neçün buradə.

* * *

O gün oleydi içeydim şərabi asudə,
Müdam xüm əyağında, xumaraludə.

Ləbim oleydi ləbində bu sərvi-azadun,
Keçirdim ömri-əzizi nə qədr bihudə.

Görünməsön gözümə, ağlaram fəraqunda,
Soraq hüsnüvi etdim, mən oğrı güzgudə.

Qaşun qılıncı necə könlümün tökər qanın,
Olub əsir bu könlüm bu dami-giysudə.

Əcəb degül, sənün eşqün yolunda rüsvayəm,

* Qurani-kərimin Bəqərə surəsinin 219-cu ayəsinə işarədir.

Nə etmədi qəmi-eşq Əyazü Məhmudə.

Dutardı daməni-səhranı bağrıqan Məcnun,
Əgər oleydi vəfa Leyliyi-cəfacudə.

Bu lə`li-nab nədür səndə, qıldı qan bağrım,
Edər hekayətini xəlqi-aləm hər sudə.

Bu tiri-qəmzövə canım fəda edəndə nolar,
İtirmə qanımı, zalim, bu tiği-əbrudə.

Şərab içməgini eyb etmə Saqibə, əl çək,
Fəsadlıq hanı, zahid, şərabi-gülrudə.

* * *

Dolanmaz sağərü mey bir nəfəs naşad olan yerdə,
Dönər qanə səbudə, naləvü fəryad olan yerdə.

İnanma, kim desə, böhtandur, azadəlik vardur,
İlanda zəhr olmaz doğrıdan azad olan yerdə.

Necə xürrəm dil olsun, ney kimi zar etməsün hərdəm,
Dönər əlbəttə qanə, rəhmsiz cəllad olan yerdə.

Vətən gülzari soldı, bağban əl çəkdi gülşəndən,
Ocaqda kül də qalmaz naxələf övlad olan yerdə.

Peşimanlıq çəkərsən, vaqif etmə xəlqi sirründən,
Nə məslək əhlisən, izhar qılma yad olan yerdə.

Ərəqdən ictinab et, badeyi-gülfamə meyl eylə,
Həmişə fitnə qalxar fitnə, bədbünyad olan yerdə.

Danışma zövqi-şe`ri bilməsən, ləbbəstədür Asəf,
Ədəb kəsb etgilən Saqib kimi ustad olan yerdə.

* * *

Məni dindirməyür ol sərvqəd əğyar olan yerdə,
Mənim də ixtiyarım qalmayur dildar olan yerdə.

Üzari-aluvi xətt eyləyüb təsxir, var vəchi,

Bitər, bu rəsmdür xarü tikan, gülzar olan yerdə.

İlan tək qıvrılur divanə könlüm, ey kəmanəbru,
Əmandur, vırma şanə türreyi-tərrar olan yerdə.

Əraqü Kabildən, ey müğənni, keçdi Çargahə,
Kəmançə verməz iş, ney naləsilə tar olan yerdə.

Qədəm, əlbəttə qoymaz guşeyi-meyxanəyə zahid,
Dolanmaz kafər hərgiz, ölsə də küffar olan yerdə.

Zəmanə gündə yüz min rəngə girmiş, heç eyb etmə,
Nə etsün bu zəmanə, adəmi-bikar olan yerdə.

Giriftar etmə, Saqib, nəfsüvi bu qeydi-İslamə,
Yetərsən sərhədi-məqsudüvə küffar olan yerdə.

* * *

Məni almaz nəş`ə xümdə naləvü fəryad olan yerdə,
İçərsən, artırur möhnət sana naşad olan yerdə.

Danışma Leylidən Məcnun kimi, Şirindən sölə,
Əlündə tişeyi-fuladı dut, Fərhad olan yerdə.

Tapulmaz zərrəcə zəhri-yilan əf`i kamında,
Olur ruhun qəzası qeyddən azad olan yerdə.

Vətən gülzarı soldı, bağban əl çəkdi gülşəndən,
Ocaqda kül də qalmaz naxələf övlad olan yerdə.

Fəqihün qövlünə bel bağlama meyxanə küncində,
Ayılma məstlikdən ta əbəd cəllad olan yerdə.

Yaneydun şö`leyi-ahimdə, Adəm, necə mən yandum,
Neçün gəldün, nə vardur, sölə, bu bərbad olan yerdə.

Kişi izhari-nifrət eyləyər min il gər ömr etsə,
Dayanmaz bir nəfəs, sərfitnədür, arvad olan yerdə.

Məlamət etmə, ey Saqib, qəzəlsənc oldığımdandur,
Oturram fəmim ləbbəstə mən ustad olan yerdə.

* * *

Sana insan deyürlər əksi-insan olmayan yerdə,
Yaşar insanlar insan ilə heyvan olmayan yerdə.

Yağar, əlbəttə, od gögdən, edər dünyanı xakəstər,
Mürüvvət gözləmə vicdanlı sultan olmayan yerdə.

Qaçar əf`i, dayanmaz zalimün amali-nəfsindən,
Əsiri-div olur aləm Süleyman(ə) olmayan yerdə.

Açar balü pərin xəffaş, eylər seyr əflaki,
Yetər məqsudinə xurşidi-rəxşan olmayan yerdə.

Nihali-əmnə sən su vermə heç, hər ləhzə boy artar,
Təravət göstərür nahəq yerə qan olmayan yerdə.

Necə yüz dutmayum səhralərə Məcnuni-rüsva tək,
Dolanmaz əsl aşiq əhdi-peyman olmayan yerdə.

Məlamət etməsün heç kim məni ney tək fəğan etsəm,
Dayanmaz göz yaşım bir ləhzə canan olmayan yerdə.

Gedirdim bir gül içün gülsitanə, verdilər getdi,
Qaçar pərvanələr şəm`i-şəbistan olmayan yerdə.

Mənim bu qan olan könlüm açılmaz min bəhar olsa,
Qəfəs küncin sevər bülbül gülistan olmayan yerdə.

Olur batil asari-kəlmeyi-həq, hərçi fəryad et,
Dutar dünyanı fitnə tiği-bürran olmayan yerdə.

Deyürsən, Saqiba, əş`ari şirin şəhdü şəkkər tək,
Kəsadi-şe`ri-Tahirdür şəməndan olmayan yerdə.

* * *

Deməzlər Qeysə Məcnun eşqi-Leyla olmayan yerdə,
Kəsərlər dil, desön Yusif, Züleyxa olmayan yerdə.

"Ənəllah" söləsə Fir`on, təəccüb etmərəm hərgiz,
Edər isbat əmrini xəlqə, Musa(ə) olmayan yerdə.

Təlatüm qətrə eylər özligində xəlqi qərq etsün,

Düşən boş arzuyə şuri-dərya olmayan yerdə.

Şərabi-Kövsəri zahid təmənna eylər hər saət,
Sınıq meyxanələrdə cami-səhba olmıyan yerdə.

Urar dəm eşqdən, gül yaprağilə oynayar bülbül,
Düşən səhralərə Məcnuni-rüsva olmayan yerdə.

Giriftar eylər idim könlümi zünnari-Məsihə,
Cünun zənciri tək zülfi-çəlipa olmayan yerdə.

Öpərdim nərgisün gülzar içində çeşmi-məstindən,
Bu sərvnazdə bu çeşmi-şəhla olmayan yerdə.

Çağırma cənnətə, zahid, məni, gəl, əl gətür məndən,
Nə ləzzət almaq olsun hüsni-ziba olmayan yerdə.

Sözüm yoxdur, Skəndər saldı bu dünyani təsxirə,
Dutar, əlbəttə, dünya tiği-Dara olmayan yerdə.

Mana təklif qılma badeyi-gülfami, ey zahid,
Nə nəş`ə var şərabunda dilara olmayan yerdə.

Giriftar eylədi Adəm məni bu deyri-möhnətdə,
Yaşardım, Saqiba, aşubü qovğa olmayan yerdə.

* * *

Vəfadən vırma dəm, ey sərv boylum, yox vəfa səndə,
Vəfa rəsmini məndən gözlə, gördüm min cəfa səndə.

Əgər yüz min mana cövr eyləsön, əl çəkmərəm səndən,
Əgərçi görmərəm qəm yüz verəndə e`tina səndə.

Yanımdan keçmə, hüsnün atəşi yandırdı bu könlüm,
Uzaqdur, bimürüvvət, məndən əl çək, var xəta səndə.

Yaraşmaz heç sana ayinə ilə rubəru durmaq,
Pəriçöhrə, iki ayineyi-gitinüma səndə.

Dili-divanə məndə, qoyma qaçsun, ey kəmanəbru,
Pərişan tökmisən rüxsarüvə dami-bəla səndə.

Deyürsən, get təbibə, çarə qılsun eşq dərdinə,

Təbibə getmərəm, şəkkər kimi şirin dəva səndə.

Əgər sorson nədür şəkkər kimi şirin dəva məndə,
Ləbi-gülbərgi-tər yaqutvəş ruhə səfa səndə.

Əl atma qətlimə fərman verəndə tiği-əbruyə,
Alur can bir nigahun, məstdür çeşmi-qəra səndə.

Necə etmüm təəccüb vadiyi-heyrətdə hər saət,
Məgər e`cazdür, Saqib, bu şe`ri-canfəza səndə.

* * *

Pərişan zülf səndə, türreyi-ənbərəfşan səndə,
Dili-üşşaqdən əbruyi-tiği-cansitan səndə.

Cünun zəncirisən, ey zülfi-pürçin, qalmışam heyran,
Dili-divanələr hərdəm dutar neyçün məkan səndə?

Biyaban seyrini tərk eylə, Məcnun, düşmə avarə,
Dəxi nə qəm çəkürsən, dilbəri-namehriban səndə.

Gülistan dutdı od, tər qönçələr yeksər xəzan olmış,
Qəfəs küncində, ey bülbül, nədür ahü fəğan səndə.

Qiyamət macərasın zahidə, ey sərvqəd, bildir,
Bu qamətlə qiyam et, qaməti-sərvi-rəvan səndə.

Genə mehrü məhəbbət üzmərəm, ey səngdil, səndən,
Vəfa rəsmin görübdür, bimürüvvət, kim haçan səndə?

Gözün qurbani, saqi, bari-qəmdən qamətim xəmdür,
Girov al dinü dil, ver badeyi-ruhi-rəvan səndə.

Nə qədri var gözəllik, kam ver üşşaqə lə`lündən,
Gəlür bir gün tapulmaz zərrəcə namü nişan səndə.

Yeddi iqlim ilə fəxr et, Azəristan, düşmə təşvişə,
Əvət, Saqib kimi bir şairi-mö`cüzbəyan səndə.

* * *

Heyrətdə qoydı badəni cami-bülurdə,
Yaqut ləblərüvün hanı bu lə`li-hurdə.

Könlüm əsirdür xəmi-zülfün kəməndinə,
Azad eylə, qalma bu kibrü qürurdə.

Əl çək, müğənni, nəğmeyi-Şəhnazə mailəm,
Şurın çıxartma, qalmagilən çox bu Şurdə.

Ey əndəlib, tərk elə bu ahü naləni,
Gülzar içində gül vərəqində hüzurdə.

Mən neyləyüm ki, yardən ayrı fəraqdə,
Xunabi-rəşkə qərq, təvan yox səburdə.

Gün arizini kəsb edə bilməz min il əgər,
Xəffaş qərq gər ola dəryayi-nurdə.

* * *

Zərrəcə, ey dil, vəfa yox yari-gəndümrağdə,
Dil verüb əğyar ilən hər gündə seyri-bağdə.

Ey soran eşqün nədür mə`nası, get, Məcnunə bax,
Görmisən Məcnun kimi rüsva qəradə, ağdə?

Dün güzarım düşdi birdən guşeyi-meyxanəyə,
Bir gözəl gördüm yazır bu beyti ağ beyrağidə.

Saqi, vermə, al gətür, məndən qan olmuş badəni,
Ta bekey qalsun vətən oğlanları dustağdə.

Qanuvun bil qiymətin, axdırma boş, bica yerə,
Tök vətən eşqində, yaz, bilsün qızıl bayrağdə.

Guş qıl tarun sədasından, eşit bu nəğməni,
Yet Vətən imdadinə, əl çək, nə var oynağdə.

Naleyi-cansuz ilə, get, sən eşit ney naləsin,
Nə qədəhdə var səfa, ləzzət nə kiştirağdə.

Yox deyən Fərhadə, bəsdür, dağə urma tişəni,
Yar olub əğyarə Şirin, hanı Şirin dağdə.

Qoca zahidsən, vətən qeydindən azad olmusan,

Qeyrətü namus olmaz sən kimi sərsağdə.

Saqiba, düşmən bir olsa, var onun tez çarəsi,
Çarə olmaz birsi solda olsa, birisi sağdə.

* * *

Fəraqi-Leylidə Məcnun qaldı heyrətdə,
Bəlayi-dərddən özgə nə var məhəbbətdə.

İtün əyağın öpüb Leyli kuyinə getmiş,
Nə vahimə eyləmüb xəlqdən, nə töhmətdə.

Soraq Leylini naqusü naqədən eylər,
Rəqiblər gecə-gündüz müdam işrətdə.

Həvayi-eşq idi Fərhadi kuhkən etmiş,
Nə hasil etdi öziçün məgər bu şöhrətdə.

Bu eşq aləminün böylədür təqazası,
Məhəbbət əhli keçər ehtiramü hörmətdə.

Vırar özin oda pərvanə, əql heyrandur,
Yananda həzz aparur çəkdigi əziyyətdə.

Gər eşq hökm eyləsə, yandur oda Kə`bə evin,
Gərək ki, yandırasan, qorxma bir məzəmmətdə.

Bu mahparənün eşqindən əl gətür, ey dil,
Əlün yetişməyəcək, yandun ah, həsrətdə.

Xəyalun almaqdur kam lə`li-nabından,
Xəyali-xamdür əmma, gər olsa qismətdə.

Çağırma məscidə bu Saqibi, get, ey zahid,
Nə faidə olacaq sən edən nəsihətdə.

* * *

Xoş günlər idi keçdi məstanə hər tərəfdə,
Sağər əlimdə sərxoş, rindanə hər tərəfdə.

Namərdə kim, zər içün baş əgmədüm cəhandə,

Keçdi ki, taci-sərdüm sultanə hər tərəfdə.

İzhari-bilməməklik heç kimə etməz idim,
Bir kamili-zəmandım, fərzanə hər tərəfdə.

Bir anü bir dəqiqə heç olmadum qəmalud,
Gülçöhrə saqi hər yan, meyxanə hər tərəfdə.

Ol sərvi-novrəsidə dil verməz idi qeyrə,
Döndükcə kam alurdum hər yanə hər tərəfdə.

Yə`qubə bir deyən yox, bəsdür bu ahü nalə,
Min Yusifim düşübdür zindanə hər tərəfdə.

Salmış bu damgahə dövran məni sitəmlə,
Çunü çəradu yeksər əfsanə hər tərəfdə.

Gəh Kə`bəyə yügürrəm, gəh məscidə yüz üstə.
Cənnət xəyalı salmış od canə hər tərəfdə.

Zahidlə həmdəm oldum məsciddə, deyr içində,
Səccadə hər tərəfdə, səddanə hər tərəfdə.

Hər guşədə edür xəlq, bəh-bəh, risalət izhar,
İnkar oxın urarlar Qur`anə hər tərəfdə.

Ey vay, getdi əldən qəflətdəkən Vətənmiz,
Əğyar hər tərəfdə, biganə hər tərəfdə.

Saqib, təməllüq etmə namərdə baş gedincə,
Xuni-cigər yetər bəs peymanə hər tərəfdə.

* * *

Ya dust, dedim deyri-qəmabadə gələndə,
Bildirdi mana dust bu bərbadə gələndə.

Aludeyi-möhnət özüvi etmə, həzər qıl,
Tərk et dilü din sağər ilə badə gələndə.

Min fikri-fəribin sana dövran satacaqdur,
Aldanmısan naz ilə irşadə gələndə.

Yüz şivələr icad ərus eyləyəcəkdür,

Məşşatə ilə hicleyi-damadə gələndə.

Eymən özüvi dutmagilən qəhbə fələkdən,
Tapşurdı ki, qanun içə cəlladə gələndə.

Bənd etsə səni gər xəmi-giysuləri yarun,
Təngişmə gəlür dam hər azadə gələndə.

Vermə qəmə yol, qoyma tapa əl sana hərgiz,
Bərbad eləyər hər dəli abadə gələndə.

Tə`zim elə dildarə gələndə, dur əyağə,
Xəlq hörmət edər sevgili şəhzadə gələndə.

Fəsli-güli sal əndəlibün yadına hər dəm,
Ney kimi qəfəsdə genə fəryadə gələndə.

Saqib yorulub, gəlməgi mümkin degül əsla,
Çək sinəyə gül ətrini o yadə gələndə.

* * *

Ey bülbül, az fəğan et, gül qalmadı çəməndə,
Qalmub lətafət hərgiz rüxsari-nəstərəndə.

Ahun şərari yaxmaz xarü xəsi qəfəsdə,
Aşiqligün nişanı yox zərreyicə səndə.

Ey dil, dedim dolaşma zülfinə bu pərinün,
Sancar səni ilan tək, yox qılca tab məndə.

Ney tək fəğan edürsən, bildim ki, sancılubsan,
Yaxşı məsəl çəküblər, təqsir var öləndə.

Sən heç demə rəqibə, dil ver bu sərvqəddə,
Çoxdan könül veribdür, aldanma bu ləvəndə.

Zahid, məlamət etmə rüsvayi-aləm oldum,
Dinü dil aldı məndən bu şux xəndə-xəndə.

Gördüm ki, sağər əldə saqi durub qəmalud,
Sərməsti-badə idim meyxanədən keçəndə.

Aldım xəbər, neçün sən min dərdə mübtəlasən,

Bir tünd ah çəkdi, durma dedi vətəndə.

Övladi-naxələflər yoldaş sözinə satdı,
Bir vəqt ayıldı gördi, salmış özini bəndə.

Saqi, gözün fədası, olmış olan keçibdür,
Doldur sınıq səbuni, ver, bari, dərdməndə.

Saqib, işi bitibdür şəhrün, kəs ülfət ondan,
Eylə təvaf kuyin sən tə`zim eylə kəndə.

* * *

Müsəvvir qaşlarun tərhin çəküb şəmşir şəklində,
Kəməndi-zülfüvi divanəyə zəncir şəklində.

Yatubdur məst nazın hər gözündə bir cəhan fitnə,
Yarub bağrım mənim ahu kimi ol şir şəklində.

Könül mülkini sən bərbad qıldun bir nigah ilən,
Çətindür bir də olsun, səngdil, tə`mir şəklində.

Gözümdə məskən etmiş, çəkməz əl məndən kəmanəbru,
Dil eylər nalə ney tək hər müjön bir tir şəklində.

Könül qan olsa da üzmək könül mümkin degül səndən,
Qəmi-eşqün edübdür qamətim xəm pir şəklində.

Behiştə sallanursan rişteyi-təsbih ilə, zahid,
Verürlər cənnəti hər bir işün təzvir şəklində.

Rəqibə vermə dil, bu göz yaşımdan ehtiraz eylə,
Dutarmı damən el olsa əgər təqtir şəklində.

Şərabi-nab vəsfi “nafe`i-linnas”dür ya yox,
Oxursan, zalım oğlı, dəmbədəm təkfir şəklində.

Mənəm Azəristanun şairi, Azərdən ögrəndim
Qəzəl arayişini, Saqiba, iksir şəklində.

* * *

Qan qoydı mənim bağrıma bir əhdbüridə,
Əbrusi kəman, kiprigi ox, zülfi xəmidə.

Etmək necə olsun şəbi-hicranüvə taqət,
Ey qaməti sərvi-çəməni-tazərəsidə.

Qovson məni, gəlləm genə yüz üstə dalunca,
"Çün tifli-dəvan dər peyi-goncək dəvidə".*

Gəlləm demiş idün sən ilə içməgə badə,
Bu ləblərimün yadı ilə ta sübhi-dəmidə.

Ta sübh səni gözləmişəm, çıxdı yadundan,
Əhd eylədigün olma rəqibə girəvidə.

Dut damənüvi, durmagilən göz qabağında,
Qərq eyləməsün dideyi-xunabi-çəkidə.

Gər lafi-gözəllik vırasan, söz deyən olmaz,
Yox ayineyi-hüsn nə hurü nə pəridə.

Xəlq eylə bilür sübhəcə lə`lün soraram mən,
"Gürgi-dəhənaludəvü Yusif nədəridə".**

Sən tək gözələ dinü dili verməmək olmaz,
Sən tək gözəl aləmdə "ke didə, ke şənidə".***

Məndən gilə eylər o pəriçöhrə dəmadəm,
Neyçün demişəm mən ona, lə`lün "ke məkidə"?****

Saqib, qəzəlün şivəsi imdi sana yetmiş,
Xətm etmisən imdi, elə inşayi-qəsidə.

* * *

Ey sərvqədü mahvəşi-tazərəsidə,
Qıl əhdə vəfa, olmaginən əhdbüridə.

Kam heç kimə verməm demə, bu lə`li-ləbündən,
Lə`ündə nədür bəs görünür zəxmi-məkidə.

Qaşun qəmidür qəddimi döndərdi kəmanə,

---

* Uşaq sərçənin arxasınca qaçan kimi (Sədi Şirazinin "Ey yare-cəfakərdeyi-peyvəndboride, İn bud vəfadariyo əhde-to nədide" mətləli qəzəlindən iqtibas olunmuşdur)

** Canavarın ağzında olan, lakin parçalanmayan Yusif.

*** Kim görüb, kim eşidib

**** Kim əmib

Tə`n eyləmə görsön qədimi, qaşı xəmidə.

Hicranüvə tab eyləyə bilməz dili-zarım,
Fəryadə gəlür ney kimi çün əf`i güzidə.

Hərgiz demərəm mən sana, ey Yusifi-sani,
Bu hüsn ola bilməz nə mələkdə, nə pəridə.

Durma gözümün qarşusına, mahvəşim, keç,
Xunab tökər, çək ətəgün, mərdümi-didə.

Zülfün nə edər şanəni, zənciri-cünundur,
Bənd et dili-divanəmi, olson girəvidə.

Mən gəndümi-rüxsarlər eşqində əsirəm,
Meyl eyləmərəm zərrəcə rüxsari səfidə.

Saqib, belə şirin qəzəl sən ki, deyürsən,
Əhsən sana aləmdə, "ke didə ke şənidə".

* * *

Dil mübtəla bu türreyi-ənbərşəmimidə,
Can rahəti bu lə`li-ləbi-lalə kimidə.

Meyxanələrdə lə`li-ləbün meypərəstiyəm,
Yoxdur bu nəş`ə badeyi-gülfamrəsimidə.

Bihuş eylədi məni kim, buyi-kakilün,
Badi-səba əsərmi genə bu nəsimidə.

Əbrulərün qılıncı ilə al bu canımı,
Göstərmə tiri-qəmzə mana, qoyma bimidə.

Zahid fəsad oxur mana bu dürdi-badəni,
Etməz fəsad zərrəcə qəlbi-səlimidə.

Aləm mana qul oğlı qul olmışdı sərbəsər,
Çıxmış gözüm oleydi əgər lə`lü simidə.

Zülfün xəyalı ilə edər ahü naləni,
Ey şux, yoxsa nalə olar xüşk simidə.

Yetməz təmamə, sərvqədim, vəsfi-arizün,

Vəsf etməgə o cür`ət hanı bir fəhimidə.

Arif sanur yetən özüni, heç nə bilməyür,
Arifligün əlaməti qalmış qədimidə.

Saqib, sən etmə tövbeyi-mey, məst ol müdam,
Məskən bizə behiştdə olar, ya cəhimidə.

* * *

Gedəndə, dut ələ can nəqdi, kuyi-dildarə,
Ədəb mülahizə et, versə də dil əğyarə.

Təəccüb eyləmə olmaz vəfa gözəllərdə,
Nədür səbəb eyləyən aşiqün günin qarə.

Desön, rəqibə könül vermə, yüz dutar səndən,
Əlac dərdüvə olmaz, düşərsən avarə.

Dəvam eyləmisən, uyma atəşi-hüsnə,
Nə bais oldı ki, pərvanə yandı odlarə.

Dolaşma, qaç, səni azad eyləyən olmaz,
Əsir olson əgər dami-zülfi-tərrarə.

Yəman dərddür, yox çarə, ayrılıq dərdi,
Neyün fəğaninə bax, ahi-naleyi-tarə.

Təbib çəkməz əlin dərdimün əlacindən,
Hanı təbibə deyən, dərdi-eşqə yox çarə.

Həzər edərdim həmişə bu tiri-qəmzöndən,
Bu xəstə könlümi min parə etdi məhparə.

Qəzəl zəmani degül, hər yetən deyür, Saqib,
Qulaq verməgilən, dinü dil ver əş`arə.

De sən də, bari ki, nadanlığun zəmanı degül,
Yox heç nədən xəbərün, çıxma böylə bazarə.

* * *

Nə hacət, arturursan zinəti bu mahi-rüxsarə,
Verür zinətsiz hüsnün, sərvqədim, rəşk gülzarə.

Pərişan etməyüb badi-səba giysuyi-pürçinün,
Edüb ahim pərişan mürği-dildə, düşmüş avarə.

Deyürsən könlüvi bir yerdə cəm` et, çox pərişandur,
İtübdür firqətündə itlərün ağzında hər parə.

Dedim ayinəyə göstərmə üz, ey şux, hər saət,
Üzarun əksin oğrar, göstərür hər ləhzə əğyarə.

Necə xunabi-həsrət tökməsün bu göz bulağından,
Ləbün kam alur əğyarvar bu dərdə bir çarə.

Nədür təqsiri şəm`ün, canı çıxsun, yandı pərvanə,
Yanar, əlbəttə, hər kimsə özini vırsa odlarə.

Demə sən, Saqiba, ol məhvəşə mail degül könlüm,
Olur təqsiri zahir, baxsa kim rəngi-günəhkarə.

* * *

Oxşadubdur özini zülfüvə, bax, zəncirə,
Aləmi saldı bu rəng ilə əcəb təsxirə.

Eyləsön var yeri, ey şux, üluhiyyəti-hüsn,
Vəsfi-hüsnündə qələm aciz olub təhrirə.

Adəmi eylədi rüsva həvəsi-xalü xətün,
Gözlərün fitnə salub məmləkəti-Kəşmirə.

Nə qədr mən kimi pir olmamısan, şirinləb,
İstəsə kami-ləbündən, elə ehsan pirə.

Ayü gün hüsnün heyrani dolanur başuva,
Əhsən olsun belə ustadə, belə təsvirə.

Qamətün xidmətinə başını əgmiş qaşun,
Səbəb oldur ki, vırar tə`nə iti şəmşirə.

Başə düşməz min ilə müshəfi-hüsnün şərhin,
Vaizi-şəhr hələ şərh yazur təfsirə.

Necə mən eyləməyüm nalə şəbi-hicründə,

Ruzigarım eləmiş xalü xətüntək tirə.

Əşk seylabi fərağundə könüllər mülkin,
Eylə viran qılub, minnəti yox tə`mirə.

Eşq dərdinə əlac eyləmək olmaz, əl çək,
Ey müalic, həzər et, düşməgilən tədbirə.

Saqibün halinə Fərhad ilə Məcnun ağlar,
Vətən avarəsi, gəlməz bu sitəm təqrirə.

* * *

Mail oldun sən nə içün bu kəmanəbrulərə,
Ey könül, əl çək, inanma zərrəcə məhrulərə.

Eyləsön qurban əgər min dəf`ə şirin canuvi,
Ru dutar səndən, uyarlar fitneyi-bədgulərə.

Çox da rəngü bu verüb arizün, ey qönçələb,
Seyri-gülzar eyləyən vəqtdə güli-şəbbulərə.

Bərqi-ahimdən solar, bir gün gəlür hüsnin güli,
Kim dedi lə`li-ləbündən kam ver bu ulərə.

Sorma heç əhvalımi neyçün pərişandur sənün,
Şanəni peyvəstə vırmazlar qəra giysulərə.

Müttəsil asılmağun bir vəchi var divardən
Əksi-hüsnün uğramış, baxdun neçün güzgulərə.

Vaizi-şəhrün inanma, Saqiba, fitvasinə,
Din evin viran qoyubdur, uyma bu bədgulərə.

* * *

Ləblərün fikri çəkibdür məni meyxanələrə,
Dinü dil getdi girov sağərü peymanələrə.

Şanə urma bu qədr zülfi-əbirəfşanə,
Toxunur şanə oxı bu dili-divanələrə.

Şö`leyi-arizün od urdı günəş xeyrinə,

Nə əcəb düşsə bu od xirməni-pərvanələrə.

Əlimə daneyi-xalun düşə, qanın içərəm,
Oxşadubdur özini səbheyi-səddanələrə.

Elədi aqibət eşqün məni rüsvayi-cəhan,
Bilmədün qədrimi, uydun genə biganələrə.

Söhbəti-camü səbu eylə mana, ey zahid,
Etmə məşğul məni söhbəti-əfsanələrə.

Saqiba, tərk elə məscid, rəhi-meyxanəni dut,
Girməz adəm elə qəmxanəyə, viranələrə.

* * *

Dolaşarsan, həzər et, ahi-səhərgahlərə,
Cövrün az et mana, uyma dəxi bədxahlərə.

Bir gədayi-səri-kuyün mana xoş etsə nəzər,
Əgərəm baş fələgün xosrovına, şahlərə.

Bu günün badəsin iç, etmə səbahun fikrin,
E\`tibar etməgilən himməti kutahlərə.

Vırma dəm çox o məhün çahi-zənəxdanindən,
Düşdi, ey dil, məhi-Kən\`an həmin çahlərə.

Eşq sövdasi bileydim məni divanə edər,
Dil verərdimmi bu mərdümdən olan mahlərə.

Qaşuvun tağinə qoyson məni səcdə edərəm,
Zahidi, qoy, edə məsciddəki Allahlərə.

Gah gözdə dolanur qəmzön oxı, gəh dildə,
Vermə fitvani belə zalimü gümrahlərə.

Lə\`li-nabun həvəsi etdi məni badəpərəst,
Verməsön dil sana verrəm xəbər agahlərə.

Saqibə eyləmə çox cövrü sitəm, ey zalim,
Qorx o gündən bu xəbərlər yetə dərgahlərə.

* * *

Xəyali-zülfün edüb ruzigarımi tirə,
Əsir, kaş oleydim, kəməndi-zəncirə.

Bu tiri-qəmzədə, ey məh, nə tirbarandur,
Mana hücum eyləyür dəmbədəm nə təqsirə?

Qaşun xəyalilən səcdəgahi-mehrabə,
Əli(ə) qoyanda başın rast gəldi şəmşirə.

Mərizi-eşqə əlac eyləmək degül mümkin,
Təbib, nəbzimə əl vırma, düşmə tədbirə.

Doyunca badeyi-gülfami verməədün, saqi,
Qədəh-qədəh dəri-meyxanədə məni-pirə.

Zəmanə, gör, nə tələb səndən eylər, Saqib,
Bırax bu daməni-təsbihi, baxma təfsirə.

* * *

Heç təəccüb etmə, ey dil, nəngü ar ağlar bizə,
Ağlamağlıq istəməz, biixtiyar ağlar bizə.

Vadiyi-heyrətdə avarə, get, ol Məcnun kimi,
Ey vətən avarəsi, əğyarü yar ağlar bizə.

Bənd-bəndindən nə hacət ahü fəryad eyləmək,
Gəh müğənni, gah dəf, gəh çəngü tar ağlar bizə.

Badeyi-qəflət içən huşyar olmaz, məst olur,
Keç ayılmaqdan dəxi yatsa, huşyar ağlar bizə.

Şikvə etmə hiç kəsdən, heç kimün təqsiri yox,
Mərdümi-azarun özi həddən kənar ağlar bizə.

Yatmışun başın ayıq gər kəsməsə insan degül,
Gülsə səyyad, incimə, əmma şikar ağlar bizə.

Kimsə məğlub etməyüb öz şəhriyarın sən kimi,
Ağlayursan imdi neyçün, şəhriyar ağlar bizə.

Çəkmədün vəqtində neyçün tiği-atəşbaruvi,

Pas qılafında dutubdur, Zülfiqar ağlar bizə.

İmdi fəryad eyləyürsən, vay mənim əhvalimə,
Varü yox əldən gedüb, müflis yanar, ağlar bizə.

Şir ikən olduq giriftari-əsiri-ənkəbut,
Nə məqamə yetdük axır murü mar ağlar bizə.

Bir zəman zalım Müxalif çəkməz əl Mənsurdən,
Paybənd etdi Həsar içrə Qətar ağlar bizə.

Aşiqü mə`şuqənün sən söhbətin et, Saqiba,
Neyləməklik, çarə yox, xurdü kibar ağlar bizə.

* * *

Mey kimi düş əyağə başda fəs olmaqdansa,
Əhli-qal ilə, dila, həmnəfəs olmaqdansa.

Tələf ol, eyləmə əfsus, nədür can nəqdi,
Nanəcibzadə sənə dadrəs olmaqdansa.

Varü yox badeyi-gülfamə nolur versə kişi,
Yegdür[*] andan ki, qumar ilə pəs olmaqdansa.

Qönçə peykaninə, ey bülbül, eylə cani hədəf,
Məskənün imdi ki, künci-qəfəs olmaqdansa.

Başə ver yaxşı-yaman ömrüvi xuni-dil ilə,
Minnəti-nakəs ilə yaxşı kəs olmaqdansa.

Asılam darə Məsiha kimi, çox xoşdu mənə,
Aqibət tö`meyi-marü məgəs olmaqdansa.

Keçər ə`malıq ilə, minnəti çəkmə hərgiz,
İki göz mərdüminə mültəməs olmaqdansa.

Saqiba, sərf elə meyxanədə mey nəş`əsinə,
Can məta`in ona bica əsəs olmaqdansa.

* * *

Qaçardum navəki-qəmzön əlindən bir diyar olsa,
Və ya zülfün kəməndindən əlimdə ixtiyar olsa.

[*] Daha yaxşıdır

Görüb sərgəştə halım sorma, naseh, necədür halun?
Edərdüm dərd izharın əgər bir qəm kəsad olsa.

Səri-kuyin verürdüm cənnətə, ey şux, Adəmtək,
Dutardum daməni-səccadə səndə e`tibar olsa.

Əcəbdür bir piyalə badəyə verdüm dilü dini,
Məlamət etməsün heç kim nə eybi əldə var olsa.

Məni mən` etmə meydən, bəsdür, zahid, dərdsər verdün,
Şərabi-Kövsəri sən tərk edərsən saqi yar olsa.

Qərani, aği qandırmaq, bəli, naəhlə müşkildür,
Edənməz çarə bu dərdə əgər pərvərdigar olsa.

Könül mülki kimi viranədür, ey dil, vətən mülki,
Vətən viran olurmı şəhriyari huşyar olsa.

Bizə darül-əmandur, Saqiba, meyxanələr künci,
Başımda nəş`eyi-mey, istəməm yüz min bəhar olsa.

* * *

Bir qaşı kəman, kiprigi ox, bir yüzi lalə,
Dərdü qəmi hicründə mana etmiş həvalə.

Vermüm sana mən dil necə, ey afəti-dövran,
Əhsən belə rüxsarə, fəda bu xətü xalə.

Göstər yüzüvi gülşənə, yansun güli-şəbbu,
Min şiveyi-naz ilə xəcalət çəkə lalə.

Qan oldı könül lə`lü ləbün yadə düşəndə
Meyxanədə, ey mahvəşim, əldə piyalə.

Sövdayi-səri-zülfüvə düşdüm, qələt etdüm,
Saldım nə yəman yerdə genə başımi qalə.

Vay halına hər kim ki, içüb badeyi-eşqün,
Ta həşr olur məst, çətindür gələ halə.

Oxlansa idi dil əgər asudə olurdum,

İstər sora lə`lün, yapuşub əmri-məhalə.

Görsön biri səccadə verüb badəyə, zahid,
Tə`n etməgilən, eylə həzər, əhli-kəmalə.

Hər kəs gərək öz məsləkinə can edə qurban,
Saqib, nə sitəm yetsə ona, etməyə nalə.

* * *

Xalun düşüb yerində ayineyi-cəmalə,
Ey sərvi-novrəsidə, əhsən bu xəttü xalə.

Hər kim desə qələtdür, əbrulərün kəmandur,
Mehrabi-əhli-dildür, ver müjdə əhli-halə.

Dutmış cəhani fitnə, yüzdən gətür niqabi,
Çək zülfüvi yüzündən, ver sülh qeylü qalə.

Dürdi-şərabə, zahid, səccadəni girov qoy,
Sən ki, içən degülsən toprağə qıl həvalə.

Düşdim əyağə meytək dəhrün həvadisindən,
Qəm seyli başdan aşdı, saqi, gətür piyalə.

Qılmanü huri-cənnət, ey naxələf, bizimdür,
Mehrabdən gətür baş, gəl göstərüm qəbalə.

Bir mülk kim, atadan qalmış ola, kimindür?
Övladinündür, əl çək, neyçündür ahü nalə.

Var bir cəhan səfası bir dəm müyəssər olsa,
Dildari-sərvqamət, saqi, meyi-düsalə.

Qandırmaq əhli-həqqün sözin çətindür anə,
Min il ona ədəb ver, gəlməz genə kəmalə.

Bica demüb bu şe`ri şirinkəlam Yusif:
"Ya fındığa dügün vır, ya qandur əhli-qalə".[*]

* * *

Əbru demək nə nisbət, ey dil, bu novhilalə,
Mehrabi-əhli-dildür, ver müjdə əhli-halə.

---

[*] Mirzə Əbdülxalıq Yusifin "Hal əhlinin misalın qal əhli dərk qılmaz, Ya fındığa dügün vur, ya qandır əhli-qalə" beytinə işarədir.

Zülfün xəyalın etməm sərhəlqeyi-cünundur,
Sərriştеyi-bəladur, Məcnunə qıl həvalə.

Saldun cəhanə fitnə, yüzdən gətür niqabın,
Ey sərvi-novrəsidə, ver sülh qeylü qalə.

Künci-məlamət içrə sərgəştə gəz, vətən dut,
Ey dil, o mahə etməz tə`sir ahü nalə.

Girməz qulağə, vaiz, tə`rifi-cənnət etmə,
Qəm seyli başdan aşdı, saqi, gətür piyalə.

Pəjmürdədil, şikəstə mey tək əyağə düşdüm,
Bəh-bəh nə dilnişindür, saqi, meyi-düsalə.

İrsi-pədərdü cənnət, ey naxələf, bizimdür,
Mehrabdən gətür baş, gəl, göstərüm qəbalə.

Dəryalərə qarışdı hürriyyətün yolında,
Qanlar cəhanı qıldı yekrəng həmçü lalə.

"Hübbi-vətən"* könüldən məhv oldı, məhv yeksər,
Sərf etdün ömri, Saqib, səd heyf xəttü xalə.

* * *

Gögçəkligün, ey şux, yetüb həddi-kəmalə,
Vırsun necə həmrəngiligün lafıni lalə.

Fəryad sənün zülfi-girəhgirün əlindən,
Axır mana zənciri-cünun etdi həvalə.

Yaqutə vırar lə`li-ləbün tə`nə dəmadəm,
Sorsun anı, dil düşdi əbəs yerdə xəyalə.

Min yerdən anı oxladı bu navəki-qəmzön,
Çıxsun canı, meyl eyləməsün əmri-məhalə.

Bu qaşlaruvun tiği verüb qətlimə fərman,
Döndərdi neçün qəddimi bəs qəmdən hilalə.

Qalmış atamızdan, yetəcəkdür bizə cənnət,
Zahid, yemə qəm, göstərürəm imdi qəbalə.

---

* Məhəmməd Peyğəmbərin (s) "Hübbül-vətən minəl-iman" – Vətənə məhəbbət imandandır kəlamına işarədir

Sərrafpəsənd olmayacaq simü zər hərgiz,
Bazarə çıxarmaz anı, ta düşməsə qalə.

Əxlaqun ilə fəxr elə, ey sevgili yarım,
Qurbanun olum, incimə, nə hüsnü cəmalə.

Kim də`viyi-həqq etsə dəlili gərək olsun,
Məşğul özini eyləməsün qeyl ilə qalə.

Həqqiyyəti həq adi əlif lam ilə etməz,
Bir başqa dəlil olmalı, fəhm eylə bu halə.

Naşi, rəvişi-həqqdən agah gər olson,
Tə`n eyləsən boş yerə hər əhli-kəmalə.

Həqq rütbəsini hər yetən hərgiz bilə bilməz,
Saqib, həzər et, uymayasan əhli-zilalə.

* * *

Düşəndə hüsnüvə giysuyi-tabdar belə,
Edərmi tab könül, düşsə şahmar belə.

Salubsan heyrətə, ey şux, xəlqi rahət qoy,
Gün açmayub yüzini səntək aşikar belə.

Çox atma qəmzə oxın könlümə, əman verməz,
Edərmi ahuni səyyadlər şikar belə?

Rəqib yetmədi sənün vəslüvə, kəmanəbru,
Əcəb degülmi deyürsən genə, nə var belə?

Bu hüsn qalmayacaq səndə beş gün, ey zalim,
Keçüb həmişə kimünçün ki, ruzigar belə.

Qaşun qılıncı verür qətlimə mənim fərman,
Bu hökmi eyləməyüb əgri Zülfiqar belə.

Xəzan yetişdi gülə, yan qəfəsdə, ey bülbül,
Bu qədr etməgilən nalə, ahü zar belə.

Ləbündən aldı yetən kam, hər yetən alsun,
Görəndə sən məni gül, olma şərmsar belə.

Bu mahparəyə, Saqib, inanma, dil vermə,
Vəfası yoxlara çox etmə e`tibar belə.

* * *

Məni hicran odına şəm`tək, ey şux, yandurma,
Nə eybi yandurursan, bimürüvvət, yarı yandurma.

Dərür kim, hər yetən bir bərgi-gül gülzari-hüsnündən,
Rəqibə dil verüb qəm seylini başimdən aşurma.

Edür rüxsarüvün vəsfini xəlqə güzgü hər saət,
Məni rəşk öldürür, ayinə ilə rubəru durma.

Könüllər naləsindən qıl həzər, ey sərvi-azadım,
Pərişan eyləmə rüxsarə giysu şanə çox vırma.

Məni min və`deyi-vəsl ilə, zalim, bəsdür aldatdun,
Tökər xunabi-həsrət çeşmi-giryanım boyandurma.

Degülsən badənün keyfiyyətindən vaqif, ey zahid,
Məlamət tərkini et, xatiri-xəlqi bulandurma.

Utanmazsanmı hərgiz ictinabi-badə etməkdən,
İçərsən badə sən də, şərti var, təsbihə əl urma.

Ürək qanından, ey dil, içgilən peymanə-peymanə,
Dənilər süfrəsinə meyl qılma, boynuvı burma.

Təriqət əhli olmaq istəsön, Saqib, bu aləmdə,
Həzər qıl, rəng ilə təzvir damın xəlq içün qurma.

* * *

Rəhi-meyxanə dut, mən kimi məsciddə məqam etmə,
Meyi-gülfamdən əl çəkmə, məst ol, tərki-cam etmə.

Həqiqət zülfünün pabəndiyəm mən, zahidi-kəcbin,
Girov səccadə verdüm badəyə, təsbihə ram etmə.

Haçan içdüm sənilə badəni meyxanə küncində,
Bu səvnazsız əl vırmadım camə, həram etmə.

Dağıtma səfheyi-rüxsarüvə giysuyi-pürçini,
Həzər qıl ah odından, sübhimi, ey şux, şam etmə.

Gözündən bağbanun salma sərvi, ey kəmanəbru,
Bu qamətlə girüb gülzarə seyr etmə, xüram etmə.

Cəhanun inqilabun yadə salma, düşmə təşvişə,
Baş alma xüm əyağından, özüvi təlxkam etmə.

Cəhan heç fitnədən əksilməyüb, asudə iç badə,
Xəyali-cənnət ilə ömrüvi bica təmam etmə.

Kəm etmə rütbəvi, dəsti-təərrüz xəlqə heç açma,
Kim olsa, dut əlin, mey düşkinin biehtiram etmə.

Ləbindən bu pərinün, ey könül, kam almaq istərsən,
Düşərsən qanə, əl çək, çox çətindür fikri-xam etmə.

Özünçün, heyfsən, nifrət qazanma, xəlqi incitmə,
Səni rüsva edər, cüz xeyr hərgiz qiyam etmə.

Şikayət çərxi-dunun gərdişindən etmə, ey Saqib,
Edərmi tərki-adət fikrin hərgiz, vəssəlam, etmə.

* * *

Ahu gözi ram oldı əcəb səndəki çeşmə,
Əlbəttə olar, səndə görüb nazü gərişmə.

Yusif sən ilə necə vırar lafi-gözəllik,
Hüsnündə onun var neçə min yerdə bürüşmə.

Əğyarə uyub eyləmə cövrün mana hərdəm,
Aləm dəgişik olsa da, sən, bari, dəgişmə.

Girəm ki, dedi aşiqüvi kuyüvə qoyma,
Hər bir sözə, ey şux, qulaq asma, soruşma.

Eşqündə sənün, gör, necə rüsvayi-cəhanəm,
Əğyar ilə yanımda mənim gülmə, öpüşmə.

Göstərmə mana məscidi-viranəni, zahid,
Meyxanə yolın dutma, məni, qoy gedim işmə.

Tə`nə eləmə çox mana məsti-meyi-nabəm,
Xəlqün işinə fikrüvi çox vermə, girişmə.

Saqi, nə qədr cami-mey dutmısan əldə,
Dut gözlərüvi əhli-nəmaz ilə görüşmə.

Saqib, bu cəhan mülki xərab oldı, qoy olsun,
Gəlməz mənim heç zərreyicə bu şeş-beşmə.

* * *

Qaşun qəmidür qəddimi döndərdi kəmanə,*
Gəldi nə bəla başimə, düşdüm genə qanə.

Pərvanəsifət yaxdı məni atəşi-hüsnün,
Pərvanəni qoy şəm`də qalsun yanə-yanə.

Taqət hanı, ey şux, təmam eyləmə qəmzə,
Divanə olar, göstərəsən pirü cəvanə.

Asan əgər olseydi, dutardım səri-kuyun,
Əğyar dutub, gəlməgə yox əldə bəhanə.

Zülfün girehində dili-divanə yatubdur,
Avarə düşər, qoyma, vırarsan necə şanə.

Fəryadimə cəm` oldı xəlayiq şəbi-hicran,
Sordunmı bu kimdür gəlür hər ləhzə fəğanə.

Saqib, dolanur göz qabağında o pərivəş,
Bifayidədür, gəzməgilən xanəbəxanə.

* * *

Qaşun qəmidür qəddimi döndərdi kəmanə,
Vay halimə dəgsə bu səri-zülfüvə şanə.

Dutdım rəhi-eşqün, nə bilim dil verəcəksən
Əğyarə, könül, gəlməz idi hiç xəyalə.

Sövdayi-səri-zülfüvə düşdüm, qələt etdim,
Azad kim etsün məni, yığdım dəxi canə.

* Bu misra başqa bir neçə qəzəldə də təkrar olaraq getmişdir.

Qəddün mana göstərdi qiyamətdən əlamət,
Olsun gərək, ey şux, qiyamətdə nişanə.

Qan oldı könül lə`li-ləbün fikrin edəndən,
Kam almamış aləmdə düşərmiş kişi qanə.

Düşməz yerə atson sən əgər navəki-qəmzön,
Verməz dəxi bir ləhzə nəfəs pirü cəvanə.

Dövran nə tələb eyləsə səndən, demə verməm,
Can nəqdini dut əldə, gedüb etmə bəhanə.

Meyxanəyə getsön, o qədr iç meyi-nabi,
Bilmə özüvi, baxmagilən xeyrü ziyanə.

Saqib, gilə çox eyləmə yarun sitəmindən,
Aşiq degül ol kimsə gəlür ahü fəğanə.

* * *

Qaşun xəyali ilən qədim dönüb kəmanə,
Ögrətdi xunfəşanlıq şəmşiri-xunfəşanə.

Dutmış cəhani fitnə, bu zülfüvə əman ver,
Zalim, tərəhhüm eylə, göstərmə bir də şanə.

Qanə dönər könüllər, sağər ləbün öpəndə,
Meyxanədə içəndə badə döneydi qanə.

Ey şuxi-sərvqamət, ey dilbəri-şəkərləb,
Qoy bir öpüm əyağun, bir ləhzə aşiqanə.

Xətm oldı hüsn səndə, sən eylə məhliqasən,
Heyrani-hüsnün olmış bu madəri-zəmanə.

Yoxdur günah məndə, dil mailün olubdur,
Səndən dil almaq içün yox əldə bir bəhanə.

Saqibdən inciyürsən hicründə sübh olunca,
Əğyarə dil verübsən, ney tək gəlür fəğanə.

* * *

Ləbün fikrilə içəm badəni peymanə-peymanə,
Məni məst eyləməz içsəm əgər meyxanə-meyxanə.

Əgər məndən xəbər alson neçün halun pərişandur,
Vırarsan şanəni hər ləhzə bu zülfi-pərişanə.

Üzarun şəm`inə yandur məni, ey sərvi-azadım,
Ki, məndən kəsb qılsun yanmağı divanə pərvanə.

Əsir et bu dili-divanəmi zülfün kəməndində,
Qaçar, yox e`tibarı, olsa gər azad divanə.

Kəmanəbru, necə tab eyləsün bu natəvan könlüm,
Düzübsən, qətlimə fərman verübsən tiri-müjganə.

Xəbər alma nədür halım, mənimlə rubəru durma,
Həzər qıl, əl gətür məndən, yanarsan ahi-hicranə.

Çağırma, zahida, bu Saqibi məsciddən əl çəkmiş,
Rəhi-meyxanə dutmış, müzdi-badə verdi səddanə.

* * *

Vıranda şanə sən hərdəm bu zülfi-ənbərəfşanə,
Dutar dil nalə ilə daməni-zənciri-divanə.

Düzübsən qətlimə səf-səf əcəb, ey sərvi-azadım,
Necə tab eyləsün biçarə dil bu tiri-müjganə.

Tökər xunabi-həsrət gözlərim hicründə hər saət,
Necə fəryad qılmum, vəslüvə yol tapdı biganə.

Necə el tə`nəsindən etməyüm çak giribanım,
Yağar səngi-məlamət başimə, döndikcə hər yanə.

Giriftar olmaseydim mən əgər zülfün kəməndində,
Ləbün fikrilə, zalim, döndərərdüm bağrımi qanə?

Degül mümkin sənün eşqün yolunda dinü dil vermüm,
Məgər bu hüsndür var səndə, salmış fitnə dövranə.

Məlahət kişvərində şahsən, aç arizün göstər,
Xəcalət hüsn bazarində ver ol mahi-Kən`anə.

İçər övqaf qanın, badeyi-gülfamə əl urmaz,
İnandım zahidə mən, and içibdür dinü imanə.

Müsəlman firqəsindən qaçgilən, rüsvayi-aləmdür,
Təriqi-küfr, Saqib, dutgilən, get kafəristanə.

* * *

Qoyma ad, zülfdür ol türreyi-müşkəfşanə,
Dami-zənciri-cünun gedə gər hər yanə.

Dutmasun qan, bəsdür, bu qədr qan etdün,
Tiği-əbrulər ilə sən də düşərsən qanə.

Atəşi-hüsnüvə yandır məni pərvanə kimi,
Necə kim atəşi-şəm` içrə yanar pərvanə.

Hüsn bazarinə çıxdun bu gözəl çöhrə ilən,
Dedilər, ey qulun oğlı, o məhi-Kən`anə.

Tab qalmaz dili-divanədə, ey qaşı kəman,
Türreyi-zülfüvə hər dəm toxunanda şanə.

Ey könül, eşqini tərk et bu pərirüxsarun,
Qanə döndün ki, tapub kuyinə yol biganə.

Ey deyən, etmə fəğan ney kimi hicran gecəsi,
Mübtəla olmamısan dərdü qəmi-hicranə.

Xüm əyağinə məni yıx, qədəhün ver, saqi,
Nə edür, qoy eləsün, baxma bu kəc dövranə.

Saqiba, alma xəbər dinü dil hanı səndə,
Yetməmiş vəslinə, qurban elədim cananə.

* * *

Mənim xoş məskənim, zahid, o meyxanə, bu meyxanə,
Sənün dilxoşlığun daim o səddanə, bu səddanə.

Şərabi-nab vəsfin eyləmə təkfir hər saət,
Yaraşmaz badeyi-nabə o əfsanə, bu əfsanə.

Fəqihi-mədrəsə heç görməmiş cənnət, deyür vardur,
Yalandan and içür zalım, o Qur`anə, bu Qur`anə.

Yetüb azadəlik vəqti əbəs heç düşmə təşvişə,
Əl atma boş sözə, uyma o imanə, bu imanə.

Sədaqət tə`rifin etmək mana düşməz, çəküb başim,
Gedüb mən dinü dil verdüm, o cananə, bu cananə.

Gözün qurbanı, saqi, badə ver peymanə-peymanə,
Qoy, içsün qanıni xəlqün o divanə, bu divanə.

Gələndə kuyüvə, ey səngdil, döndərmə yüz məndən,
Dolanur bu səri-kuyin o peykanə, bu peykanə.

Gözəllər çox var aləmdə, sənün hüsnündə heyranəm,
Fəda eylüm bu canı, de, o müjganə bu müjganə?

Nədür can qiyməti canan yolında getməsün, Saqib,
Dili-divanə meyl etməz o qılmanə, bu qılmanə.

* * *

Açılıbdu genə, ey saqi, dəri-meyxanə,
Eylə ləbrizi-qədəh, yox nə qədər biganə.

Eylə sərməsti-meyi-nab edərdim özümi,
Xəbər heç dutmayub aləmlər ola viranə.

Vermə azadəligün vəqtini, zahid, əldən,
Ver girov badəyə səccadə ilə səddanə.

Demə Qur`andə həram oldı bizə badeyi-nab,
Nəhy edübdür səni, böhtan eləmə Qur`anə.

Ruzigarun demə bəd keçsə, dəgişdür yerüvi,
Başuvun üstə durub qəm, gedəsən hər yanə.

İmdi ki, dəhrdə, ey şux, pərişanlıqdur,
Sən də vır şanəni bu zülfi-əbirəfşanə.

Aləmün hər ikisin zahidə mən vəqf etdim,
Məndən ötri qala, qoy, xalü xətün bir yanə.

Ey dil, ey dil, gətür əl, oxlanasan min yerdən,
Uydun ol məhvəşə etdün məni sən divanə.

Yadə salma ləbi-lə`lin o pərirüxsarun,
Həzər et qəmzə oxından ki, dönərsən qanə.

Eşq tə`limini məndən gərək alsun Məcnun,
Düşdi səhralərə, tab eyləmədi hicranə.

Saqiba, tə`n eləmə səndə ləyaqət yoxdur,
Tərki-can eyləməyüb sən yetəsən cananə.

* * *

Çox incidür, ey mahvəşim, könlümi şanə,
Qorxum budur axırda ki, salsun məni qanə.

Zülfün dağıdar şamü səhər arizi-alə
Tel-tel, həzər et, düşmiyə aşub cəhanə.

Bənd eyləyər axır məni zənciri-cünunə,
Neylüm, dəxi qaçmaqlığa yox əldə bəhanə.

Şəm`i-rüxüvi görməgə pərvanəsifət mən,
Bildirmə rəqibə, gedərəm xanəbəxanə.

Ey qaşı kəman, Adəmi kim eylədi rüsva,
Hər kim xəbər alsa, de, bu hüsnümdəki danə.

Qaşun qəmi salmış məni, gör, bircə nə halə,
Mehrabə vırar tə`nə, qədim döndi kəmanə.

Əldə nə qədr vardı sənün daməni-vəslün,
Gəlməzdi bu divanə könül ahü fəğanə.

İçdirdi ləbün fikri sənün badeyi-nabi,
Meyxanədə hər ləhzə gedüb pirü cəvanə.

Yandurdı oda hüsnün odı lalə yuvağın,
Pərvanələri qoygilə ta bu oda yanə.

Saqib, desə kim, rindü süxənsənc degülsən,
Göstər ona bu beyti-dilaramı nişanə.

* * *

Yanmaseydi əgər eşqün odına pərvanə,
Eşq Məcnuni belə etməz idi divanə.

Fitnə dutmazdı cəhan mülkini, ey qaşı kəman,
Sormaseydi ləbüvi sübhə kimi biganə.

Dutaram damıni-zənciri-cünun nalə ilən,
Vırma şanə bu qədr zülfi-əbirəfşanə.

Hər zəman yanimə gəlsön, elə pünhan hüsnün,
Zülf içində yüzüvi görməyə ta həmxanə.

Bu pəriçöhrədən, ey dil, necə əl çəkmək olar,
Hüsni hər ləhzə vırar tə`nə məhi-Kən`anə.

Nə əcəb qərq eləsəm aləmi bu göz yaşına,
Kim dözər, çarəsi yox, dərdü qəmi-hicranə.

Saqiya, yadi-ləbi-yar ilə məst eylə məni,
Baxma zahid sözinə, dur, dolı ver peymanə.

İçmə yadi-ləbi-dildarlə mey, saqi dedi,
Sorar əğyar ləbi-yari, düşərsən qanə.

Necə ah eyləməyüm yardən ayrı, Saqib,
Etmiş hicran qəmi bu könlüm evin viranə.

* * *

Yanmasa atəşi-rüxsarüvə gər pərvanə,
Özümi yandıraram, qoy, qala yanə-yanə.

Şəbi-hicrün qəmini sormagilən Məcnunə,
Etmədi tab o biçarə qəmi-hicranə.

Ləblərindən bu məhün busə təmənna etmə,
Həzər et qəmzə oxından ki, düşərsən qanə.

Kuhkən daşə çəküb surətini Şirinün,
Eləsün xəlq təmaşa, sevinür, cananə.

Gözüni bağladı Məcnun, dedi Leylanı görər,
Öldürür rəşk məni, bağlu gərək peykanə.

Biədəb getməgilən vadiyi-eşqə, ey dil,
Səndə yox dami-cünun, olmamısan divanə.

Vadiyi-eşqə gedənlər gərək olsun məcnun,
Tikirə* quşlara başində gərək kim, lanə.

Dili-divanəmün halıni gör, ey şirinləb,
Hər zəman türreyi-mişkinə vırandə şanə.

Saqiba, uymagilən bir də həvayi-nəfsə,
Xəlqi divanə edibdür bu cəhan viranə.

* * *

Dutuşsun, var yeri hər bir nəfəs odlarə pərvanə,
Taparmı dərdinə yanmaqdan özgə çarə pərvanə?

Səni çox yandırur, ey dil, neçün pərvanə əhvali,
Yanar, əlbəttə, uymış atəşin rüxsarə pərvanə.

Özin yandırmasa, bu atəşi-hicranə tab etməz,
Gərək şəm` atəşinə yanmağa yalvarə pərvanə.

Özümi istərəm yandırmağa, azad edən yoxdur,
Əsir olmub mənimtək türreyi-tərrarə pərvanə.

Degül asan, çətindü atəşi-hicranə tab etmək,
Dəmadəm heç dözərmi tə`neyi-əğyarə pərvanə.

Necə vırsun əbəs Məcnun ilə aşiqligün lafın,
Başında quş yuvası qalmayub avarə pərvanə.

Görəndə hər işıq fəhm eyləyür kim, şəm`i-suzandur,
Özini yandırur bica yerə, hər narə pərvanə.
Qalub avarə, bilmür hansı bir dildarə meyl etsün,
Kimün eşqində etmiş ruzigarın qarə pərvanə.

Düşərdi çöllərə Məcnunsifət bu pir Saqibtək,
Göreydi sən kimi bir sərvqəd məhparə pərvanə.

---
* Tikdirə

* * *

Kim deməz olmışam eşqündə sənün divanə,
Halımi bir xəbər al, nazuvı qoy bir yanə.

Yad qıldun ləbi-lə`lin bu məhün, qan oldun,
Deməyəydim sana, ey dil, ki düşərsən qanə.

Dutma məskən xəmi-zülfündə bu məhrüxsarun,
Düşəcəksən genə avarə vıranda şanə.

Mübtəla et dili-divanəmi, ey şirinləb,
Qoyma avarə düşə türreyi-müşkəfşanə.

Küfri-zülfün əlilən rəxnələr imanə düşüb,
Alacaq məndən anı, mən nə gəlüm imanə.

Verməràm qeyrə könül, bağrımi qan eyləmisən,
Sən iləndir ürəgim, getsəm əgər hər yanə.

Ey qoyan bağrıma qan, bu ləbi-gülbərgündən,
Rəngi solmaz, nə olur busə alam bir danə.

Məscidün qapusı zahid yüzinə bağlandı,
Əmma məstün üzünə bağlu degül meyxanə.

Saqiba, atəşi-hicranə şəbi-hicrandə,
Yanacaqsan, nə qədr şəm`ə yanur pərvanə.

* * *

Mail oldum bu məhün nərgisi-cadulərinə,
Eylədi bənd məni türreyi-giysulərinə.

Qələt etdüm, iki cəllad dedim gözlərüvə,
Oxşayur başdan-əyağə Xütən ahulərinə.

Yusifün qiymətini eylədi bir köhnə kəlaf,
Dəhri-dun gərdişi fəxr eylədi məhrulərinə.

Dut qəfəs küncini, bülbül, bu qədr etmə fəğan,
E`tibar etmə cəhanun güli-şəbbulərinə.

Bir gülə könlüvi, get ver ki, xəzani yoxdur,
Qalma solmış gülün heç zərrəcə qayğulərinə.

Bağban, eylə bir ibrət bu kəman qəddimdən,
Baxma bu sərvlərün qaməti-dilculərinə.

Fəxr edər huriyi-qılmanına zahid, etsün,
Mən də fəxr eyləyərəm Azəri bədxulərinə.

Saqiya, ver mana mey cami-cəhanbinündən,
Əlimiz yetməsə firdovsi-bərin sulərinə.

Gündə min din evi bərbad eləmiş vaizi-şəhr,
Saqiba, baxma onun naleyi-yahulərinə.

* * *

Deyəsən ah odı tə`sir eləmiş yar üzinə,
Qızarub tə`nə vırar badeyi-gülnar üzinə.

İmdi bildim nə içün aləmi dutmış fitnə,
Bu pəriçöhrə töküb türreyi-tərrar üzinə.

Durma güzguyə müqabil, dedim ol sərvqədə,
Öldürür rəşk məni, oldı xəridar üzinə.

Tökmə rüxsarüvə bu türreyi-zülfi-siyəhi,
Açılur dil baxa hər kimsənə gülzar üzinə.

Dedim, ey dil, sana uyma bu pərirüxsarə,
Qoyar həsrət səni hicran güni didar üzinə.

Yeri vardur sana tə`n eyləsə əğyar əgər,
Oxunur etdigi təqsir genə kar üzinə.

Gözlərün yadı ilə yüz qoyaram gülzarə,
Baxaram həsrət ilə nərgisi-bimar üzinə.

* * *

Xurşididürsə qarşu rüxün aftabinə,
Qıllam əsir mən anı zülfün tənabinə.

Ey şux, səndə bu ləbi-meygunə təşnəyəm,
Mən bir də meyl edim necə Kövsər şərabinə?

Can nəqdi gər güzərim düşsə kuyüvə,
Verrəm behişt bağıni zahid cənabinə.

Yuxumda gördüm ilan boynuma dolaşdı mənim,
Kəməndi-zülfün imiş, bax kitabi-tə`birə.

Bədməst gözləründə yatub bir cəhan bəla,
Bais nə oldı bəs bu cəhan inqilabinə?

Çeşmün fədasiyəm, xümi-mey, saqi, dur gətür,
Camun, piyalənün nə gedirsən hesabinə.

Zahid, qıl ictinab meyi-lə`lfamdən,
Yox tab səndə, içmə, cəhənnəm əzabinə.

Tərk etmə, Saqiba, oxı eşqün risaləsin,
Baxma fəqihü müdərrisün dörd kitabinə.*

* * *

Müqəyyəd oldı könül çini-zülfi-maçinə,
Ki, çini-zülfi dəgər Çinə, maçi Maçinə.

Hücum, qoy, eyləsün tiri-navəki-qəmzön,
Gedəndə tir ilə səyyad seydi-laçinə.

Əbəs degül ki, dutub inqilab dünyani,
Ləbün əqiqə vırar tə`nə, qaşlarun çinə.

Fəqihi-mədrəsə bir dəf`ə görsə rüxsarun,
Müdam səcdəni eylər məsihi xaçinə.

Şəbi-fəraqüvə tab eyləmək degül asan,
İnanma, mahvəşim, fitneyi-süxənçinə.

Kimə pənah aparum mən bu tiri-qəmzöndən,
Nicat varmı ki, şahindən gögərçinə.

Əsir olmısan, ey piri-natəvan Saqib,
Bu şux sərvqədün rəşk-rəşk saçinə.

---
* Dörd məşhur hədis kitabına işarədir

* * *

Dedim, cana, urarsan şanə neyçün zülfi-pürçinə,
Dedi, saldım pərişanlıq dili-üşşaqi-qəmginə.

Dedim, güzguyə durma çox müqabil, ey kəmanəbru,
Dedi, görməz məni, bu hüsnimə tab etməz ayinə.

Dedim, lə`lün xəyalilə mey içdim, meypərəst oldum,
Dedi, dutma müqabil badəni bu lə`li-şirinə.

Dedim, eşqün yolunda tərk qıldm dinü dil, getdi,
Dedi, pabənd olma, qeyddür çox, dinü ayinə.

Dedim, xali-siyəhdürmi, dutubdur ləblərün küncin?
Dedi, yox, pasibanımdur düri-yaquti-gəncinə.

Dedim, bu ayü gün neyçün belə sərgəştə heyrandur?
Dedi, ayə, günə bir dəf`ə mən göstərmişəm sinə.

Dedim, neyçün durubdur səfbəsəf müjganlarun tiri?
Dedi, səyyadlər neynən gedər bəs seydi-şahinə.

Dedim, zahid qaşun mehrabinə baş əgməyür neyçün?
Dedi, səccadə çəkmiş pərdəni, əl çək, bu kəcbinə.

Dedim, eşqün məni rüsvayi-aləm eylədi, getdi,
Dedi, Saqib, təfaxür etgilən Məcnuni-miskinə.*

* * *

Həsrət gözilə baxma cəhan tacdarinə,
Dəgməz, baş ağırı,* naləsinə ahü zarinə.

Çox etmə inqilab yaratmaq xəyalıni,
Lə`nət ağına, qarəsinə, kəcmədarinə.
Ömri-cəvanlığa uyub, incitmə heç kəsi,
Yox e`tibar beş güninə ya həzarinə.

Tir olar, batar gözüvə, atma oxlarun,
Yox rəhm səndə, ey gedən ahu şikarinə.

Qəzəlin sonunda müəllifin belə bir qeydi var: "Nəzireyi-qəzəli-Hacı Məhəmməd Ziya. İnşası, səneyi-1347 (1928)"
* Baş ağrıyar

Çox etmə, bəsdür, aşiqü mə`şuqə söhbətin,
Od vırdı eşq, gör, necə Məcnun diyarinə.

Dil vermə mahvəşlərə, qan içdirür sana,
Bənd olma dami-türrəsinin tabdarinə.

Ey sübhə kimi hicrdə əfğan edən könül,
Heyran olma hər yetənün gül üzarinə.

Hər kim verüb gözəlligi hər laləarizə,
Bir göz yumub-açınca, verür murü marinə.

Tən ver qəzayə dərdü qəmün olma düşkini,
Sağər əlündə, çək özüvi xüm kənarinə.

Eyb etmə heç kəsə, özüvə yaxşı fikr ver,
Aludə olmısan bütün eybün qübarinə.

Həmxabə olsa kim sana izhar eyləmə,
Sirri-dəruni verməgilən ixtiyarinə.

Eylər səni bəlayə giriftar bilməsən,
Olmaz əlacı, vermə könül e`tibarinə.

Tərk et həyatı, əmri-Həqə canı qıl fəda,
Varü yoxuvı uduzma cəhalət qumarinə.

Ey sərvətün xəyalilən dərbədər düşən,
Mərhəm qoyusan* hansı dilün dağdarinə.

Qarun da cəm` qıldı zərü sim gəncini,
Gəldi apardı sahibi, düzdi kənarinə.

Saqib hənuz şe`rdə təkmil olmayub,
Fəxr eyləməz odur qəzəli-abdarinə.

* * *

Tə`nə vırdıqca bu zahid meyün üftadəsinə,
Tökərəm dürdi-meyün dərdini səccadəsinə.

Etmə, zahid, bu qədr badeyi-Kövsər vəsfin,
Nə gəlüb meykədənün ruhi-rəvan badəsinə.

---

* Qoyursan

Təngə gəldim, bu qədr naləvü fəryad etmə,
Ey könül, mərdümün əl atma pərizadəsinə.

Həzər et, etmə xəyanət səni kim bilsə əmin,
Canuvun düşməni də gər ola dildadəsinə.

Dolaşıq söz sənə bir faidə verməz, ey dil,
Lütfi də olmasa, ver fikrüvi söz sadəsinə.

Qoyma qəmzə oxuni atsa sana ol gülrüx,
Eyləsün bənd səni saçları qəlladəsinə.

Vaizün qövlünə, Saqib, həzər et, dil vermə,
Baxma mehrabdə təsbih ilə səddanəsinə.

* * *

Dil giriftar oldı yarun türreyi-giysusinə,
Sərvlər heyran qalubdur qaməti-dilcusinə.

Necə heyran olmayum bu sərvqəd rüxsarinə,
Tə`nə eylər gül sənün hərdəm güli-şəbbusinə.

Pirəzən qiymət kəlafi verməz idi Yusifə,
Əksi-hüsnün düşməseydi bu cəhan güzgusinə.

Ayü gün, hərdəm dolanur başuva hüsnün görüb,
Əşkdən həsrət əlilən kim dökər zanusinə.

Ram olur səyyadə, qaçmaz, ögrənür ram olmağı,
Naz ilə qıyqacı baxson, gər Xütən ahusinə.

Guşeyi-mehrabə zahid eyləsün qoy səcdəni,
Mən də səcdə eylərəm yarun kəman əbrusinə.

İstəsön səndən ki, Saqib, xəlq ikrah olmasun,
Atma əl düşmən də olsa, pərdeyi-namusinə.

* * *

Əfsus, əsdi badi-xəzan ömr bağinə,
Səngi-cəfani vırdı sınub qol-budağinə.

Nəfsün əsirinə necə mən nifrət etməyüm,
Qərq eylədi cəhani bütün qan çənağinə.

Heyhat, bir də düşsün ələ, ey dil, əl gətür,
Bifaidə dolanma cəvanlıq sorağinə.

Fərhadçün hünər deməyün, yıxdı Bisütun,
Min tişə vırsa, etməz əsər hicr dağinə.

Daş atma, möhtəsib, həzər et, cami-badəyə,
Sınsun əlün, dolaşma könüllər dayağinə.

Qərq eylərəm bu göz yaşinə cümlə aləmi,
Versəm mən ixtiyari əgər göz bulağinə.

Bilməm nə nəş`ə var bu meyi-lə`lfamdən,
Hərdəm çəkər yüz üstə məni xüm əyağinə.

Qədün qiyam edəndə qiyamət olur xəcil,
Hüsnün şüasi tə`nə vırar gün çırağinə.

Həmrəngdür bu arizi-alunla bərgi-gül,
Bülbül odur ki, maildür gül yuvağinə.

Saqib çəkən degül bu vətən damənindən əl,
Aləm dağılsa, canı yetincə dodağinə.

* * *

Qurban olum bu qaşlaruvun əgri tağinə,
Bimar gözlərün öpüb almış qucağinə.

Mey qırmızı əqiq, ləbün lalə, arizün
Od urdı şəm` şö`ləsinə, gün çırağinə.

Qəmzə oxıyla oxlamısan xəstə könlümi,
Qan etmisən, dolanmagilən göz qabağinə.

Bildün ki, xun bəhasi onun yoxdur, oxlarun,
Məhşər güni hesab olacaq öz əyağinə.

Verdüm əbəs yerə könül ol sərvqamətə,
Fikri-ləb ilə döndi könül qan çənağinə.

Künci-qəfəsdə bülbül edər ahü naləni,
Salmış əyağə xar, qonub gül budağinə.

Əğyar yetdi vəslinə ol sərvqamətün,
Bir od düşeydi bu fələkün nöh rəvağinə.

Saqib, əziz olmağuvi istəsön əgər,
Hal əhlinün toxunmagilən heç dimağinə.

* * *

Saqiya, verməgilən cami-meyi yar əlinə,
Qorxuram məst olanda düşə əğyar əlinə.

Nalə etsə dili-divanə, məlamət etmə,
Kafər heç düşməyə bu türreyi-tərrar əlinə.

Ey müalic, elədün hər yetənə çarə, vəli,
Düşməyübsən hələ Məcnun kimi bimar əlinə.

Dişləməzdi ləbi-lə`lün belə, ey şirinləb,
Düşsə idün sən əgər yaxşı xəridar əlinə.

Bülbül, etmə bu qədr nalə qəfəs küncində,
Gülşənə badi-xəzan əsdi, düşüb xar əlinə.

Bilməyür çoxsu Segahun yerinə Şur çalur,
Boş yerə neyçün alur anlamayan tar əlinə.

Saqibə vermədi saqi mey, tövbə etmiş,
Verilür nameyi-təqsir günəhkar əlinə.

* * *

Versə yüz qəm sana, bax arizi-vəchül-həsənə,
Ehtiyacun dəxi olmaz gülə, seyri-çəmənə.

Yarsız gülşənə getsön, gül olar xar gözə,
Artırur qəm sana baxdıqca gülü yasəmənə.

Ey pəriçöhrə, nə hacət eləyüm seyri-çəmən,
Qəmdən azad olur hər kim baxa bir ləhzə sənə.

Ey edən könlümi viran, mana növbət yetməz,
Göstərürsən bu gözəl arizüvi hər yetənə.

Dolanur başimə pərvanə şəbi-hicründə,
Şəm`vəş ahi-cigərsuz çəkəndən-çəkənə.

Etmisən sən məni bu gözlərüvün heyrani,
Düşüb avazəsi ahuyi-Xətavü Xütənə.

Lafi-həmrəngi vırub ləblərüvün rənginə,
Vırulur tişə odur lə`lə, əqiqi-Yəmənə.

Öldürür rəşk məni, dil eləsün nalə necə,
Bədənün olsa həmağuş ipək pirəhənə.

Ləxtə-ləxtə demə bağrun nə içün qan olmış,
Oldı qan sağər meyi-lə`lün öpəndən-öpənə.

Tab qılmaz dili-divanəmiz, ey şirinləb,
Bağrımi qan elədün qəmzə təmam etmə mənə.

Özümi bilmərəm, əhvalımi məndən sorma,
Nəzərim bu güli-rüxsarə düşəndən-düşənə.

Etdi rüsvayi-cəhan Saqibi eşqün, getdi,
Yazaram bu sözi qəbr içrə kəfəndən-kəfənə.

* * *

Qaldı zülfündə dil avarə şikəndən-şikənə,
Olmaz azad, əsir oldı rəsəndən-rəsənə.

Dolanur başimə pərvanə şəbi-hicründə,
Od kimi ahi-cigərsuz çəkəndən-çəkənə.

Dinü dil tərk elədim xalü xətün fikri ilə,
Düşdi rüsvalığım eşqündə dəhəndən-dəhənə.

Xətm olub səndə məlahət, nə gözəl hüsnün var,
Arizün vəsfin oxur lalə səməndən-səmənə.

Yetirüb badi-səba rayiheyi-zülfündən,
Müşk bazarı kəsad oldı Xütəndən-Xütənə.

Görmədim qönçə, gülüm, lə`li-şəkərxəndün tək,
Varə-varə elədim seyr çəməndən-çəmənə.

İmdi ki, sormısan hicründə nədir əhvalım,
Qəmim  izhar edərəm mən də yetəndən-yetənə.

Gözlərim həsrəti-xunab ilə sirab etdi,
Səri-kuyində bitən sərvə güləndən-gülənə.

Qızarur lalə kimi arizün, ey şirinləb,
Ləbüvə badeyi-gülfam dəgəndən-dəgənə.

Badə içmə fələkün cami-şəkərrizindən,
Qusdurar qan sənə axırda ləgəndən-ləgənə.

Saqiba, düşdi Vətən əllərə, kimdür səbəbi?
Yazgilən bu sözi qəbrimdə kəfəndən-kəfənə.

* * *

İki qaş arasında baxun xali-siyahə,
Gör, bir nə gözəllik eləyüb bəxş bu mahə.

Fərman nə içün qətlimə almış qoşa əbru,
Qanım tökəcək seyl kimi hansı günahə?

Əğyar kimi almamışam kam ləbündən,
Təqsir mana gər bu isə, tapşır İlahə.

Gögçəkligüvə fəxr eləmə, eylədi Yusif,
Düşdi başı üstə, gözəlim, axırı çahə.

Öldür məni, azad elə, keçdim günəhündən,
Bir kəlmə yetər döndərəsən çakəri şahə.

Namərd sana taci-zərin gər verə, Saqib,
Al, vır başına, fəxr elə pəşminə külahə.

* * *

Xəlqdən çək özüvi guşeyi-xəlvətgahə,
Uyma, beş günlikdür izzətü şə`nü cahə.

Növ`ivün fikrini qıl, hər biri bir guşədədür,
Qalub avarə, yetişməz əli bir həmrahə.

E`tina eyləmə bir yarə ki, əğyarı görüb,
İktifa eyləgilən bərqi-cəhansuzi-ahə.

Düşmə təşvişə, cəhan mülkini dutmış fitnə,
Nə olur, qoy ola təslim, get ol, Allahə.

Əlivün rənci ilən sal ələ Qarun gəncin,
Dikmə göz zərreyicə bəxşişi-şahənşahə.

Qanmaza sölәmə həqqün sözini, qanmazdur,
Canuvı eylə fəda xaki-rəhi-agahə.

Fəxr qıldı bütün aləmlərə Yusif, gözəlim,
Etdi kəmrütbə səni düşdi müəlləq çahə.

Get, qul ol, kim ki, bilür yaxşı-yəmanun fərqin,
Sərfiru eyləmə şahənşah ola, bədxahə.

Saqiba, nəfsüvi öldür, ələ sal məqsudi,
Səni rüsva eləyər, uyson əgər dilxahə.

* * *

Qəsəm bu daneyi-əngurə, cami-səhbayə,
Qulami-həlqəbəguşəm, mürid minayə.

İçəndə badeyi-nabi, ləbün xəyal edərəm,
Başımi saldım əcəb yerdə bu xam sövdayə.

Könüllərün, həzər eylə, fəğanü ahindən,
Sataşma şanə ilə türreyi-çəlipayə.

Rəqib sormaseydi əgər, kəmanəbru,
Vırardı tə`nə ləbün mö`cizi-Məsihayə.

Öz ixtiyarı ilə vermədi könül Məcnun,
Əsir etdi özin dami-zülfi-Leylayə.

Nə eyləsün dili-Məcnun, gözdədür təqsir,
Görəndə göz sevəcək, dil düşər təmənnayə.

Gəlür nə başinə hər bir nəfəsdə, yox xəbəri,
O kəs ki, şad həvəslə gəlür bu dünyayə.

Nə qədr vəqt var əldə, həqiqət eylə tələb,
Keçirmə ömri-giranmayə vəqti-bicayə.

Məta`i-şe`r kəsad oldı, qiyməti yoxdur,
Qəzəl üzarinə, Saqib, nədür bu pirayə?

* * *

Yüzüvə saldı genə türreyi-mişkin sayə,
Deyəsən əbri-siyəh ayə olub həmsayə.

"Rəbbi ərini" deyür idim sana, ey şirinləb,
"Lən tərani" deməsəydün sən əgər Musayə.

Sən elə mahliqasən ki, gözün qurbani,
Arizün vəsfini kim eyləsə, gəlməz sayə.

Gözlərim həsrəti-xunabi tökər hicründə,
Kəştiyi-əhdimi qərq eylədi, vırdi sayə.

Verməmək dil sana olmaz, necə mən dil vermüm,
Görsə Məcnun səni verməz dəxi dil Leylayə.

Göstərür barmaq ilə xəlq səni bir-birinə,
Hüsnüvün pərtövi düşmüş günəşə, həm ayə.

Adəm övladi sənün tək ola bilməz hərgiz,
Verdi bu rütbəni kim Adəm ilə Həvvayə?

Dinü dil tərk elədüm bən rəhi-eşqündə sənün,
Başımi saldım əcəb yerdə genə qovğayə.

Şe`r bazari mənimdür, mənə yetmiş növbət,
Saqiba, xəlq məni bilsə nolur bimayə.

* * *

"Lən tərani" deməseydün sən əgər Musayə,
Salmaz idi yüzüvə, mahvəşim, mu sayə.

Üzmərəm könlümi səndən, elə şirinləbsən,
Etdigün cövrü cəfa gəlməz əgərçi sayə.

Pərdə çək türreyi-pürçinün ilə rüxsarə,
Yanıma gəlsön əgər görməyə ta həmsayə.

Dinü dil tərk elədim, çəkdi kəlisayə məni
Dami-eşqün, edərəm səcdə büti-tərsayə.

Qıl peşiman dəxi bir də işıq alson gündən,
Gün batandan sora hüsnüvi göstər ayə.

Müstəfa(s) eylədi "şəqqülqəmər" hüsnün ayın,
Vəsfi-rüxsarun içun gəldi həmin bu ayə.

Lə`li-nabun həvəsi qıldı məni badəpərəst,
Gecə-gündüz kim edər meyl acı səhbayə.

Qaşlarun fikri kəman eylədi bu qamətimi,
Yeri var tə`nəni vırsun bu kəmanun yayə.

Küfrü zülfün genə sevdası başımdan çıxmaz,
Düşsə, divanə olur kim bu uzun sövdayə.

Gözlərün nərgisi bimar eləmiş gülşəndə,
Qamətün verdi qiyamət xəbərin tubayə.

Növbəti-şe`r bu gün Saqibə yetmiş, Şərqi,[*]
Hər yetən kim, ola bilməz onilə həmpayə.

* * *

Əsir olmaz idim bu kəməndi-giysuyə,
Yox ixtiyar, düçarəm kəmanəbruyə.

Düşəndə hər nəfəs, ey şux, gözlərün badə,
Nigah eyləyərəm məsti-çeşmi-ahuyə.

Dedim sana, mana göstərmə, arizi-alun,
Gözüm düşər bu xətadidə xali-hinduyə.

Ləbündən öpməgə gəldim, kəmanun ox dutdı,
Fərib verdi, inandum bu xali-hinduyə.

[*] Şair Əliağa Şərqi (1879-1939) nəzərdə tutulur.

Girəndə gülşənə rüxsari-aluvı göstər,
Təvaf eyləməsün bağban şəbbuyə.

Demün neçün bu qədr ahü nalə eylərsən,
Düçar olmasun hiç kimsə yari-bədxuyə.

Cəfayi-dəhrdən etmə şikayət, Saqib,
Görərsən hər kəsi möhnətdə, getsön hər suyə.

* * *

Fələk vırdı dağıtdı, xanəm getdi yəğmayə,
Sənün eşqün yolundadur, gəl, ey Məcnun, təmaşayə.

Apardı məhmili-Leylani naqə, verdi əğyarə,
Başunda quş yuvası getdi, gəlməz, düşmə səhrayə.

Gözəllərdə vəfa olseydi sən divanə olmazdun,
Tökərsən seyl tək xunabi-həsrət döndi dəryayə.

Dolanma kuyinə, ol bimürüvvət uymış əğyarə,
Yadından çıxmısan, ey dil, əbəs düşdün bu sövdayə.

Gəl, ey könlüm evin hicran güni bərbad edən dilbər,
Əsir et könlümi zənciri-giysuyi-çəlipayə.

Gələndə yanıma rüxsarə tök giysuyi-pürçini,
İşıq olsa bilər yanımdasan şəhr əhli, həmsayə.

Bu könlüm naləsindən bixəbərsən sübhədək, zalim,
Budur qorxum ki, düşsün fitneyi-aşub dövranə.

Sənün kuyində, ey məh, "Rəbbi ərini" sölədi Musa(ə),
Kəm etdi rütbəsini, "lən tərani" gəldi Musayə.

Çətindür, Saqiba, həqqün sözün nadanə qandurmaq,
Mühəmməd(s) bir də gəlsə, göstərə hər gündə min ayə.

* * *

Çıxmaz yadımdan heç şəbi-hicran hekayəti,
Eylərdi hər nəfəs mana bərpa qiyaməti.

Qədün qiyam edəndə düşər iztirabə dil,
Kim tab edər görəndə qiyamət əlaməti?

Mehrab qaşlarunda iki məst gözlərün,
Kafər, təəccübəm, necə eylər imaməti?

Qəmzön oxilə yarələnüb dil əsir ikən,
Zülfün kəməndinə kimsə etməsün şikayəti.

Rüxsarə tökmə türreyi-ənbərfəşanuvi,
Çək bir kənarə, fitnə dutubdur vilayəti.

Həmrəngdür şərab ləbi-lə`li-nabüvə,
Gün-gündən artar hər yerə getsə, şərafəti.

Xətm oldı hüsn səndə, kəsad etdi Yusifə
Bazar hüsni, sən kimi yoxdur məlahəti.

Hər dərdə çarə etmək olur, əl çək, ey təbib,
Könlümdə var sağalmayacaq dil cərahəti.

Saqib, hənuz badeyi-iffətlə məstsən,
Tərk etmə sən meyi, keçüb ömrün cəhaləti.

* * *

Xəlqə bu sərvqəd ilə göstər qiyaməti,
Aşub dutmasun dəxi bir də vilayəti.

Mehrab qaşlarun durub məst gözlərün,
Kafər, təəccübəm, kimə eylər əmanəti.

Qəmzön oxilə xəstə könül parə-parədür,
Hökm etdi gözlərün, kimə etsün şikayəti.

Yetməz təmamə, alma xəbər, yüz min il əgər,
Söylənsə hər nəfəs şəbi-hicran hekayəti.

Xətm oldı səndə hüsn, nübüvvət Mühəmmədə(s),
Qul etdi satdı Yusifi hüsnün vəcahəti.

Heyrətdə qoydı bərgi-güli, rəngi-laləni,
Gülzar içində bu rüxi-alun lətafəti.

Bəd inqilab göstərəcəkdür bu dəhri-dun,
İndi məlamət ilə verür istirahəti.

Saqib neçün qul oldı sana, vəchi var onun,
Eylər səriri-hüsndə xalun xilafəti.

* * *

Bu qamət ilə etsön əgər sən qiyaməti,
Bir dəm qiyamətün dəxi olmaz əlaməti.

Bazari-hüsni Yusifə xalun kəsad edüb,
Eylər səriri-hüsnüvün üstə xilafəti.

Mehrab qaşlarunda xətadidə gözlərün,
Eylər, təəccübəm, iki kafər imaməti.

Çoxdan sənün bu gözlərüvün mübtəlasiyəm,
Gər olsa onda tə`biyə dünyanun afəti.

Əfşan etmisən yüzə giysuyi-pürxəmi,
Bildim neçün ki, fitnə dutubdur vilayəti.

Ey söləyən mana nədür halun fəraqdə,
Yetməz min il desəm şəbi-hicran hekayəti.

Əski zəmanənün bilən olseydi qədrini,
Etməzdi tazələr belə bihədd xəyanəti.

Girəm, zühur eylədi bir gün İmami-həqq,
Neylər cəhalətə, kimə etsün risaləti?

Saqib, cəhanda ya ayıq ol, ya ki, məst ol,
Hər iki halda dərdü qəmün yox nəhayəti.

* * *

Zahid, qiyamətün gərək olsun əlaməti,
Gər bir əlamət olsa, görərsən qiyaməti.

Hər gün mana qiyaməti bir şux göstərür,
Hərdəm qiyam edəndə onun sərv qaməti.

Gözlən gərək qiyaməti görmək, nə zənn ilən,
Yox e`tibari, xəlqə deyürsən rəvayəti.

Əhvalımi soruşma, çəkil künci-məscidə,
Tab etməsən* desəm şəbi-hicran hekayəti.

Bir mahparə türrəsinün mübtəlasiyəm,
Eylər səriri-hüsndə zalim xilafəti.

Qiymət kəlafi Yusifə verməzdi pirəzən,
Bir zərrə Yusifün gər oleydi məlahəti.

Nərgis çəməndə nərgisi-məstün xərabidür,
Tər qönçə arizündən alıbdur lətafəti.

Əfşan elədün yüzə bu zülfi-pürxəmi,
Bais odur ki, fitnə dutubdur vilayəti.

Qıldun əsir könlüni zülfün kəməndinə,
Qaşun qılıncına gərək etmək şikayəti.

Çox etmə qaşü göz bu güni qarə Saqibə,
Tab eyləyərdi zərrəcə olseydi taqəti.

* * *

Qəddündə olmaseydi qiyamət əlaməti,
İnkar edərdi xəlq mənimtək qiyaməti.

Ey söləyən mana qəmi-hicranə səbr qıl,
Naləndən inqilab dutubdu vilayəti.

Məhşər hədisini demə Məcnuni-xəstəyə,
Almaz qulağə, Leylidən eylə rəvayəti.

Ey sərvnazi-mən, necə dil verməyüm sana,
Hüsnündən aldı, mahvəşim, gül lətafəti.
Ahunigah gözlərüvün mübtəlasiyəm,
Göstərdi qəmzə məndən alub səbrü taqəti.

Xətm oldı hüsn səndə, nübüvvət Mühəmmədə(s),
Xurşidü mahə arizün eylər zərafəti.

---

* Etməzsən

Həqqində xalun eylədi rüsvay Adəmi,
Eylər sərir hüsnüvün üstə xilafəti.

Səbr et demə bu yardən ayrı düşənlərə,
Fəryadlər nədür, bu nəyün bəs şikayəti.

Saqib, hənuz badeyi-qəflətdə məstsən,
Həddən aşırma, tərk elə bir dəm cəhaləti.

* * *

Gördüm o gün ki, səndəki bu sərvqaməti,
Va həsrəta, çıxardı yadımdan qiyaməti.

Bazari-hüsni Yusifə hüsnün kəsad edüb,
Hüsnündən aldı ay işığı, gül lətafəti.

Göstər bu qamətün, görə bağ içrə bağban,
Dil sərvnazə verməyə çəksün xəcaləti.

Yetməz təmamə həşrə kimi şərhi-kakilün,
Kutah olan degül, çox uzundur hekayəti.

Qədün qiyam edəndə, dutar fitnə aləmi,
Zahir olur bu fitnədə məhşər əlaməti.

Hər bir könül ki, bu xəm zülfün əsiridür,
Məhv eyləyüb fəğaninə əhli-vilayəti.

Eşqün yolunda Saqib edüb tərki-dinü dil,
Canından əl çəkər, edəsən gər işarəti.

* * *

Məcnun fəğan ilə gəzərdi dərü dəşti,
Axtarmaz idi, eylə yəqin, huri-behişti.

Leyli itinün öpməgə istərdi əyağın,
Eyb eyləmək olmaz belə divanəsirişti.

Eşq eylədi vadar onı öpsün it əyağın,
Öpməzdi verəydün ona rüxsari-firişti.

Gördüm deyür, ey saqi, nolur qətreyi-meydən,
Əfşan edəsən dürdini meyxanədə xişti.

Məst idim, ayıldım dedim, ey xişt, de kimsən?
Cəmşidi-Cəməm, sölədi, vırma mana müşti.

Yetməz əlim heç bir şeyə, gör bir nədür halım,
Sərf eylər idim simü zəri kəştibəkəşti.

Mə`şuqü meyə, eyşü nişatə gecə-gündüz,
Bir göz yumub-açınca mana mərg yetişti.

Dutmazdı cəhan mülkini, ey dil, belə aşub,
Fərq eyləyən olseydi əgər xub ilə zişti.

Düşməzdim əyağ altına hərgiz belə, Saqib,
Sərfi-mey edəndə elədim bəski dürüşti.

* * *

Könül, fəryad qılma, bağrımi qan eyləyən getdi,
Məni Məcnunsifət rüsvayi-dövran eyləyən getdi.

Vəfası yox, gedər Məcnun başında quş yuva qılmaz,
Cərəs lal ol desün, Məcnuni giryan eyləyən getdi.

Rəqibün malıdur, söz yox ona kim, sərvqamətlər,
Bu müşkil dərdə yox bir çarə, dərman eyləyən getdi.

Dağıtma daği, ey Fərhad, ur tişə, sındırma,
Hanı Şirin, sən ilə əhdi-peyman eyləyən getdi.

Vətən, qal yanə-yanə od içində necə mən qaldım,
Sənün eşqün yolında canı qurban eyləyən getdi.

Ağız, ey qönçə, açma, bülbülə çox dərdsər vermə,
Anı giryan, səni gülşəndə xəndan eyləyən getdi.

Gözüm, çıx, tökmə çox xunablər yar uymış əğyarə,
Özin bil, müşkili hər ləhzə asan eyləyən getdi.

Qəzəl mizanı, Saqib, çox çətindür, bilməsən, əl çək,
Bilən yox tərhi-şe`ri, yazma, mizan eyləyən getdi.

* * *

Ta kəməndi-zülfini ol şux əfşan eylədi
Arizi-gülfaminə, halım pərişan eylədi,

Qanə döndər bağrımi, lə`li-ləbün fikrindədür,
Ta sora əğyar tək heç kim deməz qan eylədi,

Dil ki, olmışdı əsir ol türreyi-mişkinüvə,
Didədən seylabi-əşkim yıxdi viran eylədi,

Dutdı yer bu tiri-qəmzön gözdə, hərgiz bilmədim,
Pərtövi-hüsnün məni əzbəski heyran eylədi.

Ey qoyan qan bağrıma, ahim odından qıl həzər,
Tiği-qəmzön bəs degül, qəsdi-dilü can eylədi.

Sən rəqibə ver könül kuyin duta hicran güni,
Canıni Saqib sana, ey şux, qurban eylədi.

Fikrüvi çox vermə çərxün dövrinə, iç cami-mey,
Bir qul oğlın göz yumub-açınca sultan eylədi.

İxtiyarun yox, qarışma, dövri-çərxi-dunə hiç,
Dutmasun heyranlığun muri Süleyman(ə) eylədi.

Zərrəcə təşvişə düşmə boş yerə, İbrahimə(ə)
Atəşi-Nəmrudi kimdür pəs gülistan eylədi?

* * *

Ol pərivəş nazilə dün seyri-gülzar eylədi,
Gülşəni bülbül gözində döndərib xar eylədi.

Vırdı göz gülzar gülrüxlərün gülçininə,
Çeşmi-məsti nərgisi-bimari bimar eylədi.

Gəlməz idim kuyüvə, ey şux, əldə nəqdi-can,
Gəlməgə cadu gözün hökm etdi dildar eylədi.

Keçdi könlümdən ləbün küncindəki xalun öpüm,
Pozdı bu qəmzön xədəngin, kim xəbərdar eylədi.

Sərnigun olmış demə, əbru kəmanımdur mənim,
Yer kimidür Nuh tufanı, nigunsar eylədi.

Cövrüvi az et mana, məğrur olma hüsnüvə,
Tez alur səndən ki, yoxdur kim səni var eylədi.

Qalmadı tab ayü gündə qaçdı dağdan-dağlarə,
Ol zəman kim, bu pərivəş ərzi-rüxsar eylədi.

Dil verüb əğyarə, qaldım yanə-yanə hicridə,
Ruzigarım zülfi kimi tirəvü tar eylədi.

İnqilabun rütbəsin bilsön verürsən nəqdi-can,
Sanma, Saqib, inqilabı, mərdüm azad eylədi.

* * *

Kim ki, qaşun tərhini, ey şux, icad eylədi,
Məst imiş icad edəndə tiği-cəllad eylədi.

Mən kimi heyran oleydi vadiyi-heyrətdə kaş,
Kim sənün eşqün mənim könlümdə bünyad eylədi.

Sorsa kim məndən neçün halun pərişandur sənün,
Sölərəm zülfün pərişan bu pərizad eylədi.

Ləblərün küncində səpdi daneyi-xalun sənün,
Adəmi rüsvayi-aləm eyləyüb ad eylədi.

Qanə döndi künci-xümdə, ey pərirüxsar, mey,
Lafi-həmrəngi vırub lə`li-ləbün yad eylədi.

Tiri-müjgan ilə verdün tab qaşun tağinə,
Eylə halət yüz verüb mehrab fəryad eylədi.

Sən eylə şirinləbsən zövqi-lə`li-meykeşün,
Göz yumub-açınca Şirini Fərhad eylədi.

Dəgdigiyçün şanələr giysuyi-ənbərbarüvə,
Bağban göz yaşilə sərvi şümşad eylədi.

Hər çəməndə seyr edüb səyyadi-ahu damilə,
Gözlərün uydı gözün yadilə azad eylədi.

Öylə çəkdi qəddüvi hərdəm qiyamət eyləsün,
Zülfüvün hər tarını min dam səd yad eylədi.

Ey deyən ney tək dəmadəm ahü fəryad eyləmə,
Kim məni hicran qəmindən bir nəfəs şad eylədi.

Şe`ridə bu Saqibi ol Yusifi-şirinsüxən,
Aləmi heyrətdə qoymuş şe`rə ustad eylədi.

* * *

Tiği-qəmzön sinəmi, ey sərvqəd, çak eylədi,
Qorxısından qaçdı İsa(ə) seyri-əflak eylədi.

Çeşmi-mərdümküşlərün bimar qıldı nərgisi,
Qönçəni güldirdi gülşəndə, fərəhnak eylədi.

Bildilər sərfitneyi-aləm olur hüsnün sənün,
Ol səbəbdəndür mələklər səcdeyi-xak eylədi.

Daneyi-xalun təmənnasilə verdi cənnəti,
Həzrəti-Adəm əlindən yaxşı idrak eylədi.

Badəni sərməst edən ol lə`li-nabundur sənün,
Hər nə sərxoşlıq var aləmdə bu tiryak eylədi.

Kim sənün eşqün yolunda verdi əldən dinü dil,
Yetdi hər məqsudinə öz rütbəsin pak eylədi.

Qaşlarun tiğinə sən fitvani verdün, səngdil,
Tökməgə qan bəs anı kim böylə bibak eylədi.

Sanma, ey dil, bir mənəm eşqində giryan bu məhün,
Çoxları avarə saldı didə nəmnak eylədi.

Badənün vəsfin görüb Qur`andə "nəf`i-nas"dür,
Meykədə ovbaşı, Saqib, xidməti-tak eylədi.

* * *

Xəyali-qaşlarunla qamətim qəmdən dütaləndi,
Qədün tərhin görüb gülzar içində sərv baləndi.

Ləbündən istədüm kam almağa, qan olmasun bağrım,
İşarə etdi olmaz, çeşmi-məstün bihəyaləndi.

Məni bu zülfüvün sövdasi çəkdi dami-zəncirə.
Bu sövdayə düşən zülfün kimi bəxti qəraləndi.

Kəsad etdi Xətadə bu zülfün müşk bazarın,
Pərişan eyləyəndə arizə bad, səbaləndi.

Xəbər alma dili-sədparəmi, gəl, əl gətür məndən,
Dəmadəm, bimürüvvət, tiri-qəmzöndən sıraləndi.

Görüb müflis məni yüz dutma məndən əğniyalər tək,
Sənün eşqün yolında mən kimi çoxlar gədaləndi.

Dağıtma türreyi-pürpiçü tabun, tökmə rüxsarə,
Könüllər sərbəsər viran olub möhnətsəraləndi.

Tök indi seyl tək xunabi-həsrət çeşmi-giryanım,
Verüb əğyarə dil ol mahvəş məndən araləndi.

Məlamət etməsün heç kim məni yüz dutsam aləmdən,
Görün bir göz yumub-açınca kim qiblənüməlendi.

O gün dünyanı dutdı fitnəvü aşub hər saət,
Dəri-meyxanələr bağlandı, məscidlər binaləndi.

Vücudi-aşinani, Saqiba, axtarma, heç yoxdur,
Vücudi-aşina nayab olubdur, kimiyaləndi.

* * *

Elə paybənd edübdür məni zülfüvün kəməndi,
Sənün eşqüvə, çətindür qaçam ondan, ey əfəndi.

Necə mən əsirün olmum, elədün şikar könlüm,
Xəcil eyləmiş duvağun şəkəri, nəbatü qəndi.

Genə, ey nigari-bədxu, neçün uymısan rəqibə,
Sora gül kimi ləbündən, sana olmaya diləndi?

Dedi naseh, əl çəküm mən sana bir də verməyüm dil,
Yox əlimdə ixtiyarım, mana çox də verdi pəndi.

Dolanur dalunca ayü gün görə ayinə cəmalun,
Mən edəndə vəsfi-hüsnün, səni ayü gün bəgəndi.

Necə xəlq heyrət etməz sən açan dəqiqə rüxsar,
Səhərim bu hüsnün ilə açılub belə bəzəndi.

Sən eləyəndə seyr bağə xəcil etdi sərvi qəddün,
Rüxi-aluvi təmaşa eyləyəndə gül güləndi.

Demə neyçün eləyürsən bu qədr fəğanü nalə,
O qədr verübdür əğyarə məni-zarə dil gəzəndi.

Əyağ altına düşübdür çürümüş ki, buriya tək,
Yox əlində heç nə, Saqib, o ki, dövlətə güvəndi.

* * *

Gördi ömrində nə ləzzət o ki, dünya dutdı,
Çəkdi boş zəhməti-bica rəhi-bica dutdı.

Gördi başdan-əyağə qüssəvü qəmdür bu cəhan,
Demə Məcnun nə içün daməni-bica dutdı.

Nəfsüvün düşkini Fir`on kimi olma, həzər et,
Vermədi diqqət ona, bir dəm onı dərya dutdı.

Rütbəsin eylədi kəm, sölədi “rəbbi ərini”,
Bax bu Musayə əcəb gör nə təmənna dutdı.

Dolanur göz qabağında o pəriçöhrə müdam,
Görməyür əldə neçün bəs yədi-bəyza dutdı?

Kişi İsa(ə) kimi olsun gərək, ey vaizi-şəhr,
Qaçdı bu xəlqdən, əflakdə mə`va dutdı.

Ey Xəlilə odı gülzar eləyən şirinləb,
Daği-hicrün dili-divanədə min ca dutdı.

Aləmi eylədi bir qan çanağı əhli-qərəz,
Nə içün aləmi bəs bir belə qovğa dutdı?

Göstərür yol mana çoxsı bu yolilə gedəsən,
Neçün, ey dil, özi imdi rəhi-dünya dutdı.

Badeyi-Kövsərə bilmərrə dəxi meyl etməz,
Ləbüvün fikri ilən kim meyi-mina dutdı.

* * *

Əsiri-zülfi-pərişan bilinməmiş qaldı,
Fədayi-navəki-müjgan bilinməmiş qaldı.

Başunda tikdi neçün lanə quşlar, ey Məcnun?
Bu sirri-Leyliyə qurban, bilinməmiş qaldı.

Nədür bu neydə nəva, nalə bəndi-bəndində,
Kim eyləmiş onı giryan, bilinməmiş qaldı.

Nə şö`lədür görünür, hüsni-şəm`i-suzandə,
Bilinməgi degül asan, bilinməmiş qaldı.

Demün mana nə içün ahü nalə eylərsən,
Hekayəti-şəbi-hicran bilinməmiş qaldı.

Cəhanə salmısan, ey sərvinaz, min fitnə,
Kim oldı hüsnüvə heyran, bilinməmiş qaldı.

Bu mahparənün ağzun müdam öpər sağər,
Könüllər oldı neçün qan, bilinməmiş qaldı.

Mey etdi tövbə genə dutmasun səbu küncin,
Səd heyf, məclisi-rindan bilinməmiş qaldı.

Apardı Leylini naqə rəqiblər evinə,
Nədür bu seyri-biyaban, bilinməmiş qaldı.

Müdam təkfir edür vəsfi-badəni zahid,
Həram edüb kimə Qur`an, bilinməmiş qaldı.

Bu qədr qan tökülür, Saqiba, nədür səbəbi,
Məqami-rütbeyi-insan bilinməmiş qaldı.

* * *

Kim etdi zülfüvi əfşan, bilinməmiş qaldı,
Üzarüvə, sana qurban, bilinməmiş qaldı.

Əsiri kimdür onun, heç deməz ki, azad et,
Bu sirr edüb məni heyran, bilinməmiş qaldı.

Nədür bu xali-siyəh, mahparə, hüsnündə,
Olub məgərmiş asitan, bilinməmiş qaldı.

Özün neçün oda pərvanə yandırur hərdəm,
Məgər dönüb oda canan, bilinməmiş qaldı.

Neçün gərək ola rüx tək bu növki-müjganun,
Edərmi tab ona min can, bilinməmiş qaldı.

Bu bərgi-yasəmən olmış neçün qəmaludə,
Bu qönçə bəs niyə xəndan, bilinməmiş qaldı.

Xəyali-ləblərün ilə mən içmişəm badə,
Neçün həram edə Qur`an, bilinməmiş qaldı.

Kimün muradinə bu ayü gün çıxar hər bir gün,
Nə əhdidür bu, nə peyman, bilinməmiş qaldı.

Nə fitnə olsa cəhandə, təmam səndəndür,
Nə oldı mülki-Süleyman(ə), bilinməmiş qaldı.

Çəküb bu nəqşüvi nəqqaş qaldı heyrətdə,
Olubdur imdi peşiman, bilinməmiş qaldı.

Təəccüb etmə bu şətrəncə, əqli mat eylər,
Kim oynasa uduzur can, bilinməmiş qaldı.

Neçün yetən eyləyür şe`rbazlıq, Saqib,
Məqami-rütbeyi-insan, bilinməmiş qaldı.

* * *

Çəkmə qəmi-dünyani ki, divanəyə qaldı,
Vermə könül əfsanəyə, əfsanəyə qaldı.

Ol qəsrdə Bəhram içərdi meyi-nabi
Gülrüxlər ilə, yox, hanı, viranəyə qaldı.

Tə`n eyləmə qəddim xəm olub əgri kəman tək,
Düzlik düşüb əldən-ələ biganəyə qaldı.

Mən xaluvun avarəsiyəm, sevgili yarım,
Zahid genə səccadəyə, səddanəyə qaldı.

Zülfün girehindən könül, ey şux, açılarmı,
Hər şamü səhər vırson əgər şanəyə qaldı.

Vay halinə bu mürği-dilün, daneyi-xalun,
Qucmış işi əbruyi-kəman xanəyə qaldı.

Peyğam elədim saqiyə lə`lün həvəsilə,
Düşmiş işimiz badəyə, meyxanəyə qaldı.

Yandırdı məni, laləni bu arizi-alun,
Şəm`ün odına yanmağa pərvanəyə qaldı.

Saqib, genə bu deyri-fənayə uyacaqsan,
Varü yoxı birdən-birə, gör ha, nəyə qaldı?

* * *

Kəməndi-zülfüvə divanə könlüm paybənd oldı,
Bihəmdüllah, yetişdi məqsədə Məcnunpəsənd oldı.

Tapubdur yol necə rüxsaruvə bu daneyi-xalun,
Qul oğlun rütbəsin gör bir nə qayət sərbülənd oldı.

Məlahət mülkini təsxir edüb əbrulərün tiği,
Dutar dünyanı, əlbəttə o kim, sahibi-fənd oldı.

O qədr şaneyi-şümşad vırdun zülfi-müşkinə,
Gəhi zünnar, gəh zəncir olub, gahi kəmənd oldı.

Sənün eşqün yolında tərk qıldım dinü dil, getdi,
Ləbün kam alur əğyar, gör, kim bəhrəmənd oldı.

Mana, ey söləyən, əl çəkgilən bu sərvqamətdən,
Məlamət tərkin et, tə`sir haçan Məcnunə pənd oldı.

Şərabun tövbəsin Saqib edər, ey zahidi-kəcbin,
Haçan gördün ilan kamında döndi zəhr qənd oldı.

* * *

Kim gəlibdür bu cəhan mülkinə bədnam oldı,
Mübtəla oldı qəmü möhnətə nakam oldı.

Nə səfa badədə vardur, nə fərəh minadə,
Adıdur badə, vəli qanə sərəncam oldı.

Gecənün sübhinə bel bağlama, bir saniyədür,
Görəcəksən anı fovrən qeyidüb şam oldı.

Əl-əyağın uzadıb kim ki, məzaristanda,
Qəmü ənduhdən azadəvü aram oldı.

Sorma keyfiyyəti-Kavusü Keyi məndən heç,
Kuzəgər kargəhində mey içün cam oldı.

Gözlərün sədqəsi ollam demişəm, səhv etdim,
Döndi ahubeçə axırda xunaşam oldı.

Saqiba, bilməz idim eşq nədür aləmdə,
Eyləyən eşqün əsiri bu dilaram oldı.

* * *

Var idim mən o zəman aləmü Adəm yox idi,
Nədür bilməz idim ahi-dəmadəm yox idi.

Cami-vəhdətdən içüb badə meyaludə idim,
Ayeyi-"fəctənibu"*, nari-cəhənnəm yox idi.

Sərfiru heç kimə eyləməz idim hərgiz,
Qan içən Xosrovü Cəmşid nə pərçəm yox idi.

Yüzin idbarlərün görməz idim asudə,
Hər çürük bir söz içün həlqeyi-matəm yox idi.

Ney kimi gəlməz idim naləyə hicran gecəsi,
Göz yaşı damənimi dutmaz idi, qəm yox idi.

Nə Məsiha yüzini görməz idim dar üzrə,
Nə də rüsvayi-cəhan həzrəti-Məryəm yox idi.

Saldı bu damə genə kim məni heyranəm ona,
Mən kimi bargəhi-yardə məhrəm yox idi.

---

* "... çəkinin..." (Qurani-kərim, Həcc, 30)

İmdi bu mahvəşin eşqinə düşdüm, ey dil,
Bu pəriçöhrə kimi türrəsi pərçəm yox idi.

Saqiba, məscidə getmə, rəhi-meyxanəni dut,
Məscidə getmiş idim orda bir adəm yox idi.

* * *

Eşqün odı əvvəl dili-pərvanəyə düşdi,
Bir zərrə bu oddan məni-divanəyə düşdi.

Dil qanə dönüb ləblərüvi yad eləyəndə,
Hər ləhzə sorub nəş`əsi biganəyə düşdi.

Getdi dili-divanəm, özindən xəbərün yox,
Bu türreyi-zülfün dolaşub şanəyə düşdi.

Müşkil o gün oldı işi ol Adəmi-zarun,
Ey şux, yüzündə gözi bu danəyə düşdi.

Ey saqi, məni məstü xərab etmə ki, bir dəm
Doldur, işimiz bir dolı peymanəyə düşdi.

Adəm bizi bu deyri-dəni daminə saldı,
Saqib, yolı neyçün belə viranəyə düşdi.

* * *

Xəyalın ilə içeydim şərabi-ənguri,
Müdam meykədə küncində, ey gözüm nuri.

Əl üzmərəm desə zahid bu küfri-zülfindən,
Edüb əgərçi mana və`də cənnəti-huri.

Ədəblə gəl bu məhün kuyinə sən, ey Musa(ə),
Bırax bu "ərni" sözin, dutma daməni-Turi.

Degül bu xal dutub lə`li-nabuvun küncin,
Çəkər özinə tərəf bal həmişə zənburi.

Xümmarlıq bu meyi-lə`lfamdə olmaz,
Gər məsti-çeşmivün olmuş xərab məxmuri.

Dedim o türreyi-yarə qaralmısan nə içün,
Dedi əsir elədüm bəs ki, leyli-deycuri.

Müğənni, al dəfi, yandı bu sınıq könlüm,
Doyunca bir gətür avazə nəğmeyi-Şuri.

Neçün bu xəlq məni incidür, dur, ey saqi,
Gətür şərabi ki, incitmişəm məgər muri?

Qələt oxur sözimi, Saqiba, mənim Nadir,
Heç incimə, nə bilür fərqi-Şur ilə suri.

* * *

Dili-divanə ram oldı, görüb zülfündə zənciri,
Qaçır zülf içrə, gizləd, görməsün əbruyi-şəmşiri.

Deyürsən, öp gözümdən, raziyəm, ey aşiqi-zarim,
Düzülmüş qətlimə səf-səf budur müjganlarun tiri.

Dilə peyğam verdi, görüb göz bu mahrüxsarun,
Sana dil mail olmazdı, bu çıxmış etdi tədbiri.

Sana kim mail olmaz, xətmdür hər şivələr səndə,
Səni almış əlimdən, dutmadım əğyarə təqsiri.

Salubdur heyrətə hüsnün sənün surətgəri-Çini,
Dəxi nəqqaşi-qüdrət, bir də çəkməz böylə təsviri.

Könüllər naləsindən ehtiraz et, düşmə təşvişə,
Pərişan eyləmə rüxsarüvə, bu zülfi-şəbgiri.

Bu mahun hüsnün ayatınun şərhin, gəl et, vaiz,
Keçüb vəqti onun bilmərrə açma bir də təfsiri.

Danış, gəl, söhbət eylə, heç kimə izhari-dərd etmə,
Gülər düşmən sana dərdün bilüb, ver özvə təğyiri.

Mən ilə azərilər fəxr edər bir gün gəlür, Nadir,
Deyərsən mən əbəs incitmişəm ol Saqibi-piri.

Ürək sındırma bir də, tikmək olmaz, ey kəmanəbru,
Əgər min Kə`bəni yıxson, olur bir gündə tə`miri.

Güli ver bülbülə, ey rəfiqim, yaquti sərrafə,
Nə bilsün daşqıran beyqulər içrə qədri-iksiri.

* * *

Görmədim türreyi-zülfündə bəladən qeyri,
Mübtəlası yox onun bəxti-qəradən qeyri.

Yetdi əğyar sənün vəslüvə, ey şirinləb,
Olmadı qismətün hicründə cəfadən qeyri.

Edərəm mən necə hicran gecəsi ahü fəğan,
Yox bilən sübhə kimi badi-səbadən qeyri.

Sən mənim bağrımi qan eylə ləbün fikriylə,
Etmərəm mən sana peyvəstə duadən qeyri.

Bilsə idim bu cəhan mülkinə mən gəlməzdim,
Çəkmədim bir nəfəs heç bihudə nəvadən qeyri.

Etmə təklif mana məscidi, zahid, əl çək,
Səndə məsciddə hanı buyi-riyadən qeyri.

Hiç təşviş eləmə sərhədi-məqsəd yoxdur,
Heç nəyi görməyəcəksən boş həvadən qeyri.

Saqiba, yar sana qeyridən olmaz hərgiz,
Yar olmaz sana heç kimsə Xudadən qeyri.

* * *

Böylə hardan yaranub müğbeçə məhparələri,
Yandırur hüsn oduna aşiqi-biçarələri.

Necə tab eyləsün, ey şux, bu müjgan oxuna,
Dili-divanəmə vırdun bu qədr yarələri.

Qanımi tökməgə qəmzön oxilə bəhsidədür,
Qaşlarun tiği ilə dəgmiyə kaş arələri.

İki xunxar eləyür bəhs ki, bir qan töksün,
Birinün ahı yaxar bu iki xunxarələri.

Və`deyi-vəsl verüb gəlmədün, ey şirinləb,
Gözləməkdən səni getdi gözümün qarələri.

Saqiba, aç gözüvi, badeyi-qəflətdən ayıl,
Dutmış əldə vətənün düşməni qəddarələri.

* * *

Öylə dərd aldı mənim canımi, yox çarə yeri,
Ey təbib, çarə olarmı belə bimarə yeri.

Sünbülün halıni poz, dərhəm elə, şirinləb,
Bağə bu türreyi-zülfi-siyəhün darə yeri.

Fəsli-güldür meyi-gülfam ilə doldur cami,
Naz ilə dut qədəhi, sağəri gülzarə yeri.

Hüsnüvə fəxr eləyərdün, onı xət qarət edüb,
Şükr öpməklik içün qalmadı əğyarə yeri.

Nə əcəbdür ki, cəhan mülkini dutmış fitnə,
Zahida, məscid olub meykədə, meyxarə yeri.

Lalə bilmə ki, alursan əlüvə gülşəndə,
Dili-Fərhaddür ol, bax ona, var yarə yeri.

Ey mana tə`n eləyən tərk elə çöllər seyrin,
Nə bilim hicrdə çöllər gərək avarə yeri.

Ey Züleyxa, bu qədr fəxr eləmə Yusiflə,
Doludur Azərinün kişvəri məhparə yeri.

Yusifə yetdi qəzəl növbəti, Saqib, əl çək,
Azacıq var genə yazmaqlığa Səyyarə* yeri.

* * *

Yetişməz sərhədi-məqsudə hər kim getsə rahi-əgri,
Rəiyyət ağ olur başdan-əyağə baxsa şah əgri.

Müşəxxəs əmrdür bu əgrilik heç bir səmər verməz,
İşıqdan kəm olur, verməz işıq olduqca mah əgri.

* Şair Həsən Səyyara (1891-1936) işarədir

Qəbul olmaz min il gər səcdə qılsa Xətmi-peyğəmbər,
İnan, zahid, əgər tük qədri olsa qibləgah əgri.

Sevən sultanlığı bir dəm gərək kim yatmasun rahət,
Rəiyyətpərvər olsun, olmasun ta kim sipah əgri.

Əgər xoş gəlməsə bir kəs sənə xar etmə xəlq içrə,
Kim olsa ehtiram et, ey könül, qılma nigah əgri.

Necə qan olmasun bağrım mənim ol sərvi-gülrüxdə,
Qaş əgri, qəmzə əgri, türreyi-zülfi-siyah əgri.

Kişi öz qədrini, Saqib, qılıncla bildirür xəlqə,
Girib bazarə qol atsun nə kim, qoysun külah əgri.

* * *

Hər dərd olsa, var onun, əlbəttə çarəsi,
Əmma tapulmaz həşr qopa tə`nə yarəsi.

Hərdəm qoyar rəqib dodağın dodağuva,
Yandırsun aləmi görüm, ahım şərarəsi.

Ey və`deyi-vüsal ilən aldadan məni,
Uydun rəqibə yoxsa genə, mah parəsi.

Baxdım o qədr həsrət ilən mah hüsnüvə
Gizlin rəqibdən, gözümün getdi qarəsi.

Eşqün yolunda tərk elədim, getdi dinü dil,
Varü yox əlimdən aldı bu qaşun işarəsi.

Künhün həqiqətün əbəs heç etmə bəhsini,
Nə əvvəli, nə axırı var, yox kənarəsi.

Saqib, əlün üzüldi genə nazlu yardən,
Yatmış, ayılmaz həşrəcə bəxtün sitarəsi.

* * *

Qəmdür həmişə aşiqə dəhrün həvaləsi,
Tə`sir eyləməz ona dil ahü naləsi.

Zəncir ilə əgər dutam ülfət əcəb degül,
Divanə eyləmiş məni zülfün kəlaləsi.

Dün yetmədüm mən ol səri-kuyun minasinə,
Gülçöhrə saqinün məni incidüb piyaləsi.

Bir nimqəmzə zahidə göstərsön, ey gözəl,
Əldən gedər ibadəti-həftadsaləsi.

Gördüm fəqihi-mədrəsənün dərsü bəhsini,
Çatmırdı bircə yad ola şərhi-ğəsaləsi.

Qur`an yüzilə eyləmək olmaz ibadəti,
Vermiş bu hökmi vaizi-şəhrün risaləsi.

Zahid, behişt əhli-dilün söhbətindədür,
Mehrab içində yoxdu behiştün qəbaləsi.

Minbər kimi oturma yerə, dutma yer müdam,
Tez yaxşıdur ki, hər şeyün olsun izaləsi.

Salmış cəhandə fitneyi-aşub, Saqiba,
Gülşəndə bülbülün genə şurü nəvaləsi.

* * *

Arizün heyrətə salmışdı məgər nəqqaşi,
Qaş yerinə iki şəmşiri çəküb ol naşi.

Ləblərün fikri ilə dutdı səbu küncini mey,
Öpməgə şamü səhər bu ləbi-gövhərpaşi.

Pərtövi-hüsnüvə gün durmasa qarşu, nə əcəb,
Gün xüsusində nə hacət qınamaq xəffaşi.

Görsə bu qaşlaruvun tərhini, ey şirinləb,
Zahidün guşeyi-mehrabə əgilməz başi.

Dolanum kuyüvə qoymaz məni hicran gecəsi,
Bəs ki, ətrafinə cəm` oldi məlamət daşi.

Bağban sərvün əyağinə nolur su töksə,
Qamətün sərvinə mən də tökərəm göz yaşi.

Ləblərün fikri ilə badəyə vermiş dilü din,
Saqibə xəlq deyür, meykədənün ovbaşi.

* * *

Hər zəman şiveyi-naz ilə gər əgsön qaşi,
Zahidün guşeyi-mehrabə əgilməz başi.

Çəkə bilməz yüz ilə əksi-rüxün təsvirin,
Ki, salub daireyi-heyrətə min nəqqaşi.

Məstlik nəş`əsini badə ləbündən almış,
Dəhənün sirrinə həm mö`cizi-İsa(ə) naşi.

Zahid, kəsb elə bir əhli-təriqün rəvişin,
Bəsdü tökdün bu qədr cənnət içün göz yaşi.

Tutiya tək gözə çək xaki-dəri-meykədəni,
Kaş oleydim bu dəri-meykədənün bir daşi.

Rəvişi-Saqibi gər görməsə zahid nə əcəb,
Gün xüsusində nə hacət qınamaq xəffaşi.

* * *

Lalərəng oldı nigarun ləbi-gövhərpaşi,
Badədən bağrı meyün qanə döneydi kaşi.

Sorma məşşatədən, mən gözələm, ya Yusif,
Xəbəri məndən al, ey məh, nə bilür ol naşi.

Çəkə bilməz yüz ilə əksi-rüxün təsvirin,
Ki, salub daireyi-heyrətə min nəqqaşi.

Sən açanda yüzüvi çıxmasa ayü gün nə əcəb,
Gün xüsusində nə hacət qınamaq xəffaşi.

Nola görsəm səni göz yaşi rəvan etməm əgər,
Bağban sərvin əyağinə tökər göz yaşi.

Zahidün qövlünə bel bağlama, zahid, əl çək,
Xoşdur ondan olasan meykədələr ovbaşi.

Qaşlarun tağını Saqib kimi görsə zahid,
Dutmaz üz qibləyə, mehrabə əgilməz başi.

* * *

Atma, zahid, mana hər ləhzə məlamət daşi,
Söləyürsən mana, ey meykədələr ovbaşi.

Xalidür buyi-riyadən meyi-meyxanə yolı,
İç meyi-biğəşi, ey mədrəsənün külbaşi.

Pərdə çək türreyi-müşkinün ilə rüxsarə,
Salmısan dayireyi-heyrətə min nəqqaşi.

Edərəm hər nəfəs e`cazi-Məsiha zahir,
Sorsa idim mən əgər bu ləbi-gövhərpaşi.

Vergilən tab qaşun tağinə, ey qaşi kəman,
Zahidün guşeyi-mehrabə əgilməz başi.

Bağban sərvün əyağinə tökər gözdən su,
Etməyir xidmət sərvi-qədüvə ol naşi.

Qamətün bildirür hər ləhzə qiyamət xəbərin,
Bəs ki, verdüm bu qədün sərvinə mən göz yaşi.

Dolanur kuyüvə əğyar, verür rəşk mana,
Verməyəydim sana, divanə könül, ey kaşi.

Qəmi-bu deyri-dənini nə çəkirsən, Saqib,
Özüvə kəsb elə meyxanə kimi yoldaşi.

* * *

Hüsnündən od dutubdur hər lalənün yuvaği,
Lə`lün xəyalı ilə var sinəsində daği.

Kam istəsəm ləbündən, ey məh, məlamət etmə,
Kafər də olsa, qovmaq caiz degül qonaği.

Rüsvayi-eşqün oldum, sən qeyrə dil verürsən,
Bir səndən ötri olmış aləm mənimlə yaği.

Dəryalərə qarışdı hicründə seyli-əşkim,
Qorxum budur ki, etsün dünyani qan çənaği.

Əğyarə verməröm dil, əhd eylədün mənimlə,
Eylər təvaf kuyün, kəsilməyüb əyaği.

Dünya utanmayur heç yerdən kimi tapubdur,
Yaxşı-yəmani bilməz, seçməz qərani aği.

Çoxdan ədəm yolında sərgəştə mən gəzərdim,
Saqib, gər olmaseydi meyxanələr bucaği.

* * *

Ey saqi, gətür badəni, doldur bu əyaği,
Sərməst olayım, seyr edəyim gülşənü baği.

Rüxsarun odı cuşə gəlüb, durma yanımda,
Yandırdı məni, lalə durub yandı yuvaği.

Fəxr etməgilən hüsnüvə aşubi-cəhandur,
Ta sübhə kimi yanmayub heç kimsə çiraği.

Sərkeşligi çox eyləmə üşşaqi görəndə,
Gəzdirmə başunda dağılar qanlı çənaği.

Dağə bu qədr çalmagilən tişəni, Fərhad,
Vardur hünərün, yıx dili-zarımdakı daği.

Getsön yolı düz, sınmaz əyağun, sana qurban,
Kim getsə yolı əgri, sınar başi-əyaği.

Zahid, mana eyb etməgilən badəpərəstəm,
Tərk etmək olarmı ola gər pir dəyaği.

Çoxsı özini rəngə salub, məqsədə yetsün,
Bilməz xəbər alson nə qərani nə də aği.

Bəxtün qayıdanda onı, Saqib, dutan olmaz,
Xoşbəxt olanun bir gün olurmış belə çaği.

* * *

Olmaseydim mən əgər dürdi-meyün sərrafi,
Saqi verməzdi mana cami-şərabi-safi.

Tapmadı kuyüvə yol, vadiyi-heyrətdə qalub,
Əldə təsbih ilə zahid, dolanur Ə`rafi.

Elm ilə xəlq cəhan mülkini təsxir etmiş,
Genə vaiz oxıyur şərhi-kitabi-Kafi.[*]

Hünərü elm ilə me`rac eləyür əflakə
Əcnəbilər, verəcəksənmi məgər insafi?

Yeri var əcnəbilər də`viyyi-üluhiyyət edə
Hünərü elmilə, bihudə degül heç lafi.

Elmə diqqət gözilə, fəhm ilə bir eylə nəzər,
Müşk alur elm ilə ahuyi-Xətanun nafi.

Girmisən məscidə, yoxdur xəbərün aləmdən,
Yaradub xəlq nələr, seyr elə bir ətrafi.

Əhli-hal ilə keçir vəqtüvi, Saqib, fəhm et,
Şah ola, həmnəfəs etmə özüvə əclafi.

* * *

Eşqdən, ey dili-divanə, vırarsan lafi,
Bari-eşq etdi kəman qaməti-kuhi-Qafi.

Daridən darə çəküb bəndi-kəməndi-zülfün,
Ləblərün seyr elə, urdı Məsiha lafi.

Tiği-əbrulərə hökm eylə ki, qanım töksün,
Səri-kuyin gəzə, qoyma, duta hər əclafi.

Künci-meyxanədə, ey şux, ləbündən ayrı,
Artırur qəm mana işdikcə şərabi-safi.

Ayü gün seyr eləyür əksi-cəmalun görsün,
Vəsfi-rüxsarüvün heyrani kitabi-Safi.[*]

Yetirüb badi-səba rayiheyi-zülfündən,
Mişk ətrin alub ahuyi-Xətanun nafi.

---

[*] "Üsuli-Kafi" kitabına işarədir.

[*] Qurani-kərimin təfsiri

Rəşkdən dutdı səbu küncini meyxanədə mey,
Düşdi meyxanələrə lə`li-ləbün övsafi.

Dustə ya özüvə qaidə ilə sərf et,
Min xəzinə gedər əldən, eləsön israfi.

Naşiyə satma mətaun, nə bilür qiymətini,
Vardur hər şeyin aləmdə xələf sərrafi.

* * *

Xəm etdi qaməti-Məcnuni firqəti-Leyli,
Cəhanə fitnəni saldı məhəbbəti-Leyli.

Nə aşiq olmadı Məcnun kimi bu aləmdə,
Nə bir gözəldə var olmaz bu isməti-Leyli.

Əcəb degül eyləsəm səcdəsin bu mahvəşün,
Hərimi-Kə`bədən artuqdur qiyməti-Leyli.

Qıl ehtiyat, dila, keçmə Leyli kuyindən,
Ədəblə keçgilə, vacibdü hörməti-Leyli.

Gəlür qulağə cərəs naləsi, dur, ey Məcnun,
Dəri-biyabanı sındırdı həsrəti-Leyli.

De Yusifə bu qədr vırma dəm məlahətdən,
Zühuri-əmri-məlahətdür şöhrəti-Leyli.

Kəsilüb hələ Məcnunun ahü nalələri,
Tökər sirişk çəkər ahi-həsrəti-Leyli.

Məsih mö`cüzəsin vəsf eyləmə, zahid,
Minbər gərək eyləsün bəlkə xidməti-Leyli.

Nə meydə nəş`ə olur, Saqiba, nə saqilərdə fərəh,
İçəndə badeyi-gülfami eylə niyyəti-Leyli.

* * *

Qurbanın olum, gözəl qubalı,
Heç görməmişəm qızıl qəbalı.

Sən tək məgər huri-cinansan,

Heyranun olub Xütən qəzalı.

Bir şəhi-bəla yatub gözündə,
Kəc baxma, xətalıdur xətalı.

Qoyma sala sayə arizündə,
Hər ləhzə bu zülfi-laübali.

Gəzmə mən ilən görər xəlayiq,
Həsrət aparar, dolan aralı.

Sərgəştəvü zarü natəvanəm,
Halimdən haçan olarsan hali.

Tə`n eyləməz aşiqə dəmadəm
Əğyar, ola gər yar vəfalı.

Əmma bu gözəllərə vəfa yox,
Şahid bu sözə ki, xəttü xalı.

Qəmzön oxı san çəküb könüldə,
Seydi belə kim qoyar yaralı.

Hökm eyləgilən qaşun qılıncı,
Canım ala, azəri maralı.

Səri-kuyində gəzər müdam Saqib,
Eyb eyləmə, əslidür gədalı.

* * *

Ruhim qanad açar, eşidən dəmdə nami-mey,
Zahid soruşsa gər necə mey, lə`lfami-mey.

Həmsöhbət oldı daneyi-təsbih zahidə,
Vəchi budur ki, saxlamadı ehtirami-mey.

Gər su meyə qarışsa, verür tez baş ağrısı,
Su qatılar şərabə, oxundı hərami-mey.

Etdikcə vəsf badəni təkfiri-möhtəsib,
Meydən ayılmamış içərəm sübhü şami-mey.

Vermiş fəqihi-mədrəsə fitvani küfrimə,
İçdim qədəh-qədəh niyə mahi-siyami-mey.

Saf olmayınca künci-səbuyilə şişədə,
Zinhar dərdsər verür, heç içmə xami-mey.

Bədməstlik əlaməti olseydi məndə gər,
Verməzdi saqi birə beş cam-cam mey.

Təkfir, möhtəsib, eləmə cami-badəni,
Cəmşidlərdür həlqəbəguş qulami-mey.

Meydən sən ictinab elə, mey səndən eyləyər,
Hal əhlinə həram degül, vəssəlam, mey.

Qəm üzərində içmə mey hərgiz, qəm artırur,
Xürrəm könüllər olmasa, dutmaz məqami-mey.

Gülçöhrə saqi Saqibə verməz piyaləni,
Bədməstlik edüb, eləmibdür dəvami-mey.

* * *

Sağərün etdi cilvə rüxi-afitabi-mey,
Xümxanə düşdi məst, gətürdi niqabi-mey.

Var vəchi neyçün oldı bizə şər`idə həram,
Meyxanə dutma, olmasa gər səndə tabi-mey.

Bir cam içməmiş qoparursan qiyaməti,
Nə çarə eyləsün sana xanəxərabi-mey.

Tə`siri-mey degül səni divanə eyləyən,
Başdan-əyağə ruhi-rəvan, cənabi-mey.

Yol verməyür təbiəti, ərbabi-fitnədür,
İnsanlığa xərab degül lə`li-nabi-mey.

Ey saqi, qarəgözli məhparə sərvqəd,
Dil qanə döndi rahəti-can, ver kəbabi-mey.

Baxma fəqihü müdərrisün qaş-qabağinə,
Cani cəhənnəmə, eyləsün ictinabi-mey.

Qurma könüldə xeymeyi-qəm, şadlıq sevər,
Oynar səbudə, çal neyü çəngü rübabi-mey.

Saqib, cəhandə eyb eləmə xəlqə, qıl həzər,
Qorxma, qiyamətün güni yoxdur əzabi-mey.

* * *

Vacibdür hər kəsə eyləsün ehtirami-mey,
Olmış həramzadəyə, zahid, həram mey.

İblis səcdə eylərdi xaki-Adəmə,
Bir qətrə içseydi əgər lə`lfami-mey.

Etməz fəsad məndə, fəsadə fəsad edər,
İçsəm qərabəylə əgər sübhü şam mey.

Meyxanə piri badəni verməz əyağ ilə,
Hər kim degülsə həlqəbəguş qulami-mey.

Ey bilməyən bu qədri-meyi, uyma zahidə,
Tə`zim eylə zikr ola hər yerdə nami-mey.

Etməz tülu` piyaleyi-məşriqdən ayü gün,
Doldurmaseydi saqiyi-gülçöhrə cami-mey.

Naseh, nəsihət eyləmə bu rind Saqibə,
Ruhun qəzasıdur, içər ol, vəssəlam, mey.

* * *

Yaqutrəng, laləsifət, lə`lfam mey,
Ləbriz eyləmiş mənə ol saqi cami-mey.

Qaldıqca xümdə künci-səbu ilə şişədə,
Qiymətlənür ki, saflaşur niknam mey.

Bədməstlik əlaməti nəfsimdə görmədim,
Meyxanələrdə sərf elədim sübhü şam mey.

Keyfiyyəti-şərabə mənim kimi hali yox,
Mən mey içəndə şad olur, vəssəlam, mey.

Dinsizligin əlamətin izhar eylərəm,
Gər içsəm qərabə ilən mən müdam mey.

Buyi-riyani badədə görmək məhaldür,
Vacibdür hər kəsə eləsün ehtirami-mey.

Qövli-fəqihi-mədrəsədən ictinab qıl,
Ey saqi, ver, içə meyi, pirü qulami-mey.

Saqib hərifi-meykədədür, zahid, əl gətür,
Təklifi-tövbə etmə, olub bəs ki, rami-mey.

* * *

Əl çək, heç içmə, yoxdur əgər səndə tabi-mey,
Dutmır təbiətün ilə bu xanəxərabi-mey.

Rüsvayi-aləm olmısan, əl çəkmisən genə,
Bəsdür dedün ki, saqi, gətür lə`li-nabi-mey.

Sən içməseydün kim oxuyardı həram onı,
Rüsvayi-xəlq bisəbəb olmub cənabi-mey.

Mey görsə gər məni dəri-künci-səbu dutar,
Yıxmazmı əgər aça min inqilabi-mey.

Zahid, utangilən, məni az, gəl, məlamət et,
Meyl etməsənmi* saqi verəndə kəbabi-mey.

Vay haluva sənün qatasan gər su badəyə,
Səndən şikayət eyləsə ruzi-hesab mey.

Dutmaz cəhani fitneyi-aşub, Saqiba,
Cüz zahidü fəqih içə şeyxü şəbab mey.

* * *

Zəxmi-tiri-qəmzövün gər olsa idi mərhəmi,
Könlümi azad edərdi türreyi-zülfün xəmi.

Mən məgər eşqün yolunda dinü dil tərk eylədim,
Eylə sən məhparəsən, məhv etdi xalun Adəmi.

* Etməzsənmi

Əqlinə bax zahidün, təklifi-hur eylər mana,
Hurə meyl eylər kimün sən kimi olsa həmdəmi.

Xəlqi-aləm oxşadur mehrabə qaşun tərhini,
Göz yaşımla qərq olubdur Nuhdən qalmış gəmi.

Türreyi-pürpiçü tabun içrə gizləd hüsnüvi,
Xəlqi rahət qoygilən, aşub dutmuş aləmi.

Ey könül əğyarə uymış ol pərivəş, əl gətür,
Nalə etmə, daş ürəkli, yarə neylür göz nəmi.

Ey müğənni, nəğmeyi-Dilkeşdən əl çək, Şurə gəl,
Zabulda bir nəş`ə yoxdur, tərkin eylə, dut bəmi.

Qiymətini şairün, Saqib, qəzəldür bildirən,
Eylə yaz əş`ari ta kim, əhsən olsun fərcəmi.

* * *

Sındırdı möhtəsib dolı əldə əyağımi,
Bir ləhzə qoymadı tər edim dəmağımi.

Canım da çıxsa, yad edəməm bir də vəslüvi,
Hicran qəmi zibəski burubdur qulağımi.

Verdün əgərçi busəni gizlin rəqibdən,
Yandırdı hüsnün odı, zalim, dodağımi.

Hər bəndimi şərab ilə təxmir etdilər,
Meyxanədən odur kəsə biməm əyağımi.

Gülzar seyrini eləmiş tərk bağban,
Görmüş çəməndə seyrdə bu gül yuvağımi.

Sayə salardım aləmə, ey şeyxi-mədrəsə,
Sındırmaseydi badi-xəzan qol-budağımi.

Saqib, dutuşdım eşq odına tazədən genə,
Məşğuli-tiflü məhvəş edüb pir çağımi.

* * *

Tökdüm nə içün, alma xəbər, qaş-qabağımi,

Doldurmamışdı saqiyi-gülrüx əyağımi.

Sındırma cami-badəmi, ey möhtəsib, genə,
Pirəm, əmandur, alma əlimdən əyağımi.

Sənsiz şərabxanədən, ey sərvqamətim,
Qərq etsə seyli-qəm məni, kəsdim əyağımi.

Halım xərabdür görüb ol saqi fəhm edüb,
Verməz şərabi-nabi edəm tər dəmağımi.

Gülşəndə lalə fəxr eləyür al yuvağinə,
Əfsus, görməyüb mənim ol gül yuvağımi.

Nimnəfəs yüzüm gülə, min dəf`ə ağlaram,
Hicran əlilə eyləmişəm mən sınağımi.

Möhtac olunca loğmeyi-namərdə, Saqiba,
Xoşdur ucuz da olsa satam bu papağımi.

* * *

Əfşan eləyən zülfüvi bu şanə degülmi?
Pabənd ona bu dili-divanə degülmi?

Mehrab sanur qaşlaruvun tağını zahid,
Ey qaşı kəman, yə`ni kəman xanə degülmi?

Rüsva eləyən adəmi bu künci-ləbündə,
Qarətgəri-din, bəxti qəra danə degülmi?

Mən qan elədim bağrımi lə`lün həvəsilə,
Kam ondan alur sübhəcə biganə degülmi?

Verdün könül əğyarə, vəfa rəsmin unutdun,
Qəsdün sənün, ey şux, dilü canə degülmi?

Vəqtün iki gündür, özüvə lanə tikirsən,
Baş ərşə çəkə, axıri viranə degülmi?

Zahid oxıyur Saqibə mey tövbəsin hərdəm,
Aludeyi-meydür, sözi əfsanə degülmi?

* * *

Kim versə könül zülfüvə divanə degülmi?
Əbrulərüvin tiği susuz qanə degülmi?

Aşuftə degül türrələrün badi-səbadən,
Cəm`iyyəti-diltək səbəbi şanə degülmi?

Xalun həvəsin eyləməsəm, etmə məlamət,
Rüsva eləyən Adəmi bu danə degülmi?

Ayinəyə göstərmə yüzün, durma müqabil,
Oğrar yüzüvin əksini, biganə degülmi.

Qoy qaşlaruvun tərhinə mehrab desünlər,
Qəmzön oxı sölər bu kəmanxanə degülmi?

Ey nəfsə uyan, beş gün içün lanə neçündür,
Bax mülki-Süleyman(ə) hanı, viranə degülmi?

Məsciddə yatub xəlq də ol vaizi-şəhrün,
Saqib, sözi də büsbütün əfsanə degülmi?

* * *

Xəyali-zülfün ilə dil pərişan oldı, bildünmi?
Rəhi-eşqündə döndi qanə, viran oldı, bildünmi?

Gələndə kuyüvə qoymaz məni bu əşk seylabi,
Rəqibün müşkili, ey şux, asan oldı, bildünmi?

Degül mümkin, könül, azad olam bu dami-zülfündən,
Yüzündə telbətel aşüftəəfşan oldı, bildünmi?

Xəyali-ləblərünlə badə içdim, meypərəst oldım,
Meyim sağər içində döndi al qan oldı, bildünmi?

Dutub cənnət yolın biçarə Adəm keçdi kuyindən,
Kəm etdi rütbəsin axır, peşiman oldı, bildünmi?

Dedim, ey dil, gətür əl eşqdən, eşq afəti-candur,
Utan Məcnundən, rüsvayi-dövran oldı, bildünmi?

Yapuşma daməni-bu dəhri-dunə e`tibar etmə,
Gədalər təxtü tacə yetdi sultan oldı, bildünmi?

Behiştün fikrini mehrabdə çox etmə, ey zahid,
Vətən fikrini eylə, kafəristan oldı, bildünmi?

Yetərsən məqsədə, min şövq ilə canundan əl çəksön,
Sən ilə ruzi-əzzəldə bu peyman oldı, bildünmi?

Əgər alson xəbər Saqib hanı, əğyardən gizlin,
Bu tiri-qəmzövə şövq ilə qurban oldı, bildünmi?

* * *

Quceydim incə belün kaş zülfi-qarə kimi,
Öpeydim ol ləbi-gülbərgi ta üzarə kimi.

Yaralıdur dili-divanə tiri-qəmzöndən,
Qılınc yaralıya bilməz onı bu yarə kimi.

Həvayi-xalun ilə düşmüşəm mən avarə,
Sorağını edirəm şəhri-Zəngibarə kimi.

Mən ilə, mahvəşim, bir də rubəru durma,
Zibəski hüsnün onı yandırur şərarə kimi.

İl on iki ay çıxar müttəsil təmaşayə,
Rüxün yanında gəzər ayü gün sitarə kimi.

Gətürmədün ələ bu könlümi fəraqundə,
Məgər ürək yaranub səndə səngxarə kimi?

Kəmançə təngə gəlüb naleyi-fəğanımdan,
Şəbi-fəraqdə çəng ilə ta dütarə kimi.

Bu gülüzardən, ey bülbül, al gülabi-güli,
Gərək ki, gözləyəsən fəsli-gülbəharə kimi.

Müğənni, al ələ bu könlümi, əman günidür,
Müxalifi yüzi üstündə çək Həsarə kimi.

Əlün kəsilsə də, həqq damənindən əl çəkmə,
Dilündə zikr elə hər ləhzə payi-darə kimi.

Qiyamətim qopa, Saqib, ki qeyrə dil verməm,
Gözəllərün gözəli yox bu mahparə kimi.

* * *

Sözün həqqin degilən dardə Mənsur kimi,
Aləmə feyz yetər sureyi-"vət-Tur"* kimi.

Tərk qıl hər acı göftaruvi, ol şirinləb,
Xəlqi cəlb et özüvə nəğmeyi-Mahur kimi.

Çəkmə bir loğma içün hiç kimün minnətini,
Kəsb qıl, get, əlüvün rənci ilə mur kimi.

Saf olmağuvun fikrini etsön xoşdur,
Sil cəhalət tozuni ta ola büllur kimi.

Vəqt səndən nə tələb etsə gərək kim, verəsən,
Nəqdi-can dut ələ xun eyləmə sə`fur kimi.

Yaxşı şeydür olasan dəhrdə şirinhərəkat,
Qiymət artur özüvə şəhd ilə zənbur kimi.

Qaçma, ənqa kimi bu xəlqdən ülfət kəsmə,
Fəth qıl kişvəri-ünsiyyəti fəğfur kimi.

Düşmə təşvişə "ənəlhəqq" desə da`i əgər,
Eylə təhqiq fərar etməyəsən mur kimi.

Saqiba, sinəvi aç, dəgsə sana tiri-sitəm,
Dadü fəryad eləmə ney kimi, tənnur kimi.

* * *

Rütbə yox əmri-Həqə rütbeyi-təslim kimi,
Xəlqə feyzün yetər hər ləhzə Birahim kimi.

Dilüvi hifz elə, bədgulığa adət etmə,
Dar ağacından asarlar səni təqvim kimi.

Bilməsön söz, özüvi gözlə, danışma, lal ol,
Söz biləndən söz eşit, hifz elə Haşim kimi.

---

* Qurani-kərimin 58-ci "ət-Tur" surəsi.

Etmə naəhl ilə ülfət, səni rüsva eylər,
İxtiyar et özüvə qeybəti qaim kimi.

Sirrüvi saxla, demə heç kəsə başun gedə gər,
Ağzuva vır dügüni, rahət otur mim kimi.

Gözüvi dikmə dənitəb`lərün süfrəsinə,
İyimiş loğma içün ağzı açıq cim kimi.

Mana zahid deyür içmə mey, vardur günəhi,
Saqiba, qorxudur hər ləhzə görün kim, kimi.

* * *

Xəlqün eybin, ey könül, gizlət şəbi-yelda kimi,
Xəlqdən qaç, künci-vəhdət dutgilən ənqa kimi.

Xaksar ol, qiymətün artar, yetərsən məqsədə,
Ehtiramun xəlq gözlər vadiyi-Sina kimi.

Ad qoy aləmdə özünçün, yaxşılıq et hər kəsə,
Eylə xoş əxlaquvi, Məcnun kimi, Leyla kimi.

Yüngül olma, ağır ol, xüm tək dəri-meyxanədə,
Gəzmə əldən-əllərə camü meyi-mina kimi.

Yanə-yanə eşq rəsmin kəsb qıl pərvanədən,
Bərgi-güldə nalə etmə bülbüli-şeyda kimi.

Yar kuyin vermə əldən, uyma huri-cənnətə,
Abiruni vermə əldən Adəmi-rüsva kimi.

Al ələ hər yerdə görsön bir şikəstəxatiri,
Qıl həzər, bədbin olma, mərdümi-bica kimi.

Əl ata peyğəmbərün olsa vətən namusinə,
Dut qılıncun qəbzəsin İskəndərü Dara kimi.

Saqiba, bir özgə yarə vermə dil, yekrəng ol,
Yox gözəl bu şəhr içində ol büti-ziba kimi.

* * *

Cəmalun məhviyəm, ey sərvi-dilcu, oldum heyrani,

Müqabil durma, zalim, pərdə çək zülfi-pərişani.

Ləbündən bir cəhan meyxanə piri nəş`ələr almış,
Biyaban seyrin eylər Xızr sorsun abi-heyvani.

Cərəslərdən alur Leyli sorağın binəva Məcnun,
Səni görseydi canın etməz idi Leyli qurbani.

Nələr göstərdi, ey məh, Adəmə xalun təmənnası,
Cəmalun görməseydi etməz idi ol təmənnani.

Kəsad etdün cəmali-Yusifi bazari-hüsn içrə,
Kəməndi-zülfilə darə çəkdün axır İsani.

Könüllər mülkini viranə qoydun bir nigah ilə,
Gözün qurbani, gəl, sən məndən əl çək, olmışam fani.

Nigarun qaşları mehrabdür, zahid, xəyal etmə,
Qılınclar, bəli, hər yanə döndükcə tökər qani.

Pərirüxsarlərdən əl gətür, peymanşikənlərdür,
Məlamət guşəsini məskən et, Saqib, vətən hani.

* * *

Bu nə tərhdür qaşunda, salub heyrətə kəmani,
Nə əcəb çəkübdür ustad iki tiği-cansitani.

Nə görüb bu kakilində, xəbər al, bu mürği-dildən,
Ona göstərən kim olmış bu bəlali aşiyani.

Nəzərimdəsən həmişə deməräm mən "ərni Rəbbi",
Onı Musa(ə) söləsün, qoy, ona sölə "lən tərani".

Hələ nim qəmzə qıldun, məni etdi dinü dildən,
Elə tərkin etmişəm kim, dəxi qalmayub nişani.

Demə qeyrə, get, könül ver, mana olma məhvü heyran,
Necə səndən əl çəküm mən, sana yoxdur hiç sani.

Dedi yar bu ləbimdən sana kam vermək olmaz,
Necə sevməyüm mən, ey dil, belə yari-mehribani.

Sana mail olmaz idim, xətü xalun olmaseydi,
Eləmiş əsir zülfün məni-pirü natəvani.

Mana qaş-qabaq tökmə, səri-kuyüvi dutanda,
Dolanur rəqib kuyun sənə oldı yar cani.

Genə fəsli-gül yetişdi gözüvün fədasi, saqi,
Bu səbu, piyalə doldur bu şərabi-ərğəvani.

Bu gözəllərün, ilahi, məgər olmaz heç vəfası,
Şəbi-hicrdə dəmadəm nə qədr edim fəğani.

Desə, Saqiba, bu məhvəş, dəxi qeyrə verməərəm dil,
Bu sözi eşit, inanma, nə bilür gözəl vəfani.

* * *

Mən çox sevürəm sərvqədü mahliqani,
Sağər dolusı bir də meyi-ruhi-rəvani.

Yarun gərək əbrusi ola əgri kəman tək,
Giysuləri zənciri-cünun müşki-fəşani.

Şərtdür gözələ xali-siyəh, rəhzəni-Adəm.
Xal olmasa sevməm, gər ola Yusifi-sani.

Bimar elədi nərgisi şəhla gözün, ey məh,
Bu sürmə nədür, çəkmə, dutar fitnə cəhani.

Bu qamət ilə bağə xüram etsön əgər sən,
Mail eləyərsən özüvə sərvi-rəvani.

Sən eylə pəriçöhrəsən, ey sevgili yarım,
Eşqündə əsir eyləmisən pirü cəvani.

Hicran gecəsi hərgiz əsər etmədi, Saqib,
Bu səngi-dilə, eyləmə çox ahü fəğani.

* * *

Sölər sana kimlərsə, budur Yusifi-sani,
Var səndə gözəllik, hanı Yusifdə nişani?

Aləmləri heyrətdə qoyub əksi-cəmalun,

Doğmub heç ana sən kimi bir qaşı kəmani.

İnkari-qiyamət görə gər qaməti-sərvün,
İrşadi-qiyamət eləyər pirü cəvani.

Ey şux, gözəllikdə məlahət gərək olsun,
Hüsnün görəni xəlq, dutub fitnə cəhani.

İçdim ləbüvün fikrilə mey meykədələrdə,
Rəşki-rüxi-yaqut, meyi-ruhi-rəvani.

Ey dil, demədim qəmzə oxından həzər eylə,
Dəgsə sana, neytək eləmə ahü fəğani.

Heç naləvü fəryad eləmə sevdigün oxdur,
Kim rahət oturmaz atır əlbəttə ki, qani.

Təhqir eləmə, kim düşə meyxanə yolında,
Mə`lum degül niyyəti, kəc etmə gümani.

Nəfsə özüvi bağlama, Saqib, həzər eylə,
Bihudə yerə ömri-əzizi eyləmə fani.

* * *

Ey şux, səndə türreyi-ənbərfəşan hanı?
Olmış xəmidə qaməti-sərvi-rəvan hanı?

Adəmfərib küfrlə din qarət eyləyən,
Xali-siyah, fitneyi-axirzəman hanı?

Rüxsaruvun gülinə nə olmış xəzandur,
Bitmiş yerində xarü tikan, ey cəvan, hanı?

Mehrabı salmış idi qaşun tərhi heyrətə,
Asarı yox, nə oldı, yox ondan nişan hanı.

Ey təxti-hüsnün üstə edən hökmranlığı,
Bir vəqt olur deyərlər belə hökmran hanı?

Ey qol güciylə aləmi təsxir eyləyən,
Murun əsiri xəncəri-tirü kəman hanı?

Sınmış piyalə, xüm düşüb əldən-ələ əyağdən,
Saqi, səbudə badeyi-ruhi-rəvan hanı?

Mey qiymətin əyağə salub, içibdü hər yetən,
Meyxanələrdə hörməti-piri-muğan hanı?

Saqib, qəzəldə çox də hərifi-zəmanəsən,
Yox qədrü qiymətini bilən nüktədan hanı?

* * *

Bu qədr tökmə yüzə zülfi-əbirəfşani,
Sakit olmış genə aşub dutar dünyani.

Məhmili-Leylini, ey naqə, yetir Məcnunə,
Nə qədr yetməyüb əğyarə cərəs əfğani.

Başə ur tişəni, Fərhad, dağıtma daği,
Düşdi əğyar əlinə dağdə Şirin hani.

Qan axdısa nə əcəb didələrim seyl kimi,
Sancılubdur elə qəmzə oxunun peykani.

Nəqdi-canı ələ dut, kuyinə get dildarun,
Yetməsən məqsədə, müftə eləmə sövdani.

Eşq səndən nə tələb eyləsə, get ver, demə yox,
İmtəhanə çəkəcək, çəkdi necə Sən\`ani.

Heç məlaməıt yeri yox, etmə məlamət hərgiz,
Xahişi-eşq oda yandıracaq Qur\`ani.

Qarə daş lə\`l olur səbrlə, söz yoxdur ona,
Gərək əvvəl içəsən cami-əcəldən qani.

Ey könül, incimə düşdünsə əyağdan-əyağə,
Başə vır hər necə olsa rəvişi-dövrani.

Saqiba, fəqrlə mən fəxr edərəm aləmdə,
Almaram bir pula min səltənəti-sultani.

* * *

Necə mən olmayum, ey şux, gözün qurbani,

Olub ahuyi-Xəta dəşti onun heyrani.

Zalim oğli, ey pərivəş, dili-divanə düşər təşvişə,
Tökmə tel-tel yüzüvə zülfi-əbirəfşani.

Sorson necədür halım şəbi-hicranunda,
Çəkmək olmaz, çəkərəm bari-qəmi-hicrani.

Çöllər avarəsi etmə özüvi, ey Məcnun,
Sorar əğyar ləbin gözləmə çox Leylani.

Sevərəm, kim dedi bu daneyi-xali-siyəhün,
Adəmün yıxdı evin, necə sevüm mən ani.

Bu gözəllik səni məğrur eləmiş, şirinləb,
Salmısan şivə ilən təhlükəyə dünyani.

Düşər əldən-ələ, qalmaz bu gözəllik səndə,
Xət gəlüb qarət edər, eyləmə çox tüğyani.

Bu qədr cövrü cəfa aşiqə etdün, bəsdür,
Tiği-əbrulər ilə qətlimə ver fərmani.

Zahida, eyləmə çox huriyi-cənnət vəsfin,
Bəlkə Saqib dedi ol huriyi-cənnət hani?

* * *

Xubani-cəhan vəqfdü can, ey dili-fani,
Yarun səri-kuyini dutub, tərk elə cani.

Göstərmə dedim hüsnüvi zülf içrə nihan dut,
Ey fitneyi-aləm, dutub aşub cəhani.

Qan oldı könül aşiqə ver kam ləbündən,
Düşməz ələ hərgiz dəxi kim, vəqti-cəvani.

Zülfün girehindən dili-divanəmi qurtar,
Al canımi bir qəmzəyə, ey Yusifi-sani.

Beş gün qalacaq səndə bu hüsnü bu məlahət,
Can qəsdinə qurma dəxi əbruyi-kəmani.

Olmaz dəxi yer busəgəhündə sənün, ey şux,
Xət qarət edər hüsnüvi, olma nigərani.

Tə`sir eləməz vəsvəseyi-zahidü abid,
Ey saqi, gətür badəni, ver ruhi-rəvani.

Xəlqə demədim ol məhə dil vermişəm, ey dil,
Ey dil, yanasan, kəşf elədün sirri-nihani.

Saqib, eləməz ahun odı ol məhə tə`sir,
Naqus kimi eyləmə fəryadü fəğani.

* * *

Heyran edübsən hüsnüvə mahü sitarəni,
Sən kimi kim görüb, gözəlim, mahparəni.

Uydun rəqib fitnəsinə, səngdil, neçün,
Təqsirimiz nədür mən ilə pozdun arəni.

Eşqün yolunda eyləmərəm tərki-can necə,
Bari, bir imtəhan elə mən bəxti qarəni.

Təklifi-mərhəm eyləmə sədparə könlümə,
Qəmzön oxı əlacın edər, versə badəni.

Ey söləyən, bu hüsnim odundan qıl ehtiraz,
Pərvanə sevməsün degilən bəs şərarəni.

Ahim şərarəsi sana tə`sir etmədi,
Çəksəm bir ah, yandıraram səngi-xarəni.

Məcnun başında hicrdə dutmazdı quş yuva,
Eşqün mərizinə edən olseydi çarəni.

Mey tövbəsini eyləmərəm zahidə deyün,
Etsün özinə içməyə qan istixarəni.

Tükcə gər eybim olsa, deyər külli-aləmə,
Çıxmış gözində görməyür əmma minarəni.

* * *

Ayinə ilə görsəm əgər rubəru səni,

Nifrin eyləyərəm, gözəlim, mubəmu səni.

Etdüm əsir zülfüvə divanə könlümi,
Biixtiyar eylədi dil arizu səni.

Aləm yığıldı gəldi təmaşayi-hüsnüvə,
Ögrətdi, qoymadun məni, zalim, o, bu səni.

Səndən üzüm könül necə, ey sərvqamətim,
Hər yerdə olson, eyləyərəm cüstücu səni.

Zahid, dolanma bir də bu meyxanə səmtinə,
Meyxanə rindi etməyə biabiru səni.

Sərməsti-badəyə oxuma tövbə ayəsin,
Mehrab künci dut, kəsər axır səbu səni.

Pak olmasan* əlün dəgə təsbihə, Saqiba,
Kövsər suyilə eyləsələr şüstüşu səni.

* * *

Məndən soraq eyləyür, ey məh, bu, u səni,
Qıl ehtiraz, etməyə biabiru səni.

Xətm oldı səndə hüsn, nübüvvət Mühəmmədə(s),
Pərvərdigar tək yaradub, mahru, səni.

Gül kimi qoyma hər yetən, ey sərvqamətim,
Əldən-ələ düşüb, edə hər kimsə bu səni.

Səndən dil üzmərəm versən də rəqibə dil,
Can nəqdi əldə, eyləyər cüstücu səni.

Rəşki-həsədlə döndərərəm qanə bağrımi,
Ayinə ilə görsəm əgər rubəru səni.

Göz nurisən, gözümdən uzaq düşmə, heyfsən,
Göz mərdümində bəsləyərəm mubəmu səni.

Tövbön olur qəbul sənün, Saqib, ol zəman,
Dürdi-şərab ilə edələr şüstüşu səni.

* Olmazsan

* * *

Ey rəşki-hur, görsə idi gər mələk səni,
Etməzdi səcdə Adəm, aç yüz, görək səni.

Aləm təmam məhvi-cəmalundürür sənün,
Doğmış nə xoş zəmandə anon, banəmək səni.

Təkmilə yetmişdi demə Leyli hüsnidə,
Sultani-hüsnsən, yaradub Tarı tək səni.

Tərk eylə dinü dil dedün eşqimdə, eylədüm,
Əğyar yetdi vəslüvə, dutsun əmək səni.

Min parə etməsən bu dili-parə-parəmi,
Qanun qılıncı ilə aparsun gərək səni.

Zahid, bu sərvanzdən əl çəkmərəm demə,
Salmış xəyali-xamə əcəb səhvü şək səni.

Qoymaz xəzanəyə səni, ey zər, xəzinədar,
Ta etmiyincə təcrübə səngi-məhək səni.

Saqib, cəhandə eyləmə namərdə sərfiru,
Hərçənd xar edübdü budur fələk səni.

* * *

Gətürmə, saqi, ki məst eyləməz piyalə məni,
Səbu-səbu ver içim, mey götürsün halə məni.

Qəmü fəraqə eylədüm səbr, tə`ni-əğyarə,
Sən eylədün bu qəmü möhnətə həvalə məni.

Hekayəti-şəbi-hicrani sorma heç məndən,
Gər istəsəm deməgə, qoymaz ahü nalə məni.

Yox ixtiyar əlimdə üzüm könül səndən,
Əsiri-zülfün edübdür bu xətü xalə məni.

Sorar bu lə`li-ləbündən rəqib hər saət,
Necə fəğan eyləmüm, salma sən xəyalə məni.

Təəccüb etməgilən qamətim kəmanə dönüb,
Xəyalidür qaşuvun döndərən hilalə məni.

Başımda eylədi Məcnun kimi yuva quşlar,
Yetirdi eşqün əcəb sərhədi-kəmalə məni.

Yetən vüsalüvə yetdi sənün, kəmanəbru,
Qoyub fəraqun odı həsrət vüsalə məni.

* * *

Saldun, ey dil, sən əcəb yerdə genə qanə məni,
Etdün, əl çək, dəxi Məcnun kimi divanə məni.

Yanə-yanə qalasan şəm` tək hicran gecəsi,
Mübtəla eylədün axır qəmi-hicranə məni.

Mən hara, eşq hara, bu ləbi-gülbərg hara,
Sən əsir eylədün ol zülfi pərişanə məni.

Mən həman Adəməm, ey şux, yerim cənnətdi,
Saldı avarə bu hüsnündə siyəh danə məni.

Bu təəccübdür edəm nalə, deyürsən, etmə,
Sən də bəs etmə hədəf navəki-müjganə məni.

Dami-zülfün məni azad edəcəkdürmi məgər,
Qoymayur getməgə fəryad ilə bir yanə məni.

Etmə təklif mana məscidi, zahid, əl çək,
Qoymayur gəlməgə xişti-dəri-meyxanə məni.

Verməərəm fikrimi mən sən deyən əfsanələrə,
Öləsən, ram eləməz səbheyi-səddanə məni.

Saqiba, əl gətür ol mahvəşün eşqindən,
Sübhəcə naleyi-hicran gətürüb canə məni.

* * *

Dastani-əndəlibü gül edüb giryan məni,
Vadiyi-heyrətdə Məcnun kimi sərgərdan məni.

Yox günahi, yandırullar odda hər saət güli,

Bəs mənim halım nəlur qərq eyləmiş üsyan məni.

Gər günahi olmuş olsa vay gülün əhvalinə,
Etməsün bu dastan, ey dil, necə heyran məni.

Bülbülün cürmi nə olmuşdur qəfəs dustağıdur,
Ruzü şəb bidar edübdür etdigi əfğan məni.

Bülbülün təqsiridür bu kim, olub gül aşiqi,
Qalmışam heyran edüb avarə bu ünvan məni.

Mən də bir mahparənün eşqində rüsva olmuşam,
Bimürüvvət eyləyür hər ləhzə bağrıqan məni.

Saldı dildən-dillərə eşqün məni, ey qönçələb,
Vermisən əğyarə dil, şad etmədün bir an məni.

Xəlq səndən şad olur yandım qəmi-hicranuva,
Tapşurubdur qul sana bu gərdişi-dövran məni.

Kim səbəb bu fitnə olmuşdur deмək düşvardür,
Qətlimə fitva verür kafər, oxur nadan məni.

Açma söz, mə`lumdür kimdür səbəb bu fitnəyə,
Gər açam söz, qorxuram məhv eyləsün Qur`an məni.

Eybi yoxdur, bir işarə arifə söz bildirür,
Heyfdür, böhtan qala söz qoymayur vicdan məni.

Zatimə yol yox deyəndür hər işün sərmayəsi,
Qoy, hesab etsün bu zahid rindü biiman məni.

Saqiba, tərk etgilən bu sərvqədlər eşqini,
Etməsün rüsvayi-aləm, ey evi viran, məni.

* * *

Genə əsir elədi bir cəvani-tazə məni,
Kəməndi-zülfinə saldı əcəb güdazə məni.

Çıxdun, ey gözüm, ey eyləyən məni rüsva,
Düçarə eylədün axir bu sərvnazə məni.

Müğənni, tarü çəng saz eylə, keç Müxalifdən,
Gözün fədası ki, məğlub qıl Hicazə məni.

Xərabi-dürdi-meyəm, zahid, əl gətür məndən,
Çağırma məscidə meyxanədən nəmazə məni.

Fəraqi-Leylidə Məcnuni, ey edən giryan,
Yetirgilən nə olur yari-dilnəvazə məni.

Müridi-dürdi-meyəm, tacü təxtə meyl etməm,
Necə sən aldadacaqsan bu ömri-azə məni.

Zəmanə əhli ədəb istəyür, get, insan ol,
Mürid eyləmə, Saqib, hər hoqqəbazə məni.

* * *

Bir zəman sordum ləbi-lə`lün, dadandurdun məni,
Dil dedün verməm rəqibə heç, inandurdun məni.

Mey içirdün bəs neçün meyxanədə əğyar ilə,
Durmadum, meyxanədən çıxdım, bulandurdun məni.

Və`də verdün görməsün əğyar gəlləm kuyüvə,
Gəlmədün, gün çıxdı kuyündə dolandurdun məni.

Hökm qıldun qaşlarun tiğinə alsun canımi,
Salmısan tə`xirə, zalim, çox yubandurdun məni.

Şanə vır, giysulərün olsun pərişan hüsnüvə,
Atəşi-rüxsarüvə, ey şux, yandırdun məni.

Gözlərimdən öp dedün, öpdim əyağundan sənün,
İstədim öpmək, get, əmma utandırdun məni.

Kuyüvə gəldim görüm ayinə rüxsarun sənün,
Navəki-müjgan ilə birdən dayandırdun məni.

Saqibi qıldun əsir, ey dil, bu şuxun zülfinə,
Get, evün abad olsun, arxalandırdun məni.

* * *

Xəcil etmiş bu qədün naz ilə sərvi-çəməni,

Arizün heyrətə saldı çəməni, yasəməni.

Meyi-gülfamə vırar tə`nəni bu lə`li-ləbün,
Çıxdı bazarə, kəsad oldı əqiqi-Yəməni.

Bülbülün naləsi bihudə degül gülşəndə,
Geydirüb laləyə qəmzön oxı qandan kəfəni.

Gözlərün fikri sənün ram elədi səyyadə,
Ey xətadidə, min ahuyi-Xətavü Xütəni.

Kim deməz xalü xətün rəhzəni-küfri-dənidür,
Saldı dildən-dilə, rüsvayi-cəhan etdi məni.

"Bi əbi əntə və ümmi"* sana kimdür deməsün,
Nə desön bəs görə gər səndə bu vəchül-həsəni.

Hüsn bazarinə çıxdun bu gözəl çöhrə ilən,
Bir pula almadılar Yusifi-gülpirəhəni.

Görməyürsən dutub, ey şux, cəhani fitnə,
Tökər rüxsarüvə bu zülfi-xəmü pürşikəni.

Mə`dəni-qəndü şəkər kişvəridür Hind, vəli,
Yetirüb Saqibi kim, Azərinün gül vətəni.

* * *

Meyxanələrdə getdi girov taci-xosrovi,
Müzdi-şərabə yadi-ləbi şahi-Pəhləvi.

Doldırdı nəstərən mey ilə cami-laləni,
Ta sərfi-badə eylədi Məhmudi-Qəznəvi.

Dövran şəhi gəda eləyər, gəh gədani şah,
Vardur bu işdə bəs ki, ümurati-mə`nəvi.

Əmri-məhalə vermə könül, ey deyən mana,
Əmri-məhal içindədür iqbalü bəxt evi.

Diqqət gözilə eylə nəzər bir bu beytə kim,
Çəkmiş bəyanə Hafizi-Şirazü Mövləvi.

* Atam-anam sənə qurban olsun

“Dehqani-salxordə çe xoş goft ba pəsər,
Key nuri-çeşmi-mən be coz əz kəşte nədrəvi”.*

Bəxtün dönəndə zəhrə dönər badə camdə,
Eylər zəmanə şahını Məcnuni-səhrəvi.

Qoymaz səni yetməgə hərgiz muraduva,
Qıl ehtiraz, olmayasan nəfsə peyrəvi.

Yüz dutdı saqiyə, dedi ol piri-meykədə,
Göstərdi çərxi-gərdişi e`cazi-İsəvi.

Sərmayə ilə kəsbi-təğafül çox eyləmə,
Vəqt oldı, Saqiba, dutasan rahi-üxrəvi.

* * *

Ey dil, bəqa degül bu ümurati-dünyəvi,
Küllən fənadu, gər ola min taci-xosrovi.

Olmış fəna həzar Süleymanun həşməti,
Cüz bir kəfən aparmadı Məhmudi-Qəznəvi.

Həm marü murə tö`mədü xubani-ruzigar,
Çox nazpərvəri çəkübağuşə qəbr evi.

Çox şəhriyar xakə dönüb ziri-xakdə,
Dünyadən ötri oldıla Məcnuni-səhrəvi.

Dünyayə mail olmagilə, kəs əlaqəsin,
Qarun olub təbiətinə olma peyrəvi.

Sərmayə ilə içməmisən mərg badəsin,
Vəqt oldı kim, yetə səfəri-rahi-üxrəvi.

Şahəm demə, bu aləmə hökmim rəvandür,
Ölmək var, ol ki göstərə e`cazi-İsəvi.

Saqib, gərək bu eşqdə sabitqədəm gəzək,
Kəşf olmaq istəsön nə rümuzati-mə`nəvi.

---

* Qoca kəndli öz oğluna nə gözəl demiş: “Ey mənim gözümün işığı, əkdiyindən başqa heç bir şey biçməyəcəksən”. Haşım bəy Saqib bu qəzəli Hafizin “Bolbol ze şaxe-sərv be qolbange-pəhləvi” mətləli qəzəlinə nəzirə yazmışdır.

# Növhələr

Ey fələk, rəhm elə bu naleyi-əfğanımıza,
Barişi-qəmdü dolub dideyi-giryanımıza.

Etmədün şərmü həya, zülmdə tüğyan elədün,
Gərdişün bərhəm oleydi, necə dövran elədün?

Bağladun abi-Fəratun suyıni qan elədün,
Yoxdı bir cür`ə səpüm su ləbi-ətşanımıza.

Bir həya eylə, nəzər qıl bu yanan ləblərimə,
Dəgməyüb su neçə gündür bu solan ləblərimə,
Az qalıbdur yetişə can bu zəman ləblərimə,
Od, od üstündən tökülüb sineyi-suzanımıza.

Dəmbədəm cuşə gəlir bəhr kimi dərdü qəmim,
"Əl-ətəş" nələsi afaqə salub şuri-əzim,
İxtiyarım gedüb əldən, nə qədr nalə edim,
Bir təsəlli verən olmaz dili-viranımıza.

Qarə bəxtim kimi olsun, o yüzün qarə, fələk!
Gərdişündən düşə qəlbün, ola sədparə, fələk!
Kim qalub dəhrdə məntək belə avarə, fələk?
Yüz verüb seyli-bəla hali-pərişanımıza.

Verdün axırda bizi Şimri-sitəmkar əlinə,
Nə rəvadur ki, düşüm ləşkəri-küffar əlinə,
Gülşəni-din xəzan oldı, düşüb xar əlinə,
Həmmü qəm gərdi niyə qondı gülistanımıza?

Əsər etməz sənə ahım məgər, ey künhşüar?
Şö`leyi-ahım odı şö`lələnür misli-şərar,
Küfri-zülmət məhi-taban yüzinə dutdı qərar,
Əsdi kim, badi-sitəm şəm`i-şəbistanımıza.

Ərseyi-ruzi-qiyamət kimidür Kərbübəla,
Xeymələrdən ucalub ərşə sədayi-üsəra,
Guiya titrədi çün qaimeyi-ərşi-Xuda,
Yağdı kim səngi-cəfa xaneyi-viranımıza.

Neylədi ali-Peyəmbər sənə, ey şumi-şərir,
Kufənün əhli edüb Zeynəbi zülm ilə əsir,
Künci-viranəni verdün bizə, bu qövmə şərir,
Kim dözər aləmara bu qəmi-tüğyanımıza.

Bir həya eylə, Peyəmbərdən utan, Heydərə bax!
Qırx nəfər bəsteyi-zəncir, qəra mə`cərə bax!
Pabürəhnə, başaçuq Zeynəbi-qəmpərvərə bax!
Bağladun su yolunı xeymədə mehmanımıza.

Yan əza şəm`inə, Saqib, dili-pərvanəsifət,
Şövq ilə ur özüvi atəşə pərvanəsifət,
Salü məh saxla əza bizlərə divanəsifət,
Yadə sal, ağlagilən şami-qəribanımıza.

* * *

İçməzdi Hüseyn ibn Əli(ə) cami-şəhadət,
Qoymazdı mühərrəmdə belə matəm əlamət.

Kim razi olur başi keçə növki-cidayə,
Canın sevən haşa ki, dözə cövrü cəfayə,
Nə zülmi rəva görmədilər Ali-əbayə,
Ol kimsə ki, eylər idi Qur`anı tilavət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Kim razidü övladi anun dərbədər olsun,
Sədparə qılınclarla bəradər, pəsər olsun.
Tirü düsərə sinəsi yeksər sipər olsun,
İstər özini kim ola, billahi, səlamət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Leyla ola, ey dəhri-dəni, Şimrə giriftar,
Biganə həmi həzrəti-Külsumə pərəstar,
Övladi-Peyəmbərlə olurmı belə rəftar?
Kim, eylədilər Şamdə hər yerdə şəmatət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Zeynəb kimi baci çəkilə bəndi-kəməndə,
Ta şamə kimi səbr edən olmaz belə bəndə,
Heyranəm, Hüseyn(ə), bir belə də hövsələ səndə,
Tək-tək düşər aləmdə ələ bir belə halət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Bir xidmət idi etdi pəsəndidə əməldən,
Ol xidmət ilə saxladı İslamı xələldən,

Keçmək olur Əkbər kimi novrəstə gözəldən?
Qismətdi o məhparədə məcmu`i-məlahət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Kəşf eylədi aləmlər içün sirri-nihani,
Ol sirri-nihan kəşfinə tərk eylədi cani,
Qiymət qoya bu xidmətə İslamdə hani?
Salmış əyağə aləmi-İslami bətalət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Qəflət yuxusı milləti-İslami edüb xar,
Sərrişteyi-çarə kəsilüb bəxti-nigunsar,
Kimdür eləsün çarə bu dərdə, hanı qəmxar?
Ətrafımızi düşmən alub, din evi bərbad.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

İslam ara sən də bu qədr salma fəsadi,
Ey təfriqəcu, yadə gətür yövmi-miadi,
Zülmün keçüb ol mə`rəkeyi-ibni-Ziyadi,
Zülm eyləməgi tərk elə, çox eyləmə adət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Bəsdü bu qədr qırdı müsəlmani müsəlman,
Nahəq yerə hər kuçədə, ey xanəsi viran!
Bir beylə müsəlmanlığə kim xəsm ola Qur`an,
Bu vəhşi müsəlman çəkəcək bircə xəcalət?!

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Aləmdə əgər zahir ola Əhmədi-Məhmud(s),
Min mö`cüzi-“şəqqülqəmər”i eyləyə mövcud,
Aludəçilik bizlərə, haşa, verə bir sud,
Bais olu gümrəhligə ol kəşfü kəramət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Bu dərdimizə çarə qıl, ey Xaliqi-Əkbər,
Əldən gedüb İslam, bəhəqi-şəhi-məhşər,
Düşməndülə bir evdə bəradərlə bəradər,
İnsan eləməz bir belə vəhşiligə taqət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sərparə müsəlman.

Ey mollanümalər, elədüz aləmi viran,
Bir loğməyə təcdid elədüz gündə bir ədyan,
Yüz min cəəli sözlər ilə məhv ola Qur`an,
Hər kuçəara eyləyün də`viyyi-imamət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Elmün qapusın bağladuz İslamə sərasər,
Avarə qalub, sahibi yox xarü mükəddər,
Getdi aradan hökmi-Xuda, dini-Peyəmbər,
Millət, hələ yat, açma gözün, yat hələ rahət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sədparə müsəlman.

Saqib, hanı səndə əməl imanlığa dair,
Ey xanəsi bərbad, müsəlmanlığa dair,
Vəhşi hərəkatun hamı heyvanlığa dair,
Bəsdür bu qədr, dutma dəxi rahi-zəlalət.

Biçarə müsəlman, avarə müsəlman,
Bihörmət olubdur sərparə müsəlman.

* * *

Aç gözlərüvi, əmmə, bu növki-cidayə bax,
Başı bəlalidür babamun, gəl, hərayə bax.
Təkyə edüb əsayə, gedüb qanı çox məgər,
Durmaz əyağə zə`fdən, ey zarü dərbədər,
Ya pir olubdu, diqqət ilə eylə bir nəzər,
Çox görmisən bu piri dəxi bu əsayə bax.

Eylər cidadə ayeyi-Qur`an tilavəti,
Bir baş kəsilsə, qalmaz onun hiç taqəti,
Eyni-imamətin budur, əmmə, əlaməti,
Baxma kəsik başə belə, sirri-Xudayə bax.

Zahirdə baxma xəncər ilə parə-parədür
Cismi-İmam, hədd ona yox, gərçi yarədür,
Dərk etməz əql künhi, bir özgə işarədür,
Zahirpərəst olma ki, batin bənayə bax.

Ölmək məhaldür bu vücudi-İmam içün,
Başdan-əyağə hüccətdür xasü am içün,
Vacib bir İmam vücudi müdam içün,
Həqdən yetən İmami-zəmanə ətayə bax.

Möhtacdür cəm`i yaranmış imamətə,
Həqq bilməsön imamı, düşərsən zəlalətə,
Ey münkir, olma ağ, həzər qıl, vilayətə,
İnkarın eylə tinəti-Şimri-dəğayə bax.

Bilmə İmam vücudi vücudi-filandür,
Allah qanıdur qanı, gün tək əyandür,
Düşmən gələndə nəf` yox hərgiz, ziyandür,
Qur`anə diqqət ilə gedüb ayə-ayə bax.

Ey bilməyən vücudi-İmami vücudi-həq,
Məhşərdə incidür bədənün xəsmə çün sədəq,
Nifrət nisar edər sana Qur`an vərəq-vərəq,
Eylər onun ziyarətini, ənbiyayə bax.

İnkarın eyləmək sana asandür, vəli,
Məhşər güni dutar yaxovi Həzrəti-Əli(ə),
Səndən üzülməsün necə Peyğəmbərün əli,
Bir keçdigün, əyaqladığun həqqü sayə bax.

Toprağı-Kərbəla iki eynün cilasidür,
Aləmdə çarəsiz, bəli, dərdün dəvasidür,
Eylər əlac dərdə kimün aşinasidür,
İsayə can əta eləyən bir şəfayə bax.
Bu xaki-Kərbalayə yetər harda simü zər?
Bir zərrəsinə cəm` ola gər cinn ilə bəşər,
Sərmayə olsa gər bulara dürr ilə gühər,
Heyrətdə əhli-xirə qalub, kimiyayə bax.

Ey göz, qan ağla matəmi-şahi-şəhidə sən,
Aləm qılınc çəksə, dut üz ol məcidə sən,
Məhşərdə rəhm gözləmə nəsli-Yəzidə sən,
Can nəqdi əldə ol şəhi-zibhülqəfayə bax.

Ali-əbadən üzməgilən, kəsmə ülfətün,
Bir zərrə olsa ali-Hüseynə ədavətün,
Olmaz əlacun heç, qopar ol gün qiyamətün,
Qərqi-günah olursan o dəmdə, bəlayə bax.

Saqib ölüncə çəkməyəcək əl Hüseyndən,
Keçmək olarmı beylə İmami-mübindən?
Gərçi günahi var, genə çıxmaz əmindən
Düşməz əyağə ondakı möhkəm binayə bax.

* * *

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Necə tab etmək olur, ey şəhi-alidərəcat,
Tökmək olmır yüzə matəm güni gözdən qətərat,
Belə də aləm olarmı, nəyə lazım bu həyat,
Vay bizim halımıza olmasa gər rahi-nicat.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Matəmündə necə mən eyləyərəm ahü fəğan,
Düzülüb qətlimizə dörd tərəfə tirü sinan,
Kim desə, vay Hüseyn, dil kəsilür, yox iman,
Xəlq də tərk eləyüb qeyrətini pirü cəvan.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Cəddinün ümmətidür, bax, belə tüğyan eləyən,
Millətin nəfsi içün qətlinə fərman eləyən,

Ələ düşməz, hanı, yox hörməti-Qur`an eləyən,
Qıl nəzər aləmə, ey canını qurban eləyən!

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Belə də aləm olar, ey xələfi-həştü çəhar,
Deyəsən, vay Hüseyn, tez olasan dərdə düçar,
Bir belə millət içün eyləmisən canı nisar?
Olub heyran bu işə, eylə yəqin, xurdü kibar.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Dutmış afaqı sitəmü cövrü cəfa, eylə nəzər,
Etdigi zülmdən heç kimsə dəxi etməz həzər,
Xəlq dinsizlik içün fəxr eləyür şamü səhər,
Cəddüvün zəhməti, əfsus edirəm, oldı hədər.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Vardı bir vəqt, müsəlmani edəydi təhqir,
Kim oleydi, ona fövrən çəkilərdi şəmşir,
Bərməla həqqün özini eləyürlər təkfir,
Beş günün şə`ni içün, gör, nələr olmış tədbir.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Vəhşilik aləmi bilmərrə yıxub etdi xərab,
Çox çətindür edəsən səbr, hanı taqətü tab,
Elə şiddət edüb, itmiş aradan həqq-hesab,
Həqq getmişsə, həya həm gedüb olmış nayab.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

Aləmi-küfrə çoxı fəxr eləyür, hörməti var,
İki olmaz sözi hərgiz, o qədr şöhrəti var,
Belə olmaqlıq içün çoxlarınun niyyəti var,
Söz onundur nə desə yaxşı-yəman, cür`əti var.

Eyləyüm mən necə nalə sənə, ey şahi-şəhid,
Başımun üstə durub xəncər ilə qövmi-Yəzid.

* * *

Ya Hüseyn(ə), müzd sana rövzeyi-rizvan olmaz,
Asiman, ərşü fələk, huriyi-qılman olmaz.

Kəmtərin nokərüvün bir tüki dünyayə dəgər,
Nə ki dünyayə dəgər, aləmi-üqbayə dəgər,
Zərreyi-xaki-dərün cənnəti-ə`layə dəgər,
Həmnəfəs bir quluvə Buzərü Səlman olmaz.

Sən o sən kim, sana Cəbrail olubdur dayə,
Olmaseydun sən əgər, gəlməz idi bir ayə,
Hiç peyğəmbərə kimdür sən ilən həmpayə,
Min Məsihayi-zəmanə sana dərban olmaz.

Sən elə zatsən hərgiz sana qiymət yoxdur,
Bir yaranmışda yəqin səndəki tinət yoxdur,
Sənsiz, ey təşnəcigər, bir kəsə rəhmət yoxdur!
Olmaseydun, şərəfi-rütbeyi-Qur`an olmaz.

Kim verüb qiyməti-cənnət sənə, ey təşnəcigər,
Çox təəccüb edirəm, səhv eləyibdür yeksər,
Kim belə fikri edüb, eyləsə imanə dəgər,
Belə fitvani verən kimsədə iman olmaz.

Əhli-xübrə bilür hər naşi özin aləmdə,
Özini qərq eləyüb boş yerə qə`ri-yəmdə,
Fəhmü idrak gərək kim, ola hər adəmdə,
Bilməyən qiyməti-həqqi, dəxi insan olmaz.

Vay, nadanun əlindən ki, degül pəndpəzir,
Sözin həqqini desön, tez səni eylər təkfir,
Bilməyür heç nədür həqq, boş sözi eylər təfsir,
Səhvi isbat eləsön, genə peşiman olmaz.

Var-yoxı tərk elədi Kərbübəla sultani,
Qaldı günlər qabağında bədəni-üryani,
Əlinə salmaq içün huri ilə qılmani?
Arif həqqi deyər, hərgiz belə nadan olmaz.

Baş cidayə keçə, övladı ola Şimrə əsir,
Ali-Peyğəmbərə bir fikr elə, həmdəm zəncir,
Ol bəlali günə düşmişdi, nə etdi təqsir?
Gözlərün hali-Hüseynə(ə) genə giryan olmaz.

Cigərim yandı, necə keçdi Əli Əkbərdən?
Altı aylıq, südəmər mahliqa Əsğərdən,
Huriyi-cənnət içün, keç belə fikri-şərdən,
Səndə vicdanü mürüvvət niyə bir an olmaz?

Zeynəbün qolları zəncirə çəkilsün möhkəm,
Novərusun yüzinə sili ura qövmi-züləm,
Olmason arif Hüseyn(ə) həqqinə, dutma matəm,
Dərd alub canuvi hərgiz, dəxi dərman olmaz.

Bu ədalətmi verilsün sənə qiymət cənnət?
Yox-yox, ey təşnəcigər, ey şəhi-babi-rəhmət!
Xam sövdadu bu sövda, gərək etmək diqqət,
Həqqdə böylə əvəz, əql ilə mizan olmaz.

Qoy, mana xəlq desün, kafərü bidinü füzul,
Rəhi-eşqündə sənün eylərəm hər cövri qəbul,
Can nədür olmaya qurban sənə, ey sibti-Rəsul!
Nə gərəkdür mana ol can, sana qurban olmaz.

Bəs nədür müzd sana, ey şəhi-din, alinəsəb?!
Bu vücudundu sənün aləmi-əşyayə səbəb!
Qalmasun sirri-nihan, kəşf ola ta ki, mətləb,
Birbəbir şərh edərəm, nüktəsi pünhan olmaz.

Həq bilür, var-yoxını versə sana ari yetər,
Cənnətü hur verilsə, degül hərgiz bu hünər,
Heç rəvadur bu ağacdan yetişə böylə səmər?
Sözün həqqini də, ey dil, degilən, qan olmaz.

Əslə yetməkdi Hüseyn(ə) məqsədi, yetdi şəhi-din,
Sən gedən cənnətə getməz, onı bil, eylə yəqin,
Öz yerində qalacaqdur, bəli, firdovsi-bərin,
Bu Hüseyn(ə) həmnəfəsi-huriyi-qılman olmaz.

Xunbəhasi bu Hüseynün nə ki, bir qılmandur,
Xunbəha bəlkə ona Xaliqi-Ərrəhmandur,
Saqiba, səndə bu ünvan nə gözəl ünvandur,
Əhsən ustaduva olsun, belə ünvan olmaz.

* * *

Aləmdə məgər yoxdu müsəlman, Əli Əkbər?
Kəsdi başuvı zülm ilə üdvan, Əli Əkbər.

Rəhm etmədi heç bir sənə bu qövmi-sitəmkər,
Bu halə salublar səni, ey şibhi-Peyəmbər,
Cismün yaralu, isti qum üstə təni-bisər,
Qurbanı kəsəllər məgər ətşan, Əli Əkbər?

Nə zülmü sitəmdür yetişüb ərşi-Xudayə,
Eylüblə hədəf cismüvi həm tiri-bəlayə,
Vermişlə bəhar ömrüvi kim, badi-fənayə,
Səndən sora dünya ola viran, Əli Əkbər.

Səndən sora dünyanı görüm pürmühən olsun!
Viranəlik olsun, nə gülü nə çəmən olsun!
Solsun güli-gülzari, qədi-sərvdən olsun!
Ey qanı olan zinəti-meydan, Əli Əkbər.

Zəhmət çəküb on səkkiz il etdim sizə xidmət,
Sinəmdə səni bəslədüm həmvarə səlamət,
Görseydim əgər səndə nişani-qəmü möhnət,
Eylərdim o dəm çaki-giriban, Əli Əkbər.

Toprağlarun üstə tökülüb kakili-müşkin,
Xarü xəsə aşüftə olub qan ilə rəngin,
Toz qonmağa razi ki degüldim məni-miskin,
İmdi görürəm qan ilə əlvan, Əli Əkbər.

Bundan sora sağ qalmağı neylüm məni-biyar,
Sənsiz gözümə tardür xurşidi-pürənvar,
Sağ qalmağı istər o kəs, olsun ona qəmxar,
Olmaz dəxi bu dərdimə dərman, Əli Əkbər.

Keçməz o qədr Şimr vırar boynuma zəncir,
Biməˋcərü bisatirü bisahibü dilgir,
Yox çarə əlimdə, dur əyağə, elə tədbir,
Toprağlarara qanına qəltan, Əli Əkbər.

Şamun yolunı getməgə yox taqətü tabım,
Gün-gün də füzuntərdü fəraqunda müsabım,
Seylabə verüb aləmi bu çeşmi-pürabım,
Billahi, olubdur cigərim qan, Əli Əkbər.
Saqib, elə nalə, yetüb həngameyi-matəm,
Dut Əkbər əzasın, yüzə tök əşk dəmadəm,
Ur başuva, qan ağla bu matəmdə çü Zəmzəm,
Verdi başini ümmətə qurban, Əli Əkbər.

* * *

Yad eyləyəndə zülmüvi, ey çərxi-kəcmədar,[*]
Biixtiyar əşk tökər çeşmi-intizar.

Düşdün əziz xari, əzizi zəlil edüb,
Ey səngdil, utan bu qədr kinə səndə var.

Gəh şahi sən gəda elədün, gəh gədani şah,
Fir`ona təxti-alini verdün, Məsihə dar.

Hiç ah etməyən sənə həmdəmlik eyləməz,
Mümkin degül nə bir sitəmündən sənün fərar.

Qoydun şikəstə, qan elədün çox könülləri,
Hiç kargər degül sənə nalə, min ahü zar.

Çah içrə Yusifi elədün sərnigun, vəli,
Saldun Xəlili zülm odına, ey sitəmşüar.

Qəlbim kimi xərab olasan, dunpərəstsən,
Xar eylədün əzizi, kimə verdün ixtiyar.

Eykaş, tez oleydi sənün gərdişün xərab,
Qəm atəşinə etmisən aləmləri kəbab.

**II**

Ey çərxi-kəcmədar, nə bünyad eylədün,
Kərbübəladə zülmi çü Şəddad eylədün.

Verdün xərabə küncini övladi-Heydərə,
Ali-zinayə səltənəti şad eylədün.

Övladi-Müstəfayə rəva görmədün nədən,
Yıxdun risalətün evini, ad eylədün.

Şimrün əlinə xəncəri-fuladi kim verüb,
Zülmün əlində sən ani cəllad eylədün.

Cəhd eylədün cəlali-Hüseyni dağıtmağa,
Verdün fənayə, zülmilə bərbad eylədün.

[*] Novhənin əvvəlində müəllifin fars dilində belə bir qeydi var: “Dəvazdəh bənd dər zikri-müsibəti-övladi-Fatimə” – Fatimə(ə) övladının müsibəti haqqında on iki bənd.

Rükni-imamətün elədün rəsmini xərab,
Ey xanəsi xərab, əcəb iycad eylədün.

Verdün fənayə gülşəni-tovhid güllərin,
Birəhmlikdə sən dəxi bidad eylədün.

Ol dəm cidayə keçdi səri-şahi-dinpərəst,
Taci-təqərrüb eylədi Cəbrəil o dəm şikəst.

**III**

Heç gözlədünmi ali-Rəsulun məqamını,
Verdün Hüseyni-təşnələbə qəm məramını.

Çıxdı Hüseyn(ə) sinəsinə çəkmə ilə Şimr,
İsti qum üstə yıxdı zəmanə imamını.

Yoxdur Yəzid ilə bu Hüseynün təfavüti?
Verdün Yəzidə izzəti, şə`nün təmamını.

Xuli tənuri, rə`si-Hüseyn(ə) etmədün həya,
Verdün Yəzidə taci, həmi eyş camını.

"Məndəndü bu Hüseyn" demədi Xətmi-ənbiya,
Saldun xəyalə heç Peyəmbər kəlamını?

"Mən həm Hüseyndənəm" demədi Fəxri-kainat,
Pozdun səhifeyi-şərəfün nik namını.

Ol sinəyə ki, məxzəni-elmi-İlahidi,
Verdün nişanə Şimrü Sinanun hüsamını.

Avareyi-vətən, hərəmi-şahi-övliya,
Harda rəvadu, ey fələk, olsun yüzün qəra.

**IV**

Verdün əziz Fatiməyə dəşti-Kərbəla,
Nə dəşti-Kərbəla, ələmabadi-bərməla.

Yüz min cəhan bəlası, hüveyda bəlaləri,
Sərmənzili-müsibətü həm sərhədi-fəna.

Ol su yolların elədün qət`, ey fələk,
Ali-Rəsul(s) təşnəsinə görmədün rəva.

Ətfali-bigünəhlərə rəhm etmədün nədən?
Su-su deyüb Səkinə heç etdünmi e`tina?

Sirab elədün niyə bəs xarü xəsləri,
Hülqumi-Əsğərə elədün tiri aşina.

Möhtac etmisən kərəm əhlin dənilərə,
Ey dunpərəst, eyləgilə, bari, bir həya!

Zalimlər ilə həmnəfəs, həmrazsən müdam,
Əhli-təriqə sitəm etməkdə aşina.

Verdün qəmü müsibəti övladi-Heydərə,
Gəlsün qəra yüzin, görüm, ol ruzi-məhşərə.

**V**

Olmaz nədəndü bu fələkün tağı sərnigun,
Ya od dutub yaneydi bir böylə bu dəhri-dun.

Çün düşdi zibdən yerə sultani-Kərbəla,
San ərşi-kibriya yıxılub qərqi-bəhri-xun.

Düşmişdi qan içində çün ol ruhülaləmin,
Dərya içində necə olur kəşti vajegun.

Ol şahi-kəmsipahə nə cövr etmədün, fələk,
Olduqca səbr edərdi genə dərdü qəm füzun.

Məhparəsini almış idi gün qucağınə,
Tirü şəhab etdi anun tale`in zəbun.

Kərbübəla çölinə nüzul eyləyən zəman,
Bükdi Hüseyn qamətini dərdü qəm çü nun.

Dünyatələblər eylədi tə`yin Yəzidi həqq,
Ali-zinani etmək olur xəlqə rəhnümun.

Lə`nət ola ol ümmətə, həm e`tiqadinə,
Od urdılar ki, rövnəqi-dinün nihadinə.

**VI**

Ey didə, ağla qan, elə viran bu aləmi,
Təcdid eylə hər nəfəs, hər an matəmi.

Et navəki-müjən ilə səd çak sinəmi,
Çak eylə ta tapulmaya bilmərrə mərhəmi.

Ey ahi-atəşin ilə yandur bu dəhri kim,
Daş qalmaya daş üstə, nə bir nəfsi-adəmi.

Ey göz yaşım, gəl, eyləmə xərab gülşəni,
Nə tağı-çərxi eyləgilə qərq çün gəmi.

Gəl, firqətdə eyləmə fəryad, əndəlib,
Sor əhvalımi, eşitgilə həm ahü naləmi.

Ey əbruyi-nigarından sən xəm olmısan,
Xəm eyləyibdü qamətimi bir cəvan qəmi.

Əkbər ləqəb sipehri-məlahətdə çün qəmər,
Yə`qubi-əsr Yusifi, həmraz Məryəmi.

Ney tək odur fəğan edərəm, zar ağlaram,
Hər künci-qəmdə didəsi xunbar ağlaram.

**VII**

Zeynəb əsiri-Şimr ola, ey dideyi-pürab,
Heyranəm, etmisən* niyə bu aləmi xərab.

Zeynəb əsiri-Şimr hara, Şami-şum hara,
Zəncirə bağlu qolları bisər, biniqab.

Etmək əsir Zeynəbi hacət degüldi kim,
Daği-Hüseyn etmiş idi sinəsin kəbab.

Ah ol zəman yetişdi Yəzidün hüzurinə,
Yüz ahü nalə ilə könüldə min iztirab.

Etdi xitab Zeynəbə ol şumi-bihəya:
"Dövran atıb Hüseyni, məni etdi kamyab.

---

* Etmirsən

Səd şükr, gördüm ali-Əlini zəlilü xar,
Təşti-təladə rə`si-Hüseyn, saqi, ver şərab.

Dövran əziz etdi məni, bu Hüseyni xar,
Yetdüm muradə, aləmə salmışdı inqilab”.

Hökm eylədi qulamə, gətür çubi-xeyzəran,
Bədrin bu gün ədavətini eylərəm əyan.

**VIII**

Aldı kəsilmiş əllərinə çubi-xeyzəran,
Qan ağladı zəmanə, fəğan etdi insü can.

Yad etmədi Peyəmbəri, nə ruzi-məhşəri,
Ol şumi-bədnihad, xərab olgilə cəhan.

Vırdı Hüseyn(ə) dodağinə çubi nə halilə,
Lal ol, dilim, əgər edəsən şərhini bəyan.

Əncaq Səkinə dutdı iki gözlərin o dəm,
Fəryad eylədi, dedi, get, qoyma, əmməcan.

Zeynəb deyərdi bəs degül, ey mayeyi-fəsad,
Zülmün yetişdi axirə, ey zalim, ələman.

Girəm, degül imami-zəman, hüccəti-Xuda,
Əmma Peyəmbər oğlıdu, ey şum, bir utan!

Şil olsun əllərün, bu qədr zülmi kim edüb,
Ali-Rəsulə eylədün həm zahirü bəyan.

Amadə ol cəza gününün intiqaminə,
Çox eylədün cəfa bu zəmanə imaminə.

**IX**

Ey Şimri-dun, yüzün gələcək qarə məhşərə,
Min dağ çəkmisən dili-övladi-Heydərə(ə).

Dünyadən ötri kəsdün Hüseyn(ə) başını susuz,
Kəsdün, dedim sözün nə olur, de Peyəmbərə.

Zeynəb əsir, girəm, əsir eylədün, vəli,
Möhtac eylədün niyə bir köhnə mə`cərə.

At çapmağun zəmanıni fikr etmisən məgər,
Kərbübəladə necə deyüm nə`şi-bisərə.

Zalim, Səkinəyə ürəgün yanmadı neçün,
Kim ox uranda su əvəzi hülqi-Əsğərə.

Daşlar qan ağladı, sana tə`sir etmədi,
Saldun təhəyyürə fələki, xəlqi şeşdərə.

Gəh xeyməgahə od urub etdün qiyaməti,
Gəh taziyanə urdun o bimar müztərə.

Cinnü bəşər fəğanə gəlüb yeksər ağladı,
Sən etdigün cəfani görüb kafər ağladı.

**X**

Məhşər güni deyər kimə "əl əfv, əddəxil"[*]
Kim, Şimri-bədnihad ki, ey Xaliqi-cəlil.

Guya deyir Rəsuli-Xudayə, şəfaət et,
Çoxdur günahım, ey şəhi-məhşər, zi hər qəbil.[**]

Zibh elədüm Hüseyni qəfadən kim, ol zəman,
Şad eylədüm Yəzidi, budur üzrimə dəlil.

Daği-Hüseyni sineyi-Zəhrayə çəkmişəm,
On səkkiz oğlun eyləmişəm zülm ilə qətil.

Çəkdüm qətari-Zeynəbi Şamun diyarinə,
Vırdum dinəndə qəmçi ilə abidi-əlil.

Zəncirə bağladum, bəli, Qasim ərusini,
Başı açuq, əyağı yalın, göz yaşi səbil.

Su istədi Səkinə, dedim, xarici qızı,
Bir cür`ə verməerəm, verə kim abi-Səlsəbil.

Kəsdüm imam başın ki, alum xeyli simü zər,

[*] Əfv edin, pənah aparıram
[**] Hər qəbildən

Qıldum əyali-Heydəri aləmdə dərbədər.

## XI

Ey şəm`i-məhfili-hərəmi-kibriya, Hüseyn(ə),
Sərmayeyi-şəfaəti-ruzi-cəza, Hüseyn(ə).

Qəm kişvərini fəth elədün bir nigah ilə,
Ey Kərbəla qəribi, qəmə mübtəla Hüseyn(ə).

Millət yolında eylədi kim sən kimi fəda,
Cani-əzizi şövqilə qıldun fəda, Hüseyn(ə).

Verdün məgər ki, səltənəti-təxtü tacə can?
Ey kəştiyi-həqiqətara naxuda, Hüseyn(ə).

Hürriyyətün binasinə canlar fəda gərək,
Yetmiş iki fəda ilə qıldun bəna, Hüseyn(ə).

Göstərdün aləmə əcəb hürriyyətün yolın,
Kim getdi ol təriqilə, ey vay, Hüseyn(ə).

Can verdi ol Məsih kimi bu Məsihvar,
Əmvati-millətə sən idün rəhnüma, Hüseyn(ə).

Rahi-zəlalət içrə qalub ümməti-Rəsul(s),
Eylə dutub zəlaləti heyran qalub üqul.

## XII

Xamuş, Saqiba, dəxi bu şərhi-qissə bəs,
Tab eyləməz bu şərhüvə aləmdə hiç kəs.

Xamuş, Saqiba, bu cigərsuz qissədən,
Yandı qəm atəşinə zəmanə çü xarü xəs.

Xamuş, Saqiba, dili-Zeynəb kəbabdür,
Şamun xərabəsində ona yoxdı dadrəs.

Bu karivan həşrə kimi suznakdür,
Dut bir qulaq, edibdü cərəs naləsini pəs.

Ney kimi nalə eyləməgin gör Səkinənün,

Va Əkbəra, deyür hanı həmraz, həmnəfəs.

Ağla Hüseynə, sinəvə çək daği-Əkbəri,
Xuni-cigər rəvan elə hər an çün Ərəs.

Şamun xərabəsi kimi viran ol, ey könül,
Rahi-fənani dut, bu cəhandən əlaqə kəs.

Məhşərdə olma sən bu Hüseynə(ə) ümidvar,
Qərqi-günahsən, günəhün var bişümar.

* * *

Ya Hüseyn(ə), diqqət ilə aləmə bir eylə nəzər,
Çəkdigün zəhmətə əfsus edirəm, oldı hədər.

Kərbəladə başuvı saldun əbəs qovğayə,
Nizənün növki ilən etdün onı həmsayə,
Şəhrdən-şəhrə gedüb salsun ona gün sayə,
Pasibani ola həm Şimri-dəğa şamü səhər.

Etdilər zibh qəfadən başuvı qövmi-dəni,
Qoydular üç gecə-gündüz təni üryan səni,
Kim görübdür ola topraq şəhidün kəfəni,
Beylə tapşırdı səni xəlqə məgər Peyğəmbər?!

Kim sözün həqqini izhar eləsə qanə düşər,
Əhli-beyti başaçuq Kufə ilə Şamə gedər,
Qolları bağlı piyadə hərə bir yanə çəkər,
Beylə də zülm olarmı, dutub od, yandı cigər.

Niyyət etdün özümi ümmətə qurban edərəm,
Şövq ilə aləmi bu qanıma əlvan edərəm,
Ümmətün dərdinə bu növ`ilə dərman edərəm,
Bilmədün sən dəxi ümmət edəcəkdür nə hünər.

Biri dindən çıxacaq, birsi deyər iman yox,
Nəyi istər birisi, eyləyəcək, vicdan yox,
Mane` olsun bu cəfavü sitəmə, insan yox,
Günbəgün xəlqdə şiddət eləyür şurü şərər.

Vəhşilik, gör, nə məqamə yetüb, ey şahi-şəhid,
Var kimün cür`əti bir kəs deyə, lə`nət bə Yəzid,

Getdi şər`ün şərəfi, yox ona hərgiz ümmid,
Pasiban olmasa şər`ə, gedər, əlbəttə itər.

Künci-zindandə alimlərimiz oldı əsir,
Sözün həqqini deyüb etməmiş həqqi təkfir,
Hiç belə dərd olurmı ki, degül çarəpəzir,
Ölçi zülmü sitəmə yox dəxi, ey təşnəcigər.

Cəddüvün ümmətinün zülmi dutub dünyanı,
Günbəgün şiddət edir olmayacaq payanı,
Eyləyüb tərki-həya təhqir edüb Qur`anı,
Bulara eyləmisən canı fəda, didəsi tər.

Kim keçər şibhi-Peyəmbərdən, Əli Əkbərdən,
Keçdün, ey bağrımlzı qan edən ol sərvərdən,
Bir tüki hər iki dünyayə dəgər Əsğərdən,
Altıaylıq uşaq heç tab eləyüb tirə dözər?

Nə rəva Zeynəbi-nalan düşə küffar əlinə,
Qolları bağlu olub Şimri-sitəmkar əlinə,
Şami-viranədə min tə`neyi-əğyar əlinə,
Anası Fatimə, cəddi şəhi-ruzi-məhşər.

Kimdən ötri elədün min sitəmi canə qəbul,
Tərk qıldun Əli Əkbər kimi şəhzadə oğul,
Lə`nət olsun belə ümmət nə etdi hüsul,
Zülmdən özgə bular vermədi aləmdə səmər.

Özinə fəxr eləyür, düşməniyəm Qur`anun,
Etmişəm xak ilə yeksan evini imanun,
Hər zəman yadə düşəndə bu ləbi-ətşanun,
Çıxar od şö`ləsi candan, tökərəm əşki-bəsər.

Saqiba, səbr elə, sübhi tez olub hər şamun,
Gah bəd, gah fərəh dövri var hər əyyamun,
Tən qəzayə verəsən, qorxma, alarsan kamun,
Camdə gah olur zəhr, kimi şəhdü şəkkər.

* * *

Şami-virandə, əmmə, bizə kim yar olacaq?
Bu diyar içrə nə çox tə`neyi-əğyar olacaq.

Mən yetiməm, urulub boynuma zənciri-sitəm,
Qollarım bağlu, genə zülmin edir qövmi-züləm,

At qabağında gərək mən bu yolu Şamə gedəm,
Biz əsiran ilə bilməm, necə rəftar olacaq?

Dəstgir olmağımız bəs dögü bu qövmə məgər?
İsti günlər qabağında bu yolu Şamə gedər,
Bülmirəm harda qalub sahibi-Səmsami-düsər,
Görə ta bizlərə bu Şimr pərəstar olacaq.

Kərbəladə pozulub cahü cəlali-vətənim,
Qarə çəkdi yüzinə mah ilə həm əncümənim,
Badi-cövr ilə dönüb gör ki, xəzanə çəmənim,
Yaxşı gün getdi əlimdən, bu günim tar olacaq.

Bərhəm olsun fələkün tağï, nə dövran elədi,
Tez yetim qoydı məni, göz yaşımi qan elədi,
Ah, səd ah, əcəb könlümi viran elədi,
Mən kimi bir də məgər aləmara xar olacaq.

Saldı bu çərxi-fələk, gör, necə hicranə bizi,
Mindirüllər bu yolı naqeyi-üryanə bizi,
Yol uzaq, xovfi-ədu çün gətirür canə bizi,
Ali-Taha hamı bu yolda diləfkar olacaq.

Yüzümə sili urar, gör, necə bu Şimri-pəlid,
Nə qədr cövrü cəfa verdi bu gün, etdi pədid,
Tari-ənduhə çəkibdür məni dövrani-ənid,
Bəlkə mundan də bətər tə`neyi-əğyar olacaq.

Bir qəra mə`cərə möhtac qalum bilməz idim,
Başaçuq, çölləri üryan dolanum, bilməz idim,
Gün qabağında susuz, bağlu qolum, bilməz idim,
Bu əsir olmağımız hər tərəfə car olacaq.

Hardadur bəs əmüm, əmmə, yetişə dadə bu gün,
Verə kim, bircə təsəlli məni-naşadə bu gün,
İxtiyarım gedüb əldən, yetə fəryadə bu gün,
Gözlərim yolda qalıbdur, bizə qəmxar olacaq.
De görüm, əmmə, nə oldı bu Əli Əkbərimə,
Az qalıbdur yetişə can bu zəman ləblərimə,
Versən bu xəbəri bircə o məhpeykərimə,
Qırx nəfər bəsteyi-zəncirə giriftar olacaq.

Gəh tökər göz yaşıni səfheyi-rüxsarə ərus,
Gəh urar başə, gəlür şurə güni qarə ərus,

Bilmənəm, neylədi bu dəhrdə biçarə ərus,
Yüz məlal ilə bu gün varidi-bazar olacaq.

Saqiba, yaz bu müsibət ki, bəyanındu sənün,
Şurə gəl, ur başa, qan ağla zəmanundu sənün,
Çəkmə qəm, novhəgər ol, seyri-nihadundu sənün,
Tuşə qıl həşrdə, vallahi, xəridar olacaq.

* * *

Məhzi-böhtandur, yalandur əhli-Qur`an olmuşuq,
Pəs neçün əhkami-Qur`andan gürizan olmuşuq?

Şahiddür bu sözə qövli-Əmirəlmö`minin,
Cifeyi-dünyadən ötri qan edər heç əhli-din?
Etsə kim, dindarlıqda həqqi yox, eynül-yəqin,
Pis əməldən bir zəman, aya peşiman olmuşuq?

Hansı evdür çıxmaz ol evdən oğul vay-naləsi,
Hansı xahərdür ki, əgnində onun yox qarəsi,
Geyməyüb qardaş əzasında nədür bir çarəsi,
Su yerinə qan içüb, məşhuri-dövran olmuşuq.

Hansı ev viranə qalmub, hansı tifl olmub yetim,
Qan tökəndə zikrimiz – "Allahü Rəhmanir-Rəhim",
Xoşdilük, əfv eyləyər məhşər güni Rəbbül-kərim,
Bak yox, ümmidvari-Şahi-mərdan olmuşuq.

Ey qoyan adın yalandan mən müsəlmanəm, demə,
Sən nəsən hərgiz soruşsa, əhli-Qur`anəm demə,
Əhli-Qur`anun adın xar etmə, Səlmanəm demə,
Hansı bir mizan ilə yə`ni müsəlman olmuşuq.

Əhli-İncilük desək, vallahi, böhtandur, yalan,
Əhli-Tövratük əgər, heç bizdə yoxdur bir nişan,
Əhli-insafük desək, bir zərrəsi olmub əyan,
Vəhşiyük, insaniyyətdən ruygərdan olmuşuq.
Kim soruşsa əhli-İncildən bizi, nifrət edər,
Əhli-Tövratdən soruşma, görməmiş lə`nət edər,
Əhli-Qur`an hifzi-dinü millətü ismət edər,
Vermişük imanı əldən, məhvü heyran olmuşuq.

Kuçələrdə dəstə-dəstə əhli-Qur`andur ölən,
Qədri yox, miqdari yox min-min müsəlmandur ölən,

Kafər ölmür bir nəfər, yüzlərlə səlmandur ölən,
Aridən, namusidən, billahi, üryan olmuşuq.

Qardaşım, bəsdür bu qəflət, xabi-qəflətdən oyan!
Dutdığun bu pis əməldən ol peşiman, bir oyan!
Zülmi bəsdür eylədün həmcinsüvə, axır oyan,
Bir göz aç, düşmən əlində xarü talan olmuşuq.

Məhşəri sal xatirə, xəsmi-Peyəmbərdən utan,
Kərbəla dəştindəki ol Şahi-bisərdən utan,
Can ilə xidmət edən İslamə Heydərdən utan,
Düşməni-dini-Peyəmbər, ağı-Yəzdan olmuşuq.

Gündə bir peyğəmbər izhari-risalət eyləyür,
Mali-mərdümxar ilə hökmi-imamət eyləyür,
Malını xəlqün ki, bu rəng ilə qarət eyləyür,
Gündə bir nadan sözinə bəndəfərman olmuşuq.

Bu Hüseyni-Kərbəlayə biz əzadarük məgər?
Mə`rifətlə üsrəti-Zəhrayə xunbarük məgər?
Bizdə kim yox mə`rifət, bizzərrə dindarük məgər?
Bilmişük neyçün məgər biz didəgiryan olmuşuq?

Həqqimiz yox etməgə Şimrü Sinanə lə`nəti,
Bizdə malamaldur Şimrü Sinan xasiyyəti,
Şər`i-Peyğəmbər gedüb əldən, qalıbdur surəti,
Şimr ilə çoxdan rəfiqük, Şimrə dərban olmuşuq.

Ey Hüseyni-Kərbəla, qıl bir nəzər İslamə bax!
Dərbədər olmuş, gedüb əldən bu bədəyyamə bax!
Sora axtar Zeynəbi-zari, xərabə Şamə bax!
Çarəsiz dərdə giriftarük, pərişan olmuşuq.

Saqiba, şərh eylədün İslam halın sərbəsər,
Sən də ol İslamdənsən, həşr odından qıl həzər,
Mə`siyət dəryasinə qərq olmusan, ey bixəbər,
Qafilük rahi-zəlalət içrə yeksan olmuşuq.

* * *

Əsir olduq, babacan, bu şamyanə,
Vırar mənim başimə Şimr tazyanə.

Vırubla boynuma mənim zülm ilə zəncir,
Əlimdə çarə yox edüm dərdimə tədbir,

Nə qədr ney kimi edüm naleyi-şəbgir,
Əsir olduq, babacan, bu şamyanə.

Ərus xuni-cigər edər, nalə dəmadəm,
Fəraqü matəm eyləmiş qamətni xəm,
Qan ağlar halinə onun hər iki aləm,
Əsir olduq, babacan, bu şamyanə.

Keçər bu Şamdə necə, gör, hali-Zeynəb,
Salub bu dəhri-şumə od məlali-Zeynəb,
Gələ zəmanə görmədi cəmali-Zeynəb,
Əsir olduq, babacan, bu şamyanə.

Bu Şamun içrə yetmişəm canə sitəmdən,
Cəhanə gəlmiyeydim heç kətmi-ədəmdən,
Rəsa qəddim xəm oldı, gör, qüssəvü qəmdən,
Əsir olduq, babacan, bu şamyanə.

Kimün olubdu qardaşı qanına qəltan,
Gün istisi, yaralu, həm peykəri üryan,
Mənim kimi bu dəhridə, ey şəhi-xuban,
Əsir olduq, babacan, bu şamyanə.

Gəl, ey şəbihi-Əhmədim, Əliyyi-Əkbər,
Vırar yüzimə Şimri-dun sili, bəradər,
Nedüm, nə çarə eyləyüm, yox mənə yavər,
Əsir olduq, babacan, bu şamyanə.

Xərab oleydi kaş, o dəm görüm zəmanə,
Əliyyi-Əsğər oldı kim, tirə nişanə,
Nə vəqtədin* gəlüm, baba, ahü fəğanə,
Əsir olduq, babacan, bu şamyanə.

Xərabə künci məskənim, nədür günahim,
Bu şum bəxtim olmaz heç dəlili-rahim,

Diyari-cəddimə gedim, yoxdu pənahim,
Əsir olduq, babacan, bu şamyanə.

Baba, çox ağlaram, məni etmə məlamət,
Zəmanə içrə olmadım nə bircə rahət,
Bu Şimri-dun cəfasinə dəxi yox taqət,
Əsir olduq, babacan, bu şamyanə.

* Nə vaxtadək

Bu şəhri-şumə, gör, necə verüblə rövnəq,
Əsiri-xarici gəlür deyəllə mütləq,
Görüm, oleydi ol zəman dəhr müəlləq,
Əsir olduq, babacan, bu şamyanə.

Ölüm tozı qoneydi bu kaş üzarə,
Gedüm Nəcəf çölinə, yox əlimdə çarə,
Verə nicat şahi-din məni-fikarə,
Əsir olduq, babacan, bu şamyanə.

Kəsüblə başuvi, qalub cismün aradə,
Başun tənuri-Xulidə, gəhi cidadə,
Gələ fəğanə şiələr bəzmi-əzadə,
Əsir olduq, babacan, bu şamyanə.

Gərək qan ağlasun mənim halimə Saqib,
Həmişə sinəçak ola nazirü qayib,
Hüseyn müsibəti gərək saxlana vacib,
Əsir olduq, babacan, bu şamyanə.

* * *

Qan ağlagilən həşrəcə, ey dideyi-pürnəm,
Sal yadə Hüseyn halını hər anidə, hərdəm.
Millət, nə yatubsan?

Ümmət qoyan adını gərək ağlaya hər an,
Şad olmaya bir ləhzə, edə çaki-giriban,
Qəmdən ola xəm qaməti, həm didəsi giryan,
Matəmzədə olsun gecə-gündüz, nə ki xürrəm.
Millət, nə yatubsan?

Sal Kərbübəla vaqiəsin bircə xəyalə,
Övladi-Əli, fəhm elə, gör, düşdi nə halə,
Aç çeşmi-bəsirət, elə bir ney kimi nalə,

Göz açgilə, seyr eylə, nə aləmmiş ol aləm.
Millət, nə yatubsan?

Ümmət qoyan adın, o edər hiç ədavət?
Ümmət degül ol kimsə, ədavət edə adət,
Düşmənlik ilə parələnür pərdeyi-ismət,

“Əl-mö`minü ixvət”[1] deyüb ol Sərvəri-əkrəm,
Millət, nə yatubsan?

Can verdi məgər səltənətə şahi-Mədinə?
Zibh etdi qəfadən onı bu firqeyi-kinə,
Rəxnə salub ol qövm əbəs dini-mübinə,
Din rövnəqini eylədilər zülm ilə bərhəm.
Millət, nə yatubsan?

Hürriyyət içün canı verüb ol şəhi-məhşər,
Bu şə`nidü kim fəth elədi qəl`eyi-Xeybər,
Can verdi odur şə`ni-o damadi-Peyəmbər,
Ol eyni-Xuda, etdi müsavati fərahəm.
Millət, nə yatubsan?

Fəqrə gecə-gündüz eləyüb can ilə xidmət,
Biçarələrün dadrəsi, kani-mürüvvət,
Ömrində nə şə`nü həsəbə etmədi rəğbət,
Millət, bi rəvadurmı olaq qəflətə həmdəm?
Millət, nə yatubsan?

Məqsudi odı zülm əlindən ola azad,
Məzlumə, ey ərbabi-həqiqət, edək imdad,
Möhkəm ola, ta həşrə kimi bəlkə bu bünyad,
Zalim olana rəhm edə hər kim, odu Mülcəm!
Millət, nə yatubsan?

Zəhr içdi Həsən, millətə canın tələf etdi,
Can şişəsini səngi-cəfayə hədəf etdi,
Hər zülmi şirin canə qəbul ol xələf etdi,
Bicadu məgər canə qəbul eyləmək hər qəm?
Millət, nə yatubsan?

Fəhm eylə neçün kim, bu Hüseyn qanə olub qərq,
Millət bir ola, olmaya heç bir-birilə fərq,
Kim təfriqə salsa bizə, ol Şimrüdü mütləq,

Hər sübhü məsadə eləyək lə`n ona möhkəm.
Millət, nə yatubsan?

Əbbas kimi cümlə bəni-Haşimə sərvər
Verdi bu Hüseyn millətə, qan ağladı Heydər,
Çak etdi giribanını, baş açdı Peyəmbər,

[1] Möminlər qardaşdırlar

Zəhra yüzə əfşan elədi türreyi-pürçəm.
Millət, nə yatubsan?

Asan degül Əkbər kimi xurşidliqani,
Tərk eyləyəsən harda rəvadur elə cani?
Haşa, görə Əkbər kimi bu aləmi-fani,
Hüsnində şəbih Əhmədi-Muxtar ilə bahəm.
Millət, nə yatubsan?

Qasim kimi novrəs, güli-gülzari-vilayət,
Yüz şövq ilə can verdi, degülmi bu kifayət?
Etməz, bu təəccübdü, bizə hiç sirayət,
Bari, edə tə`sir biz avarəyə kəm-kəm.
Millət, nə yatubsan?

Verdi şəhi-din Əsğəri qurban bu həvayə,
Kimdür bu Hüseyn kimi dözən böylə cəfayə?
Vardur yeri fəxr eyləyə küllən şühədayə,
Ol tifli salur yadə, çəkər naləni adəm.
Millət, nə yatubsan?

Zeynəb kimi iffətlü bacı Şamə piyadə
Getsün başaçuq, həm bu Hüseyn başı cidadə,
Yad eyləyirük biz anı hər bəzmi-əzadə,
Viranələrün künci o banuyi-müəzzəm.
Millət, nə yatubsan?

İbrət günidür, ibrət edək Ali-əbadən,
Bir az nə olu, biz də vıraq dəm bu vəfadən,
Bu səs qulağa gündə gəlür Kərbübəladən:
Millət, ayılun, qeyr necə düşdi müqəddəm.
Millət, nə yatubsan?

Dutmış dəxi mir`at, küli-jəngi-küdurət,
Nə millətə tə`sir eləməz hiç nəsihət,
Ərbabi-kəmalə dəxi çox vermə əziyyət,
Saqib, eləmə naləvü fəryad dəmadəm.
Millət. nə yatubsan?

* * *

Qan ağlagilə həşrəcə, ey dideyi-pürnəm,
Sal yadə Hüseyn(ə) halını hər anidə, hərdəm.
Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Ümmət qoyan adını gərək ağlaya hər an,
Şad olmaya bir ləhzə, edə çaki-giriban,
Qəmdən ola xəm qaməti, həm didəsi giryan,
Matəmzədə olsun gecə-gündüz, nə ki xürrəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Sal Kərbübəla vaqiəsin bircə xəyalə,
Övladi-Əli(ə), fəhm elə, gör, düşdi nə halə,
Aç çeşmi-bəsirət, elə bir ney kimi nalə,
Çak eylə giribanuvi, qan ağla dəmadəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Ümmət qoyan adını edər hiç ədavət?
Ümmət degül ol kimsə, ədavət edə adət,
Düşmənlik ilə parələnür pərdeyi-ismət,
"Əl-mö`minü ixvət" deyüb ol Sərvəri-əkrəm(s),

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Can verdi məgər səltənətə şahi-Mədinə?
Zibh etdi qəfadən onı kim firqeyi-kinə,
Rəxnə salub ol qövm əbəs dini-mübinə,
Din rövnəqini eylədilər zülm ilə bərhəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Fəqrə gecə-gündüz eləyüb can ilə xidmət,
Biçarələrün dadrəsi, kani-mürüvvət,
Ömrində nə şə`nü həsəbə etmədi rəğbət,
Millət, bu rəvadurmı olaq qəflətə həmdəm?

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Məqsudi odur zalim əlindən ola azad
Məzlum, ey ərbabi-həqiqət, edək imdad,
Möhkəm ola, ta həşrə kimi bəlkə bu bünyad,

Zalim olana rəhm edə hər kim, odu Mülcəm!

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Zəhr içdi Həsən(ə), millətə canın tələf etdi,
Can şişəsini səngi-cəfayə hədəf etdi,
Hər zülmi şirin canə qəbul ol xələf etdi,
Bicadu məgər canə qəbul eyləmək hər qəm?

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Fəhm eylə neçün kim, bu Hüseyn(ə) qanə olub qərq,
Millət bir ola, olmaya heç bir-birilə fərq,
Kim təfriqə salmış bizə, ol Şimridü mütləq,
Hər sübhü məsadə eləyək lə`n ona möhkəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Əbbas kimi cümlə bəni-Haşimə sərvər
Verdi bu Hüseyn(ə) millətə, qan ağladı Heydər,
Çak etdi giribanını, baş açdı Peyəmbər,
Zəhra yüzə əfşan elədi türreyi-pərçəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Asan degül Əkbər kimi xurşidliqani,
Tərk eyləyəsən, harda rəvadur elə cani?
Haşa, görə Əkbər kimi bu aləmi-fani,
Hüsnində şəbih Əhmədi-Muxtar ilə bahəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Qasim kimi novrəs, güli-gülzari-vilayət,
Yüz şövq ilə can verdi, degülmi bu kifayət?
Etməz bu təəccübdü bizə hiç sirayət,
Bari, edə tə`sir biz avarəyə kəm-kəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,

Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Verdi şəhi-din Əsğəri qurban bu həvayə,
Kimdür bu Hüseyn kimi dözüb cövrü cəfayə?
Vardur yeri fəxr eyləyə küllən şühədayə,
Ol tifli salur yadə, çəkər naləni adəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Zeynəb kimi iffətlü bacı Şamə piyadə
Getsün başaçuq, həm bu Hüseyn başı cidadə,
Yad eyləyürük biz anı hər bəzmi-əzadə,
Viranələrün künci o banuyi-müəzzəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

İbrət günidür, ibrət edək Ali-əbadən,
Bir az nə olur biz də uraq dəm bu həvadən,
Bu səs qulağə gündə gəlür Kərbübəladən,
Millət, ayılun, qeyr necə düşdi müqəddəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

Dutmış dəxi mir`ati-könül jəngi-küdurət,
Biz millətə tə`sir eləməz hiç nəsihət,
Ərbabi-kəmalə dəxi çox vermə əziyyət,
Saqib, eləmə naləvü fəryad dəmadəm.

Millət, nə yatubsan, aç çeşmi-bəsirət,
Getdi Vətən əldən, bəsdür dəxi qəflət.

* * *

Aç gözün, ey mahi-münəvvər balam!
Dur yuxudan, ey Əli Əsğər balam!
Noldı sənə gül kimi rəngün solub,
Nazlu Səkinə sənə mehman gəlüb,
Aç gözüvi, gör, necə zülfin yolub,
Dur yuxudan, ey Əli Əsğər balam!

Gettün, oğul, bəzmi-bəlayə əman,

Qaldı anon bikəsü bixaniman,
Yaxşı məhəbbət elədi mizban,
Dur yuxudan, ey Əli Əsğər balam!

Bilsün anon sən niyə xab etmisən,
Əmmələrün sinəkəbab etmisən,
Ərşi-Sürəyyani xərab etmisən,
Dur yuxudan, ey Əli Əsğər balam!

Sənsiz anon ah ilə əfğan edər,
Başə urub, aləmi viran edər,
Həşrə kimi qaldı anon dərbədər,
Dur yuxudan, ey Əli Əsğər balam!

Oldı şəhid Qasimi-gülpeykərim,
Kül başıma, öldi Əli Əkbərim,
Ölsün anon, cuşə gəlüb qəmlərim,
Dur yuxudan, ey Əli Əsğər balam!

Qasimi-gülpeykərim əldən gedüb,
Bikəs oğul, qardaşım Əkbər gedüb,
Dərdü qəmün başimə küllər töküb,
Dur yuxudan, ey Əli Əsğər balam!

Bağrına qan qoydun, oğul, qönçənün,
Sinəsini dağ elədün lalənün,
Matəmüvə başın açub bülbülün,
Dur yuxudan, ey Əli Əsğər balam!

Kərbübəladə hamı su oldı qan,
Vermədi bu qövm sənə, ələman,
Eylə təkəllüm mən ilə bir zəman,
Dur yuxudan, ey Əli Əsğər balam!

Sənsiz anon zülm ilə Şamə gedər,
Qürbətara dərdinə dərman edər,
Lütf qılub Saqibə ehsan edər,
Dur yuxudan, ey Əli Əsğər balam!

* * *

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Mən necə yaddan çıxardum Kərbəla qovğasını,

Mən necə başdan çıxardum bu Hüseyn sövdasını,
Parə-parə etdilər nahəq yerə ə`zasını,
Ey gözüm, qan ağla, qan, dut bu Hüseynün yasıni.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Ey Hüseynün bilməyən aləmdə qədrü qiymətin,
Salmısan dildən-dilə, biqədr edübsən hörmətin,
Kəsb özünçün etmisən nadanlığun keyfiyyətin,
Sən özünlə heç müqabil dutma Allah hüccətin.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Gör kimi təhqir edürsən, ey filan oğlı filan,
Yadə sal etdiklərün, nə etmisən, bir dəm utan,
Göz qabağında durubdur etdigün bir-bir əyan,
Bəlkə sən səhv etmisən, gəl, fikrüvi ver bir zəman.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Bir qədr ver fikrüvi, gör, bir nə bidad etmisən,
Ey evi bərbad, sən abadı bərbad etmisən,
Zülmüvə, zalim, utan bir, məhvi-Şəddad etmisən,
Get, evün abad, özün çox gözəl ad etmisən.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Bir yerə əl atmısan sən kim, yıxar bünyaduvı,
Çox da çəkməz, hazır ol, heç kim eşitməz daduvı,
Ney kimi əflakə salson naleyi-fəryaduvı,
Sən tələb kimdən edərsən, dust yox, imdaduvı.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.
Ölçi var hər bir əməldə, xah ola xoş, xah bəd,
Ölçi yoxdur zülmüvə, ey bimürüvvət, ya ki həd,
Fərqi yox, yanunda birdür hər yetən, namərdü mərd,
Sən nə nuri-paksən mən alimən həm fərd-fərd.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,

Aləmi fəryadimə çaki-giriban etməyüm.

Gör kimi təhqir edirsən, cəddi aləm sərvəri,
Seyr edüb bir göz yumub-açınca yeddi gögləri,
Aləmə rəhm eyləyən Xatuni-məhşər madəri,
Zinəti-həft asiman, Cibril olmış çakəri.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Fatehi-Xeybər atondurmı olan şeytandən,
Çəkməyürsən əl neçün sən ol şəhi-ətşandən,
Ver cəvab, ey nütfəsi ol Şimri-bədərkandən,
Gəlmisən sən bu vücudə, sölə, hansı kandən.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Qardaşun vardur Həsən(ə) tək, xəlq görsün ver nişan,
Gər nişan versön də, billah, ya filandur ya filan,
Madərün mə`lumdür, hacət degül etmək bəyan,
Gündə min-min ər görübdür, şahidimdür insü can.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Eybdür, eyb eyləmə, ey eyb içində dərbədər,
Eyb edirsən bir kəsə, olmış ona gör kim pədər,
Cəddi Xətmi-ənbiya(s), inkarın etməz bir nəfər,
Etdigün təhqirdən heç etmisənmi bir həzər.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Bu Hüseynə eybdürmi canıni qurban edüb,
Həqq yolında şövq ilən həqqün özin heyran edüb,
Ümmətün can vermək ilən dərdinə dərman edüb,
Həqq ilən kimdür Hüseyn(ə) tək bir belə peyman edüb.
Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Səndə yox təqsir təmə`dür eyləyən rüsva səni,
Xatiri cəm` etgilən, pak eyləməz dərya səni,
Olmalıydun beylə, oldun sən, tanur dünya səni,

Bilmirəm mən eyləsün kimlər nəyə mə`na səni.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Bu Hüseynə eybdür, vermiş Əliyyi-Əkbəri,
Həqq yolunda ol şəbihi-xatəmi-Peyğəmbəri,
Bir oğuldan keçdi kim, pirayəsi həq məzhəri,
Surəti eyni-Mühəmməd(s), sətvətiydi Heydəri.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

Dut Hüseynün damənin, Saqib, yetər imdaduva,
Rəhmət olsun hər zəman, hər dəm sənün ustaduva,
Bu Hüseyndən başqa yoxdur yetməgə fəryaduva
Həşrdə, hər bir nəfəs halın görüb sal yaduva.

Mən necə hər bir nəfəs fəryadü əfğan etməyüm,
Aləmi fəryadimə çaki-giriban etməyüm.

* * *

Ey Hüseyn düşməni, bir Xətmi-peyəmbərdən utan!
Şafe`i-ruzi-cəza, fatehi-Xeybərdən utan!

Aləmi-zərrdə hər kim ki, deyibdür "ləbbeyk",*
Bu Hüseynə yetişüb, sərhədi-Həqqə bişək,
Oldı aləmdə bəli, taci-səri-cinnü mələk,
Göylərdə dedi Musayə ki, "fəxlə` nə`leyk",**
Bir Hüseyn nokəridü, bircə o nokərdən utan.

Bu Hüseyn olmasa, bir kəs görə bilməz cənnət,
Bu Hüseyn olmasa qismət ona olmaz rəhmət,
Olmaseydi bu Hüseyn, pak olumi bir tinət?

Bu Hüseyn olmasa, bir nəfsidə olmaz qüdrət,
Sən də bu məsləki-bihudəvü bihəddən utan.

Sən kimilər nə bilür məzhəri-Həqq qiymətini,
Çəkər ərbabi-həqiqət gözinə türbətini,
Tinəti pak dutar Ali-Əli hörmətini,
Dutma düşmən, həzər et, həzrəti-Həqq hüccətini,

* Əmrinizə hazıram, bəli
** "...nəleynini çıxart..." (Qurani-kərim, Taha, 12)

Sahibi-tiği-düsər, şahi-dükişvərdən utan.

Əli övladinə kəc baxmagilən, xanəxərab,
Nə nəfəs çəksön özündən alacaq həqq-hesab,
Həşrdə sən bu Hüseynə verəcəksən nə cəvab?
Verəcəklər sənə Şimr ilə ki, bir yerdə əzab,
Qorx o gündən ki, o gün mö`minü kafərdən utan.

Özüvi nə, bu Hüseyni nə hesab eyləmisən?
Möhnətindən sən haçan didə pürab eyləmisən?
Hansı bir cövrü cəfayə, qəmə tab eyləmisən?
Gündə min dəf`ə utan, xanə xərab eyləmisən,
Ali-Tahadən həya, sureyi-Kövsərdən utan.

Nə bilürsən bu Hüseyn qədrini, ey batini kur!
Ki, həyat əhlinün halın nə bilür əhli-qübur?!
Tapdı möhnət bu Hüseyn(ə) namı ilə vadiyi-Tur,
Bu şəhi-Kərbübəladə, de görüm, var nə qüsur?
Lə`nət ustadüvə olsun, belə rəhbərdən utan.

Sən hara, qürbi-Hüseynü şəhi-əbrar hara?!
Sən hara, hübbi-Əli, Heydəri-Kərrar hara?!
Nəcisül-eyn hara, itrəti-əthar hara?!
Nəsli-İblis hara, Əhmədi-Muxtar hara?!
Tuf edüllər sənə, bir milləti-digərdən utan.

Bu Hüseyn(ə) ilə neçün düşmənsən, ey külbaş?
Nuri-xurşidi ki, dərk eyləyə bilməz xəffaş,
Məhrəm olmaz bu Hüseyn nokərinə hər ovbaş,
Özüvə kəsb eləyürsən belə rəng ilə məaş,
Səni vadar edən ol şumi-bədəxtərdən utan.

Atanun oğlı Hüseyn ilə ədavət etməz,
Bu əzadarlərə tə`nü məlamət etməz,
Füqəra malını min zülm ilə qarət etməz,
Nütfəsi pak bu bidinligə adət etməz,
Səni kimdən qazanub, bir dəm o madərdən utan.
Bu Hüseyn fəxr eləyür, zalim, anam Zəhradur,
Cəddi-pakimdü Mühəmməd(s) şəhi-“əv ədna”dur,*
Atam, ol şiri-Xuda, aləmə həm mövladur,
Qardaşım zəhr şəhidi, xələfi-Bəthadur,
Sən kimə fəxr eləyürsən, anova, ondan utan.

* “... ondan daha yaxın...” (Qurani-kərim, ən-Nəcm, 9)

Səni kəsb etmiş anon yetmiş iki millətdən,
Dəm urursan genə bu halət ilə ismətdən,
Çıxmış isən bir haçan xəlq içinə xiclətdən?
Səndə asari-nəcabət hanı, ya qəflətdən,
Gecə-gündüz sən ilə həmdəmü həmsərdən utan.

Dutmısan[*] dust Hüseyni, bilürəm var səbəbi,
Çünki mə`lum degül səndəki ol ümmü əbi,
Buyurubdur belə, billahi, Rəsuli-ərəbi,
Yadə salmaz bu Hüseyn sən kimi bir biədəbi,
Şər` qurbani, susuz həncəri-Əsğərdən utan.

Bu Hüseyn olmasa aləmlər olur viranə,
Gözi çıxmış, baxasan diqqət ilə Qur`anə,
Uymısan nəfsüvə, səcdə elədün şeytanə,
Qabiliyyət hanı səndə, gələsən imanə,
Səndə ol tinəti-bimə`niyi-bədtərdən utan.

Sən deyürsən, nə Hüseyn(ə), boş sözdür cümlə hədər,
Min ilün ölmişinə tökmə dəxi xuni-cigər,
Vəhşidür milləti-İslam, əbəs novhə edər,
Dilüvi qət` edəcəklər, bilürəm, vəqt yetər,
Başaçuq Şamə gedən Zeynəbi-müztərdən utan.

Qeyri millət bu Hüseynə eləyür ahü fəğan,
Kuçələrdə dolanur novhəkünan, sinəzənan,
Baş açur, nalə edür, qarə geyür pirü cəvan,
Şad olursan bu Hüseyn(ə) ölməginə, ibn filan,
Bihəya, bari, o qonşundakı Kəsbərdən utan.

Səndə bir zərreyicə mə`rifət olseydi əgər,
Gecə-gündüz tökər idün yüzüvə xuni-cigər,
Aç bəsirət gözini, etmə həqarətlə nəzər,
Bu şəhi-təşnələbə etmisən insaf məgər,
Hakimi-ruzi-cəza, Xaliqi-əkbərdən utan.

Saqiba, dut bu Hüseyn matəmini şamü səhər,
Qərqsən bəhri-günahə, yüzə tök xuni-cigər,
Axirət tuşəsin eylə, yetişüb vəqti-səfər,
Xabi-qəflətdən ayıl, ömrüvi sərf etdün hədər,
Yazdığun novhəyə bax, əldəki dəftərdən utan.

* * *

---

[*] Tutmursan

Ya Hüseyn(ə), ey Kərbəla qurbanı, ey ətşan olan!
Din yolunda xanimanı sərbəsər viran olan!

Verdi fitva qətlüvə kim, Kufənün alimləri,
Uydular dünyayə, dindən oldılar yeksər bəri,
Salmadılar yadə hərgiz xatəmi-Peyğəmbəri,
Ey belə alimlərün fitvasına heyran olan!

Lə`nət olsun bir belə fitvayə, belə millətə!
Dəmbədəm, saətbəsaətdə səzadur lə`nətə,
Aləmi-İslami əvvəl gündən salublar zillətə,
Heç belə fitva verürmi tabe`i-Qur`an olan?!

Heç müsəlman böylə əhd eylər, belə peyman edər?
Təşnə öldürsün imami, qaninə qəltan edər?
Böylə zülmi-nagəhani hansı bədərkan edər?
Kərbəla dəştində bikəs, xak ilə yeksan olan!

İstədilər əhli-Kufə, Kufəyə mehman səni,
Yaxşı mehman etdilər, ey şahi-məzluman səni!
Qıldılar ləbtəşnə axır qanuva qəltan səni,
Ağlaram bu halə daim, ey belə mehman olan.

Hansı millət öz imamın öldürübdür təşnələb,
Hansı bidin bir kəsi qətl eyləyibdür bisəbəb,
Ağlamaz əhvaluva kim mahü salü ruzü şəb?
Yetməsün məqsudinə məhşərdə, ey talan olan!

Hansı millət öz imamun itrətin etmiş əsir?
Hansı biinsaf urmış zülmilən Zəhrayə tir,
Südəmər tiflün boğazinə degül mərhəmpəzir,
Möhnətindən Əsğərün, ey həşrədək giryan olan.

Bu Hüseyn, ey Şimr, girəm, tabe`i-Qur`an degül,
Qanıni nahəqq yerə tökdün, məgər insan degül?

Hüccətüllah qanıni tökdün, bəli, asan degül,
Ey həqiqətdən bəri bilmərrə rugərdan olan.

Yetmədün məqsudə, düşdün mülki-Rey sövdasinə,
Ah, qıldun bu Hüseyni qərqi-qan dəryasinə,
Bihəya, uydun Yəzidün dövləti-bicasinə,
Həqqdən döndün əbəs birəhmü biiman olan.

Neyləmişdi, söylə bircə, Xətmi-peyğəmbər sənə?
Həzrəti-Xatuni-məhşər, aləmə rəhbər sənə,
Lə`nət olsun dəmbədəm, ey Şimri-bədəxtər sənə!
Məzhəbindən əl çəküb, ağı-Şəhi-mərdan olan.

Bu Hüseynə dut əza, Saqib, həmişə ağla qan,
Yoxsa matəmdə baş açmış kim, Əmirəl-mö`minan,
"Va Hüseyna" sölər hərdəm, ruzü şəb eylər fəğan,
Sən də sölə: ya Hüseyn, ey qanına qəltan olan.

* * *

Bir zərrə həya eyləgilən, bari, Xudadən,
Yoxdur xəbərün dərdi-səri-ruzi-cəzadən.

Neyçün eləyürsən bu Hüseyn ilə ədavət?
Etmiş bu Hüseyn kimlərün həqqində xəyanət?
İsbat elə bürhan ilə, ta xəlq ola rahət,
Həqq zahir olanda itəcək nahəq aradən.

Min il gəzəsən, gər baxasan cümlə kitabə,
İrad yerin tapmayacaqsan o cənabə,
Vəsfin görəcəksən, onı bil, gəlməz hesabə,
Rüsva özüvi etməgilən, düş bu həvadən.

Ey düşməni-övladi-Rəsuli-şəhi-lövlak,
Bir dəm, həzər et, olmagilən çox belə bibak,
Yaxşı-yamanə fərq qoya, səndə yox idrak,
Yox səndə həya, qət` olunub "qalü bəla"dən.

Zatun səni qoymaz biləsən yaxşı-yəmani,
Yaxşı görəcəksən pisi, ey nəsli filani,
Nəslün yetişir kimlərə, göstər görək hani?
Vardur xəbərün hansı xələf ümmi-əbadən.

Bir şəxsün ola cəddi cəhan əhlinə rəhbər,
Şə`nində onun nazil ola ayeyi-əthər,
Həm xilqəti-aləm səbəbi, şafe`i-məhşər,
Hər yerdə deyürsən ki, Hüseyn çıxsun aradən.

Kimdür atası – şiri-Xuda, hadiyi-dindür,
Aləmləri heyrətdə qoyub, əhli-yəqindür,

Şahid bu sözə, aç oxı, Qur`ani-mübindür,
Rövşən görəcəksən bu sözi şəmsü zühadən.

Kimdür anası – Fatimə(ə), banuyi-qiyamət,
Başdən-əyağə nurdür, həm kani-kəramət,
Var hansı anonda bu nəcabət, bu şərafət?
Sən çəkmə əbəs, bircə utan, bu nücəbadən.

Bir vəqt gəlür sinə açub dad edəcəksən,
Təng olsa işün, yadi-bu övlad edəcəksən,
Həqdür bu Hüseyn(ə), aləmi irşad edəcəksən,
Əl çəkməyəcəksən kərəmi-Ali-əbadən.

Mən də sənə lə`nət edərəm hər nəfəs, hər an,
Nə olduğuvı kəşf edərəm xanəsi viran!
Çoxlar elədi minlər ilə sən kimi tüğyan,
Başi keçüb axırda onun növki-cidadən.

Gör, bir nə yerə iş yetişübdür, nə məqamə,
Tə`nə eləyürsən əbəs hər yerdə İmamə,
Bir vəqt gəlür, qorxma, çəkərlər səni kamə,
Qoymazla qala səndə nə ağü nə qəradən.

Min sən kimilər eyləsün inkar Hüseyni,
Biqədr eləməz zərrəcə miqdari-Hüseyni,
Hər yerdə ola, tez tapar əbrar Hüseyni,
Xali degül hərgiz bu cəhan əhli-vəfadən.

Nəmrudun odın səhni-gülistan eləyən var,
İbrahimə canü dili qurban eləyən var,
Bidərdlərün dərdinə dərman eləyən var,
Mən çəkmərəm əl daməni-Şahi-şühədadən.

Ey həqq yolunda eləyən canıni qurban!
Ey Kərbübəla təşnəsi, ey qanına qəltan!
Saqib səni tərk eyləməz aləm ola viran,
Baran yerinə başinə od yağsa səmadən.

* * *

Ey qoyan bağrıma qan, sən Kərbəla damadisən,
Rahəti-ruhi-rəvan, sən Kərbəla damadisən.

Qoyma həsrət həşrətək, rəhm et, məni didaruva,
Məhvü heyranəm əzəl gündən bu məh rüxsaruva,

Dil əsir olmuş sənün bu türreyi-tərraruva,
Sərvqəd, əbrukəman, sən Kərbəla damadisən.

Daneyi-xalun xəyali etdi sərgərdan məni,
Vadiyi-heyrətdə heyran eyləmiş hər an məni,
Ey gözün qurbanı, rəhmət eyləmə kərman məni,
Bivəfa, od dutdı can, sən Kərbəla damadisən.

Mən necə səbr eyləyüm illərlə bu hicranuva,
Paybənd olmuş könül zülfi-əbirəfşanuva,
Şimri-dun, meydanə gəl, getmə, susuzdur qanuva,
Getmə, səbr et bir zəman, sən Kərbəla damadisən.

Şimrə bax, durmuş əlində tiği-atəşbar ilə,
Qətlüvə amadə durmuş ləşkəri-küffar ilə,
Rəhmi yox, durma müqabil bir də ol xunxar ilə,
Bir zəman verməz əman, sən Kərbəla damadisən.

Əl mənim, damən sənün, ahim odından qıl həzər,
Tərk qıl meydani, canım, dizlərim, könlüm əsər,
Gör, nə halə düşmüşəm Məcnunsifət, qıl bir nəzər,
Ələman, ey novcəvan, sən Kərbəla damadisən.

Sən şəhidi-zəhrün arami-dil fərzəndisən,
Zinəti-ağuşi-Zəhra, dilbəri-dilbəndisən,
Bu Hüseyni-bipənahun yari-bimanəndisən,
Haşimilərün nişani, sən Kərbəla damadisən.

Aləmi məhv eylərəm sənsiz, bu suzi-ah ilən,
Necə mən həmraz olum bu Şimri-kinəxah ilən,
Mümkin olsa Şamə getmək kim, bu bədhəmrah ilən,
Etmərəm hərgiz fəğan, sən Kərbəla damadisən.

Mən əsiri-kakili-giysuyi-müşkəfşanunam,
Qaşlarun tiğinə mən dil vermişəm, qurbanunam,
Ağlaram neytək dəmadəm, ruzü şəb giryanunam,
Fitneyi-axirzəman, sən Kərbəla damadisən.
Eylə məhvəm hüsnüvə, heç bilmərəm dünya nədür,
Sənsiz aləm olmasun, ey şuxi-bihəmta, nədür,
Cami-eşqün məstiyəm, sağər nədür, səhba nədür,
Natiqi-şirinzəban, sən Kərbəla damadisən.

Mən necə səbr eyləyüm, görsəm əgər üryan səni,
Dəşt içində düşmüsən, qərq eyləyübdür qan səni,

Şamədək gəlləm piyadə, görməsəm bir an səni,
Qədd olar qəmdən kəman, sən Kərbəla damadisən.

Gör necə sədparə düşmüş, bax, Əliyyi-Əkbərə!
Qan içində, təşnələb, üryan bu nazipərvərə,
Sən necə tab eyləyürsən zəxmi-tiğü xəncərə,
Qoy gedüm mən natəvan, sən Kərbəla damadisən.

Saqiba, qıl novhə daim, şəm`tək yan Qasimə,
Gey libasi-matəmin, qan ağla hər an Qasimə,
Yansun aləm, olmasa illərlə giryan Qasimə,
Bu sözi de, qıl fəğan: sən Kərbəla damadisən.

* * *

Əl çək bu Hüseyndən, ona qiymət nə bilürsən?
Bədbəxt, həya eylə, həqiqət nə bilürsən?!

Bir şəxsə atursan əlüvi, əl ona yetməz,
Hər naşi onun zərreyicə qədrini bilməz,
Başdan-əyağə boş sözün heç bir yerə dəgməz,
Bica özüvə vermə əziyyət, nə bilürsən.

Sən bir kəsi təhqir eləyürsən, evi bərbad!
Aləmlər anun vasitəsilə olub iycad,
Kimsən, hələ mə`lum degül səndəki bünyad,
Nakəs, bir utan, izzətü hörmət nə bilürsən?

Hardan biləcəksən bu Hüseyn(ə), ol şəhi-ətşan,
Neyçün eləyüb canını min şövq ilə qurban,
Öz həddüvi tani, gəl, bu qədər eyləmə tüğyan,
Kimdür bu Hüseyn(ə), kimlərə nisbət, nə bilürsən?

Bir şəxsün ola cəddi Mühəmməd(s) – şəhi-lövlak,
Təhqir dilin açmaq olurmı ona, napak?!
Sayə bu şəhün misli içün salmayub əflak,
Kimdür bu cəhan əhlinə hüccət, nə bilürsən?
Zatun səni qoymaz biləsən yaxşı-yəmani,
Yaxşı görəcəksən pisi, ey nəsli filani!
Tərk eyləmisən Şimr kimi şərmü həyani,
Yox səndə əsər zərrəcə iffət, nə bilürsən.

Bir kəs ki, anun dayəsi Cəbrili-Əmindür,
Aləmlərə yol göstərən, həm əhli-yəqindür,

Ətvari, sözi, tinəti ayati-mübindür,
Bihörmət edərsən onı, hörmət nə bilürsən?

Bir kimsə ki məzlum ola, həm qanına qəltan,
Topraqlarun üstündə verə canını ətşan,
"Ləbbeyk" deyə, Həqqə ola şövqilə qurban,
Həqqin itirənsən, Həqə xidmət nə bilürsən?

Kim razı olar əhli-əyali gedə Şamə?
Atlar qabağında, başaçuq, bəsteyi-damə,
İrad eləyürsən, bu təəccübdür, imamə,
Kül başuva, bədbəxt, həmiyyət nə bilürsən?

Xidmət edəsən Həqqə, belə səndə hünər yox,
Səndə kişilikdən, görürəm, hiç əsər yox,
Qanun dəgişüb, aç gözüvi, əsl pədər yox,
Nütföndə kim ilə dutub ülfət nə bilürsən?

Xəffaş qaçır, tab eləməz Şəmsü Zühadən,
Sən qədri-Hüseyni nə bilürsən boş həvadən,
Peyğəmbərdən şərm yoxun, xovfi-Xudadən,
Avarəsən hər yerdə, təriqət nə bilürsən?

Eyvay sənün haluva, ey batini məğlub!
Eyb eyləmə, kim gördi Hüseyndə, hanı mə`yub?
Qalmış sənə ol Şimrü Yəziddən belə üslub,
Mövhumdür, əhkami-şəriət nə bilürsən?

Kim razı olar başı keçə növki-cidayə?*
Başsız bədəni, təşnə cigər düşsün arayə,
Övladi giriftar ola zənciri-bəlayə,
Yetdi ona neyçün bu müsibət, nə bilürsən?

Qan ağlayuram can nə qədr var, Hüseynə,
Canım ola qurban, əzadari-Hüseynə,

Səcdə edərəm türbəti-zəvvari-Hüseynə,
Saqib kimi həqqə elə rəğbət, nə bilürsən.

* * *

Fatimə qızlarını xar, gəlün, eyləməyün,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

---
* Misra təkrardır

Seyltək xuni-şəhi-Kərbübəlani tökdüz,
Səhl sanmun, yerə kim, xuni-Xudani tökdüz,
Kufəyə qolları bağlu üsərani tökdüz,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bağladuz abi-Fərati şəhi-məhşər yüzinə,
Baxacaqsuz necə məhşərdə Peyəmbər yüzinə?
Qoymaduz ali-Əli ta sala mə`cər yüzinə,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Zeynəbəm, Fatimə arami, atam şiri-Xuda,
Anam açmışdı başın, çıxmadı gün, qıldı həya,
Görmüsüz at qabağında ki, gedəm Şamə, rəva,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Nə rəva ali-Rəsuli belə xar eyləmisüz?
Başaçuq, təşnəcigər, naqəsəvar eyləmisüz,
Şamə getməgligə zəncirə düçar eyləmisüz,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bir tərəf nalə çəkər, Zeynəb edər ahü fəğan,
Eyləmiş ah, Hüseyn firqəti qəddini kəman,
O qədr nalə edüb, didələrin dutmış qan,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bir tərəf Əkbər içün çaki-giriban etmiş,
Ümmi-Leyla ağaran zülfini əfşan etmiş,
Göz yaşın kəştiyi-Nuhə, bəli, tufan etmiş,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Sitəmüzdən solub axırda, görün, din çəməni,
Tapşırıbdur süzə guya ki, Rəsuli-mədəni,
Başaçuq gəzdirəsüz qızların hər əncüməni,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bir tərəf Qasim anası salub afaqə şərər,
Atəşin ah ilə gözdən tökər ol xuni-cigər,
Səngdillər, süzə ol ahü fəğan etməz əsər,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Kərbəla dəştini kim, qan ilə əlvan elədüz,
Xaneyi-dini yıxub, yetmiş iki qan elədüz,

Novərusun yüzini sil ilə viran elədüz,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bir tərəf başaçuq ağlar bu güni qarə ərus,
Əşki-al içrə olub qərq, güni qarə ərus,
Qolları bağlu düşüb çöllərə avarə ərus,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Bu qədər zülmi edər ümməti-Peyğəmbər olan?
Eyləməz bir belə cövri, sitəmi kafər olan,
Siliyi-Şimrə nə hacət belə kim, müztər olan,
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

Saqiba, ağla Hüseyn halinə hər şamü səhər,
Qərqi-dəryayi-günəh olduğuva, eylə nəzər,
İmdi də Şamdə Zeynəb bu fəğani eylər:
Başaçuq daxili-bazar, gəlün, eyləməyün.

* * *

Fəryad, qalar yerdə məgər qanı Hüseynün?!
Bir gün olur əlbəttə, bu divanı Hüseynün!

Doldurdı cəhani sitəmi ali-Ziyadun,
Zəncirə çəkilmişdi qolı Zeynəlibadun,
Ey şiə, gərək od duta bilmərrə nihadun,
Yetmiş fələkə naləvü əfğanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir qani töküb Şimri-cəfapişəvü kafər,
Bir qətrəsinün qiyməti olmaz yerü göglər,
Sədparə bədən, isti qum üstə təni-bisər,
Həsrət suya qaldı ləbi-ətşanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir şəxs ola arami-dili-Xətmi-nübüvvət,
Qur`anda ona ad qoyulub, "ayeyi-rəhmət",
Başi dolana növki-cidadə çəkə zillət,
Qanə dönə su, çıxdı susuz canı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir şəxs ola hüccət, səbəbi-xilqəti-aləm,
Sərmayeyi-dinü xələfi-həzrəti-Xatəm,
Cisminə vurallar onun ox, nizə dəmadəm,

Dəfn olmaya qalsun, təni-üryanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir şəxsə verə tərbiyəti Əhmədi-Məhmud(s),
Atlar əyağ altında edərlər onı nabud,
Yansun elə dil olmaya bu halə qəmalud,
Çıxsun elə göz, olmaya giryanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir ləb ki, lüabi ləbi-Peyğəmbəri ənmiş,
Bir can ki, onı İzədü Cəbbar bəgənmiş,
Tə`ziminə kərrat ilə gögdən yerə enmiş,
Cəbrili-Əmin idi nigəhbanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Bir ləb ki, öpərdi onı naz ilə Peyəmbər,
Bir tən ki, onı bəslər idi naz ilə Heydər,
Ya Rəbb, nə rəvadur qala qan içrə mükəddər,
Yaquti-ləbi, gövhəri-dəndanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Qan ağla gözüm, hər nəfəs, hər an bu Hüseynə!
Pərvanə kimi, ey cigərim, yan bu Hüseynə!
Tez dur, olasan şövq ilə qurban bu Hüseynə!
Keçdi qəmü ənduh ilə dövranı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

Saqib, elə fəryadü fəğan sübhü məsadə
Ətfali-Hüseynə, gör, nə çəkübKərbübəladə,
Sərmayə ola bəlkə sana ruzi-cəzadə,
Göz yaşidü, şəkk eyləmə dərmanı Hüseynün,
Bir gün olur əlbəttə, bu divanı Hüseynün.

* * *

Ya Hüseyn, canıni ey şövq ilə qurban eləyən
Həq yolında, bütün aləmləri heyran eləyən.
Hansı aşiq eləyüb canıni cananə fəda
Şövq ilə, sən kimi yoxdur hanı iqlimi-səfa,
Başı daldan kəsilə zülm ilə, kim gördi rəva,
Nizəyə başı vırulsun, hanı, kim oldı riza.

Ya Hüseyn, canıni ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Sən ilə fəxr eləyər həşr güni Xətmi-nəbi,
Necə tərk etmək olur sən kimi alinəsəbi,
Sənisən xilqəti-bu aləmü adəm səbəbi,
Edən inkar sənün həqqüvi, yoxdur ədəbi.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Bir oğul eyləmisən həqq yolunda qurban,
Yanar əhvalına həşrə kimi pirü cəvan,
Sərvqəd, xalü xəti fitneyi-aşubi-cəhan,
Qaş kəman, türreyi-pürpiçidü ənbərəfşan.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Xətm idi hüsndə tərk eyləmisən, eylə oğul,
Etmək olmaz elədün sən, qalub heyrətdə üqul,
Ki şücaətdə Əli, surəti həm şibhi-Rəsul,
Olmaz idi, elə məhparədü, Yusif ona qul.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Necə tab eylədi Leyla o gün, ey təşnəcigər,
Qanə qərq oldı oğul, etmək olar tab məgər?
Qanə qərq olmış idi gün qabağında bisər,
Baş-başa çatmış idi gül boyunda xəncər.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Fərd

Kim rizadur sən kimi düşsün əyalı dərbədər,
At qabağında piyadə, sərbürəhnə, didə tər,
Şəhrdən-şəhrə, sənün tək bu cəfayə kim dözər?
Sinə açsun oxlara, şirin candan kim keçər?

Fərd

Gər desəm həqqün özi bu aləmə heyrandür,
Hər kimün insafı olsa, sölərnəz nöqsandür,

Beylə canəfşanlıq etməklik məgər asandür?
Ağla qan, ey göz, qan ağla, əqllər heyrandür.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

Saqiba, səbr elə, çox etməgilən ahü fəğan
Gecə-gündüz, tapulur dərdüvə bir gün dərman,
Məqsədə nail olarsan, belə keçməz dövran,
Xabi-qəflətdən ayıl, müşkilün olsun asan.

Ya Hüseyn, canını ey şövq ilə qurban eləyən,
Həq yolında bütün aləmləri heyran eləyən.

* * *

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Canə yetdük dəxi, ey Kərbübəla sultani,
Zülmdən sərhədi yox, fitnə dutub dünyani,
Ta bekey səbr eləyək, olmıyacaq payani,
Heç belə aləm olar həq yolunun qurbani?

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Vəhşilik bir yerə yetmiş əməli-Adəmdən,
Tərk olub rəhmü mürüvvət gedəsi aləmdən,
Bir də bu dərdə əlac olmayacaq mərhəmdən,
Sən kimi söndürən olmaz bu odı sinəmdən.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Ahü əfsus edirəm zəhmətüvə şamü səhər,
Qədrini bilmədilər, ey şəhi-ruzi-məhşər,
Etmədi zərreyicə aləmi-İslamə əsər,
Kinədür başdan-əyağə hamı sərfitneyi-şər.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Səhvimiz var, edərük Şimrü Yəzidə lə`nət,

Özlərinə genə Qur`anı bilürdi hüccət,
Xəlqə bir az də gər olseydi edirdi hörmət,
Xəlq namusinə heç eyləməyüblər rəğbət.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Bizim həməsr müsəlmanlarun imanına bax,
Əl aturlar güc ilə ismətə, vicdanına bax,
Böylə adət yox idi Şimrdə, ərkanına bax,
Bularun hər nəfəs, hər anidə talanına bax.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Hərcü mərc aləmi dutmış, gedüb əldən iman,
Nə ki iman gedüb, bəlkə gedübdür Qur`an,
Ata öz oğlına rəhm eyləməyüb verməz əman,
Su yerinə gecə-gündüz, əcəba, içdigi qan.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Demədi Şimrəm, dəxi hökmi-şəriət yoxdur,
Hamı mövhumdür Qur`an, həqiqət yoxdur,
Biz müsəlmanlar tək sahibi-xilqət yoxdur,
Nə edərsən elə, nə eybi var, iffət yoxdur.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Demədi Şimr yəlandur, nə həlalü nə həram,
Nə kəsir əqlün onı eylə, nə hacətdür imam,
Din gərək məhv ola aləmdə, qala bir qurı nam,
Beydəği-küfr gərəkdür duta dünyanı təmam.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Sədəqə, ey sərvəri-lövlaki-rəsuli-mədəni,
Vəsf edüm qələm ilə, nə lisan ilə səni,
Xəbərin sən bu günün vermiş idün bu vətəni
Beydəği-küfr dutar, olmaz onun qəm çəkəni.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Görürəm imdi həman və`də yetüb sür`ət ilən,
Aləmün vəqti keçər nalə ilən, möhnət ilən,
Zülmdən cövrü cəfadən yaramaz bid`ət ilən,
İşi yox çoxlarınun zərreyicə qeyrət ilən.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Şimr məhşərdə xəcalətdən olar azadə,
Ya Hüseyn, Şimri dəxi salmayacaqsan yadə,
Qəbrdən çıx, nəzər et, gör nə olur dünyadə,
Dinü namusü şəriət hamı getmiş badə.

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

Saqiba, dut bu Hüseyn matəmini, eylə fəğan,
Ney kimi, vır başuva, ağlagilən ruzü şəban,
İstəsön həşr güni dərdüvə olsun dərman,
Söləsün bu sözi hərdəm sən ilə pirü cəvan:

Ya Hüseyn, imdi sana çarə qalub aləmdə,
Çarə qıl, çarə, qalaq biz nə qədr bu qəmdə.

* * *

Getsə hər kim sidq ilə bir dəm Hüseynün yasinə,
Zərrəcə dəgməz cəhənnəm atəşi ə`zasinə.

Lalə kimi xuni-dil etmək gərək gözdən səbil,
Ol şəhi-zibhül-qəfa min zülm ilən olmuş qətil,
Bu şəhidi-kəmsipahə olmasa hər kim dəxil,
Olmasun ümmidvar ol cənnətül-mə`vasinə.

Arif ol əvvəl İmamun həqqinə, dut matəmin,
Olmasan, bica yerə zəhmət çəkərsən, qıl yəqin,
Böylə fərmayiş edibdür kim, Əmirəlmö`minin,
Baxsun hər inkar edən kəs ol şəhün fitvasinə.

Ta İmami bilməsön fərmandə cinnü bəşər,

"Va Hüseyna" sölǝmǝk vermǝz sǝnǝ hǝrgiz sǝmǝr,
Get, Hüseyn(ǝ) tǝk arif ol hǝqqün sözinǝ, müxtǝsǝr,
Gör, necǝ qılmış itaǝt can ilǝn mövlasinǝ.

Arif olseydi İmamun hǝqqinǝ gǝr Şimri-dun,
Kǝsmǝz idi başıni, hǝm etmǝz idi qǝrqi-xun,
Ah, oleydi çǝrxi-nöh ǝflak birdǝn sǝrnigun,
Dǝgmiyeydi zǝxmi-nizǝ zǝrrǝcǝ ǝ`zasinǝ.

Ey bilǝn arif özün, qıl bir hǝya Qur`andǝn,
Sǝndǝ hǝrgiz zǝrrǝcǝ yoxdur ǝsǝr imandǝn,
Aç bǝsirǝt gözlǝrün, ǝl çǝk belǝ böhtandǝn,
Qǝrqsǝn, ey bixǝbǝr, nadanlığun dǝryasinǝ.

Sǝn haçan keçdün kǝsik dırnağdǝn, bir muydǝn?
Hǝqq yolunda dǝm urursan cǝnnǝt ilǝ hurdǝn,
Xoş gǝlür dǝ`va, mǝsǝl vardur, deyüblǝr durdǝn,
Ǝhli-cǝnnǝt kimdü, get, bax Kǝrbǝla Minasinǝ!

İmtǝhandan sǝn haçan çıxdun, ǝzizim, can ilǝn?
Çıxmamış, dǝm urma hǝrgiz din ilǝn, Qur`an ilǝn,
Sǝn haçan durdun, oturdun bir zǝman insan ilǝn?
Pǝs, qulaq vermǝ bu xǝlqün söhbǝti-bicasinǝ.

Şǝrti var, ǝvvǝl gǝrǝk bilmǝk ki, kimdür İmam,
Sonra dutsun yüz İmamǝ, istǝsün ondan mǝram,
Ayeyi-Qur`anǝ baxson, göstǝrür bir-bir tǝmam,
Kǝşf olur, ya sureyi-"Taha"yǝ bax, ya "Yasin"inǝ!

Ǝmri-Hǝqqün arifi yüz min bǝla çǝksün gǝrǝk,
Olmasun asudǝ bir ani, bǝla çǝksün gǝrǝk,
Aşina cövrin dǝmadǝm aşina çǝksün gǝrǝk,
Var ǝlindǝ hǝr nǝ keçsün, baxmasun dünyasinǝ.

Birsi verdi millǝtǝ qurban Ǝliyyi-Ǝkbǝri,
Birsi ǝldǝ toy hǝnasi, Qasimi-mǝhpeykǝri,

Eylǝdi tir ilǝ sirab, ol Ǝliyyi-Ǝsğǝri,
Hǝrmǝlǝ getdi o tifli-müztǝrün dǝ`vasinǝ.

Cǝnnǝtǝ layiq görüm, sǝnsǝn Hüseyni-Kǝrbǝla,
Canıni hǝqqin yolunda şövq ilǝ qılmış fǝda,
Sǝndǝ iman hanı, hǝrgiz qılmısanmı[*] bir hǝya?

[*] Qılmazsanmı

Sən kimə fəxr eyləyürsən, o edər Əbbasinə.

Kim keçər Əkbər kimi bir dilbəri-dildardən,
Xətmi-peyğəmbər şəbihi, ayinə rüxsardən,
Həm şücaətdə əzizi-Heydəri-Kərrardən,
Səbrə bax, kimdür təəccüb etməsün Leylasinə.

Kim gedər Şamə piyadə dəstgirü dilfikar,
At qabağında bərəhnə, əşkbarü dağdar,
Sinədə daği-oğul, qan ağlasun leylün-nəhar,
Ağlayur aləm onun hər an ahü vasinə.

Ağla öz əhvaluva, kimdür deyən insan sənə,
Çöllərün heyvani nifrət eyləyür hər an sənə,
Əhli-Qur`anəm demə, lə`nət edür Qur`an sənə,
Sən haçan qail olubsan məhşərün bərpasinə?!

Saqiba, imanə gəl, biganəlikdən əl gətür,
Əqlivi yığ başuva, divanəlikdən əl gətür,
Xabi-qəflətdən ayıl, məstanəlikdən əl gətür,
Gözlərindən qan damar, kim baxsa kəc mövlasinə!

* * *

Kim razı olar başi keçə növki-cidayə?
Dözmək degül asan bu qədər cövrü cəfayə.

Sədparə Hüseyn tək kəsilə başı qəfadən,
Keçdi nə içün Əkbəri-xurşidliqadən?
Düşdün sən haçan başə ki, sirri-şühədadən?
Dil tə`nəsini hərdəm açursan şühədayə.

Ey münkiri-övladi-Əli, ey evi viran!
Qorx həşr odından, eləmə bir belə tüğyan,
Dan həqqi, hələ vəqt veribdür sənə dövran,
Töhmət elə kürsilərün üstə üləmayə.

Sən bilməyəcəksən şərəfi-qiyməti-dini,
Get, eyləgilən məsxərə Qur`ani-mübini,
İç qanıni, öldür nə ki var, əhli-yəqini,
Səcdə gedüb et, xaki-dəri-Şimri-dəğayə.

Qoy, mən bu Hüseyn ilə olum həşrdə məşhur,
Sən Şimri-dəğayə gedüb ol tabe`vü muzdur,

İblis qaçar, kim oxusa ayeyi-“Vənnur”*,
Bu cəhlə əsər eyləmədi mö`cizə ayə.

Fərqün var Hüseyn ilə sənün, et onı bavər,
Bir-bir edərəm kəşf sənə, olma mükəddər,
Sən nütfeyi-şeytanisən, ol nəsli-Peyəmbər,
Kim fəxr eləsün, sölə görüm, şahə, gədayə.

Əlbəttə gərək fəxr edə ol qanına qəltan,
Cinnə, mələkə, cümlə bəni-Adəmə hər an,
Həqqin bu Hüseynün tanımaqlıq degül asan,
Qiymət qoyasan xəlqə, hanı səndə o mayə?!

Xəlqə, özüvə boş yerə, gəl, vermə əziyyət,
Bica yerə əfsanə sözi eyləmə söhbət,
Yıxmış öyüvi, mən bilürəm kibrü məniyyət,
Çox meyl eləyürsən görürəm çunü çərayə.

Etdi təmə`i-səltənəti şahi-Mədinə,
Sən eylə bilürsən, utan, ey məbdə`i-kinə!
Nisbət bu sözi veməgilən əhli-yəqinə,
Salma özüvi nəfsə uyub dami-bəlayə.

Böhtan Hüseynə eləmə, ey yüzi qarə!
Bu sözlər ilə olmayacaq dərdüvə çarə,
Tab eyləməsən*, din evinə urma şərarə,
Məhşərdə gəlür bu dedigün sözlər arayə.

Tuf səltənətə, padşəhi-taci-Kəyanə!
Qərq eylədi aləmləri bica yerə qanə,
Beşgünlik içün rəhm eləmüb pirü cəvanə,
Şahü şəhlik zərrəcə salmış kimə sayə?

Məqsudi-Hüseyn etmək idi həqqdən agah
Xəlqi, nə ki o olmuş idi sən kimi gümrah,
Olma bu qədər dini-Rəsulullahə bədxah,
Tab eyləməsən dərdi-səri-ruzi-cəzayə.

Tərk olmuş idi imdikitək əmri-şəriət,
Dinsizligə etmişdi xəlayiq hamı rəğbət,
İtmişdi aradən bütün asari-həqiqət,
Yoxdı baş əgən əmri-Həqə, hökmi-Xudayə.

---

Qurani-kərimin “Ənam” surəsinin 1-ci ayəsi nəzərdə tutulur.

* Eyləməzsən

Səntək özüni satmadı dinari-Yəzidə,
Meyl etmədi ən`ami-sitəmkari-Yəzidə,
Eyb eyləməz hərgiz, gedüb ol yar Yəzidə!
Mə`lumdür aləmlərə kimdür sana dayə.

Qoymaz səni zatun olasan yari Hüseynün,
Saqib kimi hər anidə xunbari Hüseynün,
Canun alacaq, vardu həvadari Hüseynün,
Bir vəqt olu, ahun çıxacaq yeddi səmayə.

* * *

Vəqt oldı yetişdi şəhi-din Kərbübəlayə,
Ərşü fələkü cinnü bəşər batdı qərayə.

Düş yaxşı-yəmani başa, et naləvü fəryad
Əhvali-Hüseynə, səni eylər, bəli, azad,
Hər dərdü bəladən sənə Həqq eyləyər imdad,
Nail olusan* mərhəməti-lütfi-Xudayə.

Heyrətdə qalub aləmi-lahut sərasər,
Qan-yaş tökübdür yüzinə Zeynəbi-müztər,
Fəryadə gəlüb ney kimi, baş açdı Peyəmbər,
Əlbəttə ki, ağlar qəmi-dərdi-üsərayə.

Batin gözini açgilən, ey əhli-əzadar,
Çərxi-fələkün gərdişi etdi nələr izhar,
Övladi-Əlini elədi Şimrə giriftar,
Heyrətdə qalub əql ki, təqdiri-qəzayə.

Nadanlıq ilə dutma əza Şahi-şəhidə,
Kəsb eyləgilən mə`rifəti, uyma Yəzidə,
Həqqün sözini al qulağa, olma rəmidə,
Aldanmagilən, əslə yapuş, uyma həvayə.

Düşmən sözinə baxma, alar dinüvi əldən,
Eylə həzər, avarə qalursan pis əməldən,
Aldanma həvavü həvəsə, keç bu məhəldən,
Olmaz sənə çarə, başuvi salma bəlayə.

Hər kim bu Hüseyndən çəkə əl, Xətmi-nübüvvət
Hər ani-nəfəsdə edəcəkdür ona lə`nət,

* Olarsan

Hər bir yetənün vəsvəsəsin eyləmə sibqət,
Qatma özüvi, eylə həzər, Şimri-dəğayə.

Əvvəl ədəbi kəsb elə, dut matəm Hüseynə,
Gər istəsön olmaqlığa sən məhrəm Hüseynə,
Biməʿrifət olson, verəcəksən qəm Hüseynə,
Sərf etməgilən ömrüvi həm çunü çərayə.

Qanson nə içün kim, bu Hüseyn ol şəhi-ətşan,
Əkbər kimi övladı verüb şövq ilə qurban,
Kəsdi başıni təşnəcigər Şimri-bədərkan,
Keçdi nə içün başi anun növki-cidayə.

Min il edəsən naləni, min il də ibadət,
Yüz minlər ilə eyləyəsən Kəʿbə ziyarət,
Verməzlə sənə heç nə, əbəs çəkmə əziyyət,
Məşğul özüvi etməgilən zikri-duayə.

Söz yox ona müzdün olacaq ruzi-cəzadə,
Şərtini bil, et naləni, hər sübhü məsadə,
Nadanlığı tərk eyləgilən, etmə iradə,
Tab eyləməsən* məʿrəkeyi-ruzi-cəzayə.

Pak olmasa nütfə, olur əlbəttə ki, düşmən
Şahi-şühədayə, heç özümdən demirəm mən,
Urma başuva boş yerə, get, eyləmə şivən,
Peyğəmbəri-əkrəm buyurub şahü gədayə.

Ey qanına qəltan olan, ey mahi-Mədinə,
Bir dəm nəzər et, rəxnə düşüb dini-mübinə,
Zülmün odunı gör, yetişüb ərşi-bərinə,
Canım ola qurban sana, dur, gəl bir hərayə.

Saqib sana novhə edər hər mahi-mühərrəm,
Məhşər güni bax halinə, rəhm et ona bir dəm,

Ağlar sana hər an əzadar ilə bahəm,
Ney kimi gəlüb sübhü məsa ahü nəvayə.

* * *

Şiələr, kim bu Hüseyn(ə) qətlinə fərman elədi?
Kafər etməz belə fərmani, müsəlman elədi!

---

* Eyləməzsən

"Lailahə" desə hər kimsə müsəlmanmı olur?
Qurı bir boş söz ilə tabe`i-Qur`anmı olur?
Hər yetən, aç gözüvi, Buzərü Səlmanmı olur?
Çoxlar öz dinini tərk eylədi, üsyan elədi.

"Lailahə" deməgün şərtini bilseydi əgər,
Tökməz idi bu Hüseyn(ə) qanını, etməzdi "hünər",
Şimri-bişərmü həya, qıl bu sözə yaxşı nəzər,
Təmə`i-mülki-Reyə dinini nisyan elədi.

Əhli-iman özüvi bilməgilən, böhtandur,
Şahidim qövli-Nəbi(s), hər sözi bir Qur`andur,
İmtəhan olmamısan, rahbərün şeytandur,
Tabe`i-nəfs səni, tabe`i-şeytan elədi.

Rütbəsini bil İmamun, ona get, eylə fəğan,
Sən İmamun sözini, sölə, qəbul etdün haçan?
"Va Hüseyna" dedigün ari yalandur ki, yalan,
Sənün hər bir nəfəsün xəlqi hərasan elədi.

Cəm` olundı üləmayi-bəlqdi-Kufəvü Şam,
Əldə təsbih ilə səccadəvü Qur`ani-kiram,
Qalmasun nəsli-Əlidən(ə) nə rəisü nə imam,
Ümməti-Xətmi-nübüvvət belə e`lan elədi.

Satdılar dini Yəzidə, ola dilşad Yəzid,
Eyləyə din evini zülm ilə bərbad Yəzid,
Qoya aləmdə öziyçün belə bir ad Yəzid,
Kərbəladə deyələr: yetmiş iki qan elədi.

Xahişi-nəfs elədi çoxları rüsvayi-cəhan,
Yetməyibdür genə məqsudə, qalub sərgərdan,
Bir həqiqət alayun bu sözi, ey pirü cəvan!
Mülki-Rey fikri içün Şimr nə tüğyan elədi.

Yadına salmadı bir həzrəti-Xeyrülbəşəri,
Didəgiryan elədi Zeynəbi-xunincigəri,
Kufəvü Şamə piyadə çəküb ol dərbədəri,
Etdigi zülminə aləmləri heyran elədi.

Beş günün səltənətün fikri İmam öldürdi,
Etmədi şərmü həya, fəxri-ənam öldürdi,

Bilmədi, tökdi Hüseyn(ə) qanın həram, öldürdi,
Xətmi-peyğəmbəri ağlatdı, pərişan elədi.

Şimri-dun həmnəfəsi, eylər sənə lə`nət Nəmrud,
Etmədi bu sitəmi gəbrü nəsaravü yəhud,
Parə-parə elədün, qalmadı asari-vücud
Bu Hüseyndə, nə cəfa zülmi-firavan elədi.

Xəlqi irşad eləyürdi Həqə, həm Qur`anə,
Çağırırdı səni Qur`an sözilən imanə,
Sən kimi meyl eləmüb vəsvəseyi-şeytanə,
Nə günah eylədi, nahəq yerə nə qan elədi?!

Səbəbi-xilqəti-aləm bu Hüseyndür, bu Hüseyn(ə)!
Şərəfi-həzrəti-Xatəm bu Hüseyndür, bu Hüseyn(ə)!
Bargahi-Həqə məhrəm bu Hüseyndür, bu Hüseyn(ə)!
Şimri-dun kəsdi başın, qanına qəltan elədi.

Lə`nət olsun sənə, ey düşməni-övladi-Rəsul!
Şieyi-ali-Əlini bu qədər etmə məlul,
Nütfəsi pak eləyər cəddi nəsə dini qəbul,
Səni məğrur bu bədgərdişi-dövran elədi.

Saqiba, ağla Hüseyn(ə) halinə hər sübhü məsa,
Bir Hüseyn(ə) nokərinə canuvi, get, eylə fəda,
Zərrəcə ta ola sərmayə sənə ruzi-cəza,
Bir də gördün ki, sənün dərdüvə dərman elədi.

* * *

Eşqün eylüb[*] məni bimar, Əli, ya vələdi,
Yox dəxi taqəti-rəftar, Əli, ya vələdi.

Vəslüvi əldən alub göz yaşımi qan eləmə,
Salma gözdən məni, bu könlimi viran eləmə,

Nari-firqətlə, oğul, sinəmi suzan eləmə,
Etmə bu didəmi xunbar, Əli, ya vələdi.

Çəkmişəm illər ilə zəhmətün, ey kani-vəfa,
Damənündən əlimi rəhm elə, gəl, etmə rəha,
Düşsün avarə anon çöllərə, gəl, görmə rəva,
Olmayum aləmara xar, Əli, ya vələdi.

---
[*] Eyləyib

Salma avarə məni kuhü biyabanə, oğul,
Yetmişəm, ahü fəğan etməgilə canə, oğul,
Yanmışam nari-fəraqunda çü pərvanə, oğul,
Bir zəman ol mənə qəmxar, Əli, ya vələdi.

Xanimanım dağılub, könlüm evin etmə xərab,
Qoymayub məndə xəyalun əsəri-taqətü tab,
Qıl təkəllüm bu sitəmdidə ilən, eylə səvab,
Eyləyüm dərdimi izhar, Əli, ya vələdi.

Getmə meydanə, oğul, Şimri-dəğadən, həzər et,
Tərk qıl rəzmi, o bişərmü həyadən, həzər et,
Xeymələrdən ucalan şurü nəvadən, həzər et,
Ey şəbihi-şəhi-əbrar, Əli, ya vələdi.

Mətləbim vardı, oğul, mən səni damad eləyüm,
Toy dutum mən sənə, aləmlər ara ad eləyüm,
Zülfüvə şanə uram, könlimi bir şad eləyüm,
Olmayum Şimrə giriftar, Əli, ya vələdi.

Mən necə razi olam azimi-meydan edəsən,
Səbrimi əldən alub, göz yaşımi qan edəsən,
Kakilün laləsifət qan ilə əlvan edəsən,
Varisi-Heydəri-Kərrar, Əli, ya vələdi.

Qoyma düşmənlər əlində məni badideyi-tər,
Sədri-sinəmdə qəmün şö`lələnür misli-şərər,
Bir zəman halimə, qurbanun olum, eylə nəzər,
Qalmaya həşrdə didar, Əli, ya vələdi.

Saqiba, novhəgər ol, ur başa, qan ağla müdam,
Yüz çevir qəbri-Əli Əkbərə, qıl ərzi-səlam,
Şurə gəl ney kimi, yan, ağlagilən sübh ilə şam,
De dilimcə ona əsrar, Əli, ya vələdi.

* * *

Şahi-din düşmişdi, yaran, bisər aşura güni,
Aşikar olmışdı guya məhşər aşura güni.

Qan içində qərq idi ol nuri-çeşmi-Müstəfa(s),
Ox, ox üstə cismdə arami-qəlbi-Mürtəza(ə),
Gün qabağında yaralu zadeyi-Xeyrünnisa(ə),
Olmadı viran niyə, aləmlər aşura güni.

Şiələr, qurban kəsə hər kim, verür qurbanə su,
Olsa kim ətşan əgər, kafər verür ətşanə su,
Vermədi Şimri-lə`in, ol təşnələb qurbanə su,
Kəsdi başın təşnələb, ol kafər aşura güni.

Tiği-zəhralud ilən başın qılub təndən cüda,
Yendi zərbətlə qəfadən zülmilən ol bihəya,
Urdı başə Cəbrəil, qan ağladı kim masiva,
Çak qıldı sinəsin Peyğəmbər aşura güni.

Urmış idi cisminə dörd min yaranı qövmi-dun,
Ol İmami-mütləqi qərq etdilər dəryayi-xun,
Kaş, nöh əflak oleydi ol zəmandə vajegun,
Fərş oleydi yerlərə bu göglər aşura güni.

Ruzi-aşuradə, ya Rəbb, yox oleydi ruzigar,
Bu fəna afaqdə ali-Əlini(ə) qıldı xar,
Ali-Peyğəmbər cəlalın etdi, billah, tarmar,
Od duteydi kaş kim, nöh kişvər aşura güni.

Bilmirəm, ya Rəb, o gün nöş olmadı aləm xərab?
"Su" deyüb ali-Əli, yandı susuzdan çün kəbab,
Yandılar suzi-ətəşdən, kaş oleydi zəhr ab,
İçdi su tiri-ədudən, Əsğər aşura güni.

Qıldılar Əbbasinün çün qolların təndən qələm,
Su kənarində nə zülm ilən o qövmi-bədşiyəm,
Qılmayub Şəddad aləmdə bu növ` ilə sitəm,
Baş açub kim, ağladı qan Heydər aşura güni.

Yıxmış idi qövmi-dun qan içrə şibhi-Əhmədi,
Ola səndən sora kim, ol şahi-məzluman dedi:
Ey oğul, viran bu aləmdə əfakə, sölədi,
Qanuva qəltan edüb düşmənlər aşura güni.

Daği-Qasim eyləmiş ələmlərün qəddin düta,
Toy otağını edüb viranə qövmi-əşqiya,
Əllərinə yaxdular min zülm ilə qandan həna,
Kərbəla toprağı oldı bəstər aşura güni.

Nə səfa göstərdün, ey dövran, bu dövründən utan!
Cövrüvi əbrarə qıldun, kinüvi etdün bəyan,

Çəkdilər zəncirə Ali-Əlini qövmi-kufəyan,
Qıldılar Şamə rəvan, bimə`cər aşura güni.

Saqiba, qıl novhə, qan ağla bu matəmdə müdam,
Dut əzasını Hüseynün, qafil olma sübhü şam,
Mayeyi-eyni-şəfaətdür səninçün bu kəlam,
Baş şəfaətçün verüb, ol sərvər aşura güni.

* * *

# Müxtəlif şeirlər

## EŞQ

Məcnunda var idi əsəri-kimyayi-eşq,
Leylanı çəkdi kamə, qılub mübtəlayi-eşq.

Aşiqligün nə oldığını bildirüb ona,
Tikdirdi onda başdan-əyağə yuvayi-eşq.

Məcnunə sölösön ki, həqiqət nədür, deyər,
Yoxdur həqiqət aləmi, əl çək, səvayi-eşq.

Künd etdi kuhkən əbəs həmvarə tişəni
Dağlarda, bilmədi nədü hərgiz rizayi-eşq.

Şirin ləbün sorum deyər idi zəman-zəman,
Uymışdı nəfsinə, yox idi onda payi-eşq.

Dildar surətini çəküb xəlq görməgə,
Məcnun etməz idi belə iddiayi-eşq.

Razi degüldi görməgə Leyla cəmalıni,
Bağladı gözlərini eşitcək nidayi-eşq.

Eşqün həvasinün əsərin görmək istəsön,
Sultani-Kərbəla özin etdi fədayi-eşq.

Tərk etdi varü yox, qoyub heyrətdə aləmi,
Kərbübəlani eylədi matəmsərayi-eşq.

Meydani-eşqə girmədi heç kim Hüseyn(ə) tək,
Can nəqdi əldə, ta ola zibhülqəfayi-eşq.

Sərməşqi-eşqi kəsb elədi bu Hüseyndən(ə),
Məcnun biqədri-qüvvə olub aşinayi-eşq.

Yetməz təmamə həşrəcən eşqün hekayəti,
Axtarma, bilməsən* necədür müntəhayi-eşq.

Mehrabi-eşqə qoydı başın səcdə etməgə,
Fərqi-Əlini(ə) münşəq edüb tiğ vərayi-eşq.

Məqsudə yetdi, öz sözidür, mən də sölərəm,
Gör rütbəsini, dərdinə qıldı dəvayi-eşq.
Eşq aləminə diqqət elə, çox qəribədür,
Gərçi çətin degül deyə kim macərayi-eşq.

Eşqün nə oldığın bilür ol kəs ki, zatinə
Yol yoxdı, hardadur, necədür kim, bənayi-eşq.

* Bilməzsən

Cibril eşq künhinə yenməz min il əgər,
Pər açsa uçmağa genə almaz livayi-eşq.

Eşq, ey dil, ənbiyaləri də salmış heyrətə,
Adəm degülmidi elədi min xətayi-eşq.

Bu yoldan azmayub, bəli, ol Xətmi-ənbiya(s),
Hər kəslə ülfət eyləməyüb rəhnümayi-eşq.

Musa(ə) bileydi rütbeyi-eşqi deyərmidi,
Ey "Rəbbi ərini", bilmidi* yenmiş liqayi-eşq.

Kəm etdi rütbəsini eşit "lən tərani"dən,
Olmazdı nisbət hər kəsə kim, xaki-payi-eşq.

Meyxanə küncinə məni çəkmək məhal idi,
Təsbih ilə apardı məni iqtizayi-eşq.

Təkfir eyləyür məni zahid dönə-dönə,
Yox bakimiz nə eyləsə, yox onda cayi-eşq.

Mehrabı bağladı üzümə cami saqinün,
Döndərdi qiblədən məni bəngi-sədayi-eşq.

Saqib, hənuz yetməmisən əsl məqsədə,
Başunda hanı, zərreyicə yox həvayi-eşq.

## "ƏYAĞUN ALTINA..."

Əyağun altına diqqət göziylə eylə nəzər,
Çox qürur eyləmə, gör, kimdür olub zirü zəbər.

Xabi-qəflətdən ayıl, eyləmə sərkeşligi çox,
Olma eymən fələkün dami səni kamə çəkər.

Gündə həmsayə səni tərk eləyür getmədədür,
Düşmisən* başə genə səndə yox insaf məgər?

Əlüvə toprağı al, öp, qoy iki eyn üstə,
Təxti-Keyxosrovdür, taci-səri-İskəndər.

---

* Bilmirdi
* Düşmürsən

Aparub badi-fəna getdi Süleyman(ə) fələki,
Eylə nabud olubdur dəxi yox ondan əsər.

Qurı bir ism qalub, yoxdur əsər Rüstəmdən,
Düşməyür xatirə göstərdi isə çox da hünər.

Nəfsüvün düşkini olma bu qədr aləmdə,
Ey müsafir, həzər eylə, yetişüb vəqti-səfər.

Çox təəccüb edürəm ol kəsə kim, hər saət,
Bu fəna deyr içün xunabeyi-həsrət də tökər.

Qarə gözlərlə kəman qaşlılarun toprağıdur,
Cam ilə, sağər ilə kim ki, meyi-nabi içər.

Şad olur kim ki, qoyubdu qədəmin dünyayə,
Bilməyür ki, dəxi hər dəmdə könül qanə dönər.

Hədərə ömrüvi sərf etməyəsən olmazmı,
Zərəri var sənə başdan-əyağə, eylə həzər.

Tuşə yox əldə, xətərnak yolı getmə əbəs,
Nə qədr vəqt var əldə hazır eylə, bu vəqt keçər.

Murdən ibrət elə tuşəni cəm` etməkdən,
Qafil etməz özini olsa qiyamət də əgər.

Sana fəryadrəs olmaz əməlündən özgə,
Nəf` verməz sana Peyğəmbər ola ümmü pədər.

Düşmə sövdayi-səri-zülfinə məhparələrün,
Dinü dil tərk eləyərsən, səni divanə edər.

Eşqi-Leyla idi rüsva eləyən Məcnuni,
Eylədi çöllərün avarəsi, həm didəsi tər.

Bisütun dağıni bərbad elədi Şirinçün,
Kuhkən yetmədi məqsudə, vırub tişə hədər.

Gör, Züleyxayə nələr eylədi Yusif eşqi,
Düşdi dildən-dilə, sultanü gəda nifrət edər.

Bir səfər var qabağunda gedəcəksən, dolı get,
Əliboş getmə, yetibdür sana çoxdan bu xəbər.

Hazır ol getməgə, getdi hamı həmrazlərün,
Sana peyğam verür, fikrüvi ver, şamü səhər.

Eyşü işrət sana bir fayidə verməz hərgiz,
Görəcəksən zərərin, eylə yəqin, vəqt yetər.

Aldadur xəlq səni, xəlq ilə həmrəng olma,
Rəngə salmış özini xəlq bütün, rəngi sevər.

Dəxli yoxdur sana, getmə rəvişi-xəlq ilə sən,
Doğrı bilmə, mərəzi-nəfsdür hər kim nə edər.

Gəlməsün xoş sənə, hər kim nə edür, qoy etsün,
Eyləyər, sonra gedüb başı onun daşə dəgər.

Saqiba, etmə təvəqqüf bu cəhan mülkində,
Həmdəmün ahü fəğandur, yedigün xuni-cigər.

**"XƏBƏRDAR OLDI..."**

Xəbərdar oldı çün Məcnuni-xəstə,
Vəfati-Leylidən ol dilşikəstə.

Giriban çak edüb ba ahü nalə,
Kim olsa ney kimi ağlar bu halə.

Pozuldı rövnəqi-bazari-eşqi,
Kəsad oldı düri-şəhvari-eşqi.

Məzari-Leyliyə getdi şitaban,
Məzarın qucmağa baçeşmi-giryan.

Görüb bir kudəki-ayinərüxsar,
Kəməndi-zülfünə Yusif giriftar.

Məlahət kişvərinün padşahi,
Nəzakət bürcinün xurşidü mahi.

Başında taci-nazi-Xosrovani,
Lətafət bağınun sərvi-rəvani.

Töküb rüxsarinə giysuyi-pürçin,
Ki xali-gəndümi qarətgəri-din.

Dedi, ey taqətü tabü təvanım,
Fəda olsun sana bu xəstə canım.

De bircə hardadur Leyli məzari,
Qucam bir dəm məzari-ol nigari.

Fəraqında anun qəddim kəmandur,
Gözümdən seyl tək əşkim rəvandur.

Dedi Məcnuni-zarə ol şəkərləb,
Urursan eşqdən dəm ruz həm şəb.

Hanı heç səndə yox asarı eşqün,
Nədür kim bilmisən miqdarı eşqün.

Əgər olseydi səndə eşqi-kamil,
Bilərdün hardadur ol məhşəmail.

Təriqi-eşqi, get, pərvanədən sor,
Nədür pabəndi-giysu, şanədən sor.

Məzaristanı, get, bir cüstücu qıl,
Ki, hər bir qəbr toprağını bu qıl.

Haçan kim, dərk qıldun buyi-eşqi,
Hər hansı xakdən tapdun təriqi.

Həman toprağdur ol Leyliyi-zar,
Yatubdur naz ilə, gəl, etmə bidar.

O tiği-cansitani-əbrüvani,
Olub xakilə yeksan, sorma hani.

O şəhla gözləri xali-siyahi,
O sərvi-qaməti rüxsari mahi.
O tiri-qəmzeyi-kanun şikafi,
O şirin lə`li-nabi-dürri-safi.

Biri xaki-gili-kuzəgərandur,
Birsi tö`meyi-murü ilandur.

Biri sağər, biri camü piyalə,
Biri heyran qalub yeksər bu halə.

Əcəl camilə kim sərməst olmaz,
Bu qeydi-möhnətə pabəst olmaz.

Keçübdür xoş kimün leylü nəhari?
Cəhanun zərrəcə yox e`tibari.

Əcəb xoş söləmiş niku nigahi,
"Cəhan yeksər nəmiərzəd bə kahi".*

Gedən getdi, gedər, Saqib, gedərsən,
Bu bir peymanədür, sən də içərsən.

## "GƏLDİ CİGƏRİM QANI..."

Gəldi cigərim qanı bu çeşmi-nigərandan,
Asudə haçan bir olaram ahü fəğandan.

Dildar ki, yoxdur nə edim mən bu həyati,
Ey kaş, çıxeydim belə viranə həyatdan.

Əfsanə imiş bu dirilik, heç nəyə dəgməz,
Xeyr ummaq olarmı belə bihudə ziyandan.

Aram haçan bəs olacaq qanə dönən dil,
Ta key ona mən və`də verüm vəslə yalandan.

Kəskin olar hər kim ki, deyüb ahi-səhərlər,
Çox səhv eləmiş kim eşidüb pirü cəvandan.

Tə`sir neçün bəs eləməz ahi-cigərsuz,
Dünya boyanub lalə kimi qırmızı qandan.

Aşub dutub aləmi bəs ahi-cəhansuz
Neyçün səbəbə etməz əsər gəlsə nə yandan.
Kimdür yanan əhvalımıza, bir onı göstər,
Ya ağü qəradən ola ya qeyri nişandan.

Ol gün ki, yaranmış bu cəhan, qan da tökülmiş,
Artmaqdadu hər an bu filandan o filandan.

* Dünya bütünlükdə bir nəcisə də dəyməz (Hafiz Şirazi)

Kə`bə evini kim sana neylər, elə bərbad,
Abad get et, zülm evini sevgili candan.

İsanı boğub dardə, kim söz deyə bildi
Ol düşkini-nəfsə, məgər heç keçdi gümandan?

Mişar ilə başdan-əyağə kim, Zəkəriyya(ə),
Kəsildi qanı keçdi onun seyli-rəvandan.

Kim söz deyə bildi, necə cür`ət də edərdi,
Bir kimsə deyə eyləməyün yaxşı-yəmandan.

Yəhya(ə) başı kəsildi, xəlayiq dedi xoşdur,
Aləm olar asudə dəxi hər həyəcandan.

Əfsus eləyən olmadı Sultani-şəhidə,
Su verdi ona Şimri-dəğa tirü sinandan.

Ey su, sən əgər qanə döneydün, bu rəvadur,
Yad eyləmisən bəs genə bir təşnələbandan.

Kim zibh qəfadən görüm olmış bu cəhanda,
Olsun fələkün iki gözi qarə qazandan.

Ey cəhd eləyən gəlməyə bu deyri-fənayə,
Kim kaminə yetmiş, hanı sultan şəbandan.

Kim gəlsə, yəqin eylə, peşiman olar axır,
Cüz ahü fəğan görməmişəm ruzü şəbandan.

Düşmə fələkün daminə, etməz səni azad,
Mümkin ola bilməz qaça bir kəs səyəlandan.

Qəhbə fələkün şivəsinə uyma, əmandur,
Bir anidə taci-zər alub şahi-Kəyandan.

Məqsəd ələ düşməz deyürəm mən sana, Saqib,
İzhar eləsön xəlqə əgər sirri-nihandan.

## HƏQİQƏT

Dur, saqi, gətür sağəri-səhbayi-həqiqət,
Meydür, məni sərməst elə əczayi-həqiqət.

Meyxanə yolın dutmağa qoymaz məni zahid,

Göstər ona bir cam ilə mə`nayi-həqiqət.

Şirin xəbərin söləmə Məcnunə, eşitməz,
Qoymaz eşidə boş sözi Leylayi-həqiqət.

Fərhad hələ tişə vırar, dağ ilə oynar,
Bilmür nədür aləmdə təqazayi-həqiqət.

Şirin ləbini sormağa daim həvəs etmiş,
Eylər bu təmənnayilə rüsvayi-həqiqət.

Məcnun gözini dutdı, dedi Leyliyə, dur, get,
Yox səndə əsər zərrəcə simayi-həqiqət.

Bir dildə məhəbbət iki hərgiz ola bilməz,
Verdün könül əğyarə, degül rayi-həqiqət.

Dutdınmı xəbər lanələri  tikdi başımda,
Quşlar ki, degülsən hələ, get, tayi-həqiqət.

Ey əhdşikən, uyma rəqibə, demədimmi,
Beylə degül, ey şux, ki fitvayi-həqiqət.

Sən Leylini rüsva elədün Leyli adıylə,
Bu rəng ilə sən eyləmisən xayi-həqiqət.

Naqə səni əğyar evinə çəkdigi gündən,
Aləm deyür hər ləhzə hanı, vay həqiqət.

Dəm vırma vəfadən, xəbərün zərrəcə yoxdur,
Gəzdün sən haçan mən kimi səhrayi-həqiqət.

Fir`on nə qədr açsa əgər dəsti-təərrüz,
Qərq etməgə vardur onı Musayi-həqiqət.

Asanmı məgər rütbeyi-Musalığa yetmək,
Hər kəs ələ salmaz yədi-beyzayi-həqiqət.

Var kimdə təvana gedər eşqün rəvişilən,
Can nəqdi iləndür, bəli, sövdayi-həqiqət.

**"KİM İSTƏYÜR Kİ..."**

Kim istəyür ki, ola yaxşı aqibət məs`ud,
Səbu kimi özini eyləsün şərabalud.

İtirmə vəqtüvi bihudəyə, mey iç, məst ol,
Xümün əyağinə, get düş, olunca ta nabud.

Çox ehtiyat eləmə laübali olmaqdan,
Salub əlinə, de kim, hanı sərhədi-məqsud?

Qəmi-zəmanədən heç kimsə olmayub eymən,
Bəla ilən doludur kim, bu ziri-çərxi-kəbud.

Ayırdı Leylini Məcnundən bu deyri-dəni,
İtirdi nimnəfəsdə Əyazini Məhmud.

Yoruldı tişəni Fərhad dağə vırmaqdan,
Rəqibə Şirin olub yar, etdi gör kim sud?

Yetişsə fəsli-gül, iç badəni qürabə ilən,
Bu şərt ilə, çala mütrib rübab ilə neyü ud.

Fənayə bir nəfəsə geddi təxti-taci-Qubad,
Gedən bu rahi-xətərnaki, bir də etməz ud.

Əcəl kəməndi səni eyləyən degül azad,
Məsih tək edəsən sən gər asimanə süud.

Məbada sərzədə meyxanəyə qədəm qoyasan,
Əyağ ilən vırulursan deyərlər, ey mərdud.

Degül bu məscidi-viranə ilə deyrü kinişt,
Degül bu yer, həzər eylə, caygahi-sücud.

Bu yerdə rindü xərabatilər düşüb sərməst,
Bu yerdə Şur oxunur, gah nəğmeyi-Davud.

Bu yerdə sağərü camun müdam bəhsi olar,
Bu yerdə bir pulə dəgməz hədisi-Adü Səmud.
Qərəz, bu deyrə qədəm qoysa kim, xəbər dutmaz,
Gəlür nə başinə, dövran nə eyləmiş mövcud.

Əyağun altına diqqət göziylə eylə nəzər,
Dönüb qübarə, yəqin et, hüduddür və qüdud.

Nə qədr vəqt var əldə, ayıqlığı tərk et,
Həmişə məsti-mey ol, piri-meykədə fərmud.*

Qəmini çəkmə cəhan mülkin, əlündə degül,
Kimün əlində var isə, hiç olmasun xoşnud.

Əgər əlündə ola, tez çıxar gedər badə,
Deyərlər bu sözi, get, sor, var əldə gər şühud.

Demə təsərrüfümə keçdi bu cəhan mülki,
Sözimi al qulağə, gər varunsa guşü şünud.

Kimün əlindən alubsan, alur gəlür bir gün,
O kimsə kim, eyləmürsən anı hesabi-vücud.

### "CAN VERƏNDƏ ELƏDİ..."

Can verəndə elədi yad Əyazın Məhmud,
Can gözündə degül idi ki, olub eşqalud.

Ayrılıq möhnətinə tab eləmək müşkildür,
Bəs neçündür bu qədr naleyi-çəngü neyü ud.

Bisəbəb olmadı divanə bəlakeş Məcnun,
Qulaq as bu sözə, var səndə əgər guşü şünud.

Leylinün ayrılığı çəkdi onı zəncirə,
Olmadı bir nəfəs azad olınca nabud.

Bisütun dağinə diqqət gözilə eylə nəzər,
Kim onı eylədi bərbad, tələb etmə şühud.

Tişəni kuhkənə verdi fəraqi-Şirin,
Daği bərbad eləmiş, olmadı hasil məqsud.

Vəsl tə`sirini bilməklik əgər istərsən,
Göstərüm mən sana bir-bir dəlil, ya mə`bud.
İki göz var idi Yə`qubdə aləm şahid,
Nurdən yoxdı gözində onun asari-vücud.

Yusifün könəginün buyin eşitcək fövrən,
Açılub nuri edüb gün kimi əflakə süud.

---
* Buyurdu

Məsləhət eyləməz adəmlə, bunı eylə yəqin,
İstəsə etməgə xoşbəxt birin çərxi-kəbud.

Şahlıq tacıni başundan alar bir dəmdə,
Söz deyən olmaz ona aləmi etsə nabud.

Qəhbəyəm, gər inanam dövrinə qəhbə fələkün,
Əyağımdan öpə min dəf`ə əgər etsə sücud.

Nanəcibdür necə gör bir göz açub-yumunca,
Nanəcibzadəni etdi çü Süleymanü Davud(ə).

Baxma beş gün səni sultan eləyür aləmdə,
E`tibar eyləmə, etmə özüvi heç xoş sud.

Çox da çəkməz, səni bir şəxsə müsəllət eylər,
Yeri heç yerdə onun yoxdur, olubdur mərdud.

Yaxasın boşla, inanma belə bəd bünyadə,
Özinə ad qoyub hər yerdə, mənəm taci-rübud.

Əyağ altına səni salmasa əl çəkməyəcək,
Vay sənün haluva, olson sən əgər sahibi-cud.

Od vırar var-yoxuva ta səni möhtac etsün,
Nakəs içün eləyür ne`məti-dünya mövcud.

Xanəbərduş eləməkdür işi hər əhli-dilə,
Rəvişindən darıxub gəbrü müsəlmanü yəhud.

Xəbəri yoxdı özündən necə bərbad olacaq,
Görməyür ol güni qalmaz ona məhvərdə hüdud.

Qoygilən bir qədər ahəstə qədəm toprağə,
Ad qoyublar ona topraq, odur çeşmi-qüdud.

Çox da etdi sitəmin fayidəsin, sölə görüm,
Həddsiz nifrəti kəsb eylədi Fir`on, Nəmrud.
Yaxşılıq eyləgilən, xəlqə yəmanlıq etmə,
Sən ilə əhd eləmiş ruzi-əzəl Rəbbi-vədud.

Növ`üvə görmə rəva, zülmü sitəmdən əl çək,
Başuvun üstə durub xəncəri-ruzi-möv`ud.

Heç kimün sübhə kimi şəm`i-çirağі yanmub,
Yetməyübdür sana aya xəbəri-Adü Səmud?

Etdi bihəd sitəmin Adü Səmudun qövmi,
Oldı beş gündə həlak ibrət elə, tazə vürud.

## TƏRCİ`BƏND

Gətür, saqi, şərabi-ərğəvani,
Könül aramidür, ruhun rəvani.

Yetişdi fəsli-gül, doldur piyalə,
Şərabaludə qıl pirü cəvani.

Lətafətdən vırar dəm bərgi-lalə,
Ayılma məstlikdən gül zəmani.

Səmənrüxsarlər rüxsari-güldən,
Öpər, bica degül bülbül fəğani.

Qiyamət göstərür hər sərvqəddi,
Qoyub heyrətdə bağü bağbani.

Bir əldə gül, bir əldə cami-badə,
Dolan gülzari, yad et, yar cani.

Ləbin yad et, şərabi-ərğəvan iç,
Xəyal etmə bu aşubi-cəhani.

Cəhanun inqilabın yad edəndə,
Olur bihudə, bica ömri-fani.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

### II

Şərab ilə keçir xoş ruzigari,
Cəhanun zərrəcə yox e`tibari.

Gedərsən ol yerə, gəldün o yerdən,
Meyü mə`şuqə sərf et cümlə vari.

Bıraxma daməni-dildarı əldən,
Əlündə heç nəyün yox ixtiyari.

Nə var səndə, o sərvqamətündür,
Fəraqında dolan, gəz hər diyari.

Şikayət eyləmə hicran qəmindən,
Eşidməz neytək etsön ahü zari.

Əgər yar olmaseydi bimürüvvət,
Olardı Leyli-Məcnun qəm kəsadi.

Başında etməz idi quş yuvani,
Budur kim aləmi-eşqün şüari.

Ayılma məstlikdən, uyma nəfsə,
Gətürmə xatirə ruzi-şümari.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**III**

Cəhan sərmayəsi ənduhü qəmdür,
Ona kim versə dil, namöhtərəmdür.

Əgər abi-həyati versə, ey dil,
Həzər qıl nəş`əsindən, içmə, səmdür.

Əsiri kim ola bu dəhri-dunun,
İmami-əsr ola, əhli-sitəmdür.

Sataşma qəlbinə ərbabi-halun,
Dutar ahi səni beytül-hərəmdür.

Bıraxma guşeyi-meyxanə əldən,
Şərabaludə ol, nayab dəmdür.

Əyağ ahəstə qoy toprağun üstə,
Ağlarsan ani Cəmşidi-Cəmdür.

Baş əgmə heç kimə bir loğma içün,
Kişi aləmdə yoxdur, varsa kəmdür.

Üzüm suyilə ver ruhun qəzasın,
Əlaci-möhnətü dərdi-vərəmdür.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**IV**

Məhəbbət əhli olmaz şadü xəndan,
Tökər xunabi-həsrət didəgiryan.

Şəbi-hicran yanar hicran odında,
Müdara eyləməz kamınca dövran.

Gərək əğyar etsün tə`nə hərdəm,
Görəndə aşiqün halın pərişan.

Gərək aşiq olsun laübali,
Budur eşq əhlinə qanunü mizan.

Qiyas et sübhəcə pərvanələrdən,
Edər şəm`ün odına canı qurban.

Gəl, ey dil, çəkmə damən eşq odından,
Ki, dərdi-eşqə yox bir özgə dərman.

Qəzası əhli-eşqün xuni-dildür,
Rizayi-yardən yüz dutma bir an.

Bütün divanədür, aləmdən əl çək,
Həvayi-nəfsə uymış, qan tökər qan.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**V**

Səhər qəm, sübh nalə, şam möhnət,
Əzizim, bu həyatə çəkmə həsrət.

Çıxanda gün olursan şadü xəndan,
Tülu` eylər neçün, bir eylə diqqət.

Can almaq qəsdini eylər dəmadəm,
Əman verməz haçan kim tapsa fürsət.

Kəvakib sirrinün yox e`tibari,
Edər min fitnə zahir, etmə qəflət.

Alub kim kami-dil dövri-fələkdən?
Onun dövründə yoxdur cüz əziyyət.

Gədanı şah edər bir göz yumınca,
Şəhi eylər gəda, ol bimürüvvət.

Qaralsun arizi gərduni-dunun,
Kəmal əhlinə bilməz qədrü qiymət.

Olanda iş belə, ey saqi, mey ver,
Qan etdi bağrımı ənduhü möhnət.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**VI**

Süleyman(ə) mülkinün asarı yoxdur,
Nə kim asar yox, miqdarı yoxdur.

Olub bayqulərün aramgahi,
Qəmə aludədür, qəmxarı yoxdur.

Çox etmə Yusif hüsnindən hekayət,
Olubdur murə tö`mə, yarı yoxdur.

Qəfəs küncində eylər ahü nalə,
Solubdur, bülbülün gülzarı yoxdur.

Nəzər qıl güllərə diqqət göziylə,
Deyür kim hər tərəfdən xarı yoxdur.

Edər Fərhad nalə Bisütundə,
Gedüb Şirin kimi dildarı yoxdur.

Dedim, ey kuzəgər, kimdür bu sağər,
Dedi Şirin, rüxi-gülnarı yoxdur.

Meyi-Kövsər dedim qismət olarmı?
Dedi yox, nisyədür, bazarı yoxdur.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**VII**

Həzər qıl, Saqiba, növ`i-bəşərdən,
Ətək çək daima bu şurü şərdən.

Əsiri-nəfsdür başdan-əyağə,
Xəbər al bu sözi hər xüşki-tərdən.

Vəfadən dəm urar əmma yalandur,
Nihali-təlxdür, xali səmərdən.

Əgər qılson ona min canı qurban,
İçər qanun genə sutək cigərdən.

Nə hacət xilqət içün fəxr qılmaq,
İlahi, razı kimdür bu hünərdən.

Xəlayiqlə müdara eylə, ey dil,
Əlac olmaz sana, düşsön nəzərdən.

Həvayi-nəfs içün incidmə nəfsi,
Təğafül eyləmə ahi-səhərdən.

Sana qoy eyləsün cövrin dəmadəm,
Xəbərdar olmıyan əsli bəladən.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**VIII**

Peşimandur gəlüb hər kim cəhanə,
Qalubdur gül dikəndən yanə-yanə.

Çəkərsən şahə həsrət, bixəbərsən,
Ki, təxti-tacı var, sahibxəzanə.

Bütün zəhmətkeşindür, zülm əlilən,
Alınmışdur, yedikcə taziyanə.

Şərabun dürdi tək salmış əyağə,
Həqiqət əhlini dövri-zəmanə.

Əziyyət etmə murə, canı vardur,
Edər min zəhmət ilə kəsbi-danə.

Əl atma pərdeyi-namusi-xəlqə,
Gedər namusun əldən, bibəhanə.

Günahi boynuma, əl çəkmə meydən,
Ayılma, məst ol, ruzü şəbanə.

Vəlakin qan tökülsün, vermə fitva,
Degül qiymət cəhan bir qətrə qanə.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

## IX

Əgər qan tökməgə etsön iradə,
Deyim mən hansı qanı tök ziyadə.

Tərəhhüm nəfsüvə heç etmə, öldür,
Qoy, itsün qanı bilmərrə aradə.

Yetərsən məqsədə gər ölsə nəfsün,
Başun qalmaz dəxi yüz min bəladə.

O kim, sərkeşligə sərf etmiş ömrin,
İtüb imdi aradən, getdi badə.

Əl açma zirdəstə zülm əlilə,
Əlindən dutgilən görsön fənadə.

Çəkərsən damənin, zahid, əbanun,
Görəndə rəngi-badə buriyadə.

Dutubdur mey neçün künci-səbuni,
Görüb aludəsən buyi-riyadə.

Keçüb təsbih vəqti, adəm ol gəl,
Həqiqət əhli ol, ziri-əbadə.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

**X**

Nəmaz əhlinə uyma, səcdəgahi,
Edibdü qəsb anı xahi nəxahi.*

Sanur nahəq özini əhli-Qur`an,
Vəhalonki itibdür qibləgahi.

Gətürdüm qeydini İslam dinivün,
Qalub avarə hərgiz yox pənahi.

Qıra şəmşir ilə İslamı hər kim,
Behiştün əhlidür, yoxdur günahi.

"Tərəhhüm bər pələngi-tizdəndan",**
Sitəmdü gusfənd içün, İlahi!

Bu millət tərbiyətbərdar olmaz,
Ağarmaz gər yuson min il siyahi.

Müsəlmandan təmənna etmə hərgiz,
Əgər möhtac olson, sat külahi.

Gətür əl, məscidə bəsdür yügürdün,
Dağılmıbdur gözəl meyxanə rahi.

Qəmin çəkmə cəhanun, salma yadə,
Əlündə cami-saqi, xümdə badə.

## TƏRCİ`BƏND

Mən necə ney tək eləmüm ahü zar,
Həsrəti-xunab ilə leylün-nəhar.

Eyləməsün kimsə məlamət məni,

---

* İstər-istəməz
** İtidişli pələngə rəhm etmək

Ağlasam hər saət biixtiyar.

Bağrımı qan eylədi hicran qəmi,
Verdi könül yar olub əğyarə yar.

Bir gözələ mail olubdur könül,
Rəhmi yox heç səngdili-ruzigar.

Dil ona vermüm dəxi mümkin degül,
Almış əlimdən nə qalıb hər nə var.

Ey dili-divanə, yaneydun oda,
Sən məni qıldun bu bəlayə düçar.

Sən məni rüsvayi-cəhan eylədün,
Uydun o mahparəyə bie`tibar.

"Ah minəl-eşqi və halatihi,
Əhrəqə qəlbi və hərəratihi".*

**II**

Xürrəm idüm, bilməz idüm qəm nədür,
Nalə nədür, ahi-dəmadəm nədür.

Bilməz idüm vardur eşq aləmi,
Könlümi etsün belə dərhəm nədür.

Badeyi-gülfamdə sərməst idim,
İmdi olub qəm mana həmdəm nədür.

Eşq əsir eylədi axır məni,
Olmaram azadə bu aləm nədür.

Kim məni saldı bu bəla daminə,
Bilməyür heç dərdinə mərhəm nədür.
Saqi, məni eylədi qəm paymal,
Xümlə gətür badəni, kəm-kəm nədür.

Bərqi-cəhansuzdür eşq atəşi,
Tab eləyərmi ona adəm nədür.

"Ah minəl-eşqi və halatihi,

* Eşqin və onun hallarının hərarəti (atəşi) qəlbimi yandırdı (Mövlana Cəlaləddin Ruminin "Məsnəvi"sindən iqtibas olunmuşdur. Adətən mövləvi dərvişləri "səma" mərasimini icra edərkən oxuyurlar)

Əhrəqə qəlbi və hərəratihi”.

### III

Eyləmədim mən ki, təmənnayi-eşq,
Dutdı məni eylədi rüsvayi-eşq.

Mən hara, divanə könül, eşq hara,
Tərk elə, içmə meyi-minayi-eşq.

Daireyi-eşqə qədəm qoysa kim,
Verməz ona hiç təqazayi-eşq.

Eşq yəmandur, həzər et eşqdən,
Eylədi Məcnuni nə gör rayi-eşq.

Məsti-xərab eyləyər ol huşyar,
Alma ələ sağəri-səhbayi-eşq.

Xirməni-pərvanəyə od urdı kim,
Şəm` üzarında təcəllayi-eşq.

Bərqi-cəhansuzdür hər zərrəsi,
Tərki-adətdür bütün əzayi-eşq.

“Ah minəl-eşqi və halatihi,
Əhrəqə qəlbi və hərəratihi”.

### III

Meyl eyləmə eşqə bəladur, bəla,
Rahi-xətərnaklə biintəha.

Yar qəmin çəkməgə yox səndə tab,
Qaf qədin, gör, necə etmiş düta.

Çarəsi olmaz elə bir dərdidür,
Düşmə bu dərdə dəxi olmaz dəva.

Uyma pərivəşlərə, məhparədür,
Eyləmək olmaz bulara can fəda.

Qeydinə qalmaz bu şəkərləblərün,

Əhdşikən səngdili-bivəfa.

Ağ ilən qarəsinün fərqi yox,
Lə`nət ola iksinə də bərməla.

Eşqdən əl çək, nədür eşq aləmi,
Eyləmə bica yerə əhdi fəna.

“Ah minəl-eşqi və halatihi,
Əhrəqə qəlbi və hərəratihi”.

## TƏRKİBBƏND

Əndişə nədür eyləyüm aşubi-cəhandan,
Bizarəm əzəldən bu cəhandan, belə candan,
Verrəm özimi tiri-bəla gəlsə hayandan,
İçmək mana xoşdur, verə kim zəhr ilandan,
Dəhrin doludur, istəmirəm, kasəsi qandan,
Heç gülməsün yüz, görməyürəm pirü cəvandan,
Mən handan, bu aləmi-pürfitnə hayandan,
Gəldim bu yerə keçməz idi hiç gümandan,

Adəm evi bərbad, məni saldı bəlayə,
Eykaş, boğeydi məni əzzəl güni dayə.

Bədtüxmi sən əkdün neçün, ey həzrəti-Adəm?
Beşgünlik üçün eylədilər aləmi bərhəm,
Qanlar tökülür seyl kimi boş yerə hərdəm,
Bir yarə dəgüb xəlqə ki, yox heç ona mərhəm.
Gör əkdigün vəhşiligin, çəkmə sən heç qəm,
Övladuva bax, ləzzət apar, olgilən xürrəm,
Həmnöv` qırar növ`ini neyçün, anı bilməm,
Qırsun biri-birsin, deyəcəksən ki, cəhənnəm,

Bunlar yaranub ölməgə, öldürməgə hər an,
Yoxdur bir işim, aləm əgər olsa da viran.

Ol buğda ki, sən meyl elədün, şurü şər oldı,
Sülbündə sənün təmə`si vəhşi bəşər oldı,
Nəhyün itirüb əmrini, səndə hünər oldı?
Ol xahişi-nəfsün səməri od səmər oldı,
Qoydun bu cəhanə qədəmün, dərdsər oldı,
Ey dil, eləmə nalə, müqəssir pədər oldı,
Saldı bizi bu dami-bəlayə, zərər oldı,

Məs`ul odur hər nə ki, bizdən xətər oldı,

Bəndə satıram arpaya min huri-behişti,
Ta var nəfəsim, mey içərəm kəştibəkəşti.

Məhşər güni mən eylərəm əvvəl şikayət,
Adəm eləyən zülm əlimdə mənim hüccət,
Vardur kimin həqqi, mana bir etsün əziyyət,
Gər istəsə ol gün məni divani-rəyasət,
Verrəm bəhasın Adəmün, etməm ona minnət,
Tənbih olar Adəmə, gər varsa ədalət,
Saqi, mey içək, zərreyicə qüssə nə hacət?
Qur`an kimə gör nifrət edüb, çəkmə xəcalət.

Saqib kimi zövq ilə keçir ömri dəmadəm,
Məhşər güni ya mən düşərəm dərdə, ya Adəm.

## TƏRKİBBƏND

Hər gündə bir libasə girər çərxi-kəcmədar,
Gahi şərab içirdi mana, gahi zəhrimar.

Nail kim oldı istədigin bir dəm eyləsün,
Bir zərrə heç yaranmış əlində yox ixtiyar.

Boş fikrə mübtəla özüvi etmə hər nəfəs,
Sən istəyən heç olmayacaq, qalma intizar.

Çox almışam, könül, əlimə camü badəni,
Sərməst olum, içüm meyi-nabi həzar bar.*

Ləb sağərün ləbində genə içmək olmayub,
Sağər sınub əlimdə, qalub saqi şərmsar.

Qəsd etmə canə sərhədi-məqsudə yetməsön,
Salmış əlinə istədigin hansı şəhriyar?
Getdikcə yıldırım kimi mənzil uzaqlaşur,
Görmisən heç nə göglərə çıxsun Məsihvar.

Yox eybi, getgilən bu yolı boş qayıtmısan,
Qorxma, qonar üzaruva ya gərd ya qübar.

Beş gündən ötri salmagilən xəlqi zillətə,

---

* Min dəfə

Uyma bu qədr, aç gözüvü, xabi-qəflətə.

## II

Rə`yünlə çıxmaz heç, onı bil, mahü aftab,
Dünya dağılsa, xəlq, edəsən gündə inqilab.

Kəc fikri eyləmə, dutaram kainatı mən,
Əmri-məhalə kim səni etmişdür intixab.

Fikri-məhalüvə yetişərsən sən ol zəman,
Bilsön əgər cibündə sənün qızıl var, ya türab.

Bir inqilabı xəlq eləmək çox çətin degül,
Min inqilab içün sana dəhr eylər e`tisab.

Mən böylə eylərəm demə, hərgiz olan degül,
İncitmə xəlqi, xəlqə əbəs vermə çox əzab.

Muri-zəifə baxma həqarət gözilə kim,
Çox diqqət olub ki, gərdəni-şirə salub tənab.

Canü dil ilə sən deyəni eylərəm qəbul,
Göstər, kim oldı bir nəfs aləmdə kamyab.

Gün çıxdı, vəqtüvi hədərə sərf eyləmə,
Aç gözlərün, ayıl, eləmə çox də nazi-xab.

Bu inqilab şivəsi səndə bəhanədür,
Meylün sənün filanə, filanə, filanədür.

## TƏRKİBBƏND

Dəm eşqdən, ey dil, nə vırursan ki, bəladur,
Getmə bu yolı, eylə həzər, rahi-xətadur.

Divanə degülsən, elə Məcnundən ibrət,
Avarə qalub, quşlara başında yuvadur.

Fərhadə uyub dutma bu Şirindəhən eşqin,
Dağı dağıdub tişə ilə, çunü çəradur.

Hər kim həvəs etsə duta bu daməni-eşqi,

Bişəkk, yəqin eyləgilən, bəxti qəradur.

Bari-qəmü eşqə necə tab eyləyəcəksən?
Gör Qaf qədin, əgri kəman kimi dütadur.

Bimarinə eşqün eləmək çarə çətindür,
Müşkil ələ düşsün, ləbi-dildar dəvadur.

Cəhd eyləginən dutmayasan daməni-eşqi,
Dutson, dəxi qəm eyləmə, təqdiri-qəzadur.

Verməz sana yol qaçmağa, rüsvayi-cəhan ol,
Getsön hara, zənciri-cünun rahnümadur.

Keç ignə kimi varü yoxundan bu cəhanun,
Cəm` eyləmə Qarun kimi, yığson da fənadur.

Məcnun ki, degülsən, demə yoxdur, hanı Leyli,
Məcnun kim olar, dinmə, xətərnak binadur.

Getmə bu xətərnak yolı, çox hünər istər,
Əvvəl qədəmindən həzər et, tərki-sər istər.

**II**

Eşqün rəvişin bilməgə yox səndə ləyaqət,
Al canuvı qaç, durma, hanı səndə əlamət.

Adabını eşqün məgər asanmı sanursan,
Hər bir qədəmində var onun səngi-məlamət.

Varü yoxı tərk eyləməmiş keç bu həvəsdən,
Səndən hələ olmub görürəm din evi qarət.

Rüsvayi-cəhan olmamısan meykədələrdə,
Yıxmub səni mey dərdi, başun sağ-səlamət.

Təsbihi bırax, sal oda, zünnarpərəst ol,
Zahid sana tə`n eyləsə heç çəkmə xəcalət.

Biqeyd, get ol, sərv tək azadəlik istə,
Minnət yükini tök yerə, xəm eyləmə qamət.

Ol alitəbiət, hərəkat eylə hüma tək,

Quşlar arasında qazanub, gör, nə şərafət.

Bir can verüsən, qanını tökməz, həzər eylər,
Etmiş özünə tə`mi-rəmim ilə qənaət.

Aldanmagilən nəfsüvə murdar məgəs tək,
Şirini görəndə yox olur ondakı taqət.

Yüz versə sana qəm, eləmə ahü fəğani,
Bildirməgilən heç kəsə, nə etmə şikayət.

İnsanlığı nadan ikən asanmı sanursan?
Hər canəvəri tuti-süxəndanmı sanursan?

## TƏRKİBBƏND

Söz açanda biri, sən ol xamuş,
Eşqdən olsa xali, eyləmə guş.

Gülmə, hərgiz sevünmə, qəmgin ol,
Görəsən gər birini xanəbəduş.

Tab qıl dərdü möhnətə, səbr et,
Boş sözə dik kimi eyləmə guş.

O qədr içmə badeyi-nabi,
Olasan ta ki bixəbər, bihuş.

Eybdən pak olmamış xəlqün,
Demə eybin, deyərlər, etmə xüruş.

Həqiqəti deyən zəman, lal ol,
Məsti-dürdi-şərabü badəfüruş.

"Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş".[*]

### II

Olma sərkeş çü kakili-mişkin,
Tez düşərsən əyağə, eylə yəqin.

Xaksar ol həmişə zülf kimi,
Şanə gördikcə hər nəfəs çin-çin.

[*] Tumançaq darğa bazarda fahişəni vurur ki, "üzünü ört". (Sədi Şirazi, Gülüstan)

Özüvi nəfs düşkini etmə,
Səni rüsva edər bu şumi-ləin.

Eyləmə cilvə çox kəbutər tək,
Gög yüzində kəmin edüb şahin.

Bəsdür, ey cəhl ilən əlaqə edən,
Açgilən, bari, dideyi-həqbin.

Əsl Qur`anə olmason vaqif,
Xəlqə tə`lim eyləmə ayin.

“Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş”.

**III**

Olma nəfsün əsiri, huşyar ol,
Sözün həqqilə pəndbərdar ol.

İşüvün axırı nədür, fikr et,
Nə gəlür başuvə, xəbərdar ol.

Açma bir nəfsçün təərrüz əlin,
Xəlq içində pəsəndrəftar ol.

Dut əlindən yıxılsa gər birisi,
Nəqdi-can əldə dut, ona yar ol.

Vəqt səndən nə istəsə ver, keç,
Növ`ivün həqqinə tələbkar ol.

Qəhbə təklifi-tövbə etsə sana,
İç mey, get, həmişə xümmar ol.

“Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş”.

**IV**

Sənə nə məst edüb bu badə məni,
Ruzü şəb salma bir də yadə məni.

Əlimi dutma, ver əyağun ilən,
Görəsən hər zəman fitadə məni.

Saqiyə açma heç təərrüz əlin,
Qoysa meyxanədə aradə məni.

Mana eyb etmə, hər nəyəm, rədd ol,
Etmə rö`yadə də iradə məni.

Xəbərün yox özündən aləmdə,
Nələr etdün qoyub aradə məni.

İctinab etməyürsən heç şeydən,
İncidürsən neçün ziyadə məni.

"Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş".

**V**

Kimdür aləmləri edən viran
Sən kimi, bir utan, fulan-fulan.

Zərrəcə səndə bir həya olmaz,
Beş gün açmış yüzin sana dövran.

Seyltək qanı tökməgün nə içün,
Xahişi-nəfsə olmısan dərban.

Xəlqi narahət eyləmə, əl çək,
Dutdığun işdən əl gətür bir an.

Şadsən, xəlqi dərbədər etdün,
Yandurur daşi naleyi-tiflan.

Əldə təsbih künci-məsciddə,
Eyləyürsən tilavəti-Qur`an.

"Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş".

**VI**

Salmısan cümlə xəlqi təşvişə,
Olma məşğul işrətü eyşə.

Dutdığun əmrə bax bir, agah ol,
İşüvün axırın qıl əndişə.

İyimiş loğma içün hər saət,
Etmə təhqir məzhəbü kişə.

Ehtiram eyləmək günah degül,
Nimçulə, fəqirü dərvişə.

Vəqt olar, əl tapar ki, muri-zəif
Şirə, qoymaz əlaməti-rişə.

Ad qoyursan özüvə, Fərhadəm,
Yox başunda əlaməti-tişə.

"Möhtəsib kunbərəhnə dər bazar,
Qəhbəra mizənəd ki, ruy bepuş".

**VII**

Şah idim, ixtiyardən keçdim,
Sərbəsər cümlə vardən keçdim.

Düşkini-şanü şövkət olmamışam,
Tacdən, şəhriyardən keçdim.

Məni saldı əyağdən-əyağə,
Dəhri-dunü bəxti-yardən keçdim.

Sərfiru heç kimə mən eyləmədim,
Mana tikən oldı ruzigardən keçdim.

Saqib açmub təməllüqün dilini
Heç kimə, nəngü ardən keçdim.

Rəvişi-həqqi vermisən əldən,
Demə, bari, əyardən keçdim.

"Möhtəsib kunbərəhnə dər bazar,

Qəhbəra mizənəd ki, ruy bepuş".

## SAQİNAMƏ

Necə etməyüm badəni arizu,
Olur saqi hər ləhzə bu mahru.

Keçirdim neçün ömri rənc ilən,
Nolur hasilim ömri-şeş-pənc ilən.

Mey içmək qoy olsun günahım mənim,
Günahı yaxar hər gün ahım mənim.

Nə sölər, görün, bərbətü çəngü ney,
Hanı kişvəri-təxti-Kavusü Key?

Hanı Rüstəmi-Zal, ol divbənd,
Atardı yelü asimanə kəmənd.

Olub aqibət tö`meyi-marü mur,
Mənim şahidim qəsri-Bəhrami-gur.

Əlamət hanı qəsri-Bəhramdən,
Edərdi təfaxür güləndamdən.

Gətür, saqiya, badeyi-lə`lfam,
Qoy, etsün mana zövqsizlər həram.

Cəhan sərbəsər bir qəmxanədür,
Qalandan xəbər dutma, əfsanədür.

Cəhanun həyatı keçər bir nəfəs,
İkinci nəfəs görməyüb hiç kəs.

## II

Bu deyrə gələnlər gəlüb bixəbər,
Xəbər dutseydi, edərdi həzər.

Bu deyri-dəni möhnətabaddur,
Yaşar onda kim xanə bərbaddur.

Peşimandur hər kim qoyubdur qədəm

Bu viranəyə, görməyüb cüz sitəm.

Könül vermə bu dəhrə, viranədür,
Verənlər, yəqin eylə, divanədür.

O yarə könül vergilən baqidür,
Buna olma məftun, sana yağidür.

Kimi güldürüb bir nəfəs, bir zəman,
Bu bərbad olmuş, bu afati-can.

Müğənni, gəl avazə Şəhnaz ilən,
Gedən vəqtidür tar ilə saz ilən.

Əcəl caminə məst olur hər gələn
Bu deyri-sitəmpərvərə, mərdü zən.

Gətür, saqiya, badeyi-ərğəvan,
Ayılmum dəxi bir də dil oldı qan.

Vətən getdi əldən, xərab et məni,
Gözüm görməsün hər gədazadəni.

**III**

Əlim dut gətür, saqi, ya camü mey,
Edüm, ya Rəb, bir cam ilən ömri tey.

Həyat olsa gər belə, boşdur həyat,
Əmandur, mənə qəfəsdən ver nəcat.

Ədəm mülkinə xoşdur olmaq rəvan,
Olunca belə hər nəfəs bağrıqan.

Deməzlər sana qulsan, azadəsən,
Qiyamət ola, düşmisən badə sən.

Fəğan hər zəman etmisən ney kimi,
Əyağ altına düşmisən mey kimi.

Deməzlər sana şahsən, ya gəda,
Sana düşmən orda olar aşina.

Hanı zahid orda desün içmə mey,

Gədayə verür rayi-Kavusü Key.

Süxənçinü bədguvü biabiru,
Tapulmaz o yerdə, get, et cüstücu.

Odur mənzili-əmn, pərvasi yox,
Ki, şəhdən gədanun təmənnası yox.

Nəmazə deməzlər sana hazir ol,
Və ya mö`min ol, ya ki, bir kafir ol.

**IV**

Gətür, saqi, ol badeyi-lə`lnab,
Xərab et məni, yox dəxi məndə tab.

Gözümdən nihan etmə rüxsari-mey,
Məni eylədün sən giriftari-mey.

Mana dürdi-mey yari-qəmxardür,
Əlaci-qəmü naləvü zardür.

Necə tab edüm tə`ni-əğyarə mən,
Bu dərdə necə eyləyüm çarə mən.

Kimə gör yetüb növbəti-təxtü tac,
Kimə gör verübdür gərdun rəvac.

Böylə dəm olur, böylə dövran olur,
Könül necə şadü xəndan olur.

Oleydi, görüm, çərxi-dun sərnigun,
Cəhani edüb qərqi-dəryayi-xun.

Kimə eyləyüm dərdi izhar mən,
Hanı əhli-dil, ey dili-zari-mən.

Mana qəm güni yar bu badədür,
Əyağə düşüb gərçi üftadədür.

Girür gündə bir rəngə bu ruzgar,
Edüb rəng ilən aləmi tarümar.

**V**

Dur, ey saqi, ver xaki-xosrovi,
Bəyan eyləyüm nükteyi-mə`nəvi.

Məni məst qıl bu meyi-biğəşə,
Əsirəm xəm zülfi-bu məhvəşə.

Kəmandur qaşı, zülfi zəncirdür,
Cigərçak edən kiprigi tirdür.

Gözi məst edüb camü badəni,
Qədi məhv edüb sərvi-azadəni.

Edüb bəndü məftun məni halinə,
Dil heyrandür arizi-alinə.

Verübdür könül ol məhi-dilfərib,
Dəmadəm alur kam ondan rəqib.

Məni yanə-yanə qoyub şəm`tək,
Yüz üstə məni xüm əyağinə çək.

Məni məst qıl, olmayum huşyar,
Gözüm görməsün yar, əğyar var.

Olur tə`nəyə, saqi, tab eyləmək,
Yıxulsun  bu könlüm kimi nöh fələk.

Məni atəşi-firqətə yandırub,
Yananda çəküb damənin yandırub.

**VI**

Verürsən mana, saqiya, gərçi mey,
Meyündən sənün görmədim hiç şey.

Mey içdikcə mən artırur qəm mana,
Verüb görmədim nəş`ə bərhəm mana.

Görüm, sərbəsər qanə dönsün şərab,
Çox içdim, vəli olmadım kamyab.

Desəm də sana, saqiya, cam ver,

Verüm sölәmә, bәlkә düşnam ver.

Xәrab etgilәn, yıx bu meyxanәni,
Yerә vır şişeyi-camü peymanәni.

Kimün ari yoxdur içәr badәni,
Hәramzadәyә vermәrәm zadәni.

İçәr badәni xәlq bәdmәst ola,
Deyürsәn özin әqldәn pәst ola.

Könül şad olanda içәrlәr meyi,
Yerindә gәrәk görmәk hәr bir şeyi.

Heyf sәndәn, ey meyi-sürxru,
İçәr qanmaz etsün sәni sәrfiru.

Sәnün qәdrüvi bilmәk asan degül,
İçüb mәst olan hәrgiz insan degül.

**VII**

Rәsm var bu badeyi-safdә,
Fәsad eylәyәr tәb`i-әclafdә.

İçәndә mey hal ilәn әhli-hal,
Deyәr cam ona, iç, sana mey hәlal.

Əql olur badәdәn sәrdә kәm,
Dәlil istәsön, şahidim camü cәm.

Meyә meyl etsәydi iblis әgәr,
Dutardı yüzin Adәmә hәr sәhәr.

Fәsad әhlinә bir mey olmub hәram,
Niyә meyl edә nәhydür, vәssәlam.

Fәsad etmәsә sәn dә mey iç, mey,
Hәlal etdi qanun sana hәr şey.

Meyün qәtrәsi "nafe`i-nas"dür,*
O nasә onun qәdri әlmasdür.

* Qurani-kәrimin Bәqәrә surәsinin 219-cu ayәsinә işarәdir.

Həramzadə rüsva edər badəni,
Qoy içsün ərəqdən hərəmzadəni.

Əgər mur içə mey, edər şiri bənd,
Süleymanü Davudı etməz pəsənd.

Gərək içməsün badə nadanlər,
İçəndə olur məst, min qan elər.

**VIII**

Müğənni, çək ağuşə çəngü rübab,
Müxalif rəhin tərk qıl, dut Rəhab.

Əgərçi degül qəmdən azad dil,
Edər ney kimi ahü fəryad dil.

Səfa qalmayub sağərü badədə,
Nə hüsn gözəldə, pərizadədə.

Cəhan inqilabı yıxub aləmi,
Keçər xoş kimün bir nəfəs xoş dəmi.

Necə mən həvəsi-camü sağər edüm,
Təmənna ləbi-busi-dilbər edüm.

Vətən kişvəri xarü bərbad olub,
Ata öldürür oğlı, cəllad olub.

Necə bir nəfəs şadü xürrəm olum,
Nişat əhlinə bir dəm həmdəm olum.

Gözümdən düşüb sevgili yarlər,
Xəyalimdə yox seyri-gülzarlər.

Min oğlum ola qərq öz qaninə,
Qəmin çəkmərəm düşsə od caninə.
Vətən getdi əldən, vətən xar olub,
İşıq ruzigarım mana tar olub.

**IX**

Məni etmüb kimsə nəfsə əsir,
Özümdən səvayi olmadım pəndgir.

Haçan eylədüm həqqdən vahimə,
Könül vermişəm nəfsi-bədxahimə.

Kimi eyləsə bənd bu nəfsi-dun,
Öz-özinə əgər gəlsə min rəhnəmun.

Ona çarə bilməz, yox heç çarəsi,
Olur dəşti-heyrətlər avarəsi.

Nə eylər dəxi sürməni çeşmi-kur,
Edər həq mənzərilə zühur.

Nihalun ola təlx gər meyvəsi,
Min tök əyağinə bal çeşməsi.

Əgər artura meyvəsin ol nihal,
Həman təlx meyvə verür bizəval.

Əgər oxur tuti insan kimi,
Fəth surəsin* əhli-iman kimi.

Nə məqsəd ol hökmi-Qur`andə,
Əməl eyləməz, yoxdur imani də.

Əməl etməsön hökmə, nadansən,
Nə nadansən, bəlkə heyvansən.

**X**

Nəsihət sana, Saqib, etməz əsər,
Tökülsün yerə göglər, ey bixəbər.

Xətərnak əmrə çox etdün həvəs,
Xəta etməyüb sən kimi hiç kəs.

Nə qafilsən, ey həqi inkar edən,
Özin min bəlayə giriftar edən.

Gəlür bir zəman yetməz imdaduvə,
Əmin olgilən kimsə imdadüvə.

Əlün daməni-həqə yetməz yəqin,

---

* Qurani-kərimin 48-ci surəsi

Əlacun kim etsün, çətindür, çətin.

Bitibdür işün, dərdüvə çarə yox,
Olar çarə dərdə, bu azarə yox.

Həya səndə yox zərrəcə, bihəya,
Günahə bütün ömri etdün fəda.

Səfər var qabağda, utan, bixəbər,
Xətərnakdur, etmisənmi* həzər?

Əlün boş, yüzün qarə, iman yox,
Alub canuvi dərd, dərman yox.

Cəhənnəm səni, zalim, etməz qəbul,
Yetər daduva necə ali-Rəsul?!

## SAQİNAMƏ

Məni eylədi məst buyi-şərab,
Xərab etdi məni, saqiya, qıl şitab.

Cəhandə kim olsa əgər huşyar,
Ona heç kim eyləməz e`tibar.

Qəmü dərdi kim çəksə divanədür,
Cəhan sərbəsər fitnə, əfsanədür.

Əlaci-qəmü dərd bu badədür,
Səbu, ol hali, badə minadədür.

Qədəm çəkmərəm künci-meyxanədən,
Olub zər haçan xali divanədən.

Əyağdan-əyağə salub qəm məni,
Hanı, kim görüb şadü xürrəm məni.
Həzar afərin badeyi-biğəşə,
Məni yandur, ey saqi, bu atəşə.

Qədəhlə mana ver meyi-lə`lfam,
Qulaq zahidə vermə, etmiş həram.

Həram oldı mey içdi ümmül-fəsad,

* Etmirsənmi

Fəsad eyləyər içsə gər bədnihad.

Şitab eylə, ey saqiyi-mahru,
Məni etməgə məst, doldur səbu.

Xərabatiyəm mən, xərab et məni,
Meyi-sürx ola, xizab et məni.

**II**

Nolur qoysa qan bağrıma çərxi-dun,
Şitab eylə, sən ver meyi-lə`lgun.

Mənə həmbadə ol, gəl əldə cam dut,
Yamanlıq heç etmə, niku nam dut.

Həvəs eyləmə ömri-şeş-beş nədür,
Bu bihudəçün bu keşakeş nədür.

Sirişki-həsəd dutmasun damənün,
Səni qərq eylər, budur rəhzənün.

Cəhan xərabə süxənsənclər,
Könül verməyüb görsə min gənclər.

Cəhan sərbəsər fitnəəngizdür,
Kim olmuş ona bənd, xunrizdür.

Cəhanun işi məgər təzvirdür,
Onunçün bu nə ahi-şəbgirdür.

Əl atma ki, oddur, səni yandurar,
Yananda oda sən, özi yan durar.

Əmandur ki, fövt eləmə fürsəti,
Mey iç, məst ol, çəkmə çox möhnəti.

Girov badəyə nəqd imanı ver,
Nə imanı ver, get, dilü canı ver.

Təğafül nədür, rindi-meyxanə ol,
O qədr mey içməgə ki, divanə ol.

**III**

Hanı şah Məhmudü Kavusü Key,
Cəhanı bütün tiğ ilə etdi tey.

Nədür e`tibar bu deyri-fəna,
Kim ilən olub bir nəfəs aşina.

Vəfa kim, nədür dutma ondan xəbər,
Yox onda vəfa, müxtəsər, müxtəsər.

Qədəm qoydı bu deyrə Cəmşidi-Cəm,
Onı pişvaz eylədi dərdü qəm.

Niku nam özin etdi bir cam ilən,
Edüb tərk dünyanı bu nam ilən.

Əgər beylə isə niknamlıq,
Ki, dəgməz heçə, eyləmə xamlıq.

Nikunam odur laübali ola,
Ki, hər qeyddən yə`ni xali ola.

Sən aldat cəhanü dənizadəni,
Müdam algilən sağərü badəni.

Yuva etməsün, qoyma, heç səndə qəm,
Ki, meyxanədən çəkmə bir dəm qədəm.

Həmişə, get ol, mey kimi tərdimağ,
Əyağdən düşüncə ələ al əyağ.

Məsaciddə yox qeyri-buyi-riya,
Riyadən gəlüb təngə kim buriya.

**IV**

Gətür, saqiya, sağərü cami-mey,
Olum mən fəda dürdaşami-mey.

Əba, rəngə səccadə aludədür,
Belə rəngdən badə asudədür.

Gəl, ey saqi, ey canımun rahəti,

Məni yıxmaz heç bir əyağ afəti.

Cəhan inqilabın fəramuş qıl,
Xərabati ol, badəni nuş qıl.

Çal, ey mütriba, bərbətü çəngü ney,
Gülün fəslidür bu, degül fəsli-dey.

Degül bisəbəb oldı bu inqilab,
İlan kimi heç eyləmə piçü tab.

Olur məqsədün hasil, heç çəkmə qəm,
Yetər hər kəs öz həqqinə bişü kəm.

Fələkdə əgər olmasa min inqilab,
Yəqin eylə, bir qətrə verməz səhab.

Müğənni, yad qıl Şur ilən,
Nə zahid kimi cənnəti hur ilən.

Həsar qəmü dərdə Mahurdür,
Bütün musiqidə bu məşhurdür.

Əziz ömri bihudə yerdə tələf,
Həzər etgilən etmə, ey naxələf.

**V**

Müxalif dəmin dutma, ol huşyar,
Həsar eylə, çək dövrəsinə həsar.

Gətür, saqiya, badeyi-ərğəvan,
Verincə mana bağrımı etmə qan.

Bu könül bənd olub bir pərizadəyə,
Verülirdi genə dam azadəyə.

Cünun rəxtini verdi eşqi-cünun,
Məni saldı bu damə bəxti-zəbun.

Degül ram ol afəti-ruzigar,
Könül vermiş əğyarə bie`tibar.

Kəmandur qaşı, zülfi zəncirdür,

Pəriçöhrə, müjganları tirdür.

Yuvağındakı xali-adəmfərib,
Alur dəmbədəm kam ondan rəqib.

Qiyamət olur qamətindən əyan,
Yatub gözlərində bəla bir cəhan.

Rüxi-alinə lalə heyrandur,
Ləbi rəşki-yaqutü mərcandür.

Məni bilmədim çəkdi kim kuyinə,
Ki, heyranəm ol gülrüxin ruyinə.

Edibdür məni qərqi-dəryayi-eşq,
Əcəb oldum aləmdə rüsvayi-eşq.

Təqazayi-eşq ilə dil xundür,
Bu sirrə xəbərdar Məcnundür.

**VI**

Əcəb, zahida, qəmdən asudəsən,
Bu təsbih ilə zikri-"yahu"dəsən.

Olur qismətün bağі-huri-cinan,
Mənim tək degülsən dəxi bağrıqan.

Həzər eylə, olma giriftari-eşq,
Yox heç çarəsi, olma bimari-eşq.

Qiyas eylə Fərhadü Məcnundən,
Gedüb ibrət et ol cigərxundən.

Nəmazun gedər fövtə, qıl vahimə,
Səni yandırur, uyma bu ahimə.

Özün bağla bu dami-səccadəyə,
Əl atma nə camə, nə də badəyə.

Təqazası eşqün yəmandur, yəman,
Olur qamətün dərdü qəmdən kəman.

Ağır qiyməti var nadanlığun,

Əlündən gedər, vermə, sultanlığun.

Nə aləmdə var bilməmək yaxşıdur,
Olur nə günəh, dinməmək yaxşıdur.

Bu fikri edər məhz divanələr,
Get, əfsürdəyə sölə əfsanələr.

Kifayət edər xabi-qəflət sana,
Ayılma, yetər rəncü möhnət sana.

**VII**

Gəl, ey bağrımı qan edən dilbərim,
Fəraqında giryan edən dilbərim.

Ki, təxti-məlahətdə sultansən,
Vəli fitnəsən, afəti-cansən.

Genə dil səni eyləyür arizu,
Cəfa eylədikcə sən, ey mahru.

Görüm bu könül qan oleydi müdam,
Mana zindəgani edübdür həram.

Sana mail oldı vəfa səndə yox,
Əcəb fitnəsən, cüz cəfa səndə yox.

Bu adət gözəllərdə sərmayədür,
Məgər kişvəri-cövrə həmsayədür.

Gəl, ey aşiqin xanə bərbad edən,
Rəqibə uyan, kölini şad edən.

Qoyaq bir nəfəs, səngdil, ləb-ləbə,
Yetəm, bari, bir dəm nolur mətləbə.

Yetüb ömr payanə, ey sərvnaz,
Ləbün alum kam, çox etmə naz.

Səni çəkmədüm bir dəm ağuşə mən,
Sorum lə`li-nabun, gəlüm huşə mən.

Solar hüsnün, sərvnazım, güli,

Xəzan, gülün aqibət hasili.

**VIII**

Hanı kişvəri-şövkəti-Keyqubad,
Əlində qalubdur kimün, etmə bad.

Təhidəst gəldi, gedübdür təhi,
İlanü murdür qəbridə həmrəhi.

Hanı tiği-xunrizi-Əfrasiyab,
Dutub pas qılafında olmış xərab.

Əsanı edən həyy Musa(ə) hanı?
Verən ruh əmvatə İsa(ə) hanı?

Hamı nikü bəd tö`meyi-murdür,
Şəh ol, xabgahun sənün gurdür.

Cəhan sahibi noldı Bəhrami-gur?
Əman vermədi çəkdi ağuşə gur.

Nədür xabi-qəflət, ayıl, bir zəman
Açarsan bəsirət gözün sən haçan?

Kəməndi-ədubəndi-Rüstəm hanı?
Vıran bir dəmə xəlqi bərhəm hanı?

Hanı cami-yaquti-Cəmşidü Cəm?
Hanı Yusifə ol ləbqönçə fəm?

Sərayi-sə-pəncə nədür e`tibar,
Edərsən onunçün əbəs ahü zar.

Gədazadə möhtaciyəm hər nəfəs,
Nədür halımız, yox soran hiç kəs.

**IX**

Dur, ey saqi, doldur, gətür cami-mey,
Çəküm möhnəti-dəhri-dun ta bekey.

Sınıq cam ilə, gəl, məni yad qıl,
Əlim dut əyağ ilə, imdad qıl.

Mana verməseydi gər Adəm fərib,
Məni çəkdi bu dəhrə, oldum qərib.

Əman səndən, ey adəmi-rahzən,
Ki, başdan-əyağə bütün fitnəsən.

Məni eylədün xanəbərbad sən,
Sutək qan içən əkdün övlad sən.

Kimə mail oldun dilü can ilən,
Bu deyrə qədəm qoydun əfğan ilən.

Degül bisəbəb səndən etsəm gilə,
Yüzüm gülməyüb heç ildən-ilə.

Ayurdun məni sevgili yardən,
Genə çəkmisən* əl məni-zardən.
Nə qədr günəh eyləsəm ruzü şəb,
Yəqin etgilən, sən olubsan səbəb.

Görüm yandura suzi-ahım səni,
Dutar bir gün axır günahım səni.

Olarmı məgər çərxi-dun sərnigun,
Cəhani edüb qərq dəryayi-xun.

**X**

Səfər var qabağda, xətərnakdür,
Onun qorxusundan cigər çakdür.

Nə sərmayə var əldə, sərmayə yox,
Gedərsən o mə`vayə, həmsayə yox.

Əlün boş, yetər kim sənün daduva,
Yəman gündə bu ahü fəryaduva.

Əmandur ki, fovt eləmə fürsəti,
Gətür tuşə, tərk etgilən qəfləti.

Əməl yox, nəyə səndə ümid var?

* Çəkmirsən

Ayıl, qəflətə vermə çox ixtiyar.

Meyi-qəflətün məstisən ruzü şəb,
Edərlər əməl tuşəsindən tələb.

Təhidəstsən, xanə bərbadsən,
Hələ paybəndi-pərizadsən.

Keçüb vəqtün, ey naxələf, qıl həya,
Hədər yerdə bu ömri etdün fəna.

Alub canuvı dərd, dərmanı yox,
Əlac etməgə heç imkanı yox.

Yetişməz sənün həq fəryaduva,
Düşübdür dəxi rəxnə bünyaduva.

Sana Saqibün pəndi etməz əsər,
Yetübdür işün, müxtəsər, müxtəsər.

**XI**

Çoxı aləmi-bə`dün inkarıdur,
Əlində dəlili məgər varıdur?

Çoxı düşkini-nəfsi-əmmarədür,
Ki, səhrayi-cəhl içrə avarədür.

Dutub cəhli bilmür həqiqət nədür,
Xəbər alma, bilməz təriqət nədür.

Mürəbbi ona olmuş əhli-qərəz,
Bəridür odur çarədən bu mərəz.

Həqiqətdən agah Buzər gərək,
Müqabil duran Əmrə Heydər gərək.

Müafun güni verməz iş boş qılaf,
Necə şir ilə rubəh eylər məsaf.

Gər insansan, olgilən həqşinas,
Qılınclar yağa gögdən, etmə həras.

Nədür can, anı etmisən* sən fəda
Bu həqqün yolunda, yetər xunbəha.

Deyürsən nədür həq, lazım degül,
Nə etsəm keçər, etmərəm qan könül.

İnanma keçər intiqamun dəmi,
Gəlür bir gün, ey nəfsi-dun həmdəmi.

Həqqə aşina olmaq asan degül,
Həqqün münkiri dəxli-insan degül.

**BƏHARİYYAT**
(Nəzireyi-Hafiz)

Eşitdi dəmağım genə buyi-mey,
Yüz üstə məni, saqi, çək, suyi-mey.

Məni eyləsün məsti-dürdi-şərab,
Bu xanəxərabi xərab et, xərab.

Müğənni, gəl avazə Şəhnaz ilə,
Al ağuşuva tarı yox saz ilə.

Könül mülkini etdi tarac qəm,
Bu deyrə əbəs qoydı Adəm qədəm.

Ey Adəm, nə vardur bu viranədə,
Yüzüm gülmədi heç bu qəmxanədə.

Məni mübtəla eylədün möhnətə,
Əl atmış yetən pərdeyi-ismətə.

Ayurdun məni sevgili yardən,
Könül behcəti, mahrüxsardən.

Dutub aləmi fitneyi-inqilab,
Sən oldun səbəb, olmuş aləm xərab.

Gətür, saqiya, ver səbuyi-mey,
Yerit məclisə bəhri-cuyi-mey.

---
* Etmirsən

Cəhan düşməsün badə, viranədür,
İçüm məst olum, xəlq divanədür.

Hanı şövkətü cahi-gərdənkəşan?
Hanı kişvəri-padşahi-Kəyan?

**II**

Gətür, saqiya, ver şərabi-kühən,
Yetüb fəsli-gül, seyri-bağü çəmən.

Şərabi-kühən həmdəmi-pirdür,
Ki, piri-muğandən bu tədbirdür.

Cəhan inqilabın fəramuş qıl,
Səbudən mey dəmbədəm nuş qıl.

Güzərgahi-qəmdür cəhani-xərab,
Onun fitnəsi göstərür inqilab.

Dur, ey saqi, ver badeyi-biğəşi,
Ayıq olmayum bu dəm şeş-beşi.

Dənitəb` nadanə həmrazdür,
Kəmal əhlinə meyli çox azdur.

Gədayə verür təxtü taci-gühər,
Qulamə pəriçöhrə, zərrin kəmər.

Verür bülbüli-zarə künci-qəfəs,
Basub bağrına qönçəni xarü xəs.

Cəhan sərbəsər fitnəabaddür,
Bu viranədə bir nəfs şaddür.

Peşimandur kim qoyubdur qədəm
Bu viranəyə, əhli dəmbədəm.

Şüar et özüvə meyi-sürxru,
Cəhan əhlinə eyləmə sərfiru.

**III**

Başun ola taci-Keyxosrovi,

Et izhar min mö`cüzi-İsəvi.

Əyağdan-əyağə salur qəm səni,
Görən olmaz heç kimsə xürrəm səni.

Həzar afərin bər meyi-sürx bad,*
İçəndə nədür bilmisən Keyqubad.

Həlal etdi danayə fitvayi-əql,
Meyi-gülrüxi, zahidi-biəməl.

Şəriətdə nadanə olmış həram,
Sən içmə mey, zahid, ol İslam.

Gətür, saqiya, badeyi-biğəşi,
Səbuyilə ver, etsə atəşi.

Qəmə vermə yol, çəkməz əl, badə iç,
Gecə-gündüz ustadə üftadə iç.

Ol azadə, get, xanəbərduş ol,
Yetsə sana, dinmə xamuş ol.

Giran olma ki, Qarun kimi,
Eylə varü yox tərki Məcnun kimi.

Başunda sənün eyləsün quş yuva,
Qəmi-yardə canun qıl fəda.

Qoy, etsün sana cövrini çərxi-dun,
Yetər bir gün axır olur sərnigun.

**IV**

Müğənni, nədür nəş`ə Mənsurdə,
Dəgiş pərdəni şurə gəl Şurdə.

Sədayi-kəmançə, dəfü çəngü ney,
Deyər hardadur, hanı Kavusü Key.

Yetişmüb hələ vəqti-azadəlik,
Var isə, nədür belə üftadəlik.

* Qırmızı şəraba min dəfə əhsən olsun!

Gər azadəlikdən oleydi nişan,
Cəhan mülkini qərq etməzdi qan.

Nədür abü atəş, nədür xakü bad,
Bütün fitnədür sərbəsər bədnihad.

Yeri yandırur sərbəsər xüşki-tər,
Gərək ondan hər ləhzə etmək həzər.

Təlatümdədür birsi ruzü şəban,
Olur qərq kim, onda pirü cəvan.

Yerində sönəndür çirağı-həyat,
Əlindən onun edər kainat.

Yeri yox edər nazpərvərləri,
Qucağında şahənşahi-əfsəri.

Hanı Yusif ol mahi-Kən`an idi,
Fəraqında Yə`qub giryan idi.

Gözündə dutub marü əqrəb vətən,
Qübarə dönüb kül kimi gül bədən.

Bu həngaməyə diqqət etmək gərək,
Ki, sərkeşliyə nifrət etmək gərək.

Tökər qan nə içün bu növ`i-bəşər,
Nolub neydən ötri verən yox xəbər.

## BÜLBÜLÜN GÜL VƏ XAR İLƏ MÜZAKİRƏSİ

Gətür, saqi, şərabi-ərğəvani,
Gərək nəhy olmasun mey gül zəmani.

Zəmanə inqilabın yad qılma,
Nə yetsə ondan, heç fəryad qılma.
Cəhan mülkində, get, ol laübali,
Eşitmə, badə iç, boş qeylü qali.

Cəhanun zərrəcə yox e`tibari,
Bu bir az ömrdə qəm çəkmə, bari.

Vücudin etmə key əndunhü qəmdən,
Şərabi-nabi, get iç, cami-Cəmdən.

Təmam et ömrüvi meyxanələrdə,
Yox adəm məscidi-viranələrdə.

Ayıqlıq sevməyür heç bu zəmanə,
Mey iç, zahid qala, qoy, yanə-yanə.

Güzarım bağə düşdi şadü xəndan,
Əlimdə cami-mey, giysuyi-canan.

Başımda şuri-eşqi-yari-məhru,
Gözi zahidfərib, rəşki-ahu.

Nə gördüm şaxi-güldə, bülbüli-zar,
Urdı nalə ney tək dideyi-xunbar.

Dedim dildarə, ey tabü təvanım,
Fəda olsun sana bu xəstə canım.

Nolub bu bülbüli-şirinzəbanə,
Nədür bais bu fəryadü fəğanə.

Dedi, get, sorgilən bir hali-zarın,
Nolub, əldən veribdür ixtiyarın?

Yetişdim bülbülə gülzar içində,
Dolanurdi pərişan xar içində.

Dedim, bülbül, nədür bu ahü nalə?
Nədür dərdün mana qıl gəl həvalə.

Dedi, yox tab səndə, natəvansan,
Çəkil məndən, çəkil şadmansan.

Yüzin xarə dutub ba ahü nalə,
Kim olsa, ney kimi ağlar bu halə.
Dedi xarə, əman səndən, cəfacu,
Gətür əl məndən, ey əğyari-bədxu.

Əlündən eylərəm fəryad hərdəm,
Səsimdən təngə gəlmiş xəlqi-aləm.

Məni, qoy, eyləyüm bir dəm təmaşa
Gülə, eşqündəyəm avarə, rüsva.

Gəhi səndən yetər, gəh bağbandan
Cəfalar, əl çəkün bu natəvandan.

Gəhi-məskən mana künci-qəfəsdür,
Əgər bu imtəhan etməkdü, bəsdür.

Dedi xar əndəlibi-xoşnəvayə,
Ömr gərək səbr eyləsün aşiq cəfayə.

Gəzirsən gənc içün, birənc olmaz,
Əziyyətsiz müyəssər gənc olmaz.

Mənim nişim sana ruhi-rəvandur,
Nə kim, sərmayeyi-afati-candur.

Qızıl ta düşməsə girdabi-qalə,
Ona verməzlə bir sınmış piyalə.

Bilərsən qədri-gül çəksön cəfani,
Cəfani çəkməyən görməz səfani.

Təriqi-eşqi, get, pərvanədən sor,
Nədür paybəndi-giysu, şanədən sor.

Vırar şəm`ə özin, pərvani bilməz,
Yanar, bir zərrə ahü vani bilməz.

Gərək aşiq keçə min canü sərdən,
Nə hasil tökdigün əşki-bəsərdən.

Cəfadən etmədi fəryad Məcnun,
Cəhan mülkində qoydı ad Məcnun.

Başində tikdi quşlar aşiyani,
Sənün tək etmədi ahü fəğani.
Hanı, hiç səndə yox asarı eşqün,
Nədür kim, bilmisən miqdarı eşqün.

Neçün bəs çəkdi Yusif cövri-zindan,
Əziyyət çəkdi, Misrə oldı sultan.

Bu sözdən bülbüli-zar oldı xamuş,
O xamuş oldı orda, mən də mədhuş.

Gülə yüz dutdı bülbül, çəkdi avaz,
Mana bəsdür dəxi, gəl, etmə çox naz.

Mən ilə bir nəfəs həmraz ol, gəl,
Cəfa rəsmin unud, dəmsaz ol, gəl.

Məni hicr atəşində yandurursan,
Məni od yanduranda, yan durursan.

Dedi gül bülbülə, get, bivəfasən,
Urursan eşqdən dəm, boş həvasən.

Əgər olseydi səndə eşqi-kamil,
Edərdün daməni-xar içrə mənzil.

Məni od yandurur, sən bixəbərsən,
Mana bica, əbəs tə`n eyləyərsən.

Gəhi gülçin əlində xarü zarəm,
Gəhi əttar əlində dilfikarəm.

Salur od canimə əttari-zalim,
Sana vazeh degül hərgiz bu halim.

Çəkər ətrim od ilə ol cəfakeş,
Sənüntək etmirəm bir zərrə təşviş.

Sana hiç urmayubdur nişini xar,
Verürsən nalə ilən xəlqə azar.

Qəmə səbr etməyən yetməz muradə,
Gər etsön məstlik, sərf etmə badə.

Hərifi-şe`rdür, Nadir, bu Saqib,
Gedüb bisərü payə olma talib.
Müqəyyəd olgilən, Yusif, Cəlalə,
Yetərsən məqsədə, həddi-kəmalə.

Sataşma Asəfə, mümtazdür ol,
Şikari-şe`rdə şəhbazdur ol.

Desəm Azər əgər Azəristandur,
Fünuni-şe`ri ilə sanma yalandur.

Müniri çərxi-nəzmə mahi-taban,
Ziya təxti-qəzəl üstündə sultan.

**MÜXƏMMƏS**

Gedirdim məstü bixud, bixəbər hər qəmdən, azadə,
Başımda nəş`eyi-mey, bilməz idim var nə dünyadə,
Əsir olmışdım əncaq dami-zülfi-bir pərizadə,
Şəbi-hicran qəmin yad eyləməzdim, düşməsün yadə,
Bir əldə daməni-canan bir əldə badə minadə.

Güzarım düşdi nagəh məstkən bir künci-viranə,
Bütün bayqu yuvasi kim, nəzər etsəydi hər yanə,
Oturmış şəxsi gördüm oxşayurdı çox Süleymanə,
Çürük təxtinün üstündə, başında taci-şahanə,
Qurı bir cism xali candan, bihuş, üftadə.

Əl atdım damənindən dutmağa, gördüm qübar olmış,
Təəccüb eylədim mən bu cəhanda tacdar olmış,
Cəhanı dutmuş idi, sahibi-külli-ixtiyar olmış,
Nə olmış imdi belə tö`meyi-hər murü mar olmış,
Hanı cahü cəlali, şövkəti getmiş bütün badə.

Ayıldım məstlikdən mat olub heyranlıq əl verdi,
Özümi bilmədim, divanəvəş giryanlıq əl verdi,
Gözümdən seyl tək hər ləhzə xunəfşanlıq əl verdi,
Tənimdə qalmadı tabü təvan, bicanlıq əl verdi,
Xəbər kimdən alum bu sirri heyran qaldım aradə.

Gözüm nagəh sınıq divarun üstə düşdi bayquyə,
Pərişan durmış idi nigah eylərdi hər suyə,
Sual etdim, neçün məşğul bu bangi-qu-quyə,
Dedi, vardur səbəb, məşğuləm hərdəm naləyə, muyə,
Qulaq dut, kəşf edim bir-bir sana, ol vaqif hər zadə.

Süleyman(ə) mülkidür bu durduğum yer böylə virandur,
Düşüb bu halə bir bax, məskəni-quli-biyabandur,
Qalub topraq içində, tikdigindən çox peşimandur,
Gəda ilə şəhün bir zərrə yox fərqi ki, yeksandur,
Könül vermək nə hacətdür bu dünyayə, bu bərbadə.

Dedim, Davudun oğlı, əl gətür, bu həft kişvərdən,
Bütün aləmləri təsxir edüb bihədd ləşkərdən,
Təfaxür eyləmə cəm` eyləyübsən simü zərdən,
Gedər bir gündə badə, kəs təm` bu dürri-gövhərdən,
Gəlür bir gün yetişməz daduva, çox olma dildadə.

Hanı ol kişvərün, tacun, xəzinön getdi bir dəmdə
Fənayə, bilməyürsən hardadur, yat guşeyi-qəmdə,
Yazılmışdı bu sözlər baxmayurdun nəqşi-xatəmdə,
Sözindən pənd murun almadun bir zərrə aləmdə,
Verürdi təxtün üstə, durmış idün bəzmi-ə`ladə.

Həmin mur imdi gəlmiş gözlərün küncin məqam etmiş,
Yeyüb ağın-qərasın mar ilə, qalmub təmam etmiş,
Məniyyət eyləyən aləmdə ancaq fikri-xam etmiş,
Vay olsun halına hər kim özini nəfsə ram etmiş,
Pozarlar adını, quldur deyərlər nəfsə mə`nadə.

Hanı Cəmşidi-Cəm, Keyxosrovü Daravü İskəndər,
Biri xüşti-dəri-meyxanə olmuşdur, biri sağər,
Biri divar olubdur, birsi kuzə, birsi xakəstər,
Könül bu dəhri-dunə vermək olmaz, dərdidür yeksər,
Tərəhhüm eyləməz, tapşurmaq olmaz seydi səyyadə.

Nigah et Saqibə, vəqtində Rüstəm tək dəlir olmış,
Cəhan mülkində sani yoxdı anə, binəzir olmış,
Baş əgməzdi fələk sultaninə, əjdərzəmir olmış,
Kəməndi-fitnə imdi əsirü xəstə pir olmış,
Düşər bundan bətər halə o kim, kəc baxdı ustadə.

## MÜXƏMMƏS

Deyüb Məcnunə bir şirinləbü şirindəhan qardaş,
Qədi bir sərvi-novrəs, türrəsi ənbərfəşan qardaş,
Ləbi gülbərgi-tər tək, əbrusi tiği-cansitan qardaş,
Yüzi ayineyi-gitinüma, Yusifnişan qardaş,
Görənlər söləyərdi kim, budur huri-cinan qardaş.

Gətür əl Leylidən, ver könlüvi mən şuxi-tənnazə,
Cəhanə salmışam bu hüsnilə aşub avazə,
Xudadad hüsn var məndə, güli-tər qönçədən tazə,
Cəhanə fitnə sallam, əl atam gər işvəvü nazə,
Yatubdur gözlərimdə fitneyi-axirzəman, qardaş.

Ləbi-meygunimün məftuni ol yaquti-heyrandur,
Könüllər həsrətindən kasə-kasə, binəva, qandur,
Yanarsan arizi-alım odı bir bərqi-suzandur,
Nədür Leyla mənim yanımda, bir quli-biyabandur,
Sana mən tək çətindür, olmaz hərgiz mehriban, qardaş.

Dedi Məcnun, əgər sən rəşki-huri-baği-cənnətsən,
Sözüm yox, lütfsən başdən-əyağə, mahi-təl`ətsən,
Cəhanə salmısən bu hüsnilə aşubi-şöhrətsən,
Gözəlsən, doğrudur, biehtiyac zibü zinətsən,
Vəlakin etmisən eyb olmasun çox bədgüman, qardaş.

Degülsən Leyli, əncaq xarsən, get göz qabağından,
Gözümlə baxgilən sən Leyliyə, çəkmə əyağından,
Su verdüm qədi-sərvinə anun bu göz bulağından,
Qızılgül, lalə almış rəngü buyin al yuvağından,
Əyağından öpər xurşid, mahü asiman, qardaş.

Könül Leyladən özgə qeyri yarı arizu etməz,
Başı getsə, bir özgə yarı aşiq cüstücu etməz,
Məhəbbət əhli hərgiz padşahə sərfiru etməz,
Əgər Məcnun mənəm, bil, meyli-qeyri-mahru etməz,
Könüldə qalmayub ol mahçün tabü təvan, qardaş.

## MÜXƏMMƏS

Künci-meyxanədə getdim mey içüb, meyalud,
Gördüm orda oturub tarzənü nəğməsürud,
Oxıyur bu sözi, saqi, hanı Sultan Məhmud?
Cam ver, çoxları topraq eləyüb çərxi-kəbud,
Özi yox, dildə qalub nami-Süleymanü Davud.

Saqiya, ver qulağun sağərə eylər necə dad,
Sitəmi-çərxü fələkdən deyüm olsun sana yad,
Qafil olma, həzər eylə, eləmiş gör nə fəsad,
Aç gözün, bax, mənəm ol kəlleyi-Kavusü Qubad,
Kuzəgərdən xəbər al, qalmayub asari-vücud.

Yorulub yolda qalubdur hələ Cəmşid ilə Cəm,
Qoya bilməz bu yerə cür`əti yox hiç qədəm,
Dağılub hər biri bir yanda qalub kusü ələm,
Qaldən-qalə keçərlər necə keçdim mən həm,
Bu yerə eyləmişəm, fikrüvi ver, tazə vürud.

Şahidimdür bu sözə rətlü səbuyi-kuzə,
Çeşmi-şəhlayi-Züleyxa, qədəhi-firuzə,
E`tibar eyləmə xurşidi-cəhanəfruzə,
Kimə göstərdi vəfa səltənəti-dəhruzə,
Olmayub hiç kimün tale`i bir gün məs`ud.

Xüm durub guşeyi-meyxanədə min ah çəkər,
Ürəgində dolıdur mövc urur xuni-cigər,
Kim yesə loğmeyi-şürbin dolanur qanə dönər,
Bu Fəriduni-zəmandur nə ki, Sultan Səncər,
Aləmi fəth eləmişdi, de görüm, etdi nə sud.

Xişti-meyxanəyə bir diqqət elə, al ibrət,
Beş günün səltənətiçün nə çəkərsən həsrət,
Əli boşdur, hanı ol cahü cəlalü şövkət,
Qeysəri-Rumdür ol, eyləməyürsən hörmət,
Yuxıya gəlməyür hərgiz elə olmuş nabud.

Ey Xəlilün adını zikr eləyən sübhü məsa,
Hanı dəryanı yaran zərbi-əsayi-Musa(ə),
Yer-yer üstə tökülüb xakə dönüb şahü gəda,
Çoxları saldı yola bu yüzi qarə dünya,
Genə sən istəyəcəksən bu sözə bir məşhud.

Baxma gülşəndə gülə, bir neçə gün xəndandur,
Ondakı qırmızılıq, eylə yəqin kim, qandur,
Ol Səyavuşi-zəmandur, qanına qəltandur,
Əndəlib ağlar onun halına, sərgərdandur,
Bu sözi təsdiq edür naleyi-tarü neyü ud.

Yasəmən bərginə bir bax, əgər olson huşyar,
Saralub rəngi qəmaludə durub leylü nəhar,
Arizi-Leylidür ol eylədi Məcnuni düçar,
Dəli-divanəligə xəstədilü zarü nəzar,
Çöllər avarəsi insanlar içində mərdud.

Rəbbəm aləmlərə Fir`on dedi dünya dutdı,
Bir zəman keçmədi axır onı dərya dutdı,
Mən kəliməm, dedi Musa(ə) yədi-bəyza dutdi,
Çoxları boş yerə bica belə sövda dutdı,
Belə də`va eləyənlər çox olub, yoxdur hüdud.

Oxıyur künci-xərabatdə hər bayqulər,
Aşiqə cövrü cəfa etməyün, ey məhrulər,

Tö`meyi-murü ilan oldı kəmanəbrulər,
Qanə qərq etdi cəhan mülkini kim, bədgulər,
Necə bu qanı yusun həşrəcə dəryaçəvü rud.

Mərdsən, maluvı fəqr əhlinə ehsan eylə,
Nə ki, məscidə gedüb növhəvü əfğan eylə,
Ənkəbutun yuvasın yıx yerə, viran eylə,
Saqiba, get, Vətənə canuvı qurban eylə,
Vətənün olmasa heç eyləmə Allahə sücud.

Maluvun xümsü zəkatın meyi-meyxanəyə ver,
Varü yox tərkin elə, bir dolı peymanəyə ver,
Nə ki, zahid kimi din səbheyi-səddanəyə ver,
Göstərür, get, sənə yol fikrüvi pərvanəyə ver,
Canını şəm`ə verür zərrəcə verməz belə dud.

## FÜZULİDƏN TƏXMİS

Dil qıvrılur ilan tək zülfün düşəndə yadə,
Neyçün xəyali-xamə mən eylədüm iradə,
Dinü dil aldı məndən xalun həramzadə,
"Olseydi məndəki qəm Fərhadi-mübtəladə,
Bir ah ilə verürdi min Bisütuni badə".

Əl çək, təbib, məndən incitmə dil yarasın,
Mərhəm qəbul etməz, canan bilür dəvasın,
Canan uyub rəqibə, tərk eyləmiş vəfasın,
"Versəydi ahi-Məcnun fəryadımun sədasın,
Quşmı qərar edərdi başındaki yuvadə".

Yusifdə hüsn fəxri, min işvədə Züleyxa,
Buyi-qəmisi-Yusif Yə`qubi qıldı bina,
Bülbül gəzər çəməndə eylər gülə təmaşa,
"Fərhadə zövqi-surət, Məcnunə seyri-səhra,
Bir rahət içrə hər kəs, ancaq mənəm bəladə".

Səndən təəllüq üzməm, olduqca xar ümidim,
Etdikcə cövr durmaz səndən kənar ümidim,
Hicrün odında yansun, leylün-nəhar ümidim,
"Əşki-rəvanimə el cəm` ola var ümidim
Kim, ola varə-varə cəm`iyyətim ziyadə".

Salmış cəhanə fitnə, ey məh, siyah çeşmün,
Yəğmayə küfrü dini verdi nigah çeşmün,

Hər yanə tünd baxsa, eylər təbah çeşmün,
"Gəh qəmzən içmək istər qanumi, gah çeşmün,
Qorxum budur ki, nagəh qanlər ola aradə".

Künci-qəfəsdə, bülbül, az bir də ahü zar et,
Xəlqə əziyyət etmə, xəlqilə xoş mədar et,
Hər nə müqərrər olmış, can ilə ixtiyar et,
"Sər vermək istər isən, üftadəlik şüar et,
Kim, düşməsə əyağə, çıxmazdı başə badə".

Yoxdur cəhandə hərgiz bir aşina, Füzuli,
Görsön də var onda yüz min riya, Füzuli,
Saqib deməz yalandur, ey mən fəda, Füzuli,
"Gər görmək istər isən rəsmi-vəfa, Füzuli,
Olma vəfayə talib, dünyayi-bivəfadə".

## MÜRƏBBE`

Ey ki, çoxdandu könül vəslinə olmış müştaq,
Ölürəm, rəhm elə, yandırdı məni nari-fəraq.
Hicr odında sənün Qeys tək, ey simin saq,
Gəzirəm dağı, daşı vəhşilər ilə çıplaq.

Qəm evində oturub zar qucub dizlərimi,
Ağlamaqdan necə, gör, kur elədim gözlərimi,
Sərf qıldım rəhi-eşqimdə ki, simü zərimi,
Fəqrlər tək vıraram mən də yamaq üstə yamaq.

Arizün rəşk verür gögdə məhi-tabanə,
Ey boyı sərv, qaməti yay, dişi dürdanə.
Rəhm qıl aşiqinə, zülfinə az vır şanə,
Çünki bu xəstə könül onda dutubdır oymaq.

Yansa canım əgər odlarə, o minayə fəda,
Tökülən gərdənə ol zülfi-çəlipayə fəda,
O kəman qaşlara, ol nərgisi-şəhlayə fəda,
Rəhm qıl aşiqınə, bunca nədür qaşü qabaq.

## QİT`Ə

Tiryak düşkini özüvi qılma, heyfsən,
Namusi-ardən səni məhrum etməsün,
İç badeyi-mürrü qey rətli-giran ilə,
Əl çək ərəqdən, əqlüvi mə`dum etməsün.

## RÜBAİLƏR

Xalidürmi, dedim, ey şux, miyani-iki eyn,
Ya Xəta ahusi yatmış belə beynəlhərəmeyn.
Dedi, divanə, nə bu xal degül, nə ahu,
Cənnətizadə qul oğlı nəcibül-tərəfeyn.

* * *

Künci-ləbündə xal bir, türreyi-müşkfam iki,
Neyləyə mürği-dil əgər danə bir olsa, dam iki.
Vaizü möhtəsib deyür vermə könül bu məhvəşə,
Bəxtini püxtə eyləməz, netməli olsa xam iki.*

* * *

Qızıl gül söləyür, yox dəstgahım,
Qaçardım, bağlıdur hər yerdə rahım,
Günahım zərrəcə yox yandırullar,
Nolur halım əgər olsa günahım.

* * *

Xasiyyəti-mey kibrü qürur eylər kəm,
Meyxanədən, ey dil, mey içüb çəkmə qədəm,
İblis əgər içeydi dürdi-meyi-nab,
Xaki-dərinə səcdə edərdi Adəm.

* * *

Xişti-sürxim məmləkəti-Cəmdən xoş,
Bir sağəri hər iki aləmdən xoş,
Kim versə mey üftadəsinə sağəri,
Ey saqi, düşər səxayi-Hatəmdən xoş.

* * *

Yıxdı məni bu rənci-xumar, ey saqi,
Getmiş bütün əldən ixtiyar, ey saqi,
Doldur qədəhün künci-səbudə mey var,
Etsün nə edür bu ruzigar, ey saqi.

---

* Rübainin əvvəlində belə bir qeyd var: "Haşım bəg Saqib nəzirə Tahirəyə". Bu rübai XIX əsrdə yaşamış İranın məşhur şairəsi Tahirə Qürrətüleynin "Xal be konce-ləb yeki, torreyi-meşkfam do..." rübaisinin tərcüməsidir. Yəqin ki, şair nəzirə dedikdə tərcümə nəzərdə tutmuşdur.

* * *

Qəm etdi məni xanəxərab, ey saqi,
Dur, bir edəlim əzmi-şərab, ey saqi,
Heçdən buraya gəlmüşük, hiçə gedərüz,
Kim bizdən alar həqq-hesab, ey saqi.

* * *

Ta badeyi-xoşgüvar var, ey saqi,
Qoyma məni bir dəm huşyar, ey saqi,
Sərməsti-şərab et məni, ey xanəxərab,
Nə badə qoyar, nə badəxar, ey saqi.*

* * *

Bilmür nə gəlür başinə dünyayə gələn,
Şad etməyəcək heç kimi bu beytül-həzən,
Sərf etmə hədər ömrüvi, sərməsti-mey ol,
Məst olmason, əl çəkməyəcək dərdü mihən.

* * *

Dövrün dəgişür bu ruzigar, ey saqi,
Sən badə gətür, ol huşyar, ey saqi,
Yıxsa məni, çək məni meyxanə tərəf,
Məst eylə məni fəsli-bəhar, ey saqi.

* * *

Əfşan eləmiş zülfüni yar, ey saqi,
Rüxsarə dil eylər ahü zar, ey saqi,
Bari, elə aram bu divanəni bir,
Bir cami-şərab ilə biyar, ey saqi.

* * *

Qoy yatmasun aşubi-zəman, ey saqi,
Qərq eyləsün aləmləri qan, ey saqi,
Sən sağəri doldur, nə olur, qoy olsun,
Qoyma ayıla pirü cəvan, ey saqi.

* * *

* Rübainin əvvəlində müəllifin belə bir qeydi var: “Nəzireyi-rübaiyi-Şah Xətai”

Heçdür görürəm qiyməti-dünya bir cov,
Dəgməz iki günçün salasan aləmə lov,
Ver varü yoxı dürdi-meyə yarı girov,
Xişti-dəri-meyxanə olub Keyxosrov.

## "ÇƏKMƏ DÜNYAYİ-DƏNİ FİKRİNİ..."

Çəkmə dünyayi-dəni fikrini, ol meyalud,
Vermə yol möhnətü ənduhə, olursan nabud,
Hanı ol həşməti-arayişi-sultan Məhmud,
Saqiya, sağəri-mey ver, sitəmi-çərxi-kəbud,
Qoymaz heç bir kəsi bir dəm ələ salsun məqsud.

Qədəhi qoyma yerə, ruhə qəzadur meyi-nab,
Əhli-halun fərəhi, dərdə dəvadur meyi-nab,
Künci-meyxanəni dut, pirə əsadur meyi-nab,
Həqqidən ayrı degül, rahnümadur meyi-nab,
Dilnişin badə ilə oldı sədayi-Davud.

Olma sərkeş belə üftadəligə, mö`tad et,
Etmə rüsva özüvi, yaxşı cəhandə ad et,
Kimi görsön yıxılub, dut əlini imdad et,
Rəhm qıl kim ki, giriftarun ola, azad et,
Pis əməldən həzər et, olmayasan namərdud.

Düşmə təşvişə əlindən gedə gər malü mənal,
Gedənün fikrini etmə, gələnün fikrinə qal,
Hər yaranmış başınun üstə durub fitnə, zəval,
Düşməz əndişəyə dünya dağıla, əhli-kəmal,
Qane` ol yaxşı-yəmanə, nə olubdur mövcud.

Vermə dünyayə dil, həqdən səni eylər məhrum,
Doludur möhnətü ənduh ilə bu məskəni-bum,
Nə bu viranə yetirmiş, olur axır mə`lum,
Ədəmün qeydini çəkmək degül vəqti-lüzum,
Hanı ol gördigimiz, bir-bir olmuş məfqud.
Çox gəlibdür bu cəhan mülkinə Musa(ə) kimilər,
Xəlqi heyrətdə qoyub həm yədi-beyza kimilər,
Yetməyib məqsədinə getdi Məsiha kimilər,
Neynəyər gəlsə bu viranəyə Dara kimilər,
Dərsi-ibrət bizə vermiş xəbəri-Adü Səmud.

Mə`rifət badəsini, sağəri dut, nuş eylə,
Rəngi-dünyayə könül vermə, fəramuş eylə,
Nəxvətün şəm`ini bir ahilə xamuş eylə,
Baədəb məclisi-rindandə otur, guş eylə,
Nə deyür fikrüvi ver, naleyi-çəngü neyi-ud.

Simü zər cəm`i içün heç özüvi etmə məlul,
Etməsən heç kimə ehsan, səni qoymaz qara qul,
Birinə verməyəcəksən, bu sözi eylə qəbul,
Cəm` edirsən zərü simi, ola aləm sana qul,
Dutasan şişəyə qanın tanımazsan mə`bud.

Sərvətün düşkini olmaq sana rahət verməz,
Gözüvi yumub açan qədri fərağət verməz,
Nəfsüvə olma giriftar, şərafət verməz,
Daməni-fəqrdən əl çəkmə, xəcalət verməz,
Eylə təslim özüvi həqqə, olursan məs`ud.

Dövlətün ləzzəti vardur edəsən ehsani
Həqq yolunda, gedənün olmayasan giryani,
Şad ol, ondadur hər mərəzün dərmani,
Ram olur xəlq, salarsan əlüvə dünyani,
"Şərəfi-mərd bəcudəst, kəramət bəsəcud".*

Xəlqə ehsan əlini açson, olursan eymən,
Dutmaz hərgiz sana yüz zərreyicə dərdü mühən,
Özüvi öylə yarat, bilməyəsən heç sənü mən,
Göstərübdür bizə bu nüktəni xəllaqi-süxən,
Sə`diyü Hafizü Firdovsi dühayi-məşhud.

Zərü simün təmə`i qərq eləyüb dünyani
Qanə, yoxdur xəbərün, aləm olubdu fani,
Ahü nalə eləyür süngilərün qurbani,
Əyağun altına, gəl, eylə nəzər bir ani,
Kimdür onlar, hanı, yox səndə məgər guşü şünud?

## "GƏLDİ-GETDİ, XƏBƏRİM OLMADI..."

Gəldi-getdi, xəbərim olmadı heç şamü səhər,
Faidə verməyəcək boş yerə dutsam da xəbər.

Məni nəfs eylə giriftar eləmübdür özinə,

* İnsanın şərəfi əliaçıqlıqda, kəraməti isə səcdədir (Sədi Şirazi)

Qəmini çəkmərəm aləm ola gər zirü zəbər.

Nə içün gəlməgimün fikrini heç eyləmədim,
Yetişüb vəqti-səfər, sərf elədün ömri hədər.

Nə vətən var, nə bir yerdə yerim var mənim,
Olar idi eşideydim mən əgər pəndi-pədər.

Mələkül-mövt durubdur qapu ağzında deyür,
Dur gedək, qoy qala cəm` eylədigün sim ilə zər.

Badeyi-qəflət ilə eylə xumaraludəm,
Mana tə`sir eləməz başimə daş düşsə əgər.

Nə məcusəm, nə müsəlman, nə gəbrü nə yəhud,
Nə müvəhhid, nə də müşrik, hamundan bədtər.

Sormadım bilmədigim əmri biləndən hərgiz,
Odur həqqün sözi bir zərrə mana etməz əsər.

Fikrimi verdim həmişə qurı ləhvü ləəbə,
Salmadım yadimə qəhrü qəzəbi-Peyğəmbər.

Xahişi-nəfs xilafini mən heç eyləmədim,
Nə dedi, etdim itaət, belə xidmət kim edər.

Ərəqü badəyə, əfyunə müqəyyəd oldum,
Nifrət etsə mana gər var yeri mürtəd, kafər.

İctinab eyləmədim əmri-qəbihdən hərgiz,
Ləblərim yar ləbində, dolı əldə sağər.

Etmədim sidq ilə mehrabi-itaətdə sücud,
Qoymadı sərhədi-həqqə yetişəm şurişü şər.

Nə cəvabım olacaq Həqqə dəmi-məhşərdə,
Nə yüz ilə dil açum həqqə məni-bədəxtər.

Tələbi-məğfirəti hansı günahimdən edüm,
Bir tərazu bu ağır barı çəkər hiç məgər?

Xətmi-Peyğəmbərə izhar eləsəm əhvalım,
Deyəcəkdür mana, çox tökməgilən əşki-bəsər.

Hansı bir hökmimə sən etdün əməl söləyəcək,
Yoxdur, əl çək ətəgimdən bu təmənnadə səmər.

Mürtəza(ə) damənini dutsam o da söləyəcək,
Ahü nalön eləməz heç kimə bir zərrə əsər.

Necə mən Şahi-şəhidün yapuşum damənınə,
Əl qısa, daməni-pakinə güman etmə yetər.

Ölçü yoxdur görürəm eylədigim mə`siyətə,
Mə`siyət eyləsə kim, rəxnəni imanə verər.

Nə cəhənnəmdə, nə cənnətdə yerim olmıyacaq,
Bir yerə gedməliyəm, ondan edər xovf səqər.

Genə zənn etmək olar bəlkə Əli(ə) naibinə,
Yüz dutam, etməyə məhrum məni ol sərvər.

Rədd olunmaz gər Əbülfəzl şəfaət etsə,
Çü sidq ilə verüb iki qolun ol sərvər.

Bu kifayətdür onun rütbeyi-biqiymətinə,
Biqərəz Şahi-şəhidə özin etdi nokər.

Saqiba, eylə həya, nəfsüvə çox olma əsir,
Var qabağunda, həzər eyləgilən, rahi-xətər.

### "...BU NƏ ODDUR ŞƏCƏRDƏDÜR.."

Sordum Kəlimdən, bu nə oddur şəcərdədür,
Od olmaz heç şəcərdə, bu hansı xəbərdədür.

Bu od şəcərdə atəşi-rüxsari-yardür,
Sönməz müdam şö`ləsi kim, bu cigərdədür.

Yusifdə xətm olmadı dünya gözəlligi,
Xətmün nişanəsi bu pəri simübərdədür.

Zərfün tünük olanda düşərsən təlatümə,
Dərya məcaz, rütbəsi əmma gühərdədür.

Dana gərək həmişə gedüb xuni-dil yesün,
Nadan həmişə xidməti-qəndü şəkərdədür.

Bədbəxtsən, əl atma suyə, yandurar səni,
Xoşbəxtlik gədayi-dəri-bəxtəvərdədür.

Dərdün olanda çarə sorarsan təbibdən,
Bidərd olanda sormısan,* əslən zərərdədür.

Zalim, sənün ümmidün əgər növki-tiğdür,
Məzlumun ümidi naleyi-ahi-səhərdədür.

Zər həll edər nə növ` ilə gər olsa müşkilün,
Həllali-müşkilat demə boş hünərdədür.

Tövbə məasidən eləyürsən sən ol zəman,
Canun yetibdü dodağuva, keçməz, xətərdədür.

Ümmidvar olma bu xümsü zəkatüvə,
Nəfsün sənün ki, hər nəfəs hər şurü şərdədür.

Bir cami-badə iç, özüvi imtəhan qıl,
Mə`lum edər təbiətüvi nə əsərdədür.

Hər inqilab olsa məgər xudsəranədür,
Sərriştəsi bu gərdişi-dövri-qəmərdədür.

Napak tüxmi Adəm əküb, əkmiyeydi kaş,
Xasiyyətün bədi, şəri nəsli-bəşərdədür.

Zalım təbiətini dəgişməz ölincə heç,
Əqrəb kimi həmişə gözi niştərdədür.

Nəxli-həyati qəhrlə hər dəmdə yandırur,
Əfsus eyləməz, nə deməz kim səmərdədür.

Sərraf gəzmə mülki-Yəməndə əqiq içün,
Hicrində ol məhün tökərəm çeşmi-tərdədür.

Saqi, hərifi-badə degül rindi-mədrəsə,
Qüdrət bu dəşt içində məni-şiri-nərdədür.

Pabəstə olma dəhri-dəni dunpərəstə kim,
Hər bir nəfəsdə meyli anun özgə ərdədür.

---

* Soruşmursan

Sorson əgərçi var vətənün oğlı, bəs hani,
Xainlərün əlilə gedüb, dərbədərdədür.

Çox vermə tul mətləbə, kutah qıl sözi,
Saqib, sözün şərafəti bir müxtəsərdədür.

## İSTƏR

Dünyayə gələn cib dolusı simü zər istər,
Xali ola zərdən, başı tiğü təbər istər.

Həqqün kişilikdə ola bilməz ki, zərün yox,
Simü zər ilə doldura cib, şiri-nər istər.

Gər çəkməyəsən zəhməti, zər səndə tapulmaz,
Tab eyləməgə zəhmətə ancaq hünər istər.

Qarə daşı lə`l etmək olar, leyk çətindür,
Dərya dolusı xalis xuni-cigər istər.

Dikmə gözüvi, naxələf övladdən əl çək,
Daim özinə düşmən ümmü pədər istər.

Dutsun atanun, ümmün əlin vəqti-zərurət,
Canım ona qurban, xələf bir pəsər istər.

Xacə sana sərmayə verüb eylə ticarət,
Xeyr eylədigündən onı sən bil, əsər istər.

Bir zərrə zərər eyləsən, itməz aradən,
Cəm` eyləgilən xatirüvi sərbəsər istər.

Sən keyfüvi çək, fikr eləmə, nə olur olsun,
Yox eybi qucağunda yata simü bər istər.

Ta sübh ləbün lə`li-ləbində ola sərməst,
Dil hər nə təmənna edə, get, qorxma, ver istər.

İç saqi əlindən gecə-gündüz meyi-nabi,
Bir ləhzə ayıq olma, ayıqlıq zərər istər.

Müzd meyə nəqd olmasa, ver dinüvi əldən,
Məhşər güni yaddan çıxacaqdur, keçər, istər.

Yol verməgilən dərdü qəmə, eyşü nişat et,
Təqva yolını dutmagilən, dərdi-sər istər.

Nisyə dalıyca getməgilən, nəqd var əldə,
Heyhat, ona yetməgə çox-çox səfər istər.

Mətruk olunub yaxşı, fərqi yox hərgiz,
Yaxşı-yəmanun fərqi nədür, kim məgər istər?

Ovqatuvi təlx eyləmə meyxanə yanında,
Dur, get, çağırur saqi ki, vəqtün itər istər.

Leyla tələbin eyləmək asanmı sanursan,
Məcnun də gər olson, genə rahi-xətər istər.

Məcnun bu yolı gedməlidür, sən dəxi tərk et,
Simürğ tək əflakə uçan balü pər istər.

Hər mö`min olan həqqə, Əbazər ola bilməz,
Xətmi-nəbi Əhməd kimi bir rahbər istər.

Əmrə Əlinün qollarıdi zərbəti vırdı,
Hərgiz demə zərbət ona, tiği-düsər istər.

Məğlub yədullah qolı hərgiz ola bilməz,
Hər ləhzə ona Həqq özi fəthü zəfər istər.

Dana nə əcəbdür ki, içər xuni-cigərdən,
Nadan nə içün ləzzəti-qəndü şəkər istər.

Hər kəs çəkə bilməz qəzəli rişteyi-nəzmə,
Versün ona tərbiyyəti sahibnəzər istər.

Yusifdən alub tərbiyəti qəmzədə Saqib,
Ruhinə anun rayihə, reyhani-tər istər.

### "...SİMÜ ZƏRDƏDÜR..."

Xəlqün həyatı səcdədə yox, simü zərdədür,
Zahid inanmayur, deməz əqli hədərdədür.

Huri-behişt simü zərün dəstgirüdür,

Gəlsün sübut edüm mən ona, həq nə tərdədür.

Nəylə Mühəmməd(s) eylədi isbat həqiqəti,
Ey bilməyən həqiqəti, fəhmün xətərdədür.

Simü zəri-Xədicə ilə ol Nəbiyyi-Həqq,
İsbat həqqin eylədi, doğrı xəbərdədür.

Kəskinligi qılınc eləmüb, yaxşı fikr ver,
Qövli-Əlini get oxı, tiği-düsərdədür.

Həllali-müşkilat qızıldur deyüb Əli,
Simü zərün nihalı bütün bu səmərdədür.

Olmaz bədəndə qüvvə qiyami-rüku` ilə,
Zərdən səvayi qeyriləri dərdi-sərdədür.

Bir loğma nani-cov sana möhkəm həsar olar,
Cov kəsbini qızıldur edən, bu hünərdədür.

Gər olmasa bədəndə rəməq tiği neyləyür,
Dutmaz əlün qılıncı, əgərçi kəsərdədür.

Bir loğma ta ki, nani-covı meyl eylədün,
Şəmşir əlün onda görərsən əsərdədür.

Zəntəb`lər əhatə edüb külli-aləmi,
Simü zərün güciylə cəhan dərbədərdədür.

Böhtan degül bu söz, səni, gör, kim əsir edüb,
Can verməræm yüzinə onun nəzərdədür.

Rüstəm nəyün gücilə qoyub ad zəmanədə,
Rüstəm bəhanə, qüvvəsi dürrü gühərdədür.

Keyxosrovun xəzinəsi məmluvvi-simü zər,
Müflis nə eyləsün, hərəkatı kədərdədür.

Düşməndən intiqamı alursan sən ol zəman,
Həmyan içində simü zərün var, kəmərdədür.

Şəxsün müqərrəb olmağını kəşf etmisən,
Həqqün yanında cümlə fəzilət pədərdədür.

Səhv etmisən bu sözdə, əzizim, degül belə,
Başdan-əyağə bu sözün, əl çək, zərərdədür.

Şəxsün təqərrübi əməl ilə olur yəqin,
Şirin olanda meyvə fəzilət şəcərdədür.

Allahi-zülcəlal desəm gər qızıl pula,
Hərgiz məlamət etmə məni, söz dəgərdədür.

İt ağzına qızıl pulı ver, canuvı alar,
Qul eyləyər səni qızıl ol bəxtəvərdədür.

Vay halinə o padşəhün kim, zəmanədə,
Yoxdı cibində varü yoxı, yeksər süvərdədür.

Xərc et yerində, aləm olar canfəşan sana,
Sərf eyləmə fəna yolına, meyli şərdədür.

Məzlumə açma dəsti-təərrüz, qıl ehtiraz,
Ümmidgahi naleyi-ahi-səhərdədür.

Bağlandı, Saqiba, dəri-ümmid, müxtəsər,
Yox cibdə simü zər, dəxi işlər xətərdədür.

**EY ZƏR**

Xudayi-ləmyəzəlisən əgər desəm, ey zər,
Məlamət etmə məni, sölәmə, get, ey kafər.

Sən olmason, əbəda, xəlqdə həyat olmaz,
Sən olmason, olar aləm yə`ni ki, zirü zəbər.

Sən ilə almaq olur intiqam düşməndən,
Sən ilə zəhri-bəla, bil, olur nəbatü şəkər.

Sən ilə fəth eləyər həft kişvəri sultan,
Bəhanədür duta kim əldə nizəvü xəncər.

Sən ilə açılur hər babi-qəl`eyi-fulad,
Sən olmason, dağılur padşahdən ləşkər.

Zər olmasa qədəmin qoysa piri-meyxanə
Şərabxanəyə, salmaz ələ sınıq sağər.

Necə sana eyləmüm səcdə gündə min dəf`ə,
Sən ilə zahid öpər xaki-məqdəmü mənbər.

Zərün güciylə ki, təbliğ eyləmiş xəlqə,
Yetişdi sərhədi-məqsudə Xətmi-peyğəmbər.

Fəda olum sənə, ey simü zər, əman günidür,
Əlimi dut, düri-naçizara yıxılsam əgər.

Ləimə qoma* məni bir dəm olmağa möhtac,
Ki, sərfiru eyləmüm, olsa şah ya qeysər.

Zərün gücini min e`caz eyləməz batil,
Xətərdən eyməndür, yoxdur onda rahi-xətər.

Əgər min oğluvı öldürsə göz qabağında,
Xəyal eyləmə sən heç birini, öldi hədər.

Nə ilə qan elədün bağrımi mənim, ey məh,
Nə ilə arizi-gülfamə vermisən zivər.

Bu mahparəni ram eyləmək degül mümkin,
Qılınc xəlqi kəsə, kainatə düşsə şərər.

Dodaqlarun soraram sübhədək meyaludə,
Zərün güci mana bu məhvəşi edüb çakər.

İt alsa ağzına zər kisəsini, bazarə,
O gündə xəlq deyər gəl, gəl, ey mələkmənzər.

Can almaq istəsə, aləm fəda verür canın,
Zərün güci belədür, etməsön əgər bavər.

Bir imtəhan elə, bəlkə xilafdür bu sözüm,
Çətin degül, bir imtəhan yerinə düşər.

Hüseyndə(ə) olsa idi simü zər Yəzidi-dəni,
Tapardı əl necə Şahi-şəhidə şamü səhər.

Həvayi-mülki-Rey heç bilmədi Hüseyn(ə) kimdür,
Bu mülki-Rey təmə`in etdi Şimri-bədəxtər.

* Qoyma

İmami-mütləqi zibh eylədi qəfasindən,
Qiyam etdi bu əmrə, bu zər degüldi məgər?

Vay olsun haluva, bir həbbə olmasun səndə,
Səni görəndə deyər, gəlmə, madərü xahər.

## "XURŞİD QƏRBDƏN..."

Xurşid qərbdən desə kim göstərür cəmal,
İnkar eləmə, demə, bir əmrdür məhal.

Təqdiri-əmri-Həq nəyə gər əmr eyləsə,
Yox ölçi etdigində onun, etmə kəc məhal.

Muri-zəifə şiri-jəyani əsir edər,
Bir göz yumub-açınca nə qədr etsə qeylü qal.

Şahi gəda, gədani şəh etmək əcəb degül
Tari əlində, xatirüvə yenməsün məlal.

Künhi-məşiyyətə sana yetmək məhaldür,
Aləm sən ilə fikr edə hər ləhzə mahü sal.

Mərbub rəbbsiz ola bilmüb, olan degül,
Əhməq təbiət eyləyə bilməz giyahı bal.

Şahənşəhi-zəmanə olubsan, bu bəs degül,
Bu sirri düşməsən* başa, çün səndə yox kəmal.

Rəbb olmaseydi səndə bu rütbə olarmıdi?
Haşa, əgər oleydi, nə bir yuxıydi ehtimal.

Məsnu` sane`in bilə bilməz nə oldığın,
Mürği-xəyali gər nə qədr açsa pərü bal.

Möhtacdür təbiət özi bir mürəbbiyə,
Su verməsön ki, nəşvü nüma eyləməz nihal.
Bir maddədən ayırmış özin, yaxşı fikr ver,
Ol maddəni gərək biləsən qarədürmi, al.

Ağü qərani bilməmisən, aşikardür,
Kəskin qılınc əlündə var isə, get, et cidal.

---

* Düşməzsən

Çoxlar deyüb mən aşiqəm, əmma xilafdür,
Məcnun bilür ki, eşq nədür, ondan et sual.

Nə oldığun xəlayiqə bir-bir əyandür,
Lazım degül, baş ağrısıdur xəlqə şərhi-hal.

Nəf`i nədür xəlayiqə sölərsən hər zəman,
Allah yoxdur, əl gətür, ey daiyi-şimal.

Malın xəlayiqün aparursan, get al, apar,
Allah yoxdur, etmə bəhanə, dolub çuval.

Sərkeşligi çox eyləmə, tərk et məniyyəti,
Eylər əyağı alta səni mur paymal.

Göstərmə qol güci o kəsə xaksardür,
Bir vəqt olur nəfəs çəkəsən verməsün məcal.

Ey qeyri nəfsə zülmini hər ləhzə eyləyən,
Mabeyni-xəlqə fitnə salub, salma ixtilal.

Keçməz səninçün, zülmüvə ver bir nəhayəti,
Rüsva edər səni belə bihudə infial.

Dərxatir eylə qisseyi-Zöhhaki-zalimi,
Bir Gavə etdi məmləkətin məhvü iştiğal.

Cəm` eylə xatirün, ayılursan bu tez zəman,
Təngişmə* çox, sana verilür yaxşı guşmal.

Dövri-fələkdən eymən olub etmə cövrüvi,
Təşvişə düşmə çox, yetişüb vəqti-intiqal.

Bəxtün qayıtsa, çarə kim etsün, əlac yox,
Tədbir eyləsön, dəxi də çox verür zəval.

Bir nəfsi bisəbəb kim ola, Saqib, incidə
Öz nəfsinün məramiçün, qanıdur həlal.

## GÖRDÜM

Cəhan əhlini bütün divanə gördüm,

* Darıxma

Vırar od özin hər yanə gördüm.

Mürüvvət bilməyür heç bir nə şeydür,
Verür fitva, tökülsün qanə gördüm.

Degül heç bir kişi hali qərəzdən,
Vəfadən bixəbər, biganə gördüm.

Təmənnası xilafi-əhdi-peyman,
Vırub od aləmi-insanə gördüm.

Vırur dəm çoxsı mən Qur`anpərəstəm,
İnanmur sərbəsər Qur`anə, gördüm.

Yatub məsciddə, zahid, xəlqi-aləm,
Əsər etmir sözün nadanə, gördüm.

Degül söz söyləyürsən xəlqə, əl çək,
Sözün həqqini qoydun yanə gördüm.

Sözün həqqini desön tə`sir eylər,
Deyər kim həqq sözə əfsanə gördüm.

Qurubsan xəlq üçün təzvir damın,
Əlündə səbheyi-səddanə gördüm.

Qəmi-dünyani çəkməz aqil hərgiz,
Yüzüm heç gülməyüb, qəmxanə gördüm.

Bu viranxanəyə mən gəlməz idim,
Məni Adəm gətürdi anə, gördüm.

Nə var bu dəhri-duni-bivəfadə,
Gədalər tapdı əl sultanə gördüm.

Şərabun nəş`əsindən bixəbərsən,
Əlaci-qəm genə meyxanə gördüm.

Alub pərvanədən eşq ixtiyari,
Vırar şəm`ə özin mərdanə gördüm.

Dedim Məcnunə, dutma eşq rəsmin,
Tiküb quşlar başunda lanə gördüm.

Fəraqi-Leylidə sərgəştə, heyran,
Olub məskən ona viranə gördüm.

Gəlür bir gün deyərlər xəstə Saqib,
Fəda etmiş özin cananə gördüm.

## "BÖHTAN ELƏMİŞ XƏLQ..."

Böhtan eləmiş xəlq, deyür əhli-bəyansən,
Səndə yox əsər, əhli-bəyan oldun haçan sən?

Musa(ə) kimi xidmət elə bir ləhzə Şüeybə(ə),
Et vadiyi-eymən tələbin gərçi şəbansən.

Afaqı dutub fitnə, onun çarəsin eylə,
Mən neyləyüm aləmdə Süleymani-zəmansən.

Yaxşı-yəmanun fərqini bildünmi məgər sən,
Heç bilməyəcəksən onı sən, bil ki, filansən.

Dutdun sən haçan, sölə, yıxılmışlar əlindən,
Bir vəqt ki, dutdun, deyərəm mən qocamansən.

Heç düşkini-nəfs olmağuvı eyləmə inkar,
Neyçün belə bəs, sölə ki, rüsvayi-cəhansən.

Ad qoyma yalandan özüvə yaxşı vücudəm,
Nahəq yerə hərgiz eləmə beylə güman sən.

Yoxdur xəbərün zərreyicə yoxsa özündən,
Bax ayinəyə, gör, necə aludeyi-qansən.

Ey badeyi-biğəş, səni zahid neçün içməz,
Başdan-əyağə rahəti-can, ruhi-rəvansən.

Verməm sənün hər qətrəvi min taci-Kəyanə,
Arami-dili-qəmzədeyi-pirü cəvansən.

Yol vermisən insanlıq edə əhli-fəsadə,
Hal əhlinə həmrazsən həm tabü təvansən.

Hal kişvərini etsə əhatə qəmü möhnət,
Bir qətrəsini içsə, verürsən tez əman sən.

Can tazələnür buyivi dərk etsə qədəhdən,
Əlbətki səni içsə fəsad əhli, ziyansən.

Nəf`ün kimədür, əhli-kəmalə bu yəqindür,
Qal əhlini divanə edən düşməni-cansən.

Öz rahim ilə dil sənə heç verməz idim mən,
Çox da, gözəlim, sərviqədim, qaşı kəmansən.

Çıxsun bu gözüm, gördi, könül oldı əsirün,
Neylüm, səni rəşki-mələkü huri-cinansən.

Yox səndə vəfa cümlə gözəllərdə sənüntək,
Dil saldı bəlayə məni, ot canə salansən.

Ey göz, yeridür sübhə kimi hər şəbi-hicran,
Xunabeyi-həsrət eləyürsən, səyəlansən.

## OLMAQ İSTƏRSƏN

Əyağə buriya tək düş, gər insan olmaq istərsən,
Mühəqqər murə qıl ehsan, Süleyman(ə) olmaq istərsən.

Yıxılsa zülm, dut əlin, məzlumə imdad et,
Cəhan mülkində təxt üstündə sultan olmaq istərsən.

Təməllüq badəsin nuş eyləmə peymanə-peymanə,
Əsiri-nəfs olma, Həqqə qurban olmaq istərsən.

Həzər qıl, uyma nəfsə, şəm`tək sərkeşlik etməkdən,
Zəlil ol, izzət artur, Həqqə dərban olmaq istərsən.

Dənilər süfrəsinə tikmə göz qızğın məgəslər tək,
Hümatəb` ol, əgər sultani-mürğan olmaq istərsən.

Münadi kəlməsindən, qorxma, hərgiz düşmə təşvişə,
Əgər can istəsə, ver, əhli-iman olmaq istərsən.

Məaşun gəncini, get, rənc ilə kəsb eylə hər saət,
Salursan gənc ələ həmrayi-Qur`an olmaq istərsən.

Sözün həqqini inkar eyləmə, get, tabe`i-həqq ol,
Yetərsən məqsədə Buzərlə Səlman olmaq istərsən.

Dəmadəm “Rəbbi ərini” kəlməsin virdi-zəban eylə,
Eşit “lən” kəlməsin, Musiyi-İmran olmaq istərsən.

Kəm eylə rütbəvi, heç eyb qılmaz, bu təmənnadən,
Həqiqət gözləmə, irfanə nöqsan olmaq istərsən?

Vüzudən, get, gözə su səpgilən, təsbihə pabənd ol,
Eşid zahid sözin məsciddə, nadan olmaq istərsən.

Dəri-meyxanədə mey düşkinin görsön yıxılmışdur,
Əyağ ilən başun əz, qorxma, heyvan olmaq istərsən.

Ədəb kəsb eyləmə, bimə`rifət olmaqlığun xoşdur,
Utanma, bihəya, rüsvayi-dövran olmaq istərsən.

İbadət qılma, tərk et əmri-Həqqi, e`tina etmə,
Məniyyət vermə əldən, yə`ni şeytan olmaq istərsən.

Yəmanə, yaxşıya qoyma təfavüt, iksi də birdür,
Cəhalət rəsmi dut, quli-biyaban olmaq istərsən.

Həzər qıl, çəkmə hərgiz zərrəcə milliyyətün fikrin,
Qəmin heç bir şeyün çəkmə, müsəlman olmaq istərsən.

Vətən fikrindən əl çək, dərbədərsən, bəhsə məşğul ol,
Olur hər müşkilün hər yerdə asan olmaq istərsən.

Meyü mə`şuqədən əl çəkmə, dut meyxanələr küncin,
Əsiri-dami-zülfi-ənbərəfşan olmaq istərsən.

Fəqihün qövlünə bel bağla, Saqib, şəkkdən çıxma,
Yapuş mövhumdən, irfanə saman olmaq istərsən.

## ZAHİD!

Nə istərsən bu mey üftadəsindən,[*]
Gətür əl məndən, ey divanə zahid.

[*] Bu şeiri Haşım bəy Saqib yaxın dostu və ustadı Əbdülxaliq Yusifin “Mana tə`n eyləyən, bir gün noleydi, İçeydün sən də eşqün badəsindən” şeirinə nəzirə yazmışdır.

Nə nəş`ə meydə vardur, bilmisən sən,
Əlündə yox dolu peymanə, zahid.

Əyağinə xümün düşdün haçan məst,
Haçan mey almısan imanə, zahid.

Meyün keyfiyyətin məndən xəbər al,
Dəxi tə`n etməsən məstanə, zahid.

Kim içsə dürdi-badə zahid olmaz,
Dutar insan yolun irfanə, zahid.

Verür saqi mey ərbabi-halə,
Tufu, verməz səni-heyvanə, zahid.

Nə vardur camdə yad eylə Cəmdən,
Bu sirri bilməz hər biganə, zahid.

Görsən əksi-hüsni-yari meydə,
Verür rəşk huriyi-qılmanə zahid.

Cünun zəncirinə ram oldı könlüm,
Dəgəndə zülfi-yarə şanə, zahid.

Nədür bu çeşmi-zülfi xalü əbru,
Nə rütbə, gör, verüb cananə, zahid.

Əcəb həngamədür bu keşməkeşlər,
Çətindür bilmək anı yanə, zahid.

Əcəb asudəsən ənduhü qəmdən,
Ki, dərdün yox meyə, dərmanə, zahid.

Xəlayiq sərbəsər məsciddə yatmış,
Oxursan ta bekey əfsanə, zahid.

Xəbərdar olmadun eşq aləmindən,
Dutub eşq aləmin pərvanə, zahid.

Şərabi-eşq ilə məst oldı Məcnun,
Başında tikdi quşlar lanə, zahid.

Öpər kim it əyağın, öpdi Məcnun,

Dəgüb xaki-dəri-cananə, zahid.

Məhəbbət aləmində ölçü yoxdur,
Nə etdi eşq, gör, Sən`anə, zahid.

İçərdim ruhuvə dürdi-şərabi,
Edəydün məscidi meyxanə, zahid.

Yəqinimdür, sənündür bağı-cənnət,
Çox hörmət etmisən Qur`anə, zahid.

Aparmış əqlüvi mehrab künci,
Degülsən vaqif heç dövranə, zahid.

Əlündən səcdəgahun verdün axir,
Bəsündür, dutmusan səddanə, zahid.

Nədür əhvali-Saqib, bixəbərsən,
Yanubdur atəşi-hicranə, zahid.

## SANURSAN

Hər sadərüxi Yusifi-Kən`anmı sanursan,
Hər bir ağacı sərvi-xuramanmı sanursan.

Çox gül açılur dağdə hər rəng dəmadəm,
Aya sən onı sibi-gülistanmı sanursan.

Namusi unutmış kişilər neylər həyatı,
Başında kimün var papaq, insanmı sanursan?

Çox var gözəl, arami-dilü rahəti-candur,
Bu məhvəş təki afəti-dövranmı sanursan.

Çoxdur kütüb aləmdə mətn başdan-əyağə,
Heyran qoyan aləmləri Qur`anmı sanursan.

Çox şaxeyi-güldə quş oxur nəğmə dəmadəm,
Eşqində gülün bülbüli-xoşxanmı sanursan.

Hər bağdə vardur, gögərüb tazə gögərti,
Xoşrəng, yaşıl, iynəmə, reyhanmı sanursan.

Hər rəngdə daş var, səni aldatmasun hərgiz,

Sərraf get ol, lə`li-Bədəxşanmı sanursan.

Minbərdə oxur kəlmeyi-tovhidi filankəs,
Qur`anı edüb hirzi-müsəlmanmı sanursan.

Təkfir eləyür badeyi-gülfami dəmadəm,
Bimə`rifəti Buzərü Səlmanmı sanursan.

Ey taci-zərə fəxr eləyən, əqlüvə fəxr et,
Sultanlığı, əhməq kişi, asanmı sanursan.

Zahid, məni aldatma gedüm məscidə bir də,
Bu dərdkeşi tifli-dəbistanmı sanursan.

Xəlqün sən haçan dərdinə dərman elədün, sən
Sərməsti-meyü işrəti dərmanmı sanursan.

Məxluqləri eyləmisən xaneyi-bərduş,
Heyhat, bu zalimlığı ehsanmı sanursan.

Sünbüldə umursan ola zənciri-məhəbbət,
Dildardəki zülfi-pərişanmı sanursan.

Surətdə nə var, əslpərəst ol get, əzizim,
Divardakı surəti cananmı sanursan.

Növ`i-bəşərün ağü qərasında vəfa yox,
Xunxarləri sahibi-vicdanmı sanursan.

## "DURMA AYİNƏYƏ QARŞU..."

Durma ayinəyə qarşu bu qədər, qaşı kəman,
Əl gətür, etmisən onsız bu qəra bağrımi qan.

Hüsnüvə uyma, mana çox bu qədr etmə cəfa,
Şəbi-hicründə edüm mən nə qədr ahü fəğan.

Vəqt olur, baxma sən ayinəyə arayiş içün,
Bürüyər tük bu gözəl arizüvi misli-tikan.

Dəxi məşşatəyə naz eyləmə sən şanə vıra,
Zülfi-pürçinüvə qıymaz eləsün ətrfəşan.

Səri-kuyün dutam olmaz dəxi, ey şirinləb,

Gecə-gündüz dolanub olmayacaq sərgərdan.

Ləblərün fikri ilə badəyə meyl eyləmərəm,
Künci-meyxaneyi-viranədə peyman-peyman.

Çeşmi-mərdümküşüvə sürmə yaraşmaz çəkəsən,
İstəsön çəkməgə gər xəlq deyər, çəkmə, utan.

Nə qədr vəqt var əldə eləmə aşiqə cövr,
Fələkün cövri sana nimnəfəs verməz əman.

Kam ver aşiqə bu lə`li-ləbündən, sorsun,
Olmayubdur nə qədr tö`meyi-hər murü ilan.

Etmisən vadiyi-heyrətdə məni sərgərdan,
Gəzirəm yol tapum ol kuyüvə giryan-giryan.

Dutaram həşr güni çaki-giribanundan,
Naleyi-ah ilə, ey sərvqədü tazə cəvan.

Deyərəm, Bari Xudaya, bu cəfapişədən al
İntiqamım, bu çəküb sinəmə daği-hicran.

İstəsə şahid əgər göstərərəm Məcnuni,
Degül hacət mana bir qeyri dəlilü bürhan.

Muyi-julidə ilə həşrün əyağinə gəlür,
Edər öz halını divani-ədalətdə bəyan.

Vay o gündən deyə Məcnun nə gəlübdür başına,
Firqəti-Leylidə, ey padşəhi-məhruyan.

Xəlq öz dərdü qəmin yad eləməz həşr güni,
Hali-Məcnunə yanar kafərü mö`min o zəman.

Tiri-müjganlarun zəxmini göstərrəm o gün,
Ərəsat əhli pərişan olurlar heyran.
Yerbəyerdən sana aləm eləyər nifrətini,
İntiqamun eləyər hökmini xəllaqi-cəhan.

Zülfüvi zəncir edərlər səni bənd etməkçün,
Necə sən bənd eləmişdün məni, ey rahəti-can.

Mən nələr çəkmişəm, ol dəm biləcəksən, zalim,

Bu qəra zülfün əlindən, mana rəhm etdi haçan.

Sancılar tiri-müjön nərgisi-mərdümküşüvə,
Ağlayar haluvə divanəsifət huri-cinan.

Kəhrəba tək saralar daneyi-xali-siyəhün,
Deyəsən laleyi-gülzarə əsüb badi-xəzan.

Böylə görcək səni mən zərrəcə tab eyləmərəm,
Edərəm çaki-giriban məni-sərgərdan.

Deyərəm, Bari Xudaya, bunun heç təqsiri yox,
Sən səbəb olmısan, etmiş mana cövrin hicran.

Sən gözəllik ona verdün, mana cövrin eylər,
Həqqi var eyləyə cövrini mana ruzü şəban.

**MİLLİYYƏT**

Milliyyət içün yol verilüb "qalu bəla"dən,
Gözlər qabağında dolanur ağü qəradən.

"Beynəlmiləl"ün söhbətini eyləmə, əl çək,
"Beynəlmiləl" heç olmayacaq, düş bu həvadən.

Milliyət ilə şəxs olar məqsədə nail,
Milliyyət ilə şəxs çıxar dami-bəladən.

Milliyyəti tərk eyləsə hər kim, elə bilsün,
Namusun edüb tərk, olub ari həyadən.

Xurşidə haçan mehr salubdur məhi-taban?
Mehri hanı pərtov verə xurşidə ziyadən.

Gül xar olacaq, əql ona heç yol verəcəkmi?
Ya xar ola gül, zənn eləyərmi üqəladən?

Milliyyət edibdür bütün aləmləri təsxir,
Çox çəkməyəcəkdür, alacaq kam səmadən.

Milliyyəti pozmaq sana bir faidə verməz,
Nifrət qazanarsan özüvə şahü gədadən.

Gecdür bu xəyalun eləyübsən, başa gəlməz,

Boş zəhməti çəkmə, sayulursan süfəhadən.

Təklif eləyürsən, məsələn, muri-zəifə,
Al kuhi-Dəmavəndi, dağıt, yə`ni binadən.

Məqsəd sana milliyyəti pozmaq degül hərgiz,
Salma özüvi rəngə, boyanmaz bu hənadən.

Hər işdəvü hər kəlmədə ölçi gərək olsun,
Bibəhrəsən, ey naşi, sən elmü üləmadən.

Vəhşiligə bu xəlqi dəlalət eləyürsən,
Əl çəkməyəcəksən məgər heç sən bu riyadən?

Heç kim sana səs verməyəcəkdür, onı sən bil,
Fəryad edəsən şamü səhər hərçi ucadən.

Kəc fikrüvi aləm başa düşmüş, elə bilmə,
Təklif eləmə, dərd sağalmaz bu dəvadən.

Dəryayə düşən xarü xəsə əl atacaqdur,
Canın edə azad təki bu cövrü cəfadən.

Milliyyəti kim öldürə, vicdani ölübdür,
Dəgməz qurı bir xarü xəsə, çıxsun aradən.

Kim anlamayur məqsədüvi, sənsə deyürsən,
Vermə ölümə, heyfdür, əl çək füqəradən.

Heyhat, əlün yetməyəcək, başqa xəyal et,
Bu əmri-məhalə dəxi, gəl, keç bu ricadən.

Azad elə xəlqün yaxasın, eyləmə tüğyan,
Qafil özüvi etməgilən xovfi-Xudadən.

Saqib sana olmaz həməqidə, yəqin eylə,
Təhsil eləyübdür ədəb elmin ürəfadən.

**"VERMƏ ÇOX FİKRÜVİ..."**

Vermə çox fikrüvi, divanə könül, simü zərə,
Heç kimün şəm`i işıq verməgə qalmaz səhərə.

Qiymət artur özüvə, lə`li-zərə sim kimi,
Dəxi yoxdur sana, qəhr eyləmə ümmü pədərə.

Hünərün var isə, get, fəqrü fənanun dut əlin,
Susama qanına xəlqün, bu yanaşmaz hünərə.

Sözə bax, söz deyənün ağzına baxma kim ola,
Bilgilən yaxşı-yaman fərqini, düşmə xətərə.

Qanmaza sölə həqqün sözini, qanmazdur,
Qanmazı, fəhm elə, təşbih dutublar şəcərə.

Tələbi-mö`cizə Həqdən eləməz əhli-kəmal,
Ləhzə-ləhzə onı sən yandırasan gər şərərə.

Vermə sərmayəni əldən, əliboş olmayasan,
Yetişüb vəqt, nə var əldə, gedərsən səfərə.

Dilüvi saxla, nə niyyət eləmiş olson əgər,
Zərəri olmasa da, söləmə heç bir nəfərə.

Çoxluğu simü zərün kibrü məniyyət gətürür,
Yerinə eyləməsön sərf, edərsən hədərə.

İncimə versə kəmal əhli sana tərbiyəti,
Bil, vırar nəf`li peyvənd vıranda şəcərə.

Olma pul düşkini bir loğma içün hər yetənə,
İktifa eyləgilən, səbr elə, xuni-cigərə.

Hər dəni süfrəsinə qonma məgəs tək hərgiz,
Öl acından, dönə gər loğması qəndü şəkərə.

Qədrüvi bil, nə içün gəlməgivün fikrini et,
Ömrüvi zaye` edürsən nə içün şurü şərə?

Qaməti sərv, ləbi qönçəni çox vəsf eləmə,
Səni rüsva eləyər, tə`n edə şəmsü qəmərə.

Nanəcibzadə ilə durma-oturma, Saqib,
Başı gər ərşə dəgə, zərrəcə alma nəzərə.

### "AZƏRİ KİŞVƏRİNÜN ŞAİRİYƏM..."

Azəri kişvərinün şairiyəm bimayə,
Füqəradür mana başdan-əyağə həmsayə.

Açmısan çoxlarına lütf ilə ehsan əlini,
Çox təəccüb eləmə, Hatəmə salson sayə.

Qocalıq salmış əyağə məni, ey kani-kərəm,
Demirəm sirrimi hər bir kəsə, hər bicayə.

Bir degül, iki degül, dörd-beşdür dərdi-dilim,
Kim dözər bir belə dərdü qəmə, bu qovğayə.

Hərə bir yanə çəkür istədigin almaqçun,
Necə tab eyləmək olsun bu uzun sövdayə.

Novruz* əhvalımi çox yaxşı bilür, sorson əgər,
Neçə ildür mənilə şe`rə olub həmpayə.

Bilməyən yox necə mən şairi-şe`rəfruzəm,
Salmışam şe`r ilə aşub bütün dünyayə.

Məni məcbur eləmiş vəqt, deyüm əhvalım,
Dirilik kəştisi qərq oldı dəxi dəryayə.

Kişiyəm, türkdür əslim, nə farsam nə ərəb,
Əgərəm baş nə şəhü xanə nə də ağayə.

Nokərəm türkə, təmizlikdə onun qanı hələ,
Salmayubdur özini rəngə, çıxub arayə.

Namımız Haşimdür, leyk təxəllüs Saqib,
Bildirübdür özin ədna ilə həm ə`layə.

Qızımun birsi gedüb Mosqvaya dərs oxıyur,
Dayısı Ruhullah** ilən ta mana salsun sayə.

İksi də burda oxur, xərcinə tabım yoxdur,
Qorxuram namusum əldən gedə axir zayə.

Azəri millətinün dərdinə dərman sənsən,
Başqaya meyl eləməm, getsə başım ə`dayə.

Bir məqamə yetişüb iş, varü yox tərk olunub,

---

* Şair Novruz Neyyir (1870-1948) nəzərdə tutulur.
** Ruhulla Axundov (1897-1938)

Yox gümanım dəxi nə beş günə, nə bir ayə.

## "CƏHD EYLƏGİNƏN..."

Cəhd eyləginən xəlqə demə sirri-nihani,
İzhar eləsön, xəsm sana verməz əmani.

Kim neyləsə, qoy eyləsün, heç fikrüvi vermə,
Yox dəxli sana, var özinə xeyrü ziyani.

Saxla dilüvi, qorxma, səlamət yaşayarsan,
Mail eləyərsən özüvə pirü cəvani.

Dil saxlamason, künci-qəfəsdür sana məskən,
Bülbül kimi xar eyləyəcəksən dilü cani.

Dil saxlamayanlar bizə, gör, bir nələr etdi,
Min fitneyi-aşub neçün dutdı cəhani?

Canım, həzər et, eyləmə nadan ilə ülfət,
Salma özüvi zillətə, həmrazuvi tani.

Yoldan keçənə kəşf eləyürsən varü yoxdan,
Gördün sən haçan onda məgər dust nişani?

"Bihudə mərov dər peyi-hər huri-sereşti,
Nəzzarə məkon bər rüxi-hər qönçədəhani."*

"Zinhar, məxor şiveyi-hər mahcəbin ra,
Canra to be yek didən, həzər kon, nəfəşani".**

Dinü dili əldən-ələ düşmüşlərə vermə,
Düş başə bir az olsa da, gör yaxşı-yəmani.

Eylər səni rüsvayi-cəhan, hüsninə uyma,
Aldanma, sana oynada əbruyi-kəmani.

Səyyad görən ahuni ram eyləmək olmaz,
"Səd bar nəhi dam, gereftən nə təvani".*

---

* Boş yerə hər huriyə oxşayanın ardınca getmə, hər qönçə ağızlının üzünə nəzər salma.

** Saqın, hər ayüzlünün şivəsinə aldanma, özünü gözlə ki, bir göz qırpımında sənin canını əlindən almasın.

* Yüz dəfə tələ qursan, yenə də tuta bilməzsən

Məhrəm özüvə eyləmə naməhrəmi hərgiz,
Versə sana iqlimi-Süleymani-zəmani.

Ovbaş ilə xəlvət eləyəndən nə umursan,
Eşqində onu eyləmə xoş, ömrüvi fani.

Həmxabə kim ilə olacaqsan, onı fikr et,
Bəd olsa, deyərlər sana, bəh-bəh, a filani.

Bəddən həzər et, ayeyi-Qur`an həzər etmiş,
Sakit eləmək olmaz onı, qızsa dabani.

Olseydi əgər Leylidə bir zərrə vəfadən,
Məcnun başına quş dəxi tikməzdi yuvani.

Peyğəmbəri-əsr olsa, gözəllərdə vəfa yox,
Əğyar könül verməyəcək, etmə gümani.

Yetmək sana ol sərhədi-məqsudə çətindür,
Öldürməyəsən yırtıcı ta nəfsi-həvani.

"Xahi nəkoni minnəti-Qarunsifətan ra,
Rənci nəkəşidə, mətələb loğmeyi-nani".*

"Bər mur nigəh kon, həmədəm hər dəri-dəştəst,
Azuqə konəd cəm`, məgər to be key mani".**

"Mərdan nəçeşəd şərbəti-sael bəkəfi ra,
Namərd məgər qiyməti-xod hiç nədani".***

Ta ağlamasa tifl, ona süd verən olmaz,
Kim vəslə yetər çəkməsə hicranü cəfani?

Əl açma dənizadəyə, Saqib, həzər eylə,
Çox yaxşıdur ondan, içəsən zəhri-ilani.

## MEYİ

Yalquz içəndə rahəti-ruhi-rəvan meyi,

---

* Qarun sifətli insanların minnətini çəkmək istəmirsənsə, əziyyət çəkmədən bir loğma çörək də tələb etmə.

** Qarışqaya diqqət et, həmişə çöllərdə azuqə toplamaqla məşğuldur, bəs sən harada qalmısan?

*** Kişilər əl açmış dilənçinin şərbətinin dadına baxmazlar, ey namərd, heç öz qiymətini bilmirsən?

Yox ləzzət onda, içməgilən ərğəvan meyi.

Yarun əlindən öp sana versün piyaləni,
Dilşadlıq ilə eyləmisən nuşi-can meyi.

Hər bir kəs ilə alma ələ cami-badəni,
Hədsiz günahdür edəsən bağrıqan meyi.

Mey imtəhan səni gərək etsün, nəinki sən,
Bədməstlik edən eyləməz imtəhan meyi.

Meyxanələrdə bax gücüvə, iç şərabdən,
Yox tab səndə, içməgilən heç zəman meyi.

Tab etməyəndə, söləyəcəksən həramdür,
Rüsvayi-aləm etməgilən, ey filan, meyi.

Qanun üziylə badəni iç, piri-meykədə
Fitva verüb, nihan içə pirü cəvan meyi.

Az iç, özüvə eyləmə adət, ziyan verür,
Bilmək gərək ki, şərtdür içmək haçan meyi.

Ümmülfəsad badəni bilmək günahdür,
Rüsvayi-aləm etməgilən, bir utan, meyi.

Təqsir səndə vardur ümmülfəsadsən,
Meyl eyləyür nə etmək olar hər şəban meyi.

Mey neyləsün içəndə bu başun əyağ olur,
Vardur xətası, içməgilən, ey biiman, meyi.

Xasiyyəti budur bu şərabi-mürəvvəqün,
Nadan əlinə vermə bu gövhərfəşan meyi.

Əzm etsə yar badeyi-gülfamə, sən də et,
Şad eylə xümdə camidə ruzü şəban meyi.

Bünyadı bəd olan, deyür içmək həramdür,
Əmma özi həmişə içür bədgüman meyi.

Bədməstlik müdam edərəm bəzmi-yardə,
Meyl etmərəm əgər verə hurü cinan meyi.

Meyxanəyə gedəndə çıxar pişvazimə,
Gülçöhrə saqi əldə dutar gülfəşan meyi.

Vəqtində sərf elə, nə hərdəm, nə hər zəman,
Az-az, nəinki çək başuva bir qazan meyi.

Hikmət yüzilə, yə`ni həkimanə nuş qıl,
Loğman kimi verəndə əgər məhvəşan meyi.

Fitvayi-şər` nəhy eləyüb gərçi badəni,
Nəhy ilə zahid eylədi virdi-zəban meyi.

**BƏXT**

Bir göz yumub-açınca olur şəh cəhanə bəxt,
Döndərsə piri, etmə təəccüb, cəvanə bəxt.

Bədbəxtlik idi eylədi Fir`oni payimal,
Gör, bir nə rütbə qiyməti vermiş şəbanə bəxt.

Nəmrud odı Xəlili yaxub etmədi əsər,
Döndərdi nar şö`ləsini gülistanə bəxt.

Toprağə bir nəzər eləsə kimiya olur,
Xoşbəxt eyləyər nəzər etsə nə yanə bəxt.

Səngi-siyəh əlündə dönər lə`li-nab olar,
Bir zərrə düşməgə səni qoymaz ziyanə bəxt.

Ey kimiya vücudini inkar eyləyən,
Yox səndə, kimyayə olubdur xəranə bəxt.

Sərhəddi-arizuyə yetərsən sən ol zəman,
Dutsun əlün sən ilə əgərçi rəvanə bəxt.

Fəhmü kəmal rütbəsini bəxt anlamaz,
Görməzmisən verüb nələri hər filanə bəxt.

Çox əql əvvəli eyləmiş xanimani-səbz,
Biəqli çox edüb, bəli, şahi-zəmanə bəxt.

Möhtaci-nim loğma olub əhli-zövqlər,
Bizövqə bəxşiş etdi qızıl asitanə bəxt.

Bədbəxti heç xəyalinə salmaz nə kimsədür,
Xoşbəxt içün gəzər, dolanar xanə-xanə bəxt.

Xoşbəxtə qəm yüzin duta bilməz əzizdür,
Daim çalar onunçün dəf şadmanə bəxt.

Xoşbəxt bağinə yağsa daş lə`lü nab olar,
Bədbəxtə yağsa lə`l, tökər qeyri kanə bəxt.

Xoşbəxt içsə zəhri dönər şəhdü şəkkərə,
Bədbəxt içün əlində dutub taziyanə bəxt.

Xoşbəxt damənini ələ gər bəxt almasa,
Yatmaz qiyamət olsa da ruzü şəbanə bəxt.

Saqib əyağə düşdi çürük buriya kimi,
Yox çarə, əldə qoymış anı yanə-yanə bəxt.

**EYLƏR**

Eşqün yüki ağırdur, min Qafı kəman eylər,
Məcnun gətürər tabın, eşq onda ziyan eylər.

Mənsuri çəkər darə, bilməz ki, "ənəlhəq"dür,*
Verməz ata İsayə, Musani şəban eylər.

Sən`ani məlamət sən, heç eyləmə, ey zahid,
Saldı oda Qur`anı, qəsdi-dilü can eylər.

Fərhad haçan bildi eşqün nədür adabi,
Başıni urar taşə, bilməm nə güman eylər.

Pərvanədən ögrənsün eşqün rəvişin bülbül,
Gül yaprağı ağzında fəryadü fəğan eylər.

Urduqca özün şəm`ə, pərvanə deməz yandım,
Əhvalinə şəm` ağlar, göz yaşı rəvan eylər.
Zənciri-cünun eylər, gəh türreyi-pürçini,
Qorxuzmağa üşşaqi, əfsuni-ilan eylər.

Ey dilbəri-məhparə, lə`li-ləbüvün fikri,
Kam almamışam ondan, bağrım niyə qan eylər?

---

* "Ənəlhəq" (Mən haqqam) nədir

Hər tiri-bəla gəlsə, əbruyi-kəmanundan,
Heç yerdə məkan dutmaz, könlümdə məkan eylər.

El damənini dutmış, ey xublərün şahi,
Bu göz yaşım hicründə eylə səyəlan eylər.

Ey dil, demirəm etmə ney kimi fəğan hərdəm,
Eşq aşiqi güldürməz, giryan, nigəran eylər.

Dövrani-cəfapişə, qoy, bağrımi qan etsün,
Hərgiz demərəm zalim, cövrin nə yəman eylər.

Bir gün yetişər ahim bir od olur aləmçün,
Gülzari-bədəndişi bilmərrə xəzan eylər.

Məqsudə olur yetmək, ey könlümün arami,
Naəhldən hər kimsə sirrini nihan eylər.

İqbalun əgər olsa meyli sana, fikr etmə,
Bir göz yumub-açınca, min piri cəvan eylər.

Sultan eləsün fəxri, qoy, tacinə hər saət,
Tabut edər təxtin, heç bilməz haçan eylər.

Yusif sana ögrətmiş e`cazi-qəzəl, Saqib,
Şe`rün odur hər saət e`cazın əyan eylər.

## İNSANLAR

Cəhan mülkini qılmış sərbəsər viranə insanlar,
İçərlər su yerinə qanları, divanə insanlar.

Tökülmiş qanlarə dünyani viran qanə qərq etmiş,
Nərm etməyüb, od yağdırur hər yanə insanlar.

Təəccüb bundadur heç dutdığı işdən xəbər dutmaz,
Qoyar baş səcdəyə, lə`nət oxur şeytanə insanlar.

Cəhani fitnə dutmış, ey ədalətdən vıranlar dəm,
Edüb gül tək cəhani sərbəsər qəmxanə insanlar.

İlanı vırmason vırmaz səni, bu söz degül böhtan,
Günahi yox vırursan nişüvi insanə, insanlar.

Degül asan, bir insaf etgilən həmnöv`i öldürmək,
Səni yoldan çıxardub, uyma bu dövranə, insanlar.

Muradun bəs nədür incidməgündən xəlqi hər saət,
Nədür məqsəd sana, qoy zülmüvi bir yanə, insanlar.

Mürüvvət rəsmini mə`nadə etmə növ`ə, rəhm eylə,
Məgər yox e`tiqadun zərrəcə vicdanə, insanlar.

Bəhayimlər də süzdən hər nəfəsdə e`tiraz eylər,
Bu bəd rəftaruvuz xoş gəlməyür heyvanə insanlar.

Ayıl bir xabi-qəflətdən, əsiri-nəfs çox olma,
Bir az ver meylüvi, eyb eyləməz, irfanə insanlar.

Dəlalət eyləyür, gör, bir nəyə xəlqi mürəbbilər,
Əgərçi e`tiqadun olmayub Qur`anə insanlar.

Təsərrüf eylədün dünyani, girəm, xəlqi məhv etdün,
Nə olsun, neyləmək, əfsanədür əfsanə insanlar.

Ə`zası üstüxandur, canə ver, ləhminə meyl etməz,
Hümadən ibrət al, vermür əziyyət canə insanlar.

Haçan rahət yaşar miskin olanlar bəs bu aləmdə,
Nəhayət vergilən, meyl etmə çox tüğyanə, insanlar.

Baş ağrı vermə, Saqib, rəhmə gəlməz Adəm övladı,
İşün yoxdur, qoy olsunlar dəli-divanə insanlar.

## QALMIŞDUR

Gözün yum, zahida, bica yerə Qur`anda qalmışdur,
Anun əksini qıldun sərbəsər bir yanda qalmışdur.

Qurı bir ad qalub Qur`andən, dini-Mühəmməddən,
Ədalət qəbr içində məhv olub, bicanda qalmışdur.

İmami-əsrə uyma, ixtiyarun anə tapşurma,
İnanmaq olmaz anə, hansı bir peymanda qalmışdur.

Kəmalü əqlü fəhmə zərrəcə qiymət qoyan yoxdur,
Kəmalü əqlü fəhmün rütbəsi böhtanda qalmışdur.

Məniyyət göstərürsən baş dögəndə taği-mehrabə,
Demişlər bəs məniyyət tinəti-şeytanda qalmışdur.

Girüb gülzar içində xar tapdar qönçələr bərgin,
Qəfəs küncində nalə bülbüli-xoşxanda qalmışdur.

Zəmanə çevrilüb bir özgə rəngi ixtiyar etmiş,
Bu rəngi kim veribdür, əqllər heyranda qalmışdur.

Danışma, ağzuvi yum, yetmiyüb azadəlik vəqti,
Sözin həqqin deyənlər guşeyi-zindanda qalmışdur.

Əl atma çör-çöpə, çox uzaqsan, getmə sahildən,
Malun kəştisi sınmış, batub ümmanda qalmışdur.

Demə, dibdən kəsərlər min dilün gər olsa xəncərlə,
Mürüvvət, rəhmü vicdan rəhmdil sultanda qalmışdur.

Səpərsən cənnətə çürmüş sümüklər künci-məsciddə,
Şəhid olmış vətən oğlanları meydanda qalmışdur.

Qutar, çox vəsf qılma, əl gətür kəskin qılınclardan,
Qılıncun sahibi yoxdur, keçən dövranda qalmışdur.

Düşübdür əql ol qiymətindən sorson hər kəsdən,
Hünər sərriştəsini bilmək yədi-nadanda qalmışdur.

Məlamət etmərəm bica yerə sərgəştə əflaki,
Mənim kimi o da sərgəştə sərgərdanda qalmışdur.

Sənün fikrün qalubdur huridə, qılmanü Kövsərdə,
Mənim çıxmış gözüm bu Azəribaycanda qalmışdur.

Qəzəl bazarıni yıx, de, Füzuli vəqti bitmişdür,
Əlifba bilməyən sərdəftəri-irfanda qalmışdur.

Təqazayi-zəmanə Saqibə qan içdürür hər dəm,
Təvəkkül eylədikcə dərdi bidərmanda qalmışdur.

**GƏRƏK**

Ey xacə, etmə fikr, sana taci-zər gərək,
Yox nəf` onda hiç, əbədi bir əsər gərək.

Qəvvasə qəsd bəhrdə xali sədəf degül,

Canından əl çəküb, ona dürri-gühər gərək.

Boş abü danəni məgəsi-nəhl neyləsün,
Nəhl umma zərreyicə, gülü bərgi-tər gərək.

Bazarə getsə boş əl ilə padşah əgər,
Verməzlər heç nə, simü zəri-mö`təbər gərək.

Səngi-siyah lə`lə dönər səbr ilə, vəli,
Aludə rəngə etməgə xuni-cigər gərək.

Asudə yatma, aç gözüvi, keçdi qafilə,
Sölər cərəs fəğanı, xətərli səfər gərək.

Əflak seyrini eyləmə boş xəyal ilən,
Seyr etməgə o dayirəyə balü pər gərək.

Bəsdür "Hicab" ayəsinün bəhsin eylədün,
Vəqtin itirmisən, dəxi fəsli-digər gərək.

Zahirpərəstlikdən utanmaq nə eyb edər,
Batin yol ilən getməgə bir müxtəsər gərək.

Aləm bir özgə rəngə girüb, çarə qıl dedim,
Verdün cəvab, get, mana bir simübər gərək.

İsbat həqqi etməgə Fir`oni-bixudə,
Musayə cilvə etməgə nari-şəcər gərək.

Tə`sir zalimə eləməz tiği-xunfəşan,
Sübhün zəmanı naleyi-ahi-səhər gərək.

Mərbub rəbbsiz ola bilməz təbiətə,
Dil vermə əsl nöqtəyə sahibnəzər gərək.

Əqlü şüurdən xəbəri yox təbiətün,
Hardan bilüb müt`i ola şəmsə qəmər gərək.

Məcburdür ki, məhv ola ay aftabdən,
Vaqif bu sirrə əqlü kəmal dolu sər gərək.

Şahun gəda bilərmi məgər şə`nü rütbəsin,
Yaxşı-yəmani bilməgə əhli-bəsər gərək.

İnkar etsə kim sözün həqqini, Saqiba,
And olsun həqq sözə, ona tiğü təbər gərək.

## QIZIL QƏBALI

Aldı dili-biqərarı məndən,
Həm taqətü ixtiyarı məndən,
İncitdi cəm`i varı məndən,
Kəsdi bütün e`tibarı məndən.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Yusif ona qul, fəribi-Adəm,
Xali-siyəhinə mail aləm,
Gülzardə gül onilə xürrəm,
Zənciri-cünuni-zülfi-pərçəm.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Şirinhərəkatü Leyliraftar,
Xurşidliqavü mahrüxsar,
Giysulərinə könül giriftar,
Əbrusinə məhvdür kəmandar.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Bir gülşənü lalədür yuvağı,
Bir xərməni-güldür əl-əyağı,
Eylər mana tünd qaş-qabağı,
Əğyarə uyub, mənimlə yağı.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Göz sürməli, zülfi ənbərəfşan,
Şirin dodağında abi-heyvan,
Rəşki-mələk, əzizi-dövran,
Qıyğaci baxanda dil olur qan.

Bir şux cəvan, qızıl qəbalı,

Afəti-can, Xütən qəzalı.

Lə`lindən alub şərabi-biğəş,
Sərməstligini rəngi atəş,
Dilbəstələri büti-pərivəş,
Çəkdi məni eşqinə keşakeş.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Döndərdi bu qədimi kəmanə,
Qaşı qəmi qoydı yanə-yanə,
Dil fikri-ləbilə döndi qanə,
Aşub salub bütün cəhanə.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Yoxdur gözüm huridə, pəridə,
Dutma yolum, ey sirişki-didə,
Bir dilbərdür cəhan nədidə,
Kuyin duta bu sitəmkəşidə.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Saqib, gər edə qiyam qiyamət,
Verməz sana dil o sərvqamət,
Gögçəklərə rəsmdür bu adət,
Səndən qoy ala qərari-taqət.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Bir meykədə nəş`ə lə`li-nabi,
Məst eylədi saqini, şərabi,
Giysulərinə verəndə tabi,
Saldı bu cəhanə inqilabi.
Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

Gəl şurə müğənniyi-xoşavaz,
Tənbur ilə çal həvayi-Şəhnaz,
Aç könlümi qəmdən, etmə çox naz,

Bir ləhzə mənimlə olmaz həmraz.

Bir şux cəvan, qızıl qəbalı,
Afəti-can, Xütən qəzalı.

## "QAN BAĞRIMA QOYMA..."

Qan bağrıma qoyma, bir utan sən,
Gördün məni zarü natəvan sən,
Əğyarə həmişə mehribansən,
Birəhm, neçün gözəl cəvansən.

Tərk eyləmisən neçün vəfani,
Hiç etməz idüm belə gümani,
Ey qaşı kəman, Leyliyi-sani,
Var səndə gözəlligün nişani.

Aldun əcəb ixtiyarı məndən,
Kəsdün bütün e`tibarı məndən,
İncitmisən hər diyarı məndən,
Bari, eşit ahü zarı məndən.

## "...ƏHLİ-YƏQİN OL..."

Məscid yolıni dutmagilən, əhli-yəqin ol,
Yandır oda səccadəni, meyxanənişin ol.

Sərrişteyi-təzvirdü, təsbihə əl urma,
Pabəndi-xəmi-türreyi-bu mahi-cəbin ol.

Huşyarlığa fikrüvi çox vermə, qəm artar,
Meyxanədən əl çəkmə, bucağında kəmin ol.

Zahid, mana əngur meyin ver, sana düşməz,
Sən məsti-xərabi-mey ol, xüldi-bərin ol.

Xəlq ilə müdara elə insanlığa dair,
Sındırmagilən qiymətüvi, eyni həmin ol.
Qatma yedigün loğmaya qeyrün səmərindən,
Az et təmə`ün, ali təbiətlə nəmin ol.

Sağər kimi hər bəzmdə əldən-ələ gəzmə,
Yüngül özüvi saxlama, xüm kimi mətin ol.

Ülfət eləmə düşkini-nəfs ilə, həzər qıl,
Həq talibisən, tabe`i-Qur`ani-mübin ol.

Atma əlüvi pərdeyi-namusinə xəlqün,
Heç kimə xəyanət gözini açma, əmin ol.

Murdar olursan, uzaq ol əhli-qərəzdən,
Salma özüvi təhlükəyə, həqqə qərin ol.

Qur`an oxıyursan, sözüm heç bir ona yoxdur,
Əmma özüvi pak elə həm, layiqi-din ol.

Səndən xəbəri-simü zər almazlar, əzizim,
Bir gün də ki, yox nəf` sana, get, həqqbin ol.

Ləbbeyk demə hər sözə, çox sadədil olma,
Yaxşı-yəmanun fərqini düş başə, dərin ol.

Xəlqün işinə hər nə isə etmə mədaxil,
Öz haluva ver fikrüvi, bir azca qəmin ol.

Bir metr düşər yer sana, təşviş çox etmə,
Ya padşəhi-qərbü ya Çinü Maçin ol.

Minnət eləmə heç kimə bir loğma çörəkçün,
Nuş et əlüvün rəncini, hər ləhzə çənin ol.

Saqib, eyləmə heç də təəccüb vətənündə
Yoxdur sana yer, kim dedi namərdə kəmin ol.

## GÖRDÜM

Yalandur kim desə bu sərvqədlərdən vəfa gördüm,
Kimə can nəqdi verdim, həddsiz ondan cəfa gördüm.

Keçirdim Bisütun dağında gördüm nəqşi-Şirini,
Qurub giysulərin Fərhad içün dami-bəla gördüm.

Düşüb avarə Məcnun çöllərə Leyli fəraqında,
Başında tikmiş idi minlər ilə quş yuva, gördüm.

Yapuşdı düşməyüm düşmən əlimdən, gör, nə aləmdür,
Əyağımdan çəkərdi yıxmağa min aşina gördüm.

Nə yaxşı ne`mət imiş bilməmək, nadanlıq aləmdə,
Bilən yox qədrini qanmazlığun, sahibliva gördüm.

Vay olsun haluva, bir zərrə olson əqlü fəhm əhli,
Olub xəlqün içində bədnüma ruyin qəra gördüm.

Sözün həqqin desön, başdan-əyağə xəlq eyb eylər,
Edərlər həddsiz batil sözə canlar fəda gördüm.

Nə hacət dəm urursan boş yerə əmri-həqiqətdən,
Həqiqət yoxdur, həq talibin halın fəna gördüm.

Nədür izhari-həqqiyyətə məgər hər bir yetən eylər,
Çətin bir iş degül, asanü səhlü boş həva gördüm.

Kitabun olsa bəsdür, ya yalan, ya doğrı, get, bəsdür,
Məsiha mö`cizindən bəhs etmə, iftira gördüm.

Mühəmməd(s) zalim olmış, tökdi qanlar şanü şövkətçün,
Sərapa hər nə iş görmiş, bütün buyi-riya gördüm.

Biri namusuvi gər istəsə, ver keç, nə eyb eylər,
Difa`i neyləyürsən, bu difa` içrə bəla gördüm.

Demə verməm, birisi istəsə gər varü yox səndən,
Verən varü yoxın Hatəm kimi sahibəta gördüm.

Nə əqlün kəssə anı, qorxma hərgiz, ixtiyar eylə
Kim, etmüm məsləhət bir əmr içün əhli-ziya gördüm.

Edir irad ol kəs ənbiyayə, bilmür heç kimdür,
Özin başdan-əyağə elmdən boş, binəva gördüm.

İgirmi əsrə çox lazım degül hal əhli olsun xəlq,
Təmami-xəlqi, Saqib, hər nə vardur nabina gördüm.

## EYLƏYƏNLƏRDƏN

Soran yox bu sözi aləmdə bu qan eyləyənlərdən,
Həvayi-nəfs içün dünyanı viran eyləyənlərdən.

Neçündür xəlqə mən heç bilmirəm bihəd əziyyətlər,

Məgər heç qorxmayurlar ahü əfğan eyləyənlərdən.

Nədür məqsəd süzə, ey əl açanlar xəlqə hər saət,
Nə istərsüz, deyün, çaki-giriban eyləyənlərdən.

Yetər kim zülm əlilə xanəbərduş eylədüz xəlqi,
Genə əl çəkmüsüz* məskən biyaban eyləyənlərdən.

Əlamət qalmayub diqqətlə hər kim baxsa tarixə,
Hanı asari, göstər, zülmə tüğyan eyləyənlərdən.

Eşitdim bu sözi növ`imdən, öldür növ`ini eyb etməz,
Külahın kəc qoyub də`viyi-irfan eyləyənlərdən.

Gərək keçmişlər içün rəhm etmüb intiqam almaq,
Əmansız, həqq yolında canı qurban eyləyənlərdən.

Gərək biz gözləyək ad qalmasun aləmdə Qur`andan,
Cibişdan xatiriçün tərki-iman eyləyənlərdən.

Gərək afaqə çoxdan od düşeydi imdi od düşmiş,
Özin nahəq yerə bihəd müsəlman eyləyənlərdən.

Xəbər aldım soğan tək xəlqi soymaqdan nədür məqsəd?
Əlində xəncəri-xunriz talan eyləyənlərdən.

Dedi, bəs, at öləndə itlərə bayram olmazmı,
Təəccübdür məgər bu tərki-vicdan eyləyənlərdən.

Gərək din əhlini məhv eyləmək, bilmərrə yox olsun,
Dəgüb zərbət bizə çox hifzi-Qur`an eyləyənlərdən.

Yetər tez vəqt, Saqib, eyləmək təşviş bicadur,
Alarsan intiqamun həqqə böhtan eyləyənlərdən.

## "NƏ GÖRDİ YAXŞIDAN..."

Nə gördi yaxşıdan, əl çəkməyür aləm yəmanlıqdan,
Çəkinməz göz yumub-açınca bir dəm xunfəşanlıqdan.

Kəlimə baxgilən, imanə də`vət eyləmiş xəlqi,

* Çəkmirsiniz

Gətürdi boş yerə əl, padşəhlıqdı, şəbanlıqdan.

Kimi Qur`anə də`vət etmisən, ey Xətmi-peyğəmbər,
Özin pak etməyübdür, görməyürsən, meyfilanlıqdan.

Aparmaq ağır idi, çəkmədün Qur`anı qəbr içrə
Özünlə sən, nə hasil eylədün boş imtəhanlıqdan.

Cəhan mülkin qanə qərq edənlər əhli-imandur,
Əgər var əhli-iman, əl gətürsün bəs ziyanlıqdan.

Kim ilə söhbət etsön bir nəfəs qəm dəf`in etməkçün,
Verür min qəm sana, fövrən vırar dəm min talanlıqdan.

Qəmü ənduh içində görmüsən bir nəfəs xəndandur,
Cəhani dutdı fitnə sərbəsər sahibqiranlıqdan.

Məni öz sevgilimdən saldı ayrı sadədil Adəm,
Nə gördüm dərdi-sərdən özgə mən pirü cəvanlıqdan.

Həvayi-cənnət ilə başuvı mehrabə çox urma,
Umursan, zahid, əl çək, huri-qılman, nagümanlıqdan.

Mana təklifi-badə etmə, zahid, vermə mey camın,
Durulmaz, min piyalə vergilən könlüm, bulanlıqdan.

Girüb yat qəbr içində, ey düşən təşvişə şahlıqçun,
Olub bərbad yeksər, ad qalubdur bu cəhanlıqdan.

Mana irfan yolıni göstərür naşilər hər saət,
Təəccüb etmərəm hərgiz, deyürlər xurdədanlıqdan.

Bitirdim məktəbi-irfani mən Vasiflə* keçmişdə,
Dəxi azadəyüz zənciri-damü natəvanlıqdan.

Dəmirlə həmtərazu kimiya heç olmub aləmdə,
Var həqqim, də`vi etsəm bir zəman mö`cüzbəyanlıqdan.
Olur zəhri-bəla, bil, Saqiba, zənbur kamində
Əsəl, bir kəlmə vırsam dəm əgər şirinzəbanlıqdan.

## RƏNGDÜR

Səndə, ey Məcnun, bu sövda, eşqi-Leyla rəngdür,

* Kürdəxanılı şair Dadaş Vasifə (1880-1960) işarədir

Vadiyi-heyrətdə sərgərdan sərapa, rəngdür.

Boş yerə bu vadiyi-heyrətdə sərgərdansən,
Əl gətür, biçarə, dəşti-kuhi-səhra rəngdür.

Naqədən, ey bixəbər, Leyla sorağın eyləmə,
Leyli əğyarun evində, olma rüsva, rəngdür.

Tişə vırma başuva Şirin içün, ey kuhkən,
Başuvı qovğayə heç salma, bu qovğa rəngdür.

Rəngdür, dünya yüzin döndərdi qan dəryasinə,
Görmisən birəng heç, ə`lavü ədna rəngdür.

Badədə rəng olmasa yıxmaz səni meyxanədə,
Mürşidi-meyxanə saqi, cami-səhba rəngdür.

Yar kuyin verdi əldən, Adəm almış cənnəti,
Sölər imdi "Rəbbəna inna zələmna",* rəngdür.

Adəmün övladinə bax, hər biri bir rəngdə,
Abü ataş, xakü bad, cümlə əşya rəngdür.

Müxtəlif bu rənglər bir-bir fəsad etməkdədür,
Baxma birsi eyləsə üzdə təbərra rəngdür.

Olsa gər birənglik heç kim təmənna eyləməz,
Bir yerindən canı çıxsa, xud təmənna rəngdür.

Duzəxü cənnət nəhayət rəngdür isbatsız,
Birsi xəlqi qorxuzur, birsi dilara rəngdür.

Turdə Allah yoxdur, yox Kəlimə bir deyən,
Göz qabağında durubdur, Turü Sina rəngdür.

Məryəmə nəfx eylədi kim ruhini, bilmək gərək,
Sölər aləm, yoxsa ol ruhi-Məsiha rəngdür.
Biqərəz insan cəhan mülkində yoxdur, olmayub,
Əqrəbavü aşina, düşmən-əhibba rəngdür.

Ərməni, gəbrü müsəlman, yəhudü bütpərəst,
Məscidü mehrab həm, deyrü kəlisa rəngdür.

* "Ey Rəbbimiz, biz özümüzə zülm etdik..." (Qurani-kərim, Ə`raf, 23)

Biqərəz insan demiş birsi, olur tabutdə,
Səhvdür tabut, meyyitü qəbrü üqba rəngdür.

Ta əbəd ömr eyləyərdi şəkksiz birənglik,
Qatili-ömri-giranmayə, bu bica rəngdür.

Birsinün rüxsari hərdəm, ayü gün bəhsin edər,
Oxşamaz insanə birsi, ziştü ziba rəngdür.

Cümlə aləmlər, bəli, asan yetərdi həqqinə,
Eyləyən xəlqi məlamət şumi-bica rəngdür.

Hansı bir kəs söləyərdi, bu sənindür bu mənim,
Bu həyasız qismətə lareybü əcza rəngdür.

Mübtəladür birsi fəqrə, birsi dövlət qərqidür,
Müstəhəqqə verməyür bir həbbə ədna, rəngdür.

Kim tökərdi bir kəsün qanın sutək bica yerə,
Eyləyən hər fitnəni aləmdə bərpa rəngdür.

Mətləbi çox açma, qoy, sərbəstə qalsun, vəhm qıl,
Müxtəsər, hər nə yaratmış Rəbbi-Ə`la, rəngdür.

İmdi, ey saqi, aləm rəngdür, ver cami-mey,
İctinab etmək nə hacət, etmə pərva, rəngdür.

Saqiba, çox da qəzəlxansan, qəzəl ustadisən,
Söləyür aləm sana, ey nitqi guya, rəngdür.

## ZƏRDƏDÜR

Şəxsün həyatı, hörməti bu simü zərdədür,
Şahun gər olmasa zərü simi, xətərdədür.

Zərsiz zəmanə Rüstəmi olson, nə faidə,
Məğlubsən, əgərçi qılıncun kəsərdədür.

Zərsiz nə dəm vırursan hünərdən, nədür
Məbdə` hünərdən ötri, bu zəri-bəxtəvərdədür.

İnsan özinə kəsb eləyər hər şərafəti,
Hər kim desə, inanma, şərafət pədərdədür.

Daşun qərası lə`l olur gərçi səbr ilə,
Sərmayəsini sal ələ, xuni-cigərdədür.

Bil qiymətüvi, nəfsüvə qul olma, heyfsən,
Uyson həvayi-nəfsüvə, qanun hədərdədür.

Dutmış cəhani fitneyi-aşub sərbəsər,
Fitvası dövri-gərdişi-şəmsü qəmərdədür.

Məsnu`ə vermə fikrüvi, sane` xəyalın et,
Fikrün həmişə boş sözə, tərhi-digərdədür.

Sərraf qiyməti verür ustad fəhminə,
Hərgiz demir ləyaqət dürrü gühərdədür.

İqbali-nikü bəd sənü məndə cibillidür,
Bu ixtiyar kilki-qəzavü qədərdədür.

Şiddətlə bağbanlər alur səndən intiqam,
Qət` etmə bisəbəb hər ağac kim, şəhərdədür.

Məzlumə açma, dəsti-təərrüzdən əl gətür,
Hər ixtiyari naleyi-ahi-səhərdədür.

Heç kimsə arizusinə yetmüb, yetən də yox,
Ayineyi-murad həmişə kədərdədür.

Hər yerdə, hər məkandə edər cilvə hüsni-yar,
Gəh Turidəvü gahi görərsən şəcərdədür.

Dünya dolısi düşməni məğlub zər edər,
Fəthün livası, heç demə, tiği-düsərdədür.

İsbat etdi həqq sözini xəlqə simü zər,
Xətmi-Rəsuldən yetişən söz nəzərdədür.

Əl eyşü nuşdən sən haçan çəkmisən məgər,
Əfsus eyləmə Vətənün qeyrilərdədür.
Oğrı yatanlara tapar əl, yatma çox, dedim,
Yatdun, apardı var-yoxı şəhri-şəhərdədür.

Bu kainati zər güci qaimməqam edüb,
Çox mərdi-cənginün zəri yox, dərbədərdədür.

## DEGÜL

Gərçi məhrulərə dil verməgə əyyam degül,
Kim ki, dilbəstə olubdur bulara, xam degül.

Vəqt özidür səni bu damə keşakeş çəkmiş,
O səbəbdən görürəm mən könül aram degül.

Rəhbərün sevdigüdür, qoydığı qanuni budur,
Eyləyür kim nəyi istər, hanı bədnam degül.

Cür`ətün varsa əgər həq sözüni xəlqə yetir,
Kəsb edüb hörmət öziçün o ki, İslam degül.

Kim hərifə verə namusını, əhsən eşidir,
Sevünür çoxsı bu gün tabe`i-əhkam degül.

İmtəhan eyləgilən bu sözümi bir dəf`ə,
Həqqi təkzib elə min ləfzilə, düşnam degül.

Degilən birsinə həqqün sözüni tərk etmə,
E`tina eyləməz hərgiz sana sərsam degül.

Gözləyürmiş belə aləmləri çoxlar nə bilüm,
Gözlə bundan bətərin, imdi sərəncam degül.

Qorxma heç aləmi-bə`dün xəbəri böhtandur,
Yandıra kim oda Qur`anı bədəncam degül.

Var-yoxın birsi əgər tərk edə bihudə yerə,
Eyb qılmaz, deyəcəksən kişi nakam degül.

Qibleyi-həqqə desəm bir kəsə, gəl, səcdə elə,
Deyəcəksən mana var fazili-Bistam degül.

Ey bu aləmlərə min şivə ilə fəxr eləyən,
Etmə dilşad özüvi çox belə, bayram degül.

Bilməyürsən nə bəlalər gələcəkdür başuva,
Görəcəksən sana heç kimi dəxi ram degül.

Eylə fikr etməgilən heç nə sana etməzlər,
Əmri-həqq, eylə yəqin, heç kimə əqvam degül.

Kim deyübdür sana kəsb etməgilən elmü ədəb,
Dutmısan xəncəri-xunriz ələ, əqlam degül.

Heç nədən yox xəbərün də`viyi-irfanlıq edüb,
Rəngə salma özüvi meykədə həmmam degül.

Xəlqə sən etmə nəsihət, sana eyb eylərlər,
Sən kimi xəlq bədəncami-xunaşam degül.

Xəbərün yoxdur özündən nələri eyləmisən,
Göz qabağında durubdur yeri Ağdam degül.

Elmdən dəm vırar ol kimsə onun var elmi,
Sən nəyün bəhsin edirsən, sana ilham degül.

Sən özündən sözi aç, xəlqün işindən əl çək,
Elm təhsili sənünçün bir əlif-lam degül.

Kasə-kasə sən haçan xuni-dili nuş etdün,
Yetəsən məqəsdüvə badeyi-gülfam degül.

Öldürüb nəfsini təhsil eləyənlər elmi,
Elm ilə fəxr eləyənlər keçəl əllam degül.

Sən hələ şişəyə dut başını ərbabi-həqün,
Paybəndi-xəmi-giysuyi-güləndam degül.

Etdigün söhbətüvə fikrüvi ver, gör nəyədür,
Gecə-gündüz gətür əl, elm qədəh, cam degül.

Xilənün kəndinə get, gör nələr olmış peyda,
Deyəcəksən genə nahəq yerə e`lam degül.

Şimr ol zülmi rəva görməyüb heç görmüşlər,
Qətl olanlar nə ilan, nə məgəs, əcsam degül.

Sana bu vəhşiligün dairəsi çox xoşdur,
Olarun dutdığı iş nəfsüvə xüddam degül.
Xəlqə eyb eyləmə, eybün bütün aləmdə durub,
Yetənə eyb eləmə sən kimi cüzzam degül.

Saqibə eyb eləyürsən ki, deyür həq vardur,
Həmpiyalə sən ilə olmayacaq, xam degül.

Səni rüsva eləyər, uyma həvayi-nəfsə,
Həq özin bildirəcək, həq sözi övham degül.

Etmə inkar, utan, aləmi-bə`dün xəbərin,
Müxbiri-sadiqün əmri qurı, boş bam degül.

## "CƏHANƏ EYLƏMƏRƏM MEYL..."

Cəhanə eyləmərəm meyl bəski huşyarəm,
Haçan ki, meyl eləsəm, bil ki, mərdümazarəm.

Yolı oleydi əgər batinə Məsihanun,
Aparmaz idi özilə qəmin bu dünyanun.

Deməzdi, mən gedirəm tez genə gəlüb yetərəm,
Ki, xaki-payi-dənizadəni dutub öpərəm.

Ədəb mülahizə et, dut təriqi-insani,
Əsiri olmagilən, çəkmə qeydi-dünyani.

Nədür səfası bu deyrün, fəğandur, nalə,
Təfaxür eyləmə beş gün fəribi-iqbalə.

Nəhayəti bu cəhanun qəmü əziyyətdür,
Qədəhlə ömrüvi vır başə, dəm qənimətdür.

Məgər şərafəti şəxsün bu ağu sərvətdür,
Xəlayiqə sitəm etmək və ya əziyyətdür.

Cəhanə zərreyicə olsa idi gər məftun,
Başında tikməz idi quşlara yuva Məcnun.

Dağılsa min belə dünya, yəqin ki, bizarəm,
Fəribini yemərəm mən nə qədr ki, varəm.

Birovuz aləmi min yerdə eylərəm icad,
Bir ah ilə yıxılub ani olmasun bərbad.

Təlatüm eyləmərəm bəhr tək mən hər saət,
Görəndə hər xəsü xaşaki heç degül hacət.

Mühitəm aləmə, seylab ilə daşan degüləm,
Yağış kimi yağa tiri-bəla, qaçan degüləm.

Dəgişməzəm qanımi hər fəribi-nadançün,
Baş əgmərəm fələkə kişvəri-Süleymançün.

Qəmi-zəmanədən asudəyəm, həm azadəm,
Əsiri olmaram hərgiz bu yolda ustadəm.

Libasi-ardən eyb eyləməz ki, mən urəm,
Fəqirü dərbədər olmağlıq ilə mə`murəm.

Təməllüq eyləmərəm padşahü sultanə,
Bu növ` ilə varam aləmdə getsəm hər yanə.

Fəqirə dəsti-təərrüz kim açsa, düşməniyəm,
Cəhanə sahib olam gər fəqirün eyməniyəm.

Nə xoş demiş bu sözi ol ədibi-Şirazi,
Ədəb yolıni dutub aləmün sərəfrazi.

"Homay bər səre-morğan əz an şərəf darəd
Ke, ostoxan xorədo canəvər nəyazarəd".*

Nə möhtəsib nə şəhəm, nə əmirü sultanəm,
Əziyyətim kimə vardur, fəqət bir insanəm.

Nə kafərəm nə müsəlman, nə erməni nə yəhud,
Özümi rəngə salum yə`niçi olum mərdud.

Nə məscidü nə kəlisa, nə deyrdür nə kinişt,
Nə saqiyi-meyi-Kövsər, nə huri-baği-behişt.

Nə meykədə nə piyalə nə badeyi-gülfam,
Nə saqiyi-mahrux, sərvqədü güləndam.

Şərab məndən olub məst, dutdı meyxanə,
Nə mən şərabdənəm məst, böylə divanə.

Ayırma Rəbbdən heç bir zəman mərbubi,
İtirməyübdür, itirməz həbib məhbubi.

Dəvam etmisən, ey naşi, bu hekayətdən,
Açam əgər sözi mən, söz düşər lətafətdən.

* Hüma quşu quşlar arasında o səbəbdən daha şərəflidir ki, sümük yeyər, canlılara əziyyət verməz (Hafiz Şirazi)

Əgər sən eyləməsön canü dinü dil tərkin,
Muradə yetməyəcəksən olunca həşr yəqin.

Fəribi-zahidə aldanma, əhli-irfan ol,
Şərabi-mə`ni ilə məst olub, get, insan ol.

Nə e`tiqad eylə bu bəs fəribi-şeytandur,
Təmam başdan-əyağə yəqin ki, böhtandur.

Behiştü huriyi-qılman bəhanədür yeksər,
Bir özgə fikrü xəyal etməgündən eylə həzər.

Əgərçi zahirən ol abü atəşü xakəm,
Həqir sanma, gühər kimi, Saqiba, pakəm.

Bu kainatə həyati verən vücudimdür,
Bu varlığım mana mənsubdür, şühudimdür.

Vəli gərək ola bir sərvnazü məhparə,
Qoyubdur aləmi heyrətdə, meyli əğyarə.

Çətindür ol pəri səyyadi-didə ram olmaz,
Sənilə həmnəfəs heç ləhzə, vəssəlam, olmaz.

Yox e`tibari, eylə səngdil cəfacudür,
Rəqibün həmdəmidür, neyləyüm ki, məhrudür.

Xəlili saldı oda, çəkdi darə İsani,
Şəban etdi Şüeybə yetim Musani.

Gözəlligi vardur, laübali canandur,
Vəfası var desə hər kim, inanma, böhtandur.

Kim olsa mail ona, qıl yəqin ki, rüsvadur,
Əsir olma ona, kim olubsa, bicadur.

Məni bu halə salan kimdür, ol pərivəşdür,
Onun cəfası ilə xatirim müşəvvəşdür.
Dəvam eyləmisən bir nəfəs fəraqında,
Muradə yetmisən, heç olma iştiyaqında.

Əlaqə kəs bütün aləmdən, içgilən badə,
Ayılma, məst elə ol, salma heç nəyi yadə.

Bəlalu aşiqə hicranda xuni-dil bəsdür,
Qumari-eşq ilə kim, Saqib, oynayur, bəsdür.

## "KAKİL KİMİ SƏRKEŞLİGİ..."

Kakil kimi sərkeşligi çox eyləmə adət,
Çün zülf, əyağə düş, olasan başi səlamət.

Bir fayidə verməz sana, qorx aqibətündən,
Girəm ki, sən etdün bu cəhan mülkini qarət.

Tarixi əsatirlərə sən bir, nəzər eylə,
Kəsbi-ədəbi etgilə, tərk eylə cəhalət.

Qan tökməgi nahəq yerə, asanmı sanursan?
Qan sahibi vardur, bu qədər səndə qəsavət.

Ey nəfsün əsiri, xəbərün yoxdur özündən,
Bir nəfsə məgər etməyəcəksənmi riayət.

Zülmi bu qədr görmə rəva xəlqə, həzər qıl,
Min qat alacaqsan əvəz, ey kani-şərarət.

Eymən özüvi eyləmə, dövran sana qalmaz,
Bu dövri-fələkdə hanı bir zərrə dəyanət.

Girəm ki, qiyamət güni yox, olmayacaqdur,
Yoxdur nə hesabü nə iqabü nə siyasət.

Vicdan gərək olsun, bu qədr növ`ə edirsən
Zülmü sitəmi, çəkməyəcəksənmi xəcalət?

Üqbadə qiyamət olacaq, yox ona elmün,
Burda görəcəksən ki, olar nicə qiyamət.

Bir vəqt gəlür yetməz əlün bir kəsə yəqin,
Divani-ədalət qurular, sanma zərafət.

Bir murə də zülm eyləyəsən, yox sənün əqlün,
Vay haluva, məhv oldı vilayətdə cəmaət.

Neyçün bu qədr xəlqi qırub ya ki, soyursan,
Vardur bularun sahibi, tərk eylə ədavət.

İnsan kimi al aldığuvı, şərti-ədəblə,
Nəinki basub kəsmək ilə, zülmə nə hacət.

Rahət yaşamub xəlq edüb kəsb öziçün,
Bir parça çörək, al onı olmaqlığa rahət.

Daş-başuva düşmüb edəsən kəsb mənim tək,
Min zəhmət ilə et sitəmi xəlqə inayət.

Zülm etməmişəm sən deyəcəksən genə xəlqə,
Zahirdə deyərsən ki, mənəm ki, mən ədalət.

Getdi biri əttarə dedi, bəng varundur?
Çox nəş`əsi olsun, mənə lütf eylə bu saət.

Əttar dedi, yaxşısı var, yaxşı da pul ver,
Gər olmasa yaxşı, pulın al, eylə şəmatət.

Əhsən dedi, ver yaxşısını, on tümən istə,
Vəchin verərəm eyləyərəm bir də ziyafət.

Bir bəng ona verdi ki, onun nəş`əsi fili
Məst eylər idi, qalmaz idi zərrəcə taqət.

Aldı yügürüb xanəsinə çəkdi təmamın,
Gördi əsəri-bəng eyləyüb xeyli nədamət.

Bir ləhzə keçüb üzvlərün dutdı gicişmə,
Getdi həmama üzvi onun ta tapa halət.

İsti suda gerçəkdə aşub nəş`ə başından,
Qışqırdı öz-özinə olmaz belə rahət.

Yox eybi, dedi vacibi yaxmaq də gərəkdür,
Yaxdı təpədən dırnağaca əzmi-məlamət.

Üryan yügürüb kuçəvü bazarə həman dəm,
Əttarə yetüb sölədi, ey mərdi-xəyanət.
Verdün mana bir bəngi onun nəş`əsi yoxdur,
Divanə, gərək səndən edəm imdi şikayət.

Əttar dedi, xanəxərab oğlı, utan bir,
Vırmış başuva nəş`ə, nədür səndə bu halət.

Üryan bazara bəs nə içün çıxmısan, əhməq,
Yox bəngdə nəş`ə dedi kim, kani-həmaqət.

Bundan dəxi bədtər olacaq bəngdə nəş`ə,
Bax halətüvə, xəlqi dəxi etmə məlamət.

### "DUTMIŞ NƏ İÇÜN..."

Dutmış nə içün fitneyi-aşub vilayət,
Sərkeşlik edən yox ki, olur qətl ilə qarət.

Vicdan yox, məhv olunub rəsmi-mürüvvət,
Ciddiyyət ilə şiddət edür eyni-cəhalət.

Kimdən ədəbi almalıyuz, əhli-ədəb yox,
Nadanlığa hər pirü cəvan eyləmiş adət.

Hər fərd itirübdür özini, bilməyür hərgiz
Təklifini, əzbəski dutub rahi-zəlalət.

Rəhbərlərimiz bilməyür heç yaxşı-yəmani,
Fərqin başa düşmir, eləyür cəhli riayət.

Ey əsri-igirmiylə edən fəxr dəmadəm,
Əfsanə söz ilə eləmə xəlqi hidayət.

Nifrət gərək etmək belə əsr əhlinə hərdəm,
Kimdür yaşasun bir nəfəs asudəvü rahət.

İnsanlığa dair rəvişün eyni yox olmuş,
Kimdən bizə yüz verdi bu üslub, bu halət.

Hacət degül hərgiz bu sözi sorma, əzizim,
Kimdür səbəbi, kəşf eləməglik degül hacət.

Kürdə balığı duzlı bilürsən, demə şordur,
Şirin deyəsən, eyb eləyər cümlə cəmaət.

Bir kənd görünsə nə dəlil istəyəcəksən,
Getməgligə axtarma dəlili, degül hacət.

Murdar olar ağzım adını zikr gər etsəm,
Qalsun gərək hər ləhzə nəcasətdə nəcasət.

Cəhd eylə ki, incitməyəsən xəlqi özündən,
Kim düşsə əyağə, dut əlin, eylə himayət.

Gər istəyəsən yaxşı səlamət ola başun,
Eyb eyləmə xəlqə, dilüvi saxla səlamət.

Tapşursa əmanət sana gər düşmən canın,
Canun gedə əldən, həzər et, etmə xəyanət.

Bərbad ola aləm, kişilik ismin unutma,
Bir-bir deyərəm, var kişilikdə nə əlamət.

Xəlqün nəzərindən özüvi salma, həzər qıl,
Heç bir kəsə sən açmayasan çeşmi-həqarət.

Olmaz kişilər zərreyicə nəfsinə tabe`,
Həqqün rəvişün tərk eləməz, olsa qiyamət.

Din məs`ələsi gəlsə arayə, onı sən bil,
Can tərkin edər, olmaya ta din evi qarət.

Tikməz gözini süfreyi-namərdə, yəqin et,
Ac qalsa min il, eyləməz əfsus şikayət.

Min rənc çəkər ta ki, yetə sərhədi-gəncə,
Yağsa başına, bak eləməz səngi-nədamət.

Düşmən qabağında dayanar şiri-jəyan tək,
Göstərməsə də, eyb eləməz rəmzi-şücaət.

Gər yetsə cəhad hökmi ona, səcdeyi-şükri
Təkrar edər hərdəm, verülüb sanki bəşarət.

Cismində çata baş-başa gər tiri-cigərçak,
Gözlər özinə, bak eləməz vəqti-şəhadət.

Hübbül-vətən ilə bədəni təxmir olunmış,
Bir zərrə yox onda təmə`i-təxtü xilafət.
Min Yusifi-Kən`an kimi gər olsa min oğli,
Qurban eləyər həqqə, çəkər bir də xəcalət.

Mərdün belə ətvarı gərək səndə ki, yoxdur,
Göstər kişilik rəsmini, gər varsa ləyaqət.

Olseydi ləyaqət, vətəni verməz idün sən
Bir kimsəyə, yox onda əlamati-nəcabət.

Buysa kişilik səndə var, heç bir şeyə dəgməz,
Neyçün edirük boş yerə namərdə şəmatət.

Qaldı kişilik rəsmi keçən əsrdə, Saqib,
Hər kəsdə tapulmaz kişilik, sanma zərafət.

## QƏLƏM VƏ QILINC

Qələmlə qılıncun eşit söhbətin,
Bu xoş söhbətün bilgilən qiymətin.

Qələm sölədi tiğə xunrizsən,
Ki, can almağa fitnəəngizsən.

Sərasər cəhani sən etdün xərab,
Cəhan səfhəsin qanə etdün xizab.

Cigərçaksən, səxt bibaksən,
Sutək qanı tökməkdə çalaksən.

Oğulsuz qoyan sənsən hər madəri,
Bütün şərsən, rəhmdən həm bəri.

Sən ilə olur bəski ülfət çətin,
Odur əgrisən, əgridür əhli-kin.

Mürüvvətsizə əgrilikdür nişan,
Nə hacət dəxi eyləmək imtəhan.

Əman verməsən dustə, düşmənə,
Yanaşsa əgər bir nəfs kim, sənə.

Xətadidələrlə xətadidəsən,
Bütün etmisən xəlqi rəncidə sən.

Sən etdün xəlayiqləri dərbədər,
Şərrdür vücudun sənün, müxtəsər.

Mən ilə, gəl, ol bir nəfəs həmnişin,
Bilərsən nədür rəsmi-əhli-yəqin.

Mənəm kainatə vıran beydəği,
Mənəm kainatə verən rövnəqi,

Mənəm məbdə`i-eyni-abi-həyat,
Mənimlə tapub mübtəlalər nicat.

Mənimlə tapub xəlq irfan yolın,
Nə irfan yolın, eyni-insan yolın.

Mənəm müşkəfşan, həm müşkru,
Məni ətri-ənbər edər arizu.

Qılıncsız mənəm fatehi-hər diyar,
Mənəm baisi-asyişi-hər diyar.

Mənəm padşahə verən təxtü tac,
Mənəm dərdlilərə eyləyən əlac.

Mənim şə`nimə sureyi-"vəl-Qələm"*
Olub nazil, ey xəncəri-bədşiyəm.

Bütün aləmin ixtiyarı mənəm,
Cəhan əhlinün tacdarı mənəm.

Mənəm sülh imzasinə hökm edən,
Mana rubəru durmasun hər yetən.

Mənəm söndürən fitnənün atəşin,
Mən iləndür asan əmri-çətin.

Tökər qanım kim düşmənimdür mənim,
Yeddi kişvər həm məskənimdür mənim.

İtaət edər hökmimə cümlə nas,
Mənimlə olan həmdəm etməz həras.

Xilafi-əmrimi etsə kim xar olar,
Ki, hədsiz bəlayə giriftar olar.

Mənim hökmimə etməyən e`tibar,
Düşər zillətə adı leylünnəhar.

---

* Qurani-kərimin 68-ci əl-Qələm surəsi

Nisar eylərəm dürri-nasüftələr,
Mənimlə olur cəm` aşüftələr.

Gühərpaşlıq eylərəm hər zəman,
Yalandur demə, olmışam imtəhan.

Kilidi-dəri-hikmətəm bixilaf,
Degül məndə bihudə lafü gəzaf.

Yoxumdur mənim şahidə ehtiyac,
Degül hacət heç eyləmək ehtiyac.

Qələmdür verən hər nizam aləmə,
Qələm elmi tə`lim edüb Adəmə.

Qələmlə cəhan mülki abad olub,
Qələm hər məkatibdə ustad olub.

Qələm görmiyən şəxs insan degül,
Qələm qədrini bilmək asan degül.

Qələm rütbəsin Xatəmül-ənbiya(s),
Bütün aləmə bildirüb biriya.

Bəraşüftələndi qılınc ol zəman,
Qılaf içrə hey vurdı atəşfəşan.

Dedi, ey qələm, sakit ol, vırma laf,
Vücudun sənün fitnədür hiyləbaf.

Əgər etsəm çak mən başuvi,
Olarsan zəbun, bilməsən yaşuvi.

Mənəm bildirən qədrüvi aləmə,
Mənəm güc verən Adəmə, Xatəmə.

Mənimlə edüb qəl`eyi-Xeybəri,
Əliyyi-vəli fəth nöh kişvəri.
Nə ilə vırub Əmrə ol zərbəti
Yədüllah, ey xarü xəs tinəti.

Mənim şə`nimə Xatəmi-ənbiya(s)
Deyüb bu sözi, etgilən e`tina:

“Qılınc yox cəhanda çü bu Zülfiqar”,*
Əli kimi fəth eyləyən aşikar.

## “MƏN GƏLMƏZ İDİM...”

Mən gəlməz idim belə cəhanə,
Adəm məni çəkdi yanə-yanə.

Sərmayeyi-cənnət sitəmdür,
Bu deyri-fəna bənayi-qəmdür.

Bir gün gülə birsi, min gün ağlar,
Bu deyrə əbəs ümid bağlar.

Ol kəs ki, gəlüb yox ixtiyari,
Bu aləmə etdi e`tibari.

Bayqulər edir bu deyrə nifrət,
Gör, kim eləməz cəhanə rəğbət.

Viranələr içrə, get, məqam et,
Bayqu kimi əmrüvə qiyam et.

İsa(ə) kimi xəlqdən fərar et,
Tənhalığı bir dəm ixtiyar et.

Ram olmagilən bu nəfsi-dunə,
Nifrət elə beylə rəhnümunə.

Nöh kişvərə şah idi Süleyman(ə),
Bir ləhzədə oldı mülki viran.

Toprağə qarışdı, bu əyandur,
Səndə bu nə nəfsi-bədgümandur.

Həm tö`meyi-murü mar olubdur,
Bəstər ona fövc xar olubdur.

Hər kim ki, gəlüb bu dunpərəstə,
Nəfsinə olub ki, paybəstə.

İnsan yeri kişvəri-ədəmdür,

* Məhəmməd Peyğəmbərin(s) Həzrət Əli(ə) haqqında söylədiyi – “La fəta illa Əli la seyfə illa Zülfiqar” – “Əli kimi oğul yoxdur, Zülfüqar kimi qılınc” kəlamına işarədir.

Yox dərdü qəm orda, möhtərəmdür.

Göstərmədi dəhr Keyqubadə
Bir xoş güni, geddi ömri badə.

Cüz cami-sınıq nə etdi hasil,
Hər səhərgəh qıldı, oldı batil.

Dünyayə gələn olur peşiman,
Bu təcrübədən çıxubdur, ey can.

Rahətligə bir nişanə yoxdur,
İsbatinə bir bəhanə yoxdur.

Qəmdən bükülüb qədün kəmandur,
Biçarə, demə bu imtəhandur.

Neydə nədür ol fəğanü nalə,
Ver fikrüvi yaxşı bir bu halə.

Var kimdə həqiqətü təriqət,
Çəkdi bu cəhanda min əziyyət.

Tənbur ilə çəng həmnəfəsdür,
Heç bir demisən, bu səs nə səsdür?

Şivən nə içün eyləyür kəmançə,
Qan oldı çəməndə bağrı qönçə.

Ağuşə, müğənni, çəkmə tari,
Bil, neçün edir ol ahü zari.

Giysu yüzə dəf edüb pərişan,
Bu sirri bilən degülsən asan.

Yar ayrusi ahü zar eylər,
Təng aləmə ruzigar eylər.
Bir yardən ayrılub ki, əğyar
Yol kuyinə tapmayub, ol huşyar.

Bir yardur ol, şəkərdəhandur,
Müjganları tiri-cansitandur.

Axtarma şəriət, oldı nabud,

Var səndə hanı ki, verməyür sud.

Mə`budə inanmağun yalandur,
Başdan-əyağə işün filandur.

Yarından olub cüda qan ağlar,
Fəryad eləyəndə sinə dağlar.

**OĞLUM, SANA DEYÜRƏM, DİQQƏT EYLƏ:**

Nə ilə gün verür cəhanə ziya,
O ziya sayəsində şahü gəda.

Kam alur, hasil eyləyür məqsud,
Göz qabağında nə şahid, məşhud.

Elm ilə nuri kəsb edüb xurşid,
Heç kimi elm etməyüb numid.

Elm pəjmürdəyə həyat verür,
Müşkilə düşsə kim, nicat verür.

Hünərü elmi eyləmə təhqir,
Elmlə varü yox olur təsxir.

Elmlə annamaz kəmalə yetər,
Həm kəmalə, həm cəlalə yetər.

Elmsiz şəxsə eyləmə xidmət,
Eyləsön gər verür sana xiffət.

Yetürür elm hər məqamə səni,
Həddsiz şə`nü ehtiramə səni.

Fikrüvi elmə ver, keç işrətdən,
Qafil eylər səni həqiqətdən.

Uyma məhparələr lətafətinə,
Qəmzeyi-şivəsinə, halətinə.

Tərk qıl, ey oğul, meyi-məhbub,
Elmə ver fikrüvi, edər mətlub.

Elmi-rəsmi fəribi-şeytandur,

Kim anı təhsil etsə, nadandur.

Elm odur dəm vıra həqiqətdən,
Həm həqiqətdən, həm təriqətdən.

Elmdən qafil olma, ey fərzənd,
Sana hər bir dəqiqə yetsə gəzənd.

Elmi vəsf eyləmək degül asan,
Əql yetməz ona, olur heyran.

Müxtəsər, elm rahəti-candur,
Vəsfinə əqlü fəhm heyrandur.

Səni kim əcnəbilərə nokər,
Eyləmiş mahü salü şamü səhər.

Ədəmi-elmdür, degül böhtan,
Göz qabağındadur durub əl`an.

Qul edüb aləmi-müsəlmani,
Adı var, sərbəsər olub fani.

Sahibi yox, əsirdür müztər
Əcnəbilər əlində sərtasər.

Mane`i-elmə etgilən lə`nət,
Dəmbədəm mən də eylərəm nifrət.

Kim bizi eyləmiş bəlayə düçar,
Elmsizlik, kim eyləyər inkar.

Elmdən bixəbər müsəlmandur,
Zülfi-giysu kimi pərişandur.

Kim ki, millətin edər paymal,
Məhv olur ondan eyni-istiqlal.
Nəqdi-can eylə, elmə ol talib,
Sana hüccət təmam olar, Saqib!

Türklik qanını xərab etmə!
Əcnəbi qanını intixab etmə!

Düşkini-nəfs olma, eylə həzər,

Səni rüsvayi-xasü am eylər.

Feyz ver xəlqə elmü irfandan,
Elm içün əhli-həq keçər candan.

Həqqə qıl e`tiqaduvı kamil,
Həqqdən başqa hər nə var, batil.

**TƏRCÜMƏ***

Dedi Məcnuni-zarə bir pərivəş,
Könül Leylayə vermə, ey bəlakeş.

Üzarım rəşki-bağü hurü cənnət,
Olubdur xətm məndə hər lətafət.

Kəmandu qaşlarım bir nazəninəm,
Cünun zənciri zülfim, məhcəbinəm.

Gözüm yəğmayə vermiş küfrü dini,
Salıbdur heyrətə ahuyi-Çini.

Pərişan eyləsəm rüxsarə giysu,
Dutar fitnə cəhani, ey bəlacu.

Bu qamətlə əgər etsəm qiyamət,
Qiyamətdən dəxi qalmaz əlamət.

Fəribi-küfrü din, xali-siyahım,
Xəbər al həzrəti-Adəm güvahım.

Könüldən aşina kim edsə məsti,
Məlamət eyləməz bir meypərəsti.

Ləbimdən nəş`ə almış camü badə,
Ayıl, Leylanı tərk et, salma yadə.
Mənim eşqimdə ol aləmdə rüsva,
Səni bədnam edübdür eşqi-Leyla.

Çəküb bir ahi-atəşnak Məcnun,
Yanub ol atəşin ahinə hamun.

Dedi, sən nazəninsən, lalərüxsar,

* Fars dilində yazılmış bir şeirdən təcümə olunmuşdur. Şeirin orijinalından cəmi beş beyt verilmişdir.

Kəməndi-zülfinə aləm giriftar.

Əlimdə yox mənim bir ixtiyarım,
Verəm dil mən sənə qoymaz nigarım.

Haçan Məcnun olursan, ey səmənbu,
Bilərsən mən kim ilə dutmışam xu.

Sən özgə fikirdə, get, məndən əl çək,
Mən özgə fikirdə düşvar bilmək.

O yol mən getmişəm, yoldur xətərnak,
Düşübdür heyrətə sərgəştə əflak.

Gözimdə xarsən, xari-müğilan,
Sənə quldur əgərçi mahi-Kən`an.

Ölüncə söylərəm mən Leyli-Leyli,
Mənə gər olmasa bir zərrə meyli.

Giriftar olmaram hər bir kəməndə,
Alınmış bir qulam Leylayə bəndə.

Üzari-Leylidə qılmış təcəlla
Rüxi-dildar, Məcnun oldı rüsva.

Xəyal etmə məni surətpərəstəm,
Ki, məsti-badeyi-cami-ələstəm.

Kimin məcnuniyəm mən bilmək ani,
Çətindür, bilməsən, get, ey filani.

## "MƏHƏBBƏTSİZ MÜHƏMMƏDDƏN(S) NƏ HASİL"

Əgər olseydi səndə eşqi-kamil,
Deməzdün eşq edəndür əqli zail,
Məgər Məcnun olub Leylayə mail,
Yox idi heç kim Məcnunə hayil,
Min e`caz ilə etməz eşqi batil.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Olub Məcnun içün Leyla bəhanə,
Gəlürdi ney kimi neyçün fəğanə,
Başında quş yuvasi yanə-yanə,
Üzari-Leylidə görmiş nişanə,
Ki, cananun rüxindən düşdi qanə.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Geyüb Leyla libasın ol pərivəş,
Vıruldı xərməni-Məcnunə atəş,
Kəməndi-eşq ilə birdən keşakeş,
Düşüb dəşti-cünunə ol bəlakeş,
Ver, ey saqi, meyi-gülfamü biğəş.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Bileydün sən əgər miqdari-eşqi,
Edərdün can ilə iqrari-eşqi,
Çətindür bilməsən əsrari-eşqi,
Bileydün etməz idün xar eşqi,
Bilər eşqi o kimsə var eşqi.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Əgər eşq olmaseydi aləm olmaz,
Kimün yox eşqi hərgiz adəm olmaz,
Get, ögrən eşqi, rütböndən kəm olmaz,
Məhəbbət aləmi tək xoş dəm olmaz,
Məhəbbət kimi yaxşı həmdəm olmaz.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Kəməndi-eşqi, get, divanədən sor,
Nədür eşq aləmi, pərvanədən sor,
Nədür pabəndi-giysu, şanədən sor,
Nə nəş`ə meydə var, məstanədən sor,
Nə yerdə gənc var, viranədən sor.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,

Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Gedüb kəsb et şəhidi-Kərbəladən,
Təriqi-eşqi ol zibhül-qəfadən,
Var həqqi dəm ura hərdəm vəfadən,
Ona həmrütbə yox şahü gədadən,
Keçübdür rütbəsi hər ənbiyadən.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Həqarət çeşmün açma ol şəhidə,
Ona həmrütbə yox bir afəridə,
Təməllüq etmədi zalim Yəzidə,
Kim olmış bu Hüseyni-qəmkəşidə,
Haçan oldun ətəşdən ləbməlidə.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Mühəmmədlə(s) olub xətm nübüvvət,
Binadən var rəsmi-eşqə etdi xidmət,
Məqami-eşqə yetdi, tapdı şöhrət,
Yeyüb xuni-dil ilə çəkdi zəhmət,
Yetərsən məqsədə çəksön əziyyət.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

Bu bir yoldur xətalı, bu yəqindür,
Müyəssər olmaz hər kəsçün, çətindür,
Səlamət getmək olmaz cövri mindür,
Bu yolda min bəla tiği kəmindür,
Xəbər alson sözün həqqin həmindür.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,
Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.
Haçan Məcnun tək oldun laübali,
Olursan xahişindən eşqün hali,
Və gər nə olmason Məcnun misali,
Dəxi tərk etgilən əmri-məhali,
Eybdür, getmə, Saqib, dəst xali.

Məhəbbətdə Mühəmməd(s) oldı vasil,

Məhəbbətsiz Mühəmməddən(s) nə hasil.

### “CANAN SANA GƏR ETSƏ SİTƏM..."

Canan sana gər etsə sitəm, vəsl hesab et,
Min canun ola istəsə, ver, durma şitab et,
Hicran qəminə ahü fəğan eyləmə, tab et,
Səccadəni yandur oda, mehrabi xərab et,

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Mey içməyəni sən məgər insanmı sanursan?
Zahid, özüvi tabe`i-Qur`anmı sanursan?
İnsanlığı, biçarə, sən asanmı sanursan?
Sağər tələbin huriyi-qılmanmı sanursan?

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Tərk etməmisən məscid ilə deyrü kinişti,
Var səndə hələ buyi-riya kəştibəkəşti,
Sən bildün haçan zərreiycə xubilə zişti?
Verməzlə sana, istəmə çox huri-behişti.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Hər aşiq Məcnun kimi rüsva ola bilməz,
Hər mahliqa hüsndə Leyla ola bilməz,
Hər Yusifə pabənd Züleyxa ola bilməz,
Hər quş oxuyar, bülbüli-şeyda ola bilməz.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Mənsur degülsən, demə, hər ləhzə “ənəlhəq”,
Əngüşti-Mühəmməd(s) gərək etsün ayı münşəq,
Versün necə məşşatə yüzin çirkinə rövnəq?
Sultan necə vırsun yıxılan xanəyə beydəq?

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Sən bilməyəcəksən rəvişi-eşqü məhəbbət,
Yoxdur xəbərün kim, necədür rahi-təriqət,
Göstər, hanı səndə, hanı asari-həqiqət?
Tə`sir eləməz xəlqə əbəs, etmə nəsihət.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Əfsanəyə meyl etməgilən, əhli-yəqin ol,
Nə valehi-əbruyi-xəmü mahi-cəbin ol,
Məqsudə yetərsən, tələbi-həqqə qərin ol,
Min tiri-sitəm yetsə sana, qorxma, mətin ol.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Çoxdan uzağam sən kimi peymanəşikəndən,
Verdün vətəni düşmənə, dəm urma vətəndən,
Kül başuva, nə gözləmək olsun dəxi səndən,
Bülbül qaçır əlbəttə, yox asar çəməndən.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

Saqib, dedim ol saqiyə, dur, ver meyi-nabi,
Məst eyləgilən, məst məni-xanəxərabi,
Sağər dolısı rəf` eləsün rəncü əzabi,
Rədd ol, dedi, get, verdi mana böylə cəvabi.

Əvvəl cigərün sənci-məhəbbətdə kəbab et,
Ondan sora meyxanəyə get, əzmi-şərab et.

## "NECƏ AH EYLƏMƏYÜM..."

Nə yəman gündi o gün kim, sana düşdi nəzərim,
Deyəsən dutdı məni naleyi-ahi-səhərim,

Kim məni çəkdi səri-kuyivə, yoxdur xəbərim,
Yetməmiş vəslüvə, qəm fövci dutubdur bərim,

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Bağrımi laləsifət eylədi qan hicranun,
Qədimi əgri qaşun kimi kəman hicranun,
Qoymayub təndə qala tabü təvan hicranun,
Bimürüvvət, çəkər əl məndən haçan hicranun?

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Tökərəm göz yaşı rüxsarimə Ceyhun-Ceyhun,
Ağlar əhvalıma Fərhad ilə Məcnun-Məcnun,
Tökülüb üstimə möhnət yüki hamun-hamun,
Vırar hər ləhzə mana qəm oxı şəbxun-şəbxun.

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Küfri-zülfün məni pabənd eləmiş zünnarə,
Aləmi fitnə dutar, tökmə bu məhruxsarə,
Dutanı mən rəhi-eşqün, günüm olmış qarə,
Etmisən bağrımı qan, vermə könül əğyarə.

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Dedim, ey dil, sana, əl çək bu pərivəşlərdən,
Uyar əğyarlərə, zülfi müşəvvəşlərdən,
Ehtiraz eyləmədün yandıran atəşlərdən,
Oldı hasil sana möhnət bu keşakeşlərdən.

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Hüsnüvə bu dili-viranəmi heyran etdün,
Könlimi lə`li-ləbün fikri ilə qan etdün,
Tiği-əbrulər ilə qəsdi-dili-can etdün,
Dutar ahim səni, bəsdür dəxi tüğyan etdün.

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

Saqiba, eylə həzər, eşq yəman sövdadur,
Eşqün əndişəsi başdan-əyağə qovğadur,
Kim rəhi-eşqi dutub aləmara rüsvadur,
Məni rüsva edən aləmdə bu məhsimadur.

Qalmadı ahi-cigərsuz ilə təndə əsərim,
Necə ah eyləməyüm, ah, yanubdur cigərim.

## AYRILMIŞAM

Eylərəm fəryad ney tək yardən ayrılmışam,
Çeşmi-mərdümküşləri xunxardən ayrılmışam,
Afəti-can, türrəsi tərrardən ayrılmışam,
Bağbani-möhnətəm, gülzardən ayrılmışam,

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam.
Afəti-can, türrəsi tərrardən ayrılmışam.

Zülfi zənciri-cünundur, xalıdur adəmfərib,
Qəmzəsindən ox təmənna eylərəm, olmaz nəsib,
Lə`li-nabindən alur hər ləhzə kam dili-rəqib,
Dərdimə yox çarə, dərman eyləmə, əl çək, təbib.

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam,
Afəti-can, türrəsi tərrardən ayrılmışam.

Aləmi bir tari-zülfində giriftar eyləmiş,
Çeşmi-məsti nərgisi-şəhlani bimar eyləmiş,
Arizi bülbül gözində qönçəni xar eyləmiş,
Səngdil əğyar ilə dün seyri-gülzar eyləmiş.

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam,
Afəti-can, türrəsi tərrardən ayrılmışam.

Dəşti-qəmdə naləmə Məcnuni giryan eylərəm,
Kimsə sormaz halımi neyçün mən əfğan eylərəm,
Ah, neylüm hər nəfəs çaki-giriban eylərəm,
Ey deyən qan ağlama, qəsdi-dilü can eylərəm.

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam,
Afəti-can, türrəsi tərrardən ayrılmışam.

Sən məni saldun bəlayə, ey dil, ey dil, yanəsən,
Çox dedim, əl çəkgilən, əl çəkmədün divanəsən,
Mail oldun bu pərirüxsarə, döndün qanə sən,
Dil verüb əğyarə, gəl, əl çəkgilən viranəsən.

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam,

Afəti-can, türrəsi tərrardən ayrılmışam.

Ey deyən fəryad neyçün eyləyürsən hər nəfəs,
Bir bəlayə düşmişəm, yoxdur mana fəryadrəs,
Maliəm bir sərvnazə, görməyübdür hiç kəs,
Olmışam eşqində rüsva, eylədim bica həvəs.

Bir pərivəş, sərvi-xoşrəftardən ayrılmışam,
Afəti-can, türrəsi tərrardən ayrılmışam.

## RAHƏT YAŞAYUR

Əldən nə gəlür, neynəyüm iqbal cünundur,
Sövdanı dutsam ot olur, bəxt zəbundur,
Yoxdur soran heç kim mənim əhvalımi çundur,
Dərdim kimə izhar eləyüm, dərd füzundur.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Qismət mana dərdü qəm olub “qalü bəla”dən,
Bu tale`i-idbar durub çıxmaz aradən,
Çəkməz əlini atdığı min səngi-cəfadən,
Ey bəxti zəbun, bir dəm ayıl, düş bu həvadən.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Bir yanda vətən nalədə, bir yan dili-zarım,
Ney kimi gəlür naləyə, yox səbrü qərarım,
Ya Rəbb, nə olur yüz aça bir sevgili yarım,
Ənduh ilə daim keçəcək leylü nəharım.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Fəryad əlündən sənün, ey gərdişi-dövran,
Qıldun vətənimdən məni avarə, pərişan,
Qan etməmişəm, eyləmisən bağrımı sən qan,
İnsaf degül, rəhmə gəl, ey xanəsi viran.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Xunabə gözümdən sitəmündən səyəlandur,
Kim qəddimi görsə, deyəcək əgri kəmandur,
Möhnət yüki bükmiş, gətür əl, bir dəm əmandur,
Zalim, demisən səndə bu nə ahü fəğandur?

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Bir kəsdə vətən olmasa, vicdanı da olmaz,
Biqədr olur hər yerdə, nigəhbanı da olmaz,
Öldürsön onı, qanı itər, qanı da olmaz,
Kim düşsə bu dərdə, dəxi dərmanı da olmaz.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Bənzər vətəni olmayan aləmdə gədayə,
Getsə nə yerə, xəlq deyər gəlmə burayə,
Fəryad eləsə bir kəsi yox yetsün hərayə,
Qur`an eləyür lə`nət ona ayəbəayə.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Hər kimdə vətən var, edər aləm ona hörmət,
Düşmən əyağın öpməgə eylər, bəli, minnət,
Getsə nə yerə zərreyicə görməz əziyyət.
Ölməz vətən oğlı, diridür ta bəqiyamət.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Xaindi, vətəndən həzər etsəydi filani,
Düşməzdi vətən əllərə bir ləhzə, bir ani,
Avarə salub nalə ilə pirü cəvani,
Ya Rəbb, görərim kimdür, alan varmı bu qani.
Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

Övladi-vətən tə`nə vırar şahi-cəhanə,
Tə`zim eləməz bir kəsə qərq olsa da qanə,
Kəmrütbə degül, qiyməti var, getsə hayanə,
Vəqt oldı, gəleydi, məni qoymış yanə-yanə.

Rahət yaşayur hər nə ki, vardur vətənində,
İlla məni-biçarə qəmü dərdü mihəndə.

## EDƏCƏK YOX

Zülmün evini qəhrlə bərbad edəcək yox,
Qəmdən dili-naşadımi azad edəcək yox,
Hər bir nəzərün düşkiniyəm, yad edəcək yox,
Viranə könül, yan, səni abad edəcək yox,
Fəryad eləmə ney kimi, imdad edəcək yox.

Ey söləyən, icad olacaqdur yeni dünya,
Bir səhvü xətadur dedigün, yox ona mə`na,
Əfsun oxımaqlığla açılmaz bu müəmma,
İslah özüvi eyləməmiş etmə təmənna,
Doğru yola netmək səni irşad edəcək yox.

Abadı yıxub xak ilə yeksan kim edibdür,
Xatirləri bilmərrə pərişan kim edibdür,
Yox zülmə nəhayət, belə tüğyan kim edibdür,
Xunabə tökər, gözləri giryan kim edibdür,
Dəf`i-sitəmi-naxələf övlad edəcək yox.

Çox eyləmə tüğyan, sana dünya belə qalmaz,
Qanı tökülər sağəri-mina belə qalmaz,
Var-yoxını xəlqün elə yəğma, belə qalmaz,
Başun dəgəcək daşə, bu sövda belə qalmaz,
Mumi demə bir ləhzə də fulad edəcək yox.

Girəm ki, müsəxxər elədün külli-cəhani,
Verməz sana bir faidə, tökmə yerə qani,
Rahət yaşasun xəlqi qoyun bir nəfəs ani,
Həddindən aşırdun, həzər et, cövrü cəfani,
Zülmündən usanmır, bizə imdad edəcək yox.

Qanlar yatacaq yerdə, inanma, dutar ahi,
Axır səni, ey nəfsə uyan xahi nəxahi,
Hər sahibi-nəfsün onı bil, var pənahi,
Tezdür yetişə müntəzir ol, əmri-İlahi,
Dərd çox, ona bir çarəni icad edəcək yox.

## ELƏMƏKDƏN

Qafun qədi neyçün bükülüb böylə kəmandur,
Eşqün yükinə tab eləmüb, barı girandur,
Məcnundən ibrət elə, rüsvayi-cəhandur,
Tərk eylə bu sövdanı, yəmandur ki, yəmandur,
Ey dil, həzər et, hər nəfəsi afəti-candur.

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

Cəhd et özüvi etməyəsən eşqə giriftar,
Qəm dutsa sana yüz, dəxi olmaz sana qəmxar,
Rüsva eləyərsən özüvi, kam alur əğyar,
Kölin* verür əğyarə o yar, sevgili dildar,
Bir zərrə inanma bu gözəllərdə vəfa var.

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

Dutma rəhi-eşqi demədimmi sana mən, dil,
Uydun bu pəriçöhrəyə bica yerə sən, dil,
Hicrində nigarun gedüb avarə düşən dil,
İbrət elə Məcnundən, ey qanə dönən dil,
Rüsvayi-cəhan oldı o Leylanı sevən dil,

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

Rüsva səni eylər bu gözi qarə gözəllər,
Məcnunsifət eylər səni avarə, gözəllər,
Adət belədür dil verür əğyarə gözəllər,
Dünyayə salur fitnəni məhparə gözəllər,
Giysulərini gər tökə rüxsarə gözəllər,

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.
Baxma bularun şiveyi-rəftarinə, ey dil,
Bənd olmagilən türreyi-tərrarinə, ey dil,
Azad eləməz bənd ola kim tarinə, ey dil,
Uyma, həzər et, arizi-gülnarinə, ey dil,
Rəng ilə verüb zinəti rüxsarinə, ey dil,

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,

* Könlünü

Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

Hər riştеyi-giysuləri bir əf`i ilandur,
Qarətgəri-din, xalü xəti sanma yalandur.
Rüsva eləmiş Adəmi məşhuri-cəhandur,
Şəhla gözinə uyma əmandur ki, əmandur,
Daim dili-üşşaqi yıxub, içdigi qandur,

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

Bir yarə könül ver, ona əl tapmaya əğyar,
Bir zərrə vəfası yoxa dil etmə giriftar,
Mail özüvi eylə o yarə, ola qəmxar,
Qəm dutsa sana yüz, gedüb ol talibi-dildar,
Saqib degül heç səndə pəsəndidə bu rəftar.

Ey dil, gətür əl naləvü fəryad eləməkdən,
Hərdəm bu pəriçöhrələri yad eləməkdən.

## "...NECƏ GƏLDİ, NECƏ GETDİ"

Tərkin necə mən eyləyərəm ahü fəğanun,
Gözdən tökülən seyl kimi əşki-rəvanun,
Fikrün nə çəküm mən dəxi bu sevgili canun,
Çəkmə qəmin, ey dil, qoy, aradən itə qanun.

"Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi".*

Qurban olum ol mahvəşü laləüzarə,
Bir dərdə salubdur məni, yoxdur ona çarə,
Peyvəstə vırar qəmzə oxını məni-zarə,
Əbrusi kəman, kiprigi ox, gözləri qarə.

"Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi".

Min cani-girami ola, cananıma qurban,
Yandır məni, yandırgilən, ey atəşi-hicran,
Yansun mənim əhvalıma, qoy, şəm`i-şəbistan,
Əğyarə veribdür könül ol afəti-dövran.

* Beyt Qarabağ xanı İbrahimxəlil xanın qızı Ağa Bəyim xanımındır.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

Ey badi-xəzan, əs, güli-gülzarı xəzan et,
Bülbül gözinə qönçeyi-novxizi tikan et,
Fəryadın eşidmə, dəxi də bağrını qan et,
Yıx sərvi əyağ altına, qəddini kəman et.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

Təklif mana eyləmə, saqi, meyi-nabi,
Yıxma xüm əyağinə məni-xanəxərabi,
Bağlar yüzümə meykədəni, eylə səvabi,
Bəsdür, səni tari, mana çox vermə əzabi.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

Xunabeyi-həsrət tökərəm, ah, dəmadəm,
Dutdum rəhi-eşqi könül heç olmadı xürrəm,
Qan qoydı mənim bağrıma ol türrəsi pürxəm,
Fəryadü fəğandur mana hicran güni həmdəm.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

Qan qoydı mənim bağrıma bu tazə cəvanlar,
Zənciri-cünun türrələri, qaşı kəmanlar,
Tə`sir eləməz heç bulara ahü fəğanlar,
Dünyayə salub fitnəni bu afəti-canlar.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

Saqib, gətür əl eşqdən, eşq afəti-candur,
Şahid bu sözə, get xəbər al, pirü cəvandur,
Tərk et bu pəriçöhrələri, eşqi yəmandur,
Bəsdür bu sözi söləmə divanə zəbandur.

“Əfsus ki, yarım gecə gəldi, gecə getdi,
Heç bilmədim ömrüm necə gəldi, necə getdi”.

## AZƏR GÖZƏLİ

Fəryad əlündən, eşq, fəryad,
Bir ləhzə məni sən etmədün şad,
Kimdür məni qəmdən etsün azad,
Etdi məni seyd bir pərizad.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Almış bütün ixtiyarı məndən,
Kəsmiş hamı e`tibarı məndən,
İnciddi cəm`i varı məndən,
Kəsməz qəmi, ahi-zarı məndən.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli mələk misalı.

Xali-xətidür fəribi-Adəm,
Rüxsarinə məhv cümlə aləm,
Zənciri-cünun zülfi pürçəm,
Əbruyi-kəci kəmani-Rüstəm.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Qamət demə, qədidür qiyamət,
Xalı dilü dini etdi qarət,
Qoymub qala məndə tabü taqət,
Şirin hərəkat, Leyli halət.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Gün açmaz, üzin açanda rüxsar,
Can tazələnür edəndə göftar,
Naz ilə gər etsə seyri-gülzar,
Bülbül gözinə çəmən olur xar.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Çox var gözəl kəmanəbru,

Xurşidliqa həm səmənbu,
Aşubi-zəmanə, çeşmi-cadu,
Təkdür gözəl içrə bu pəriru.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Dur, saqi, gətür şərabi-biğəş,
Dutdı dili-natəvanı atəş,
Meyxanəyə çək məni keşakeş,
Əğyarə verüb dil ol pərivəş.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

Saqib, eləmə çox ahü zari,
Əldən nə verübsən ixtiyarı,
Məhparələrün yox e`tibari,
Əzbər eləmə bu şe`ri, bari.

Qurbanı olum, qızıl qəbalı,
Azər gözəli, mələk misalı.

## XX ƏSRÜN YARATDIĞI VƏHŞƏTƏ DAİR

Bir aqibətün fikrini qıl, etmə məniyyət,
Bihudə yerə eyləmə çox xəlqə əziyyət,
Etmək sana bica yerədür gərçi nəsihət,
Bəsdür bu qədər eyləmə qan tökməgə rəğbət,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Qan tökməgi nahəq yerə asanmı sanursan?
Qan içməgi sən dərdüvə dərmanmı sanursan?
Zülm etməgi həmnöv`üvə vicdanmı sanursan?
Qəflətdən ayıl, zalımı insanmı sanursan?
Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Ahi-səhərün, eylə həzər, ahi yəmandur,
Şahid bu sözə, get xəbər al, pirü cəvandur,
Axır dutacaqdur səni, fikr etmə, yəlandur,
Rahət yaşasun xəlqi qoyun bir dəm, əmandur,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Bir gün gələcək tabü təvanun gedər əldən,
Çatmaz əlün heç bir yerə, canun gedər əldən,
Rəhm eyləyən olmaz sana, qanun gedər əldən,
Avarə qalub, pirü cəvanun gedər əldən,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Vermiş sana bu görmədigün vəqti zəmanə,
Get, hörmət elə hər kəs ola, pirü cəvanə,
Beş gün qalacaq, sən də qalursan yanə-yanə,
Qan tökmək içün boş sözi çox etmə bəhanə,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Ram olmagilən nəfsüvə, bir dami-bəladur,
Kim nəfsinə uymış, onı bil, bəxti qəradur,
Getmə bu xətərnak yolı, rahi-xətadur,
Zalimligi tərk eyləgilən, harda rəvadur,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Qadir nəyə oldun elədün xahi nəxahi,
Öz millətüvə, bil, səni axır dutar ahi,
Dutmış vətənin, dust edibdürmi günahi,
Yox səndə məgər zərrəyicə xovfi-İlahi,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Satdun vətəni heç nəyə əfsanələr içün,
Verdün vətən oğlın ələ biganələr içün,
Keçdün şərəfündən kimə divanələr içün?
Namusı buraxdun belə peymanələr içün,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Satdun kimə namusi-vətən, ey evi bərbad!
Əksikrağı xəlqün, tufu, ey naxələf övlad!
Yıxdun vətənün rüknini axır, evün abad!
Gördün hərifi vermədi axir sana hiç zad,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Oğlanları vardur vətənün şiri-jəyandur,
Vəqtində gələr, gözləyür hökmi, nigərandur,
Heç kim onı bilməz gələnün vəqti haçandur,
Tədbir gərək hər işə, məşhuri-cəhandur,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

Bu Saqibə baxma ki, zəmingir olubdur,
Qəm-qüssə alub canıni, dilgir olubdur,
Yox tabü təvanı, qocalub pir olubdur,
Vəqtində görərsən dirilüb şir olubdur,

Qan sahibi yoxdur demə, ey qan eləyənlər,
Vardur, gələcək aləmi viran eləyənlər.

## MƏRHUM MİRZƏ RƏHİM ĞÜFRANPƏNAHUN VƏFATINUN TARİXİ (1349)*

Bivəfadür bu cəhan əhli, bütün mafiha,
Ey könül, eyləmə bir zərrəcə meyli-dünya.

Qəmə aludə ikən, gəldi genə qəm xəbəri,
Qapumi açdı xəbər verdi mana badi-səba.

Səfəri-axirətün dutdı yolın, fəryad et,
Ney kimi şamü səhər Mirzə Rəhim, yə`ni Fəna.
Azəri kişvərinün şairi-bihəmtasi,
Aldığın verdi bütün, varü yoxın qıldı fəda.

Bir kəsi qəbr qucub alidi başdan-əyağə,
"Əz ğəməş çun nə konəm nalə, dela, sübhü məsa".*

* Mirzə Rəhim Fəna (1841-1931) Qarabağ şairlərindən olub "Məclisi-üns"ü təşkil edənlərdən biri olmuşdur.
* Onun qəmindən gecə-gündüz nalə edirəm

## MƏRHUM FƏRƏCÜN VƏFATİNƏ DAİR**

Genə dövran sitəmi musiqiyə çəkdi Həsar,
Dutdı matəm eləyüb çaki-giriban Qətar,
Nitqdən düşdi cərəs, ağladı çəngü neyü tar,
Yardən gizlədüb ayinəsini ayinədar,
Tökdi əfşan yüzə giysulərini ol məhrüxsar,
Saqinün sağər əlində eləyür əşk nisar,
Dedim, ey saqi, əmandur, genə aləmdə nə var,
Verməyürsən meyi, öldürdi məni rənci-xumar,
Sağəri vırdi yerə sölədi, get, ol huşyar,
Fərəcün canını səyyadi-əcəl etdi şikar.

Yadə düşməz dəxi nə Şur, nə bir də Şəhnaz,
Pərdədən xaric olub rəsmi-Bəyati-Şiraz,
Əldə dəf xəstə müğənni eləməz əzmi-Hicaz,
Verdi səccadə meyə, tərk elədi razü niyaz,
Çıxdı mehrabdən hər zahid edüb tərki-nəmaz,
Salmayur yadinə hərgiz dəxi Məhmudi Əyaz,
Dəxi, heyhat, görə misli-Fərəc vəqti-diraz,
Yerü gög cüft ola, almaz əlinə tar nə saz,
Kim ilən fəxr edəcəkdür genə ol çərxi-fəraz,
Azəri kişvərini eylədi ənduhə düçar.

Dəhrdə musiqidən zərrəcə olmazdı əsər,
Olmaseydı Fərəcün himməti gər şamü səhər,
Görəcək mislin anun bir genə Qəfqaz məgər?
Nə ki Qəfqaz, cəhan məmləkəti sərtasər,
Yaradan musiqini göstərəcəkdür kim hünər,
Fərəcün mislinə verməz sütin heç bir madər,
Gər qəzası ola min illər ilə qəndü şəkər,
Saqisi huriyi-cənnət, meyi abi-Kövsər,
Necə ah eyləməyüm, şəm`tək od dutdı cigər,
Düşdi nadan əlinə musiqiyü musiqar.

Gər müğənni oxusa bir də həvayi-Şuri,
Yerbəyerdən ona tə`nə eylə Mənsuri,
Artırursan bizə qəm yad eləmə Mahuri,
Mütriba, çalma, əmandur, yerə qoy tənburi,
Ey neyün naləsi, incidmə məni-rəncuri,
Saqi, tökmə qədəhə bir də meyi-ənguri,
Ey gözəl, tökmə yüzə zülfi-şəbi-deycuri,

** Məşhur tarzən Mirzə Fərəc (1847-1927)

Hüsnüvə vermə bəzək, gözlərimün sən nuri,
Getdi əldən, hanı ol tarzənün məşhuri,
Yasə dönsün bizə gülzar dəmi fəsli-bəhar.

Qarabağ əhli kim ilə eləyür fəxr müdam,
Musiqidən xəbəri yox, genə dutmır aram,
Eyləyür boş yerə, bica yerə bu əmrə qiyam,
Musiqini eləyür tar çalanda bədnam,
Musiqi getdi Fərəclə, qalub əncaq boş nam,
Bağla meyxanəni, saqi, bizə ver sağərü cam,
Kim içər badə dəxi bir də olub badə həram,
Ey kəmançə, eləmə nalə dəxi sübh nə şam,
Düşdi əldən-ələ gör, musiqidən itdi nizam,
Ey könül, çaki-giriban elə, et naləvü zar.

Salikün nəğmeyi-dilsuzinə aləm heyran,
Nə əcəbdür ki, ona canımi etsəm qurban,
Var kimün həqqi ki, inkarun edə pirü cəvan,
Necə mən eyləməyüm ney kimi fəryadü fəğan,
Gör, itirdi kimi bir anidə bu dövri-zəman,
Qəm odunda yanasan kişvəri-Azərbaycan,
Qəzəli başdan-əyağə deyəsən candur, can,
Musiqi təxtinə sultan idi mümtazi-cəhan,
Bir də Salik gələ bu aləmə heç etmə güman,
Nəğmə bazarı kəsad oldı, dağıldı bazar.

Gözümüz gər qala Mənsuridə, ey dil, nə əcəb,
Fərəc asarını kəsb eyləmiş ol alinəsəb,
Cəm`idür onda gözəl şiveyi-adabü ədəb,
Həm müəllimdi Fərəc anə, bəli, həm məktəb,
Yerinə düşdi nə qədri ki, çəküb rəncü təəb,
Əlini tar öpər, mən qoyaram sağərə ləb,
Çəkmə dağın dili-suzanimə, bari, ya Rəb,
Ona hər ləhzə Fərəc kimi mürəbbiydi səbəb,
Fəxr Mənsuri ilə eyləyərəm ruz ilə şəb,
Saqiya, ver qədəhün badeyi-gülfam biyar.

Xətm olub məndə demə türk dilində əş`ar,
Ey Füzuli, eylə bu Bakuyə bir ləhzə güzar,
Bu sözündən nola bir dəm edəsən əstəğfar,
Yusifün gör qəzəlin, eyləgilən canı nisar,
Mahvəşlər kimi, gör, bir necə açmış rüxsar,
Aləmi heyrətə salmış, eləyərsən iqrar,
Azəri kişvərinün Azəri var nabşüar,

Vahidi-meykədə ovbaşi, Həsən tək Səyyar,
Saqibə verdi Müniri ədəbi şe`r yazar,
Cənnəti[*] cümləsinün dövrəsinə çəkdi həsar.

**RƏNGDÜR**

Zahid, əl çək, səndə bu tə`nə, nəsihət rəngdür,
Etdigün təsbih ilə hər ləhzə söhbət rəngdür,
Sübhədək mehrab içində rəncü zəhmət rəngdür,
Xatirün eyləyürsən hər nə niyyət, rəngdür,
Getdi əldən, söləmə hökmi-şəriət, rəngdür.[*]

Vəqtüvi bəsdür itirdün boş yerə, əfsanəyə,
Çox yügürmə, heç nə yoxdur məscidi-viranəyə,
Xəlqi, get, irfanə çək, ram eyləmə səddanəyə,
Keçdi vəqtün, kim uyar bir sən kimi divanəyə,
Buriyanun damənin dutmaq nə hacət, rəngdür.

Firqəti-Yusifdə hərdəm naleyi-Yə`qub, rəng,
Aləmə aşub salmış hüsni-hər məhbub, rəng,
Bu cəhani məhv edəndür fitneyi-aşub, rəng,
Müxtəsər, ə`lavü ədna, qalibü məğlub rəng,
Dərdsərdən başqa şey yox, dərdü möhnət rəngdür.

Baxma gülzarun içində bülbülün qovğasinə,
Qanə batmış güllərün, tər lalənün ə`zasinə,
Kuhkən Şirininə, divanənün Leylasinə,
Şəm`ə yandırmış özün pərvanənin sövdasinə,
Aşiqü mə`şuqə rəng, həm məhəbbət rəngdür.

Əcnəbilər milləti, gör, bir nələr icad edür,
Gör, kimün bağrıni yarmış, kimləri dilşad edür,
Mum edür fuladı, nadan, mumdən fulad edür,
Elm ilə aləmləri bərbad edür, abad edür,
Minbər üstündə deyürsən ki, sən`ət rəngdür.
Eybi yox aləmdə bu rəng ilə məşhur olmağun,
Külbaşun oğlı, nəinki müft muzdur olmağun,
Vəqti vardur, xanəviran, talibi-hur olmağun,
Gör, nələr göstərdi, zalim, xəlqdən dur olmağun,
Xəlqi həqqə qılmadun də`vət,  həqiqət rəngdür.

Aləmi-lahuti kim görmüş, kim olmuş bəhrəmənd,

Şair Əbdülxalıq Cənnəti (1855-1931)
[*] Səməd Mənsurun (1879-1927) eynirədifli şeirinə nəzirədir.

Söləyürsən xəlqə hərdəm söz danişü irfanpəsənd,
Boş həvayə atmaz hərgiz, əqlə gəl, aqil kəmənd,
Xabi-qəflətdən ayıl, keçmiş zəmani-çunü çənd,
Bu yəlan sözçün hanı, yox əldə hüccət, rəngdür.

Kim vırar, gör, Kə`bənün səhnində sağər-sağərə,
Yaxşı hörmət eyləyürlər xatəmi-Peyğəmbərə,
Dutgilən təsbihi əldə, lə`nət eylə kafərə,
Gün qabağinə çıxırsan, qıl həya, ey şəbpərə,
Namünasib, səndə bu namusü qeyrət rəngdür.

Ayü gün baş qaldırur hər gündə Qərbün kamiçün,
Şərqdən ləbtəşnə ol sən, abi-Kövsər namiçün,
Başuvı işlədmə, eyb etməz, vətən əqlamiçün,
Bəslə cani, bəslə, bəslə əhli-məğrib damiçün,
Qıl nəmazi səhvsiz on yeddi rük`ət, rəngdür.

Az da olsa vırgilən dəm sən də var-namusdən,
Açma söhbət, bisəmərdür təxti-Keykavusdən,
Ver qulağun bir zəman həq söz eşid naqusdən,
Ey müsəlmanlər, deyür rəngi alubsuz rusdən,
Söləyürsüz, olmasun asari-iffət, rəngdür.

Bixəbər, birənglik qaldı keçən əyyamdə,
Həqqi isbat etmək içün tiği-xunaşamdə,
Qalmısan avarə, sərgərdan əlfidə həm lamdə,
At çapar, gör kim, gözün çıxsun, İraqü Şamdə,
Yatgilən asudə, eylə istirahət, rəngdür.

Yox qoyan qiymət, danışma, əl gətür imandən,
Ehtiramın sən itirdün, yum gözün Qur`andən,
Gör nə istər, çarəsin et, dut xəbər əyyamdən,
Yetməsən məqsudüvə, qorxson əgər sən candən,
Eyləmə bifaidə min canə rəğbət, rəngdür.

Yox vətən səndə, əzizim, zərrəcə iman da yox,
Olmayanda səndə iman, dərdüvə dərman da yox,
Paksən, naşüstə get, boynunda heç bir qan da yox,
Keç vətəndən, neynəyürsən, huri yox, qılman da yox,
Sölə sən, hübbül-vətən yeksər əziyyət, rəngdür.

Milləti-İslam içün, Saqib, qalub bədnamlıq,
Kasə-kasə hər nəfəs, hər an xunaşamlıq,
Vadiyi-heyrətdə sərgərdan biaramlıq,

Kamə yetdi hər yetən, bəsdür bizə bədnamlıq,
Beylə millət olmasun hərgiz səlamət, rəngdür.

## RƏNGDÜR - II

Rəngsiz bir nəfs yoxdur, əsl insan rəngdür,
Urgilən mizani-əqlə, küfrü iman rəngdür,
Mən deməm hərgiz müsəlmanəm, müsəlman rəngdür,
Çox da var imkan, bu bəhsi açma, imkan rəngdür,
Çox da qoy baş səcdəgahə, zikri-sübhan rəngdür.

Rəng olan yerdə boğar milliyyətin ünsiyyətin,
Kimdə var birənglik hifz eyləyübmi ismətin,
Fitnə dutmış aləmi kim göstərüb xasiyyətin,
Olsa kim birəng pozmaz heç kimün hürriyyətin,
Müxtəsər, başdan-əyağə elmü irfan rəngdür.

Rəng qoymaz ülfət olsun, ülfəti nifrət edər,
Əhli-izzət ehtiramın məhvü bihörmət edər,
Mərdümi-biqeyrətün amalına şöhrət edər,
Xahişi-nəfsin bıraxmaz, boş-hədər işrət edər,
Gündə yüz milyanlar ilə insə ehsan rəngdür.

Rəng qoymaz xəlqi rahət, fitnələr icad edər,
Xanəbərduşun evin, rəhm eyləməz, bərbad edər,
Mərdümazari həmişə güldürür, dilşad edər,
İncidür azadə görsə tuşeyi-cəllad edər,
Adı var, asarı yoxdur, rəhmü vicdan rəngdür.

Rəngdür icad edən şəmşiri-xunəfşanları,
Qırdırur min illər ilə boş yerə insanları,
Ad qoyursan bisərü payə vətən qurbanları,
Bu vətən qurbanlarınun varmıdur vicdanları?
Yox, oğul, min dəf`ə yox, gəl, olma nadan, rəngdür.

Rəngdən ayrıldı məslək, bir görək məslək nədür,
Gər yəqinlik var isə, aləmara bəs şək nədür,
Səndə var, yox məndə, vermürsən çürük əppək nədür,
Söləyür nokər ağayə hər zəman ləbbeyk nədür,
Başə düş, əl çək bu məsləkdən, bu ünvan rəngdür.

Əvvəla, birənglik yoxdur, yalandu var deyən,
Olsa, var xasiyyəti şərh eyləyüm, ver fikr sən,
Olmaz heç rəngdə təzvir, hiyləvü məkrü fən,

Dust eylər düşməni, olmaz dəxi peymanşikən,
Öldürürsən sən məni olmaq peşiman rəngdür.

Sən müsəlmansan, get ol, girəm, yəhudəm, hər nəyəm,
Sən məni təkfir neyçün eyləyürsən dəmbədəm,
Tarı bir, məxluqi birdür, yaxşı fikr et, gör kiməm,
Bir ana doğmış bizi mən də sənün tək adəməm,
Söləyürsən ol mənim tək əhli-iman, rəngdür.

Məscidün, meyxanənün, deyrün de bir nə fərqi var,
Naleyi-naqusi neyçün etməyürsən ixtiyar,
Zikri-"ya mə`bud" söylər hər nəfəs ol huşyar,
Ya müəzzin qışqıra birdür və ya kim çəngü tar,
Fərqi yoxdur zərrəcə Buzərlə Səlman, rəngdür.

## TAZİYANƏ

Ey dil, səni bənd eylədi bu zülfi-səlasil,
Əl çək, özüvə dami-cünun eyləmə hasil.

Çoxlar özüni rəngə salub, sanma gözəldür,
Bir görmək ilə olmayasan renginə mail.

Əldən-ələ düşmişlərə çox fikrüvi vermə,
Olson yaxın, eylər səni rüsvayi-təcahil.

Olmaq sana layiq degül heç nəfsün əsiri,
Qoymaz səni hərgiz olasan məqsədə nail.

Zinhar, dut uzaq şiveyi-hər qönçədəhani,
Uyma sana göz eyləsə hər mahşəmayil.

Qoyma, həzər eylə, sən ilə Həqq arasında,
Hər qaşı kəman zülfi qəra ta ola hail.

Mən, gör, necə düşdüm əyağə, eylə bir ibrət,
Nadanlığa yol verdim edüb əqlimi zail.
Əfsus, məni nəfsi-dəni saldı əyağə,
Nə sehr elədim, etdi mənim sehrimi batil.

Qərq etdi məni bəhri-məlamətdə, nə çarə,
Nə əvvəli, nə axıri vardur, nə də sahil.

Düşməz rəhi-bihudəyə, sərf eyləməz ömrin,

Düşməz bu yola, eylə yəqin, mərdümi-kamil.

## TAZİYANƏ

Ağazadə, özüvə fikrüvi ver bir ani,
Qalacaqsan başaçuq, eyləmə çox tüğyani.

Təkyə, ey naşi, verürsən o kəsün təxtinə kim,
Əqldə, fəhmdə aləmlər olub heyrani.

Oturub-durmağuvun rəsmini heç bilməmisən,
Söləyürsən yetənə yaxşı-yəmani tani.

Qaşı düz eyləməgə kuşiş edürsən əmma,
Çıxarursan gözi, ey nazlu Quba ceyrani.

Əkgilən yay Şıxverdi soğanın bir-bir,
Nə içün tərk elədün məmləkəti-Hövsani?

Özüvi rəngə salubsan, bu sənün mə`rifətün,
Bir qarın loğma içün doldurusan torbani.

Qarğa tə`lim elədi tavusa, get, mən kimi yol,
İtirüb öz yerişin, ləng gəzir hər yani.

Səndə təqsir yox hərgiz, o kəsün təqsiri var,
Sana bu rütbəni vermiş o mürüvvət kani.

Mə`rifət bir pula dəgməz çıxasan bazarə,
Yerbəyerdən deyülür səndə fərasət hani?

Müştəri qanmaza çoxdur çəkə kim bazarə,
Düzgilən guşeyi-vıstavkələrə nadani.

Gör necə fəhm tənəzzül eləmiş aləmdə,
Tapşurublar sana bir on məni yox, milyani.

İmtəhan etmək içün əlli minin qoy cibüvə,
Deməz heç kimsə sana əlli min olmış, hani?

Xəlqi narahət edürsən, sana şayəstə degül,
Əqlüvi başuva yığ, beylə yeməzlər nani.

Hər kəsün ölçisi var, ölçi ilə iş də görər,

Yollamazlar naxıra padşəhi, sultani.

Lə`li sərrafə verüllər nə ki, qax qoz satana,
Tanımursan hələ sən arpa ilə buğdani.

Kül olub gör necə xəlqün başına aləmdə,
Xəlqə təng eyləmisən boş yerə bu dünyani.

Sən hara, əhli-kəmalə vırasan tə`nə hara,
Yer gögi sürmə yerinə gözə çək, ey nani.

Atanun gözlərini vırdı çıxardı birisi,
Xəlqi qorxuzmaq içün, salsun ələ meydani.

Dedilər kor kişi oğlı, xəcl oldı bu sözə,
Evə girdi başına çəkdi cırıq yorğani.

Malakan atı vırar şıllağıni divarə,
Sahibi həddən artıq verə gər arpani.

Nanəcibzadədə olmaz əsəri-fəhmü kəmal,
Gecə-gündüz oxuya min kütübi-Loğmani.

Oxıdıqca dəxi də qanmazü nafəhm olur,
Xatirün cəm` elə, yoxdur bu sözün bətlani.

Ərəbistan atı nacins ilə cinsi gözlər,
Bir nəzərlə tanıyur cinsi degül madyani.

Şəkəri bayquya versön dəxi ququ etməz,
Tutiyə versön, açar nitqi-gühərəfşani.

Şir vırmaz ağzın it qabağından qalana,
Künci-məğğarədə gər çıxa acından cani.

Başuvi sal aşağə, kibrü qüruri tərk et,
Özüvə kəsb elə bir mə`rifəti-insani.
Şəm`vəş eyləmə sərkeşligi, üftadə get ol,
Yandurarsan özüvi, vermə belə fərmani.

Bax oğul tək quluva, xəlq sana rağib olar,
Şərəfü izzətün artar, demə var nöqsani.

Tərbiyət gərçi çətindür verəsən naəhlə,

Yaxşılıq rəngi gətürməz, yox onun ərkani.

Ey canım, tap özüvə bir işi bel işləməgin,
Olmasun onda nə bir səhvi, nə də bir nisyani.

Düşməyürsən başa bir şey ki, deyürsən bilürəm,
Bu yəman dərddür, yoxdur onun heç dərmani.

Bilməyür birsi, deyür bilməyürəm, eyb degül,
O bilər hər nə desön, müftə yeməz həlvani.

Müftəxorlıq eləməz sən kimi, var insafi,
Xəlqi aldatmağa hərgiz bəzəməz dükkani.

Bu nəsihət sana tə`sir eləməz mən bilürəm,
Məkrivün qüdrəti heyrətdə qoyub şeytani.

## ZƏN EYLƏR

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,
Nalayiq əməl var nə qədr, yad zən eylər,
İblisə verüb tərbiyət, irşad zən eylər,
Pis gündə sana sanma ki, imdad zən eylər.

Hər bir nəfəs ondan özüvə gözlə xətani,
Əsraruva, zinhar, gedüb vermə yol ani,
Həmdəm onilə olma, edər ömrüvi fani,
Bir göz yumub-açınca yıxar kövnü məkani,
Heyrətdə qoyub məkri onun hər üqəlani.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər.

Məğlub eləyər fitnəsinə aləmi yeksər,
Qur`andə vermış xəbərin Xətmi-Peyəmbər,
Sancar səni əf`i kimi ol şumi-bədəxtər,
Görsön anı e`caz eləyür misli-hünərvər,
Zinhar, inanma, sana məkr eyləmək istər.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər.

İblis ona iman gətirüb, sanma yalandur,

Böhtan ki, degül bu dedigüm gün tək əyandur,
Bir kimsənün adı zən ola, bəs bu nə nişandur,
Yetmiş bu xəbərlər bizə, get, gör, nə zəmandur,
Hər bir rəvişi, hər nəfəsi düşməni-candur.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər.

Gəlməz xoşı bir zərreyicə xeyrüləməldən,
Təxmir olunub zatı belə ruzi-əzəldən,
Varü yoxuvı almasa, qoymaz səni əldən,
Şəkk etsön əgər yaduva sal ruzi-Cəməldən,
Şirinligi məkr ilə alur qəndü əsəldən.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər.

Eymən özüvi etmə bu napakdən hərgiz,
Aldanma, onun şivələrindən elə pəhriz,
Zəndən doğulub fitneyi-xunriziyi-Çingiz.
Xoşdur hərəkatından onun xəncəri-xunriz,
Zəndən dağılub məmləkəti-kişvəri-Pərviz.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Lə`nət bularun ağü qərasinə dəmadəm,
Cənnət qapusından qovulan vəqtdə Adəm,
Peyğam eləyibdür belə ol rəhbəri-aləm,
Nifrin eləyübdür bulara həzrəti-Xatəm,
Zən eylədi rüsva məni, yox zəxminə mərhəm.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Bax "keydi-əzim"* ayəsinə, eylə bir ibrət,
Qur`andə nifrət eləyüb Xətmi-nübüvvət,
Uyson bularun fe`linə, ey dil, sana lə`nət,
Yox zəndə vəfa zərrəcə hərgiz, elə nifrət,
Fərqi-Əli mehrabdə kimdən yedi zərbət?

Hər fitnə bu aləmdə var icad zən eylər,

* "...Sizin məkrləriniz böyükdür..." (Qurani-kərim, Yusif, 28)

Abad cəhan mülkini bərbad zən eylər,

Kim oldı səbəb, içdi Həsən(ə) zəhri-həlahil,
Bavər eləməz fe`li-zəni mərdümi-kamil,
Əl çək, bulara uymagilən, etmə təğafil,
Rüsvaluğuva olma səbəb, eyləmə hasil,
Bu bəhri-bəladən həzər et, yox ona sahil.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Əhmiyyəti yox, bir şey içün eyləmə əfsus,
Boşla yaxasın, hər yetənə bəsləmə namus,
Şərhin eləyibdür bularun müshəfü qamus,
Olmaqdadur səndən, onı bil, düşmənə casus,
Nisvan əlilə oldı fəna səltənəti-Tus.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Məl`undür ol kəs inana fe`li-zənanə,
Hər kim inana, tez salacaqdur onı qanə,
Qanə boyanubdur nə səbəbdən bu zəmanə,
Od vırdı zənan aqibəti-pirü cəvanə,
Bir fitnə salub, çarəsi yoxdur bu cəhanə.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Bədəsl ilə rəftar eləmək xeyli çətindür,
Əfsanə demə yazdığıma, eyni-yəqindür,
Şahid bu sözə ayeyi-Qur`ani-mübindür,
Həmraz bu bədtinət ilə olma, çətindür,
Başdan-əyağə şərrdür, həm mayeyi-kindür.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Salson yaduva mə`rəkeyi-Kərbübəlani,
Yəqinligün artar ki, nədür kim bu filani,
Kim saldı bəla taminə şahi-şühədani,
Əhvali bilüb sora, get, et ahü fəğani,
Zən oldı səbəb, saldı oda Ali-əbani.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

İtlə gedüb ol həmnəfəs, həmraz dəmadəm,
Övrətdən uzaq ol, özüvə rəhm elə bir dəm,
Əqrəblə keçir ömrüvi, əf`ilə ol həmdəm,
Yandırsa səni, qorxmagilən, nari-cəhənnəm,
Asudə olarsan, sana yüz verməyəcək qəm.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər,

Saqib özini saldı əbəs dami-bəlayə,
Bir dərdə düşüb, yetməz əli hiç dəvayə,
Möhtac eləyübdür özini nəsli-gədayə,
İmdad eləyən yox dəxi bu bəxti qərayə,
Yansun oda ol kəs ki, məni saldı xətayə.

Hər fitnə bu aləmdə var icad zən eylər,
Abad cəhan mülkini bərbad zən eylər.

## EY ZƏR

Xudayi-ləmyəzəli gər desəm sana, ey zər,
Məlamət etmə məni, sölәmə, get, ey kafər.

Sən olmason, əbəda, xəlqdə həyat olmaz,
Sən olmason, yəqin, aləm olur ki, zirü zəbər.

Sən ilə almaq olur intiqam düşməndən,
Sən ilə möhkəm olub bəndi-səddi-İskəndər.

Sən ilə fəth eləmiş həft kişvəri sultan,
Bəhanədür duta kim əldə nizəvü xəncər.

Sən ilə açılur hər babi-qəl`eyi-fulad,
Sən olmoson, dağılur padşahdən ləşkər.

Zər olmasa, qədəmin qoysa piri-meyxanə
Şərabxanəyə, salmaz ələ sınıq sağər.

Necə sana eyləmüm səcdə gündə min dəf`ə,
Sən ilə zahid öpər xaki-məqdəmi-minbər.

Zərün güciylə ki, təbliğ eyləmiş xəlqə,
Yetişdi sərhədi-məqsudə Xətmi-peyğəmbər.

Fəda olum sana, ey simü zər, əman günidür,
Əlimi dut düri-naçizara yıxılsam əgər.

Ləimə qoyma məni bir dəm olmağa möhtac,
Ki, sərfiru eyləmüm olsa şah ya qeysər.

Zərün gücini min e`caz eyləməz batil,
Xətanun eymənidür, yoxdur onda rahi-xətər.

Əgər min oğluvı öldürsə göz qabağında,
Xəyal eyləmə sən heç birini öldi hədər.

İt alsa ağzına zər kisəsini bazarə,
O gündə xəlq deyər gəl, gəl, ey mələkmənzər.

Bir imtəhan elə, bəlkə xilafdür bu sözüm,
Çətin degül, bir imtəhan əgər yerinə düşər.

Vay olsun haluva, bir həbbə olmasun səndə,
Səni görəndə salur qaş-qabağıni madər.

Evə qədəm qoyson, sındırar əyağlaruvi,
Deyər sana hanı nanun, acından öldi pədər.

Verəndə yüz sana qəm, döndərür yüzin səndən,
Qaçar, yanunda dayanmaz bəradərü xahər.

Cibündə olsa zərün, düşmən əl çəkər səndən,
Düşər əyağüvə, xaki-qədəmləründən öpər.

Hüseyndə(ə) olsa idi simü zər Yəzidi-dəni,
Tapardı əl necə Şahi-şəhidə şamü səhər.
Həvayi-mülki-Rey heç bilmədi Hüseyn(ə) kimdür,
Bu mülki-Rey təmə`in etdi Şimri-bədəxtər.

İmami-mütləqi zibh eylədi qəfasından,
Qiyam etdi bu əmrə qiyam degüldi məgər?

Zərün olanda yalan söləsön, deyər aləm,
Degül xilaf genə bir də sölə, ey sərvər.

İmami-əsr olasan heç kim qəbul etməz,
Deyəndə həq sözi, aləm deyər sözi qeytər.

Kəlami-həqqi oxursan, dutar qulaqların,
Ata, oğul, ana, xahər, bəradərü digər.

Deyərlər ağzuvı yum, baş-qulağımız getdi,
Danışma boş sözi, bu sözlərün gətürdi kədər.

Cibündə heç nə yoxun, simü zər açar dügini,
Zəmanə Rüstəmi ol, çox da göstərürsən hünər.

Nə ilə qan elədün bağrımi mənim, ey məh,
Nə ilə arizi-gülfamə vermisən zivər.

Bu mahparəni ram eyləmək degül mümkin,
Qılınc xəlqi kəsə, kainatə düşsə şərər.

Dodaqlarun soraram sübhədək meyaludə,
Zərün güci mana bu məhvəşi edüb çakər.

Can almaq istəsə, aləm fəda verür canın,
Zərün güci belədür, get, sən eyləmə bavər.

Cəhandə simü zərün olsa idi gər, Saqib,
Təsərrüf eylər idün bu cəhani sərtasər.

### "TƏRƏHHÜM BƏR PƏLƏNGİ-TİZDƏNDAN..."

Könül, neyçün edərsən ahü əfğan,
Əbəs bir də olma heç zarü giryan,
Dedim, qafil oturma, xanəviran,
Tapar düşmən sana əl, qoyma bir an.

"Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan".*

Sana mən çox dedim, get, huşyar ol,
Təğafül badəsindən, dur, kənar ol,
Kəmənd atmış sana düşmən, həsar ol,
Çəkildi ahi-həsrət tarümar ol.

* İtidişli pələngə rəhm edilsə, qoyunlara zülm edilmiş olar (Sədi Şirazi, Gülüstan)

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Əlimdə çarə yox, ey xanə bərbad,
Eşitməz kimsə, etmə ahü fəryad,
Vətən ahusini seyd etdi səyyad,
Əman vermür sana həqqində cəllad.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Dedim, çox vermə fövtə vəqt fürsət,
Dedün, var vəqt hələ, etmə əziyyət,
Çıxar əldən, heyfdür, eyşü işrət,
Dəxi fikri-vətən çəkmək nə hacət.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Mana can rahəti bu məhliqadur,
Nə lazımdur vətən, başə bəladur,
Vətənsizlik vücudi-kimiyadur,
Düşüb əldən-ələ, düşsün, rəvadur.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Nə eyb eylər, yox əldə ixtiyarım,
Gedüb badi-fənayə cümlə varım,
Kifayətdür mana bu məhüzarım,
Mana tə`sir qılmaz, yoxdur arım.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Mana bir sağərü meyxanə bəsdür,
Əlimdə bir dolı peymanə bəsdür,
Əsiri-nəfs ol, əfsanə bəsdür,
Qoy olsun sahibim biganə, bəsdür.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Ləbim yarun ləbində məsti-badə,
Nə olmuş, salmıram bilmərrə yadə,
Mənim ağzım gəlübdür imdi dadə,
Nə eybi, qanımız itmiş aradə.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan!”.

Meyü mə`şuqədür ümmidgahım,
Əsir olmuş cəhənnəm padşahım,
Həyatım hasilim həm qibləgahım,
Bulardan qeyri yoxdur dadxahım.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Vətən övladı, neylüm dərbədərdür,
Bu bica fikri çəkməklik hədərdür,
Ənisim, munisim bu simü bərdür,
Vətən getsün ki, nəxli-bisəmərdür.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

Mey iç, bəsdür meyxanə, Saqib,
Fəğan çox eyləmə, divanə Saqib,
Əsir etmiş səni biganə, Saqib,
Vətən mülki olub viranə, Saqib.

“Tərəhhüm bər pələngi-tizdəndan,
Sitəmkari bovəd bər gusfəndan”.

## KEÇƏCƏKDÜR

Qan eyləsə gər bağruvı dövran, keçəcəkdür,
Müflisligüvə olma pərişan, keçəcəkdür,
İçdirsə əgər qan sana hər an, keçəcəkdür,
Ney tək eləmə naləvü əfğan, keçəcəkdür,
Etmə özüvi çak, çaki-giriban keçəcəkdür.

Məskən sana gəh şaxeyi-gül, gah qəfəsdür,
Fəryad eləyürsən, səsüvi kəs, bu nə səsdür,
Bülbül, dəxi gül vəqti keçür nəkhəti bəsdür,
Qafilsən əcəb aqibəti xardür, xəsdür,

Gül vəqti gəlür, fəsli-zimistan keçəcəkdür.

Girəm ki, bu dəhrün yedi iqlimi sənindür,
Birənc elədün cəm`, zərü simi sənindür,
Bir-bir bularun vəqti gəlür, bimi sənindür,
Kim desə inanma, nəfəsün yümni sənindür,
Axır edəcəklər səni talan, keçəcəkdür.

Həsrət nə çəkürsən yetənün malü zərinə,
Əgri qoyub hər padşəhün taci-sərinə,
Yıxma özüvi sayə kimi xaki-dərinə,
Yaqutsifət çayinə, qəndü şəkərinə,
Bir loğma içün, xanəsi viran, keçəcəkdür.

Ögrətməgilən çox dilüvi lafü gəzafə,
Hüsnün vıra gər tə`nəni ayineyi-safə,
Dəhrün rəvişi Yusifi satdırdı kəlafə,
Şad olmagilən eylədigün əmri-xilafə,
Hərgiz günəhimdən demə Yəzdan keçəcəkdür.

Çox da qədüvün maili hər sərvi-rəvandur,
Rüxsarun odı lalənün hüsnində əyandur,
Mən neyləyüm heyran sana həm pirü cəvandur,
Səndə qalacaq beşcə gün ayini-cəhandur,
Hər kim olur olsun sana heyran, keçəcəkdür.

Kimdür var əlündə dolıdur cami-piyalə,
Gülrəng şərab ilə gətür bircə xəyalə,
Yusif rüxidür yox demə var əldə qəbalə,
Get, kuzəgər etsün sana bir ləhzə həvalə,
Olmış, hanı, yox xak ilə yeksan, keçəcəkdür.

Azad olan olmaz fələkün heç qəzəbindən,
Çox da vıra dəm hər nəfəs ali nəsəbindən,
Nə faidə gördün, de görüm, ruzü şəbindən,

Kim gördi vəfa zərrəcə türkü ərəbindən,
Gər söləsə də mən sana qurban, keçəcəkdür.

Rəftar elədün sən haçan insanlığa dair,
Həmnöv`ün ilə bir nəfəs vicdanlığa dair,
Dutdun hər işi, gir yerə, heyvanlığa dair,
Zahir elədün fe`lüvi şeytanlığa dair,
Yox-yox demə, qafil, belə tüğyan keçəcəkdür.

Düşdün bu xətərnak yola ari həyadən,
Əl çəkməyəcəksən məgər heç cövrü cəfadən?
Vəqtün yetişüb tez çıxacaqsan bu aradən,
Namusə əl atdun, nə qalub ağü qəradən,
Heyhat, demə iş mana asan keçəcəkdür.

Xurma yemək olmaz ki, əkübsən bu tikandan,
Ətləs toxuyan olmayub iplik kətandan,
Sən keçdün haçan həqqi dutub sevgili candan,
Biçarələri dögməgə mərd oldun haçandan,
Sən beylə bilür, belə hər an keçəcəkdür.

Ey başı bəlali, belə zülmü sitəm olmaz,
Səndə məgər heç etdigün azar kəm olmaz,
Düşmiş əlüvə, cövrüvi et, beylə dəm olmaz,
Zalim, sitəmündən həzər et, hər qədəm olmaz,
Qorxma sana beş gün hələ meydan keçəcəkdür.

Vəhşiligə vermək sana müşkilmi nəhayət,
Ey düşkini-nəfs, eyləmə həmnöv`ə xəyanət,
Tərkin elə, varmış nə qədər səndə şərarət,
Bihədd əziyyət eləmək xəlqə nə hacət,
Dünya bulara yoxsa ki, zindan keçəcəkdür.

Bir vəqt gəlür verməz əman heç sana bir dəm,
Qəflətdən ayıl, çox özüvi saxlama xürrəm,
Səndən, evi bərbad, gəlüb təngə bu aləm,
Nə eyləmisən xəlqə, edərlər onı bil həm,
Qan eyləyənün boynına yüz qan keçəcəkdür.

Dögmə vətənün oğlıni, Şərqə qocamandur,
Məğğarədə yatmış hərəsi şiri-jəyandur,
Məşhuri-cəhandur, demə bilmərrə yəlandur,
Sən eylə xəyal eyləmə heç kim bu filandur,
Fərmaninə min mülki-Süleyman(ə) keçəcəkdür.
Sən də bularun qədrini bil, ey evi bərbad,
Bir vəqt səni təhlükədən eyləyər azad,
Salmış səni təsxir içir qanuvı cəllad,
Yıxdun vətəni getdi yelə, qalmadı bir zad,
Dərman belə dərdə necə Loğman keçəcəkdür.

Saqib sana gər pənd verürsə əsər etməz,
Daşdan bu məsəl var ki, neştər güzər etməz,

Təb`im gecəni yazmasa şamın səhər etməz,
İnsanə olar kargər hərgiz xətər etməz,
Yaxşı keçəcək yaxşıya hədyan keçəcəkdür.

## KEÇƏCƏKDƏ*

Qaldı rəvişi-hörməti-Qur`an keçəcəkdə,
Mə`lumdür, etmiş nəbi iman keçəcəkdə,
Dövr eyləmədi heç belə dövran keçəcəkdə,
Yüz açmadı bir dəf`ə bu ünvan keçəcəkdə,
Vardur səbəbi, var idi mərdan keçəcəkdə.

Fərqi yox idi zərreyicə şahü gədanun,
Yoxdı yeri dana arasında süfəhanun,
Qiymətdə idi rütbəsi hər əhli-ziyanun,
Söz qalmaz idi pərdədə pünhan üqəlanun,
Düşməzdi əyağ altına insan keçəcəkdə.

İmdi baxasan hər kəsə peymanəşikəndür,
Başdan-əyağə rəngə girüb, talibi-fəndür,
Qoymaz görəsən düz işi bəs ki, qədəğəndür,
İslahi qoyub bir tərəfə, fitnə sevəndür,
Haşa, var idi bir belə peyman keçəcəkdə?

Əfsanə degül keçmişə yetmək hünər istər,
Bu dairəyə girməgə bir şiri-nər istər,
Ənqa kimi əflakə uçan balü pər istər,
Bazarə gedən cib dolısi simü zər istər,
Azadə idi hər kişi hər yan keçəcəkdə.

Söz birdi, iki olmaz idi eyləmə inkar,
Ey keçmişi təhqir eləyən, səndə yox asar,
Ol talibi-Həqq idi, edüb can ilə iqrar,
Sən talibsən vəhşiligə, etməgə azar,
Əldən düşənə yoxdı bu mizan keçəcəkdə.
Ölçi var idi keçmişə hər işdə nəhayət,
Yox səndə bir ölçi, hanı heç yoxdur əlamət,
İnsanlığa dair degül hərgiz belə adət,
Etdün kimə bir zərrə, görüm, sölə, riayət,
İnsaf var idi, xanəsi viran, keçəcəkdə.

Keçmiş nə bilürdi ki, nədür qeyrətü namus,
Eylərdilər xəlqi əbəs hər ləhzədə mə`yus,

* Şeirin əvvəlində müəllifin belə bir qeydi var: "Keçəcəgün halilə əsri-hazirənün halinə dair".

Satmazdı hərifə qızını bir kişi əfsus,
Gəldün nə içün aləmə sən, ey belə dəyyus,
Həqqa ki, yox idi belə oğlan keçəcəkdə.

Keçmişdəkinə söləmək olmazdı filani,
Bihədd gözəldür gedirəm görməgə ani,
İzhar eləyərdim ona mən sirri-nihani,
Əfsus çətindür görəm ol mahliqani,
Əzbəski vırardı hərə qan-qan keçəcəkdə.

İmdi deyəsən hər kəsə, ey sevgili yarım,
Gəl, bir qoyarım ləb-ləbə, yox səbrü qərarım,
Bazarun içində deyər heç yox məgər arım,
Qəm çəkmə fədadur sana, gəl al, yox vəqarım,
Olmışdı məgər heç belə ehsan keçəcəkdə?

Keçmişdə qadınlar kişiyə hörmət edərdi,
Bica yerə canü dil ilən xidmət edərdi,
Meyxanədə hansı lotıyla söhbət edərdi,
Saxlardı özin, bəd əmələ nifrət edərdi,
Əl tapmaz idi bir kəsə şeytan keçəcəkdə.

Dinsizlik içün elmü kəmalat gərəkdür,
İnkarıni etməkligə halat gərəkdür,
Nə səndəki bihudə xəyalat gərəkdür,
Əhməqcəsinə nə qurı mandat gərəkdür,
Hər ləhzə açıqdı belə meydan keçəcəkdə.

Hazırdakı din əhlinə nifrət edirəm mən,
Yoxdur xəbəri dindən, heyrət edirəm mən,
Bu lə`nətə gəlmişlərə lə`nət edirəm mən,
Görcək buları qəhrlə töhmət edirəm mən,
Əksikraq idi Buzərü Səlman keçəcəkdə?

Ey söləyən hər anidə mən əhli-yəqinəm,
Canü dil ilə tabe`i-Qur`ani-mübinəm,
Eyb eyləmək olmaz mana hər işdə mətinəm,
Aləm ola düşmən mən ilə, talibi-dinəm,
Olmışdı bütün din evi viran keçəcəkdə.

Söz yox dedigün sözlərün heç yoxdı xilafi,
Təsdiqün edər gər gəzəsən Qafbəqafi,
Həqqində vırursan görürəm lafü gəzafi,
Bir də degilən, etmə həya, olmadı kafi,

Səntək hanı əlbətki müsəlman keçəcəkdə.

Tüğyan kimə baxson eləyür mö`minü kafər,
Bu hazirə əsrün həzərati nəyi istər
Etməkligə, aləm dutub od yandı sərasər,
İnsaf gedüb zülm genə artmada bədtər,
Başdan tikən heç olmayub eyvan keçəcəkdə.

Lə`nət dəxi mən eyləmərəm Şimrə, Yəzidə,
Gər əhli-yəqinsən, olasan kimsə nədidə,
Sən Həqqə haçan, de, belə oldun girəvidə,
Mən and içərəm zibhi-qəfa şahi-şəhidə,
Sən tək yox idi quli-biyaban keçəcəkdə.

Qur`an oxıyursan, əməlün meyli fəsadə,
Lə`nət dəxi heç etməgilən ibni-Ziyadə,
Bərbad elədün şər` evin düşməyə yadə,
Bir loğma çörəkçün şikəmün dönə badə,
Kim aldı qızıl rüşvəti batman keçəcəkdə.

Qanun var idi xəlqdə, əfsanə degüldi,
Qanuni qoyanlar dəli-divanə degüldi,
Bir yolda gedirdi, hərə bir yanə degüldi,
Nahəq qəsdi nə dilə, canə degüldi,
Çəkmişdi kənarə özin heyvan keçəcəkdə.

Qanun nəyə lazim, nə edərsən elə, əhməq,
Əqlün nə kəsir, get elə, nahəq ola ya həq,
Zülm ilə gərək vırmağa aləmlərə beydəq,
Xəlq anlamayur zülmdə ləzzəti-rövnəq,
Nahəq olub ədlilə divan keçəcəkdə.

Oğlan qız ilə olmaya bir yerdə nə ləzzət,
Ayrı yaşamaq vəhşiligi eylədi sibqət,
Bikr olmasa gər eyb eləməz, bəhsi nə hacət,

Yüz dəf`ə doğanda nə olur getdi şəriət,
Gözlərdi belə işləri nadan keçəcəkdə.

Düşdi əlüvə fövt eləmə fürsəti zinhar,
Yox eybi qızun olsa da, tərk eylə, nədür ar,
Məşğuli-ibadət gedüb ol, qoy yerə dəstar,
Allah nədür xovf eləmə harda məgər var,
Vardı bizə nə Qadirü Sübhan keçəcəkdə.

Çox verməgilən fikri həlal ilə haramə,
Bel bağlama bica yerə fitvayi-imamə,
Get, fikrüvi ver ləzzət ilən işrətə, kamə,
Döndərməgilən boş söz ilə sübhüvi şamə,
Hardeydi gözəl baləbi-xəndan keçəcəkdə.

Din altına kim girsə onun qanı hədərdür,
Başdan-əyağə qəm gətürən canə zərərdür,
Dinsizligə qurban deyəsən qəndü şəkərdür,
Düşmən sözidür hər işimiz hərçi bətərdür,
Allah nədür eylədi böhtan keçəcəkdə.

Mövhum yolın milləti-İslam dutubdur,
Girsün belə millət yerə bədnam dutubdur,
Nə faidəsi var təmə`i-xam dutubdur,
Əldə deyəsən badeyi-gülfam dutubdur,
Bica deyilüb mayeyi-üsyan keçəcəkdə.

At ölsə, məsəl var, olur itlərə bayram,
Saqib, o zəmandur yetişüb vay belə əyyam,
Viran olasan, qalmaya səndən dəxi bir nam,
Bundan bətərin gözləməli, qoy yerə əqlam,
Xoşbəxt olub hər nəsə mərdan keçəcəkdə.

## DƏLİDÜR

Əqlə gəl, ey dəli könlüm, demə dünya dəlidür,
Nə ki, dünya dəlidür, Adəmü Həvva dəlidür,
Dedigün sözdən utan, cümlə sərapa dəlidür,
Aç bəsirət gözini səndəki xulya dəlidür,
Nəzdi-danada belə söhbəti-bica dəlidür.

Sane`ün sən`ətinə fəhm elə, irad etmə,
Bir para söhbəti-bihudələri yad etmə,
Get, özündən həzər et, yox sözi icad etmə,
Eybdür xəlqi bu nadanlığa irşad etmə,
Səndəki bu təriqün axırı heyfa dəlidür.

Ayü gün hər nəfəs hər an eləyür seyr müdam,
Etdigi seyrdə xəlqə yetirür feyz təmam,
Kimdən ötri belə sərgəştə gəzər sübhlə şam,
Ad qobsan* ona divanə, səzami bu kəlam?

* Qoyubsan

Sən kimilər deyəcək beylə müdara dəlidür.

Fəxr edir xilqəti-insanə Xudavəndi-kərim,
Ola bilməz bu sözün münkiri şeytani-rəcim,
Qıl nəzər ayeyi-Qur`anə bir, ey nəfsi-ləim,
Bu sözə xəlq gülər eyləmisən zərrəcə bim,
Şəhvəti tərk elə, başundakı sövda dəlidür.

Gög dəli, yer dəli, xurşidi-pürənvar dəli,
Ərşü lövhü qələmü sabitü səyyar dəli,
Dedigündən görünür Əhmədi-Muxtar dəli,
Cümləsin vəsf eləyüb eyləmə inkar dəli,
Əf`iyi-zəhrin desə bica yerə bica dəlidür.

Ədəmi-elm sənün hövsələvi təng etmiş,
Ya səni məst, gəh tiryaki və ya bəng etmiş,
Çoxunun payi-səbatın bu həvəs ləng etmiş,
Rəngə salma özüvi, sel səni bədrəng etmiş,
Get, oxı vəsfi-iti Kəhfdə[**], aya dəlidür?

Olmasa bəhr verilməzdi bu məxluqə həyat,
Xəlqə minnət qoyub ol Xaliqi-alidərəcat,
Şuri-bəhr əgər olmasa, olmazdı nicat,
Xəlq çün gül yüzüvə, bari, çevir bir sələvat,
İçdigün su haradandur, necə dərya dəlidür.

Bəhrdə var balıq lö`lö`ü mərcanü gühər,
Səndən ötri yaranub, eyləgilən yaxşı nəzər,
Olmasa cünbişi-dərya, ola bilməz bu əsər,
Ki, dənizdən doğulub daş ilə toprağü şəcər,
Heyrət istər demə heç bir belə əşya dəlidür.

Bu cəhan mülki içün çoxları qurban oldı,
Əvvəli sidq ilə ol şahi-şəhidan oldı,
Vətənün xatirəsiyçün belə fərman oldı,
Böylə fərman verən ayeyi-Qur`an oldı,
Əcəba, mən də deyüm ol şəhi-Bətha dəlidür.

Dəli kimdür deyərəm mən sana, ey kani-ədəb,
Şərti var, leyk mənim açmayasan tə`nimə ləb,
Dəlinün əslisi kimdür deyüb ol miri-Ərəb,
Vətənün xaininə nifrət edüb ruz ilə şəb,
Vətənün xaini hər kim ola, qət`ən dəlidür.

---

[*] Qurani-kərimin 18-ci "əl-Kəhf" surəsi nəzərdə tutulur

Vətəni vermisən əldən, evi bərbad oğlı,
Başuvun üstə durubdur dəli cəllad oğlı,
Gündə min dəf`ə vırar başımıza yad oğlı,
Sən səbəbsən nə olub, gör, necə heç zad oğlı,
Deyəcəksən degilən qövmi-Məsiha dəlidür.

Bir məsəl var olub xəlq dilində əzbər,
Yatmayanlar yatanun başını, əlbəttə, kəsər,
Səndə heç olmayacaq zərrəcə namus məgər?
Xanəbərduş olubsan, genə gəlməz sana tər,
Çalgilən zurnovı, Rusiyyədə ağa dəlidür.

Ta bekey çunü çərayə edəcəksən rəğbət,
Əlüvə düşmiş idi gül kimi yaxşı fürsət,
Zərrəcə milləti-İslamdə yoxdur qeyrət,
Bilmədün qədrini, biçarə, çək imdi zillət,
Görmüsən ol güni bir də bu təmənna dəlidür.

Nə kişi olmusan aləmdə, utan, bir nə də zən,
Gəlmisən aləmə neyçün, onı da bilməmisən,
Çox çətindür olasan dəhrdə ərbabi-süxən,
Vətənün halinə ağla ki, açub beytül-həzən,
Deyəcəksən bu nə səsdür, bu nə qovğa, dəlidür.

## "...YATMAĞUN DƏMİDÜR"

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Əlündə sağəri-mey, məsti-xab olanda, nolur,
Ki, hər nəfəs sana həmdəmi-şərab olanda, nolur,
Əsiri-türreyi-pürpiçü tab olanda, nolur,
Cəhənnəmə, bütün aləm xərab olanda nolur.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Səni yox axtaran aləmdə, kəc xəyal etmə,
Kimün yadındasan, avarə, qiylü qal etmə,
Məhali-əmr xəyalilə keyfi-hal etmə,
Gətür eşqdən əl, tərki-xətü xal etmə.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Təəccüb eyləyürəm mən, deyürsən insanəm,
Əlimdən həqqim alınmaz ki, mərdi-meydanəm,
Nəyün var idi alındı, bu sözüvə heyranəm,
Satılmısan xəbərün yox, desön də sultanəm.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Vətən-vətən demə, biçarə, yoxdur heç vətənün,
Gorun var idi ola, binəva, cırıq kəfənün,
Hanı, kim olmalı aləmdə dərdü qəm çəkənün,
Xəyalını kim, edirsən boş Əhrimənün.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Sənün kimi hanı biar, aləmi-xakun,
İtirmə vəqtini bir ləhzə bəngü tiryakun,
Vıranda nə`şə başa seyrün eylə əflakun,
Cəhanı seyl apara olmasun sənün bakun.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Cəmi`i-aləmi-İslam qeyrə nokərdür,
Yox ixtiyari əlində ki, nəxli-bisərdür,
Nəfs bu millətə əsil fəsaddür, şərdür,
Rəis bunlara hər gündə bir peyəmbərdür.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Nə erməni, nə müsəlman, nə gəbrdür nə məcus,
Nə bütpərəst, nə müşrik hər ismdən mə`yus,
Bu firqə kimi yox hərgiz cəhanda binamus,
Uranda başinə bir zərrə çəkməyür əfsus.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Sən oğlısan vətənün, səndə yox vətən qani,
Vətən yolındə haçan tərk eylədün cani?
De saqiyə sən hələ, ver şərabi-ruhani,
O qədr içgilə, məst ol, ayılma bir ani.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Vətən əlündə idi, hanı, neylədün külbaş?
İtirdün heç nəyə, get, oyna sən beş-daş,
Edərmi dərbədər öz yoldaşını bir yoldaş?
Fərib verdi sana bə`zi qan görən ovbaş.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Var əldə vəqt, get, ol eyşü işrətə məşğul,
Nəsihət etsə sana əmri-həqq, hiç etmə qəbul,
Əl atsa qeyrətüvə əcnəbilər, olma məlul,
Yamanlıq eyləgilən, yaxşı işdən eylə üdul.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Degülsən əslisi türkün ki, türk qanında,
Vətənfüruşlik olmaz, od olsa canında,
Kəsər dilüvi dibindən, danışma yanında,
Kişilik aləmi var türk dudmanında.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Hanı tatar, hanı Şamü İraqü Türkistan?
Bu-gün səba əyağ altında məhv olur İran,
Din oldı tərk bütün, getdi hörməti-Qur`an,
Məhaldür dəxi bu dərdə eyləmək dərman.
Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

Qanun dəgişdi nə tez, lailahəillələllah,
Nə rütbə yetişübsən, de bircə, ey gümrah,
Vırular başuvə hər ləhzə olmusan agah,
Məlamət eyləmə, Saqib sana degül bədxah.

Ayılma, yum gözüvi, yat ki, yatmağun dəmidür,
Ayıqlığı nə edirsən, min aləmin qəmidür.

## "ŞİMRÜN İŞİ HƏŞR GÜNİ SƏHLDÜR"

Eyləmə təşviş ilə ahü fəğan,
Ney kimi biçarə könül, bir zəman,
Vahimədən göz yaşuvı etmə qan,
Allaha tapşur özüvi şadman,
Boynuva gəlsə günəhi-insü can,
Atə-anadan sənədür mehriban.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

Xəlq eləyən kimsə sana yar olur,
Həşr güni, qorxma, nigəhdar olur,
Yaxşılıq ilə sana rəftar olur,
Aqibətün yaxşılığa var olur,
Çəkmə qəmin, qəm güni qəmxar olur,
Adəmün övladı genə kar olur.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

Rəhman adın kim özinə ad qoyar?
Boş yerə çox olmagilən didətər,
Asiyə rəhm etməsə Rəhman əgər,
Heç nə deməzlər ona söz müxtəsər,
Etsön itaət degül hərgiz hünər,
Versün əvəz huri-behişt, ey pəsər.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

Gər bu imiş bəxşişi-kanü kərəm,
Qoymayuram qiymət ona bir dirəm,
Müzdsiz işdür demə, çox vırma dəm,
İşləmə, müzd alson odur lütfə xəm.
İş yiyəsi onda olar möhtərəm,
Ehsan əlin xəlqə aça dəmbədəm.

Şimrün işi həşr güni səhldür,

Müddəası çünki onun əhldür.

Növki-cidadə səri-Şahi-şəhid,
Şamə aparsun onı qövmi-pədid,
Və`deyi-cənnət verə Rəbbi-məcid,
Lütf degül, bu belə ehsan ke did?*
Müzd deyərlər ona çün nəxli-bid,
Mən belə Rəbbə ola bilməm mürid.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

Tərk yolın etməgilən ixtiyar,
Dinün evini eləyər tarümar,
Qaili-Həqq ol səni etməz kənar,
Həqqdən heç qorxma, günəhdə nə var,
Məsti-şərab olgilə leylün-nəhar,
Əfv qılar həzrəti-pərvərdigar.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

Saqibə, ey zahidi-pəşminəpuş,
Eyləmə mey tövbəsini, ol xəmuş,
Səndə məgər olmıyacaq əqlü huş,
Qəbrə gedincə olaram badənuş,
Zöhdü riya satma, get, ol meyfüruş,
Bu sözüvə olmaram həlqəbəguş.

Şimrün işi həşr güni səhldür,
Müddəası çünki onun əhldür.

## "...VERMƏ ƏZİYYƏT..."

Rədd ol, mana, zahid, bu qədr vermə əziyyət,
Keç, məsti-şərabəm, mey ilən dutmışam ülfət.

Çox etmə "Hicab" ayəsinin bəhsini, əl çək,
Əldən-ələ düşdi, dağılub pərdeyi-ismət.

* Kim görüb

“Me`rac” hədisin oxuma, vəqti keçibdür,
Təyyarələrün bəhsini et, etmə məniyyət.

Hər saniyədə, gör, necə me`rac eləyən var,
Daş başuva düşsün, gözüvi aç, elə diqqət.

Təsbihi bırax sal oda, səccadəni yandur,
Gəl əqlə, desünlər sana ustaduva rəhmət.

Bihudə yerə ömrüvi sərf etmə, heyfdür,
Qorxma, sana vəqtində yetər huriyi-cənnət.

Ey xanəxərab oğlı, bu qəflət yuxısından,
Bir ləhzə ayıl, boş, hədərə eyləmə rəğbət.

Elmün qapısı bağlu degül, qəflətə uyma,
Təhsili-kəmalat ilə tap dəhrdə şöhrət.

Pak etməyəcəkdür səni bu abi-qəsalə,
İtdən eləməz bəhr dəxi rəddi-nəcasət.

Elmün, hünərün bilməyəcəksən, evi bərbad,
Çıxsun bu gözün, elm olub kəşfi-nübüvvət.

Mə`nayi-nübüvvət nə deməkdür, onı sən bil,
Əhli deyəcək elmdür, elmə elə sibqət.

“Nəml” ayəsinün[*] bəhsini etmək sana bəsdür,
Kəsb eyləgilən, ondadur hər kəşfü kəramət.

Nəmlün gücilə xəlq cəhangir olubdur,
Bu nəmldən özgə sana bir başqa nə hacət.

Əczayi-bəni-növ`i-bəşər cümləsi birdür,
Səndən nə içün məhv olubdur bu həmiyyət.
Şəkk dairəsindən, sən haçan bəs çıxacaqsan,
Yəqinligə yol yoxmı məgər, noldı həqiqət?

Əlbəttə, əsir düşdi sənüntəklər əlinə,
Qoydun bizi avarə, bu əf`aluva lə`nət.

Asudə otur, müddəilər məqsədə yetdi,
Bəsdür, sana avarə qalub vadiyi-heyrət.

---

[*] Qurani-kərimin “Nəml” surəsinin 18-ci ayəsinə işarədir

Yox səndə həya, damənü təsbih əlündə,
Qur`an oxıyub etməgilən xəlqə nəsihət.

Sən pəndi qəbul eyləməmiş pənd verürsən,
İblis ilə həmpayə olub səndəki tinət.

Söz müxtəsər, hərgiz sana insan demək olmaz,
Şeytan sana izhar eləyür lə`nətü nifrət.

Təqva yolını dutsa idün ömrdə bir dəm,
Saqib də düşərdi bu yola ruzü şəb əlbət.

## "BİRİSİ FƏQRƏ GİRİFTAR..."

Birisi fəqrə giriftar, birisi dərdə əsir,
Fələkün dövri utanmaz, degül heç pəndpəzir.

Biri azadə gəzər, heç nə əlindən gəlməz,
Kim bilür iş, vırılub boynuna ağır zəncir.

Degül hacət sorasan halımi, naseh, əl çək,
Rəngdən mə`lum olur hər kəsə əsrari-zəmir.

Yuvası yox birinün yatmağa, çöllərdə yatur,
Birinə qismət olub təxt ilə yaquti-hərir.

Sini şin yazsam əgər, heç gərək eyb eyləməsün,
Anlayan yox, yazaram, çox mana dutmun təqsir.

Nə gözəl ne`mətdür bilməyəsən yaxşı-yəman,
Ona qiymətdə bərabər ola biməz iksir.

Boşla xəlqün yaxasın, xəlqi çağırma nəmazə,
Nəmazı sübh qılub, sən ki, oxurdun təkbir.

O nəmazi ki, qılursan onı, gəl, vır başıma,
Nələr aləmdə olub, ah degülsən ki, xəbir.

Vəqt çoxdur, verülür məslələrün[*] tə`limi,
Doldı küfrün əyağilə hərəmi-həzrət Əmir.

Xəlqi sən elmə dəlalət elə, ey xanəxərab,

[*] Məsələlərin

Bu degül sən oxıyursan xəbəri-“Şərhi-kəbir”.

Bir ox olsun gözüvə, hər əlifi Qur`anun,
Ta bekey səhvü şəki sən edəcəksən təqrir.

Dinüvi əldən alublar, oxıyursan Qur`an,
Qeyrəti tərk eləməglik degül hərgiz təqdir.

Yatma, yatma dəxi bəsdür, bir ayıl qəflətdən,
Başuvün üstdə durub düşmən əlində şəmşir.

Yıxdı yatmaq səni, gün görmədün heç, gün batdı,
Karvan düşdi yola, sən də yügür, vəqt keçir.

Dinü məzhəb sözini rəng ilə bədrəng etdüz,
Gülür, Allahə qəsəm, dinimizə bangi-həmir.

Sən ki, ol qibləyə hər an ki, edərdün səcdə,
Oldı bütxanə genə, gözlərün aydın, ey pir.

Getdi yəğmayə bütün zivəri-asayişi-din,
Cəm` qıl xatirüvi, qalmadı bir köhnə həsir.

Biri bir həbbə içün başını min taşə ura,
Biri evdə oturubdur pulı var aləmgir.

İşimiz bitdi, əlacın eləmək müşkildür,
Necə tədbir edə bilsün, nə edər cürmi-səğir?

Yeddi əflakə gedibdür, dedim elmün hünəri,
Lə`nət etdün mana hər ləhzə, həm etdün təkfir.

“Ayətəl-kürsi”** duası dəxi bir iş verməz,
Qol gücin kəsb elə aləmdə, get, ol mərdi-dəlir.

Gözi çıxmış, oxı tarixi-əsatirləri,
Göz qabağında durub, olmayub əsla təğyir.

Cənnətün abü həvası səni heyran etmiş,
Hər şeyi tərk elədün, ey dəli-divanə fəqir.

Sən əsa eylədün əldə, vırasan başimizə,
Süngi oldı, gözüvə batdı, həman köhnə dəmir.

---

** Qurani-kərimin Bəqərə surəsinin 255-256-cı ayələri

Bax hədidün sözinə, səni Qur`an kəssün,
Düşmədün başə neçün, kül başuvə böylə müdir.

Hələ bundan bətəri dalda qalubdur, görərüz,
Nə gəlür başuva, heyrətdə qalar Şimri-şərir.

Əhli-məğrib yedi Şərqi, yeyəcəkdür, yeyəcək,
Məscidün baminün üstə demə, Allahü Kəbir.

Əl gətür bircə bu təcdidi-vüzu` etməkdən,
Çox nə lazım, nəcisül-eyn işi etmək təthir.

Bizə sübhin nəmazı eylədi tə`sir nədi,
Zöhr içün xəlqi xəbərdar eləyürsən bir-bir.

Çəkdi təb`im məni, bir qeyri sözə məcburəm,
Eyləyüm kəşf anı, gər eyləməsəm həq söz itir.

Oyna təhtül-hənəkün riştəsilə sübhü məsa,
Kə`bənün pərdəsinə od saçır gündə sətir.

Çəkmə əl genə əhməq sözə meyl etməkdən,
Getdi arşın, yerinə imdi gəlib tazə metir.

Seyli-qəm açdı başımdan bu sözi mən açdım,
Yanmasa şö`leyi-od içrə itər ətri-əbir.

Nadirün çəkmə adın, eyləmə təhqir anı,
Sən necə Nadir olur, demə hər yerdə Bəşir.

Nadirün xidməti hübbül-vətənə vazehdür,
Baxgilən tarixinə, aləmi etdi təsxir.

Vətən övladı odur, eylədi canın qurban,
Yoxdur aləmdə ona hiç hərifü nə münzir.
Kasəlis edir anun ilə yəqin pəhləvilər,
Həminan rəxşə haçan oldı himar ilə həmir?

Kim ki, hifz etdi vətən, rəbbü peyəmbər də odur,
E`tiqadım belədür, sən de mana, ey kafir.

Verdün əldən Vətəni, varü yoxı, rahət otur,
Bu kifayət eləyür loğma içün olduq əcir.

Mənfəət sən kimə verdün, de görüm, bir həbbə,
Xahişi-nəfsüvə bəzl eylədün əmvali-kəsir.

Kim ki, ustadinə kəc baxsa, gözi qan ağlar,
Doğrı sözdür deyirəm, olmagilən heç dilgir.

Gələcək günlərivün fikrini bir ləhzə, get et,
Yetəsən sərhədi-məqsudə dağılmub bu ömir.

Cigərim yandı, bizə heç şeyi layiq bilmə,
Bizə kim versə, edüb mə`siyəti, nanü pənir.

Çox dedim mən sənə, get, həmnişin bab eylə,
Sözümi başimə vırdun, dedün, it, it yerə gir.

Həmədan eşşəgi işlər, bu məsəl var, yeyər at,
Nökərün layiqi bezdür, ağanun ətləs hərir.

Külli-İslam zəlalət çölünün çör-çöpidür,
Odı yox, tüstisi yox, beylə yola yolçı nədir?

Sən, sən olseydun əgər təfriqə mən` eylərdün,
İxtilafun sözinə getdi vətənmiz axir.

Başuva vurmagilən, heç demə aləm nə olub,
Sən qılan köprüni sındırmaq olurmı, mahir?

Saqiba, dut rəhi-meyxanəni, sərməsti-mey ol,
Qoy, dağılsun belə millət, yox olsun bir-bir.

## "GERİ ALLAM VƏTƏNİ..."

Geri allam Vətəni, söləmə, boş fikrdür ol,
İflici qoy qəbirə, salmagilən yağlı xəmir.

Əliyə(ə) verdi xilafət elmin Peyğəmbər(s),
Yetməyübdür sənə aya xəbəri-Xümmi-Qədir?

İxtilafun sözi saldı araya min fitnə,
Güli kim əkdi, dərən kimdi, çəkən kimdi ətir.

İxtilafun sən həman rişəsisən verdi Şimr,
Xəlqə göstərdi nələr, yum küpüvi, çalma nəfir.

Arizumuz bu idi biz sənə aya çataruq,
Nə bilüm sən çatacaqsan bizə, eylə səbir.

Bu həman və`dədü vermiş sana Qur`ani-şərif,
Əlüvi at cibüvə, gör, nə yazubdur təfsir.

Yığdığun dövləti sən sərf elədün yaxşı yerə,
Çəkilür yol biri Bəğdadə, biri Şamə gedir.

Loğmanun yağlısı qaldı boğazunda yemədün,
Boğuşur it onun içün hərə bir yanə çəkir.

Sən mənim şe`rimi təhqir eləmə, təhsin elə,
Tülkinün həddi nədür qışqıra, ey şir, ey şir!

Çıraq öz təhtinə salmaz işığı, var bu məsəl,
Eyləyürsən məni hər yerdə qərəzlə təhqir.

Həqlisən sən, məni təhqir edəsən hər yerdə,
Görsə xəffaş qaçar lanəsinə, mehrü münir.

Xələf övladı mənəm Azərinün, səhv etmə,
Ləqəbim Saqibi-bibak, dəmir daşı deşir.

Düşmənə baxma həqarət gözilə, Rüstəmdür,
Söləyürsən mənə hər ləhzə nə var, tülki Nəsir.

Əsrün, əlbəttə, Füzulisi gərək Azər ola,
Qərəzün yoxdısa təsdiq elə, ey naşı müşir.

## QOCAMAN ŞƏRQÜN ŞİRLƏRİ

Qocaman Şərqün ayılmış deyəsən şirləri,
Salub əndişəyə xunxar cəhangirləri.

Məğrib əhli, bu qədr qanları tökdüz, bəsdür,
Süngi qurbanları etdüz cocuqü pirləri.

Yağlıdur loğması Şərqün, yügürürsüz yeməgə,
Görmüsüz*, eyləməyün boş yerə tədbirləri.

Gündə bir qonfrans açmaqlığuvuz iş verməz,

* Görməzsiniz

Bilüb əbnayi-bəşər süzdəki təzvirləri.

Bu qədr qanı tökərlərmi, tökürsüz yəmtək,
Eşidərsüzmi haçan naleyi-şəbgirləri.

Sınmaz həqqün qolı, rahət yaşasun xəlqi qoyun,
Dutsoz əldə nə qədr zəhərli şəmşirləri.

İntiqamun dəmi yetmiş, alacaqlar süzdən,
Bağlar həqq boynuvuza qəhrlə zəncirləri.

Axıdursuz füqəra qanıni seylab kimi,
Nə olubdur bularun zərrəcə təqsirləri.

Kim tələb eyləsə həqqini dögərlərmi məgər,
Bəs degülmi ki, verüblər süzə iksirləri.

Saqibün pəndi süzə zərrəcə tə`sir etməz,
Yağdıra süzlərə gər seyl kimi tirləri.

## "MƏARİF SÖYLƏYÜR..."

Məarif söyləyür, insan get ol, gəl,
Cəhalət söyləyür, nadan ol, gəl.

Məarif söyləyür, mövhumdən qaç,
Cəhalət yox deyür, mövhumə göz aç.

Məarif eyləyür insanı kamil,
Cəhalət məhv edüb yüz min qəbayil.

Məarif sərbəsər ruhi-rəvandur,
Cəhalət sərbəsər adı ziyandur.

Məarif xeyr işə eylər dəlalət,
Cəhalət göstərür rahi-zəlalət.
Məarif kimi aləmdə fən olmaz,
Cəhalət kimi heç düşmən olmaz.

Yetim oldur yox onda elmü irfan,
Atadən mehribandur, həm nigəhban.

Məarif nurdür başdan-əyağə,
Cəhalət tirəni sürtər dəmağə.

Məarifdən yaranmış mahi-taban,
Məarif zühasi xurşidi-rəxşan.

Cəhalətdən yaranmış nəfsi-şeytan,
Cəhalət eylədi dünyanı viran.

Cəhalət kimdədür, alson xəbər gər,
Sana kəşf eylərəm, ey nikmənzər.

Firəngistan edibdür elmə şöhrət,
Gərək etmək ona izhari-nifrət.

Tökür öz növ`inün qanın dəmadəm,
Ki, rudi-Nil tək həmvarə xürrəm.

Neçün dövlətdən ötri sərvət içün,
Qurı bir boş həvayi şöhrət içün.

Bilüb kim yağlıdur Şərqün həvasi,
Nəinki yağlıdur ruhun qəzasi.

Ki, min təşviş ilə düşmiş təlaşə,
Vırur başıni hər saətdə daşə.

Yesün ol loğmanı şirin-şirin,
Aparsun həzz, tapsun qəlbi təskin.

Dəxi bilmür kim ol xunriz cəllad,
Boğazında qalur heç etməsün yad.

Məarif ziddidür xunxarlıqlan,
Əziyyətlən, bəli, azarlıqlan.

Məarifdür fəqirün pasibani,
Məarif zalimə verməz əmani.
Cəhalət yandurur ağü qərani,
Cəhalət düşməni-elmü məani.

## "AT ÖLÜBDÜR, İTLƏRÜN BAYRAMIDUR"

Əhli-halun söhbəti gərçi könül aramıdur,
Xəlqi-aləm can ilə başdan-əyağə ramıdur,
Bir sözüm var sölərəm, sanma cəhan düşnamıdur,

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Neyləyürsən əqlü fəhmi, əqldən divanə ol,
Hörmətün artar cəhandə, fəhmdən biganə ol,
Məstlikdən heç ayılma, düşkini-meyxanə ol,
Qorxma heç kəsdən, gedüb əfsanəyə peymanə ol,
Zahidün fe`lin unutma, talibi-səddanə ol.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Qanmaz ol qanmaz, sənün hər dərdüvün dərmanıdur,
Bilmisən heç qəm nədür, asudə olmaq kanıdur,
Ehtirazi-əqldən əl çək, bəla peykanıdur,
Əqldən kim dəm vırubdur, it-pişik qurbanıdur,
Qanmaza canım fədadur, aləmün sultanıdur.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Paymal oldı, nə eyb eylər, unut milliyyəti,
Çəkmə hərgiz fikrini, izhar eylə nifrəti,
Var-yoxı, tərk eylə, ver, tərk etmə eyşü işrəti,
Fikrüvi namusa vermə, neyləyürsən qeyrəti,
Biqəm ol, kəsb et özünçün harda var can rahəti.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Əl gətürmə ruzü şəb meyxanələrdə camdən,
Bixəbər ol, neyləyürsən, gərdişi-əyyamdən,
Eylə sərməsti-mey ol, dəm vırma niku namdən,
Başə düşmə, anlama tə`siri-sübhü şamdən,
Uf demə, min tiğü nizə keçsə gər əcsamdən.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Baxma aləm dutsa od, dildari-məhrüxsarə bax,
Rəşki-bağı-huri-cənnət, gözləri xümmarə bax,
Qaməti sərvi-xuraman, türrəsi tərrarə bax,
Daneyi-xali-fəribi-zahidi-dindarə bax,
Saqiyi-gülrüx əlində sağəri-sərşarə bax.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Qalmasun hörmət, nə eyb eylər, bütün Qur`andən,
Qiyməti yox zərreyicə, vırma dəm imandən,
Zalim ol, zalim, nə nəf` var sənə vicdandən,
Dərdsərdür, əl gətür bu millәti-nadandən,
Dərbədər olsun, qırılsun tiği-bədərkandən.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Ver hərifə qeyrətü namusuvi, qeyrət nədür,
Qeyrətün vəqti keçübdür, daməni-iffət nədür,
Əhməq olma, ver yelə, bu pərdeyi-ismət nədür,
Baxma təqva əhlinə, heç bilməyür ləzzət nədür,
Dilbəri-məhparə ilə ruzü şəb işrət nədür.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

Saqibün pəndin qulağə algilən, ol huşyar,
Kim nə səndən istəsə, ver, etmə heç bir kəsdən ar,
Neyləyürsən qeyrəti, rəngin dəgişmiş ruzigar,
Sahibi-qeyrətdə qalmub zərreyicə ixtiyar,
Var-yoxı getmiş əlindən, qalmub onda bir mədar.

Əhməq ol, əhməq görün, əhməqlığun əyyamıdur,
Bir məsəl var: "At ölübdür, itlərün bayramıdur".

### "ƏHMƏQ OL, ƏHMƏQ..."

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Ver tərəqqi, rahət ol, əhməqlığa, nadanlığa,
Qədri yoxdur, xidmət etmə zərrəcə insanlığa,
Meylüvi bayqusifət, get, vergilən viranlığa,
Seyl kimi qıl həvəs hər ləhzə xunəfşanlığa,
Mənfəət yoxdur, nə lazım da çevür irfanlığa,
Həqqi dan, təhrik elə xəlqi nafərmanlığa.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,

Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Can kimi əhməqlığı tərk eyləmə, sərmayədür,
Bilməmək çün qədrini, bil, sərbəsər pirayədür,
Vermək olmaz əldən anı, arsıza həmsayədür,
Vermə əldən damənin,  hərgiz demə kim, mayədür,
Xaki-payin öp, sana ruzi-əzəldən rayədür,
Bilməgi sən neyləyürsən, həq dilindən ayədür.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Vəhşilik etsün tərəqqi qoygilən hər sübhü şam,
Badeyi-gülfam ilə, ey sərvqəddü niknam,
Aləmi bərbad etsün, saqi, qıl ləbriz cam,
Məstü bixud ol, yıxıl, heç dutmasun dövran nizam,
Kim alubdur əql ilə, göstər görüm, dünyadə kam,
Vermə dil danalığa, ləzzət sana eylər həram.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Kim həqiqət əhli olsa, qabili-insan degül,
Bir pula dəgməz vücudi, çunki biiman degül,
Nəfsinə qul olmayubdur, tabe`i-şeytan degül,
Vadiyi-rahi-cəhalət içrə sərgərdan degül,
Etməyür təkzib Həqqi, münkiri-Qur`an degül,
Xəlq içində zərrəcə yox hörməti, nadan degül.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Neynəyürsən isməti sən, xəlq sevməz isməti,
Keçmişün rəsmin unut, çox vəsf etmə iffəti,
Kim sana nə eyləsə, heç dinmə, boşla qeyrəti,
Xabi-qəflətdən ayılma, açma çeşmi-ibrəti,
Qaç kəmal əhlindən, etmə onlar ilə ülfəti,
Növ`üvə təqsirsiz hər bir nəfəs vır zərbəti.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Qoyma tapsun yol sana qəm, məsti-camü badə ol,
Çəkmə millət fikrini bilmərrə, get, azadə ol,

Guşeyi-meyxanələrdə məst olub üftadə ol,
Mahvəşlər damənin dut, eşqinə dildadə ol,
Həqq sözin hərgiz eşitmə, söhbəti-bicadə ol,
Elmü irfandan sana hasil nəlur, get, sadə ol.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Keçdi vəqti, vırma dəm, biar ol, namusdən.
Qeyrətün dərsini eylə kəsb, qövmi-rusidən,
İttihadun tərhin umma, milləti-dəyyusdən,
Heç xəbər dutma, nə gördün dinmə, şəhri-Tusdən,
Nə sitəmlər çəkmisən, səbr etgilən  Petrusdən,
Heç nə verməzlər sana, boş naleyi-əfsusdən.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

Qoy, desün aləm sana, ey millətin xar eyləyən,
Çarəsiz min dərdü ənduhə giriftar eyləyən,
Hər vətən övladinə bihədd azar eyləyən,
Saqibi avarə-sərgərdan xunbar eyləyən,
Sölə, eyb etməzsən hərdəm yoxı var eyləyən,
Xabi-qəflətdən ayılma, getdi bidar eyləyən.

Əhməq ol, əhməq, bu gün əhməqlığun əyyamıdur,
Görməyürsən at ölübdür, itlərün bayramıdur.

## KİM-KİMƏDÜR

Qoydı qan bağrıma ol zülfi-qəra, kim-kimədür,
Nə qədr qılsa mənə cövrü cəfa, kim-kimədür.

Sən də, ey dil, eləmə ahü fəğanın tərkin,
Yandur aləmləri, ey bəxti qəra, kim-kimədür.

Dəgişüb dövrü zəmanə hərə bir nəğmə oxur,
Hökmranlıq eləyür şahə gəda, kim-kimədür.

Yaxşı ilə yamanə fərq qoyan yoxdur heç,
Ya Hüseyn olgilə, ya Şimri-dəğa, kim-kimədür.

Sözün həqqin demə xəlqə əbəs, yox eşidən,
Qaranı ağ oxu, ağı qəra, kim-kimədür.

O sənündür, bu mənim, keçdi o günlər keçdi,
Varuvı kim aparur, olma riza, kim-kimədür.

Börküvi başdan alurlar, hanı imdadə yetən,
Eşidən yox, eləsün ahü nəva, kim-kimədür.

Dadü fəryad eləmə, pərdeyi-ismət getdi,
Düşdi əldən-ələ, məhv oldı həya, kim-kimədür.

Nanəciblər oturub təxti-xilafət üstə,
Tökülür seyl kibi xuni-Xuda, kim-kimədür.

Mərdi-baqeyrət özin öldürə, eyb eyləməyün,
Öldi sərdəftəri-aləm süfəha, kim-kimədür.

## KİM-KİMƏDÜR - II

Çərx içirdür bizə gər badeyi-qəm, kim-kimədür,
Bir nəfəs çəkmərük asudəcə dəm, kim-kimədür.

Nur ilən zülmətə bir yerdə ki, yox fərq verən,
Cahil ol birdü və ya əhli-qələm, kim-kimədür.

Kim səhər tez oyanur əsrin odur sultani,
Ziri-payindəki Xosrovü Cəm, kim-kimədür.

Gavə tək nəsb elə aləmdə ədalət ələmin,
Ya ki, Zöhhak tək et xəlqə sitəm, kim-kimədür.

Rəncü zəhmət çəkəsən hər nə qədər Haman tək,
Olacaq hasilün axırda ədəm, kim-kimədür.

Qətlü qarətlə vur insanlığa mühlik tişə,
Ya ki, Hatəm kimi qıl bəzlü kərəm, kim-kimədür.

Məqdəmi-xəlqdə pamal et özin mur kimi,
Qoy fələk baminə yainki qədəm, kim-kimədür.

Ya Əbu Cəhl kimi cəhldə sabitqədəm ol,
Ya Mühəmməd(s) kimi ərbabi-hüməm, kim-kimədür.

Sən də vur kəndüvi, ey dil, dəxi divanəligə,
Aqil olma, çəkəsən dərdü ələm, kim-kimədür.

## HƏR KƏS ÖZ KEYFİNDƏDÜR

Aləmi dutmış cəhalət, hər kəs öz keyfindədür,
Az qalıb olsun qiyamət, hər kəs öz keyfindədür.

Doğruluqdan qalmayub hər kimə birbəbir,
Var adı, yoxdur əlamət, hər kəs öz keyfindədür.

Xəlqdə qalmub həyadən zərreyicə bir əsər,
Günbəgün artur şərarət, hər kəs öz keyfindədür.

Çoxlarun xəlqün görərsən əl çəküb namusdən,
Bilməyür hərgiz qiyamət, hər kəs öz keyfindədür.

Din yox, vicdan yox, insaf yox, namus yox,
Xəlqə dəb olmuş bu adət, hər kəs öz keyfindədür.

Çoxsı namusın hərifə müftə ehsan eyləyür,
Hatəmə eylər şəmatət, hər kəs öz keyfindədür.

Hər kimə izhar qılson dərdüvi, yüz döndərür,
Məhv olub, yoxdur sədaqət, hər kəs öz keyfindədür.

“Lailahə” söləsön, oğlun sana eyb eyləyər,
Təsdiqin eylər cəmaət, hər kəs öz keyfindədür.

Din adın çəksön, deyərlər əl gətür, mövhumdür,
Dinsiz ol, et istirahət, hər kəs öz keyfindədür.

Bu sənündür, bu mənim yoxdur, nə etsön etgilən,
Söz deyən olmaz bəşarət, hər kəs öz keyfindədür.

Dindən kim mənfəət görmüş, yapuşma dindən,
Boş sözə, get, ver nəhayət, hər kəs öz keyfindədür.

Dindür aləmləri avarə, sərgərdan qoyan,
Fikrini çəkmək nə hacət, hər kəs öz keyfindədür.

Qoy arayə varü yox, qismət aparsun hər yetən,
Bəd degül, xoşdur bu adət, hər kəs öz keyfindədür.

Naxələf tüxmi sən, ey kaş, əkmiyeydün, Bülbəşər,
Əkdigündən çək xəcalət, hər kəs öz keyfindədür.

Səcdəni şeytan sana həqqində etmüb, incimə,
Etmə şeytandan şikayət, hər kəs öz keyfindədür.

Nanəcib övladuvı görmüş nə tüğyan eyləyür,
Sahibi-kəşfü kəramət, hər kəs öz keyfindədür.

Qəbrdən çıx, bir təmaşa etgilən övladuva,
Göstərür, gör nə şücaət, hər kəs öz keyfindədür.

Sel kimi tökdi qanı qandan peşiman olmayan,
Mənbə`i-kinü ədavət, hər kəs öz keyfindədür.

Düşməni-dini-Mühəmməd(s), əmri-həqdən bixəbər,
Hadiyi-rahi-zəlalət, hər kəs öz keyfindədür.

Bilməyən aləmdə heç yaxşı-yəmanun fərqini,
Adətidür qətlü qarət, hər kəs öz keyfindədür.

## HƏR KƏS ÖZ KEYFİNDƏDİR

Aləmi tutmış cəhalət, hər kəs öz keyfindədir,
Az qalıb olsun qiyamət, hər kəs öz keyfindədir.*

Hər kəsə izhar etsən dərdüvi – üz döndərər,
Eyləyir yüz min məlamət, hər kəs öz keyfindədir.

Qolbaqol cananımız biganə ilə seyridə,
Bilməriz hərgiz qəbahət, hər kəs öz keyfindədir.

Ehtirami-şər`i getdi, inqilabı görmüşük,
Zərrəcə çəkməz xəcalət, hər kəs öz keyfindədir.

Gər müsəlmanlıq bu imiş, etmişik izharilər,
Qoy Yezid etsin imamət, hər kəs öz keyfindədir.

Dini yox, İslamı yox, eyni xilafət məhv olub,
Rəhmdən yoxdur əlamət, hər kəs öz keyfindədir.

Hər kəsə versən əmanət, əl götür, heç istəmə,
Eyləyir fövrən xəyanət, hər kəs öz keyfindədir.

* Bu şeir 1996-cı ildə "Boz oğuz" nəşriyyatı tərəfindən çap olunan "Kim-kimədir" adlı kitabda verilmişdir. Mərhum Aydın Qaradağlının arxivində də bu şeirin cüzi fərqlərlə əlyazma variantı mövcuddur.

Yox hökumət, – var idi, əldən alıblar kəlblər,
Heç kimə etmə şikayət, hər kəs öz keyfindədir.

At ölübdür, bir məsəl var, itlərin bayramıdır,
Canuvu al qaç səlamət, hər kəs öz keyfindədir.

Doldu ciblər, canı çıxsın milləti-biçarənin,
Oldular asudə, rahət, hər kəs öz keyfindədir.

Qarət etməklikdi qəsdi malını xəlqin əgər,
Etdilər, ey dil, bəşarət, hər kəs öz keyfindədir.

Qorxuram bundan betər günlər yetişsin dəmbədəm,
Zahir olsun hər ədavət, hər kəs öz keyfindədir.

Əyləşib təxt üstə kimlər, hökmranlıq eyləyir,
Etməyə şərhin nə hacət, hər kəs öz keyfindədir.

Hər kimə üz döndərirsən, düşməni-candır sənə,
Umma oğlundan şəfaət, hər kəs öz keyfindədir.

Vəhşilik bir həddə yetmiş, şərhin etmək olmayır,
Adəm oğlundan bu saət, hər kəs öz keyfindədir.

Müxbiri-sadiq xəbər vermiş bizə bu günləri,
Dindən qalmaz əlamət, hər kəs öz keyfindədir.

Din gedib, iman gedib, vicdan gedib, Qur`an gedib,
Gəlmə hərgiz yox ənabət, hər kəs öz keyfindədir.

“Lailahə” zikrin etsən, xəlq səni təkfir edər,
Etmə çox Qur`an tilavət, hər kəs öz keyfindədir.

Ya Mühəmməd! Baş götür bir qəbrdən bax ümmətə,
Gör necə tapmış hidayət, hər kəs öz keyfindədir.
Heyf ol zəhmət ki, çəkdin illər ilə ruzü şəb,
Ümmətin tərk etdi adət, hər kəs öz keyfindədir.

Doğru sözdür bu, kişi eylər rücu öz əslinə,
Tutdular rahi-zəlalət, hər kəs öz keyfindədir.

Söyləmək olmur sözün həqqini hərgiz zərrəcə,
Günbəgün artır şərarət, hər kəs öz keyfindədir.

Xoş gəlir xəlqə əgər Qur`anı yandırsan oda,
Qəlblər tutmuş (kəsafət) qəsavət, hər kəs öz keyfindədir.

Və`dədir kim zahir olsun qaimi-mövlud üçün,
Vaxtı keçdi, qıl işarət, hər kəs öz keyfindədir.

İntiqam almaqlığa din düşmənindən tiğlər,
Səbri yox bir zərrə saət, hər kəs öz keyfindədir.

Nadürüstün toxmunu kaş əkməyəydin, ey bəşər,
Əkdiyindən çək xəcalət, hər kəs öz keyfindədir.

Dəmbədəm şiddətlənir dinsizliyin əndişəsi,
Din olur bilmərrə qarət, hər kəs öz keyfindədir.

Dini-İslamı vermə əldən, Saqiba, tutma rahi-küfr,
Mənfəət verməz boş adət, hər kəs öz keyfindədir.

# HAŞIM BƏY SAQİB

